*Bu cild yazıçı* ***İsmayıl Şıxlının*** *"Seçilmiş əsərləri. İki cilddə"* (*I cild, Bakı, Azərnəşr, 1971*), *"Namərd gülləsi"* (*Bakı, Yazıçı, 1991*), *"Ölüləri qəbristanda basdırın..."* (*Bakı, Gənclik, 1992*) *və "Ölən dünyam"* (*Bakı, Azərnəşr, 1995*) *kitabları əsasında təkrar nəşrə hazırlanmışdır*

Tərtib edəni: **Elçin Şıxlı**

Ön sözün müəllifi: **İntiqam Qasımzadə**

**894.3613 - dc 21**
**AZE**
**İsmayıl Şıxlı. Seçilmiş əsərləri. İki cilddə. I cild.** Bakı, "Şərq-Qərb", 2005 , 408 səh.

Xalq yazıçısı İsmayıl Şıxlının istedadlı bir nasir kimi oxucular və ədəbi ictimaiyyət tərəfindən təqdir olunması onun "Ayrılan yollar" (1956) romanı ilə bağlıdır. Azərbaycan kəndində 1941-45-ci illər müharibəsindən sonrakı dövr üçün xarakterik olan dəyişikliklər bu əsərdə öz maraqlı, bədii ifadəsini tapmışdır. Əsərdə dövrün ideoloji çərçivələrindən çıxmaq cəhdləri var.

"Ölən dünyam" isə yaradıcılığının son akkordu kimi yazıçının ömrünün qürub çağı qələmə aldığı əsərdir. Uzun illər ənənəvi nəsr təhkiyəsindən kənara çıxmayan, klassik roman janrının bütün qayda-qanunlarına riayət eləyən müəllif bu əsərdə çərçivələri vurub dağıdır.

Seçilmiş əsərlərinin bu cildinə adları çəkilən romanları ilə yanaşı, yazıçının "Namus qaçağı", "Namərd gülləsi" və "Ölüləri qəbristanda basdırın" hekayələri də daxil edilmişdir.

**ISBN 9952-418-33-4**



Azərbaycan Respublikasının Prezidenti
İLHAM ƏLİYEVİN
**“Azərbaycan dilində latın qrafikası ilə kütləvi nəşrlərin həyata keçirilməsi haqqında”**
12 yanvar 2004-cü il tarixli sərəncamı ilə nəşr olunur və ölkə kitabxanalarına hədiyyə edilir



## OXUNAN VƏ SEVİLƏN YAZIÇI

Azərbaycan nəsrinin tarixi daha əvvəllərə gedib çıxsa da, ədəbiyyatın bu qolunun inkişafı, heç şübhəsiz, XX əsrə aiddir. XX əsrə qədər nəsr yazmış cəmi bir neçə yazıçının adını çəkə bildiyimiz halda, bu əsrdə yaşayıb-yaratmış nasirlərin böyük bir siyahısını tutmaq mümkündür. Onların da əksəriyyətinin yaradıcılığı sovet dövrünə təsadüf edir. Bu yazıçılardan biri də tamamilə orijinal yaradıcılıq dəsti-xətti olan İsmayıl Şıxlıdır (1919-1995).

İsmayıl Şıxlının adı Azərbaycanda həm bir yazıçı, həm də bir ictimai-siyasi xadim kimi kifayət qədər geniş tanınır.Yaşlı və orta nəslin nümayəndələri arasında onun heç olmasa "Dəli Kür"ünü və bir sıra kiçik hekayələrini oxumayan adam tapmaq çətindir...

İsmayıl Şıxlı haqqında yazanların çoxu onun ədəbiyyata 1938-ci ildə "Quşlar" şeri ilə gəldiyini qeyd edirlər. Bu, həqiqətən belədir. Amma "heç olmasa bircə şerim dərc olunaydı..." arzusu həyata keçsə də, elə həmin gün, şeri "Ədəbiyyat qəzeti"ndə dərc olunanda, şair olmaq sevdasına o özü birdəfəlik xitam verdi. Sonralar o, bunu belə xatırlayacaq: "Həmin gün mən həm sevinir, həm də kədərlənirdim. Sevinirdim – nəhayət, şerim çıxdı; kədərlənirdim – heyf ki, bir də şeir yazmayacağam..."

Bu, özünə inamsızlıq deyildi, yox. Bu, təxminən 20 yaşında olan bir gəncin öz imkanlarını qiymətləndirə bilmək, yazdıqlarına tənqidi yanaşmaq qabiliyyəti və bir də qətiyyəti idi. Gənc İsmayılın təbiətindəki bu iki xüsusiyyət ömrü boyu, lap son gününə kimi onu tərk etmədi. Ağayana, son dərəcə təvazökar və müdrik İsmayıl Şıxlı şəxsiyyətinin kökündə bir də bu durur.

Niyə "bir də"? Çünki bu onun yeganə xüsusiyyəti deyildi. İsmayıl Şıxlı səliqəli, zəhmətkeş və əqidəli bir insan idi. Onu nasir, romançı kimi formalaşdıran da xarakterinin məhz bu cəhətləri idi.

* * *

İsmayıl Şıxlı çox ağır, lakin olduqca maraqlı bir həyat yolu keçib. Bu yola ötəri də olsa, nəzər salmağına dəyər. Rəsmi sənədlərdə İsmayıl Şıxlının 1919-cu il mart ayının 22-də Qazax rayonunun İkinci Şıxlı kəndində müəllim ailəsində anadan olduğu yazılır. Amma əslində bu, belə deyil; çoxları yaşlarını azaltdıqları halda, onun yaşını düz 3 il artırmışdılar. Çünki Kosalar kənd məktəbində ibtidai təhsilini başa vurduqdan sonra 1934-cü ildə valideynləri onun Qazax Pedaqoji Texnikumuna daxil olmasını məsləhət bilirlər. İsmayılın onda cəmi 12 yaşı vardı; bu yaşda onu, çətin, texnikuma götürəydilər. Odur ki, fikirləşib yaşını artırdılar.

Xülasə, 1936-cı ildə balacaboy, çəlimsiz İsmayıl Qazax Pedaqoji texnikumunu bitirib bir il Kosalar məktəbində müəllimlik edir. Lakin burda o, çox ləngimir, ali təhsil almaqçün 1937-ci ildə Bakıya gəlib Lenin adına Azərbaycan Dövlət Pedaqoji İnstitutunun dil və ədəbiyyat fakültəsinə daxil olur. Burada İsmayıl Şıxlı o dövrün istedadlı gənc şairləri – Tələt Əyyubov, Böyükağa Qasımzadə və Ənvər Əlibəyli ilə dostluq edir. Son dərəcə ağır illər idi o illər – repressiya tüğyan edirdi. İnstitut müəllimlərinin bir çoxu artıq həbs olunmuşdu, yerdə qalanlar isə amansız siyasi təzyiq altında idilər – elə tələbələr də. İsmayıl Şıxlının bəy nəslindən olduğunu, iki gündən bir institut komsomol komitəsinə sorğu-suala çağırılmasını nəzərə alsaq, onun o dövrkü həyatını, keçirdiyi psixoloji sarsıntıları təsəvvür etmək çətin olmaz...

Bununla belə, gənclik – tələbəlik illərinin öz gözəlliyi, öz romantikası var. İsmayıl Şıxlı da, təbii ki, arzularla yaşayırdı; savadını artırmaqla yanaşı, tənqidçi Məmməd Cəfər Cəfərovun APİ-də təşkil etdiyi ədəbiyyat dərnəyinə gedirdi. Elə ilk yazılarından biri olan "Dəli Kür" hekayəsini də o zaman institut qəzetində çap etdirir. Beləliklə, poeziyadan "əlini üzən" İsmayıl Şıxlı ara-sıra özü üçün şeir yazsa da, üz tutur nəsrə. Hətta günlərin bir günü məsləhət almaqçün görkəmli yazıçı Mehdi Hüseynin yanına gedir. Düşündüyünü, qənaətini gizlətməyi xoşlamayan Mehdi Hüseyn onunla açıq danışır; iradlarını deyir, çoxlu mütaliə etməyi, yaradıcılığa kiçik hekayələrlə başlamağı məsləhət görür. Ürəyində həmyerlisindən tərif, sığal gözləyən İsmayıl Şıxlı bir müddət pərt olur. Amma sonralar özünün də etirafına görə, onun əsl ciddi bir nasir kimi formalaşmasında bu açıq söhbətin rolu danılmazdır.

1941-ci ildə müharibə başlayır və 42-ci ildə o, cəbhəyə gedir. İsmayıl Şıxlının o dəhşətli müharibə illərində bir döyüşçü kimi keçdiyi yolların xəritəsini sadəcə göz önünə gətirmək kifayətdir ki, onun hansı odun-alovun içindən çıxdığını təsəvvür edəsən; Şimali Qafqaz – Kerç – Belorusiya – Pribaltika – Şərqi Prussiya... Şəxsən mənə, bu sətirlərin müəllifinə Kerç sularının büsbütün al qana bulanmasını, minlərlə cəsədin suların üstündə üzməsini danışanda, mən zahirən çox həlim, mənən humanist bu insanın o dəhşətlərin içindən necə sağ-salamat çıxmasına heyrət etdim. Ömrü boyu da bir dəfə də olsun sinəsinə vurub cəbhə illərində min dəfə ölümlə üz-üzə gəlməsini gözə soxduğunu, öyündüyünü görmədim. Və şübhəm də yoxdur ki, heç kim görməyib.

1945-ci ilin noyabrında İsmayıl Şıxlı cəbhədən geri dönür. Qələbə ilə qayıdan bu döyüşçünün özü ilə gətirdiyi iki qazancı vardı: mərmilər altında qazanılmış dözüm – mərdlik, kişilik; bir də – barıt qoxuyan cəbhə gündəlikləri...

İsmayıl Şıxlı Qazaxda bir il müəllimlik etdikdən sonra, doğma institutuna gəlir, aspiranturaya daxil olur. Sonralar o, burda müdafiə edir, elmi dərəcə, elmi ad alır, ən əsası isə, həyatını sevimli peşəsinə – müəllimliyə həsr edir... Təkcə müəllimliyəmi həsr edir həyatını?!

Bəli, İsmayıl Şıxlı müəllimlik peşəsini, tələbələrin içində olmağı çox sevirdi. Fəxr edirdi müəllimliyi ilə. Amma "Quşlar" adlı ilk dərc olunmuş şerindən sonra o, bir gün də belə, yazıçılıq arzusundan əlini üzməmişdi; qələmdən, bədii yaradıcılıqdan ayrılmamışdı – ömrünün son anına kimi də ayrılmadı. İsmayıl Şıxlı aspiranturada oxuduğu illər (və ondan sonra da) çoxlu mütaliə edir, öz üzərində çalışır (Mehdi Hüseynin sözlərini unutmamışdı), ara-sıra hekayələr, daha çox publisistik yazılar üzərində işləyirdi. Bu da Mehdi Hüseynin məsləhəti idi; bu sərt, amma xeyirxah insan ona yalnız gördüklərini, bildiklərini yazmağı tövsiyə edirdi. Beləcə o, "Həkimin nağılı", "Səhəri gözləyirdik", "Kerç sularında" və başqa hekayələrini, "Raykom katibi" kimi portret oçerklərini, yol qeydlərini və "Daşkəsən" adlı sənədli povestini yazır.

İsmayıl Şıxlının bu dövr yaradıcılığı haqqında nə demək olar?! Heç şübhəsiz, İsmayıl Şıxlının o illərdə yazdıqları səmimi idi, təravətli idi; sözə qarşı məsuliyyət hiss olunurdu. Amma onun da əsərlərində dövrün, zamanın pafosu aşkar görünürdü. İdeoloji qadağalar yazıçını müəyyən çərçivələrlə məhdudlaşdırırdı: o, həyatı ziddiyyətləri ilə qələmə ala bilməzdi; o, təsvir etdiyi insanı daxili aləminin bütün çalarları ilə, tərəddüdləri, zəifliyi ilə göstərə bilməzdi və s. və i.a. Qadağaların çox uzun bir siyahısı vardı. Sovet ideoloqları adi bir həqiqəti anlamaq istəmirdilər ki, müsbət qəhrəmanın da zəiflikləri ola bilər, o da insandır, müqəvva deyil. Totalitar rejim çox amansız idi; sovet adamının əqidə azadlığının büsbütün əlindən alınmasına baxmayaraq, o daim siyasi təcavüzə məruz qalırdı, bunu dilinə gətirən ziyalı, qələmə alan yazıçı ən azı dəlixanaya salınırdı. Bununla belə, onlar həqiqətin hamısını olmasa da, bir qismini yazırdılar.

Bütün bunları xatırlatmaqda məqsəd yazıçılarımızın, o cümlədən də İsmayıl Şıxlının hansı şəraitdə işlədiklərini çatdırmaqdır. İsmayıl Şıxlı cəbhədən qayıtdıqdan sonra – ta "Ayrılan yollar"a (1954-55) qədər belə bir şəraitdə, belə bir dövrdə qələmini publisistika sahəsində sınadı və ucqarlarda yaşayan zəhmət adamlarının portretlərini yaratdı, əmək qəhrəmanlıqlarını qələmə aldı.

On ilə yaxın ən müxtəlif mövzularda hekayələr, publisistik əsərlər yazan İsmayıl Şıxlını geniş oxucu kütləsinə tanıdan, sevdirən 1955-ci ildə "Azərbaycan" jurnalında çap etdirdiyi "Ayrılan yollar" romanı oldu; bu əsər o zaman əl-əl gəzirdi. Ədəbi ictimaiyyət də onu çox yaxşı qarşıladı. "Ayrılan yollar" 1941-45-ci illər müharibəsindən sonra Azərbaycanda gedən dirçəlişdən bəhs edir. Yazıçının təsvir etdiyi kənddə yeni dövrün İmran, Zeynəb, Nəsib kimi nümayəndələri köhnə fikirli Kosaoğlu, Kazım, Musa və Şahnaza qarşı çıxırlar; belə bir konflikt üzərində qurulub roman. İsmayıl Şıxlı "Ayrılan yollar"da dövrün ideoloji çərçivələrindən çıxmağa müəyyən cəhdlər göstərmişdi, amma buna hələ tam nail ola bilməmişdi və ola da bilməzdi. Nizami Cəfərov demişkən: "Çünki 50-ci illər hələ davam edirdi, 60-cı illər isə hələ qabaqda idi..." Bununla belə, "Ayrılan yollar" İsmayıl Şıxlının çoxplanlı roman yazmağa qadir istedadlı bir yazıçı olduğunu göstərdi.

* * *

İ.V.Stalinin ölümündən sonra ölkədə siyasi ab-hava tədricən dəyişməyə doğru gedirdi. N.S.Xruşşov şəxsiyyətə pərəstişi ifşa etdikdən sonra isə totalitar rejimin soyuq buzu bir qədər də əridi. Ədəbiyyat sosializm realizmin məngənəsindən yavaş-yavaş qurtulurdu. Yazıçılar artıq keçmişlərlə müqayisədə azad nəfəs alır, illərdən bəri əlçatmaz bir arzu kimi ürəklərində gəzdirdikləri mövzuları, dilə gətirməyə cürət etmədikləri fikirləri, sözləri üzə çıxarırdılar. Amma hələ qorxa-qorxa, ehmal-ehmal. Elə bu vaxt ədəbi mühitin sakit, aydın səmasında sanki şimşək çaxdı; 1962-ci ildə "Azərbaycan" jurnalında (№ 6, 7, 8) İsmayıl Şıxlının yeni "Dəli Kür" romanının I hissəsi çap olundu. Özünə qarşı həddindən artıq tələbkar olan, hər cümləsinin üstündə əsən, yüz ölçüb bir biçən İsmayıl Şıxlı, sən demə, neçə illər imiş ki, iki otaqlı mənzilinin bir küncünə çəkilib bu əsəri yazırmış. Belə bir əsər naminə özünü könüllü surətdə çox şeydən məhrum etməyinə dəyərdi. "Dəli Kür" oxucuların hədsiz marağına səbəb olmuşdu. Bütün daxili ziddiyyətlərinə baxmayaraq, əsərin baş qəhrəmanı Cahandar ağa hamını əfsunlamışdı. Həmkarları da yazıçını bu uğuru münasibəti ilə təbrik edirdilər. Belə bir vaxtda İsmayıl Şıxlı üçün ən yüksək qiymət, özünə ustad bildiyi Mehdi Hüseynin 1962-ci ilin noyabrında ona göndərdiyi məktub oldu. Mehdi Hüseyn yazırdı: "Əzizim İsmayıl! "Dəli Kür" əsərini dünən gecə oxuyub qurtardım. Düzünü deyim ki, mən səndən yaxşı əsər gözləyirdim, amma bu cür qüvvətli və təsirli bir əsər yazmağını gözləmirdim. Əhsən, bərəkallah! Son on ildə bizim ədəbiyyatımızdan oxuduğum heç bir əsər məni bu cür sarsıtmamışdı".

Hamı səbirsizliklə romanın ardını gözləyirdi. Əsəri tamamlamaq üçün İsmayıl Şıxlıya daha dörd il vaxt lazım gəldi. Nəhayət, 1966-cı ildə "Azərbaycan" jurnalında romanın II hissəsi dərc olundu. İllər keçəcək, "Dəli Kür"ün yaranıb ədəbiyyatımızın faktına çevrilməsini Nizami Cəfərov belə mənalandıracaq: "Dəli Kür" onlarla povestlərin, romanların milli təfəkkürümüzdə yaratdığı mənəvi səhradan axıb keçdi və ona can verdi". Bu, həqiqətən belə idi; sovet ideologiyasının tələb etdiyi mövzulardan, hazır sxemlərdən, konflikt, ziddiyyət görüntüsü yaratmaq xatirinə istehsalat mövzusunda uzun-uzadı soyuq, cansıxıcı mübahisələrdən oxucular da, elə yazıçıların özləri də bezmişdilər. "Dəli Kür" və 60-cı illərdə bir-birinin ardınca yazılan ən yaxşı povest və romanlar Azərbaycan nəsrində yeni bir dönüş mərhələsi oldu. Yazıçılar indi mövzu seçimində, yaradıcılıq axtarışlarında nisbətən sərbəst idilər.

Soruşula bilər: siyasi iqlimin yumşalmağa başladığı bir vaxtda İsmayıl Şıxlı niyə müasir mövzuya yox, məhz tarixi mövzuya müraciət etdi? Zənnimcə, bu, başadüşüləndir. Çünki, uzun illər idi ki, sovet ideologiya maşını

xalqların milli özünəməxsusluqlarını: onların dinlərini əllərindən almağa, adət-ənənələrini, əxlaq normalarını, həyat tərzlərini mərhələ-mərhələ silib yox etməyə və beləliklə, "sovet xalqı" adı altında bir xalq yaratmağa çalışırdı. Bu maşının gücü azaldıqda ilk olaraq milli mədəniyyətlər – xalqların ən çevik və güclü özünübərpa instinkti fəallaşmağa başlayır; ədəbiyyat milli yaddaşı oyatmaqçün tarixi keçmişə, folklora müraciət edir.

Bunları xatırlatmaqda mənim məqsədim İsmayıl Şıxlının "Dəli Kür"ünün izlərini onun əvvəlki əsərlərində axtarıb tapmayan və beləliklə, "Dəli Kür"ün az qala möcüzə kimi göydəndüşmə olduğunu söyləyənlərə etiraz etməkdir. Bu əsərin toxumu İsmayıl Şıxlının qan yaddaşında həmişə mövcud olub, sadəcə, əlverişli şərait yarananda – oyanıb, Şıxlı da onu qələmə alıb; xoşbəxtlikdən bu, onun sənətkar kimi yetkinlik dövrünə təsadüf edib – həqiqət budur.

İsmayıl Şıxlının ən doğma əsəri, şübhəsiz ki, "Dəli Kür"dür; yaratdığı ən güclü obraz isə – Cahandar ağadır. Qəribədir, diqqət etdikdə, Cahandar ağada istənilən qədər mənfi cəhətlər, naqisliklər var: başqasının namusuna sataşır – arvadını götürüb qaçır, rəiyyətə qarşı amansızdır, bacısını qətlə yetirir, yoxsullara yuxarıdan aşağı baxır və sair və ilaxır. Lakin biz ona mənfi obraz kimi baxmırıq, nifrət etmirik ona. Hətta, dəyişən zəmanədə təklənmiş dağ cüssəli Cahandar ağaya acıyırıq. Bir sözlə, o, faciəvi obrazdır. Mən burda mütləq görkəmli filosof-tənqidçi Asif Əfəndiyevin bu obrazla bağlı çox dəqiq fikirlərini yada salmaq istəyirəm. O yazırdı: "Yarımçıq ehtirasların, yarımçıq mərdliyin, yarımçıq xeyirin, "nəzakətli" bədəməlliyin, pambıqla baş kəsməyin... antipodu dəli Cahandar". – Onu oxucuya sevdirən cəhətləri necə də ustalıqla deyib... Və ya: "Cahandar ağa quru, ehtirassız, namərd, zavallı adam deyil". Cahandar ağanın rəğbət doğuran xüsusiyyətlərini əsl seleksiyaçı kimi necə də həssaslıqla, zərrə-zərrə toplayıb "sapa düzüb".

Tənqidçi sonra obrazın faciəsinin kökünü müəyyən edir, yazır: "Cahandar ağa başa düşmüşdür ki, artıq dəyişməyə doğru gedən zəmanədə ona, onun idealına, həyat tərzinə yer yoxdur. Buna görə də Cahandar ağanın mənəvi ölümü fiziki ölümünü qabaqlayır".

Nəhayət, yekun: "Cahandar ağa tarix tərəfindən məhvə məhkum edilən şəxsiyyətdir. Onun həyat idealı məhdud, fəaliyyəti birtərəfli və qeyri-kamil, qayəsi ibtidaidir. Lakin o, qəribə bir şeriyyəti, qəribə bir gözəlliyi və ahəngi də özüylə bərabər Kürün dalğalarına tapşırdı".

Bax, bu "qəribə"ləri görən də, ustalıqla oxucuya çatdıran da İsmayıl Şıxlı qələminin qüdrəti, İsmayıl Şıxlının sənətkarlığıdır.

"Dəli Kür" haqqında yazan bəzi tənqidçilər (roman haqqında saysız-hesabsız məqalələr yazılıb) onu "gərgin dramatik toqquşmalar, qüvvətli xarakterlər romanı" adlandırırlar – tamamilə düzdür. Bəziləri "feodal geriliyinin təsvirini" görürlər romanda – qoy görsünlər. Başqaları Cahandar ağaya "də-

liqanlı və zalım mülkədar" deyirlər – onlar da müəyyən mənada haqlıdırlar. Amma bütün bunlar bir o qədər də əhəmiyyətli deyil. Əhəmiyyətli olan odur ki, İsmayıl Şıxlı Cahandar ağa kimi son dərəcə sanballı, ölməz bir obraz yaratmağa müvəffəq olmuş, Azərbaycan ədəbiyyatı xəzinəsinə "Dəli Kür" kimi başdan-ayağa milli ruhla aşılanmış dəyərli bir roman vermişdir.

* * *

İsmayıl Şıxlı az yazan, amma yaxşı yazan yazıçılardan idi. "Dəli Kür"dən sonra o, uzun müddət iri həcmli nəsr əsəri yazmadı. Düzdür, arada "Cəbhə gündəlikləri"ni çapa hazırladı, hekayələr yazdı, amma oxucu ondan "Dəli Kür" kimi köklü-köməcli, dolğun xarakterlərlə zəngin, geniş panoramlı roman gözləyirdi. Haqqı da vardı, axı, yazıçı özü söhbətlərində, müsahibələrində inqilabdan sonra, 20-ci illərdə Azərbaycanda baş vermiş hadisələri əhatə edəcək bir əsər yazmaq fikrində olduğunu bildirmişdi və hətta gələcək romanının adını da elan etmişdi. "Qanlı təpə" adlanacaqdı həmin əsər. Lakin mühüm arxiv sənədlərinə əlinin çatmaması, hələ də qapalı cəmiyyətdə yaşamağımız, inqilabın beşiyi Moskvadan asılı olmağımız, "böyük qardaş" faktoru ona bu niyyətini həyata keçirməyə imkan vermədi.

Bununla belə, "Dəli Kür"dən sonuncu əsəri "Ölən dünyam"a qədər olan dövrü mən İsmayıl Şıxlının həyatında çox mühüm bir mərhələ sayıram. Bu illərdə o, yenə də müəllimliyini davam etdirdi, kinoda, teatrda qələmini sınadı, "Azərbaycan" jurnalının tarixində seçilən redaktorlardan oldu, Yazıçılar İttifaqına rəhbərlik elədi və artıq dediyim kimi, hekayələr yazdı və "Cəbhə gündəlikləri"ni çapa hazırladı. Gündəlikləri o, 1942-ci ildən – cəbhəyə gedən gündən yazmağa başlamışdı; uzun illər onların əsasında müharibə haqqında roman yazmaq fikrindəydi. Amma roman yazmadı, bir balaca əl gəzdirib, demək olar ki, olduğu kimi adi bir döyüşçünün cəbhə gündəlikləri – qeydləri şəklində çap etdirdi. Barıt qoxusu gələn gündəliklərin çox böyük əks-sədası oldu.

* * *

İsmayıl Şıxlı yaradıcılığının son akkordu ömrünün qürub çağı qələmə aldığı "Ölən dünyam" romanıdır. Əsəri özü yazmağa başlasa da, sonradan ağır xəstəliyin fəsadı nəticəsində gözləri tutulduğu üçün romanın əksər hissəsini diqtə etmək məcburiyyətində qaldı; bu işi vəfalı həyat yoldaşı Ümidə xanım gördü.

"Ölən dünyam" forma baxımından İsmayıl Şıxlının əvvəlki iki romanından xeyli fərqlənir. Nisbətən kiçik həcmli bu əsərdə yazıçı əsas süjet xətti ilə bağlı müxtəlif hadisələri paralel inkişaf etdirmək hesabına və konkret zaman

çərçivələrini cəsarətlə pozaraq, gah irəli – gələcəyə gedib, gah da geri – keçmişə qayıtmaq sayəsində iki böyük nəslin taleyini izləməyə və ölkənin siyasi mənzərəsini verməyə müvəffəq olur. Romanın dili də quruluşuna uyğun çox çevik və lakonikdir; hətta təbiət təsvirlərinin özündə belə, "Dəli Kür"lə müqayisədə, yazıçı bir-iki dəqiq ştrixlə kifayətlənir, qəti təfərrüata varmır. Qəribədir, illər uzunu ənənəvi nəsr təhkiyəsindən kənara çıxmayan, klassik roman janrının bütün qayda-qanunlarına riayət edən İsmayıl Şıxlı "Ölən dünyam"da çərçivələri vurub dağıdır; qəhrəmanlarının taleyi ilə bağlı bir epizodu, Azərbaycan miqyasında baş verən qlobal ictimai-siyasi proseslərin təsviri əvəz edir. Və yaxud, aramla qələmə alınmış psixoloji vəziyyətdən sonra çox rahatlıqla süjetin müəyyən bir hissəsini sürətlə nəql edib keçir. Yazıçı bunu bilə-bilə edir, diqqətini ikinci-üçüncü dərəcəli heç bir şeyə yayındırmır; məqsəd əsərin qayəsini qabartmaqdır. Qayə isə bundan ibarətdir: Azərbaycan xalqına kənardan zorla qəbul etdirilmiş siyasi sistem onun həyatında saysız-hesabsız məhrumiyyətlərə, ölümlərə, faciələrə səbəb olub.

"Ölən dünyam" romanı çox dəqiq tapılmış və böyük ustalıqla qələmə alınmış simvolik bir sonluqla bitir. Əsərin qəhrəmanlarından biri, elindən-obasından didərgin düşmüş Həsən ağa uzun illərin ayrılığından sonra dönüb yurduna qayıdır, çinar ağacının altında oturub kürəyini onun gövdəsinə söykəyir və gözlərini yumub bir zamanlar öz əli ilə əkdiyi bu əzəmətli ağacın rişələri ilə əbədi olaraq doğma torpağına qovuşur.

Çox təsirli səhnədir, amma burda bir təskinlik işartısı, bir ümid rüşeymi var; torpağa qovuşmaq – əbədiyyətə qovuşmaqdır. Torpaqsa əbədidir. Ən güclü tufanlar, qasırğalar belə toz-tozanaq qaldırsa da, torpağın üstündəkiləri uçurub-dağıtsa da – torpaq yerində qalır. Kənardan gətirilmiş zorakı inqilablar da elədir – saysız-hesabsız insan ölümü, müsibətlər, faciələr hesabına cəmiyyətdə xırda-para nələri isə dəyişə bilsə də, xalq mənəviyyatını, xalq ruhunu tamam məhv edə bilmir. Belə olmasaydı, adət-ənənələrimiz, dilimiz, başqa milli dəyərlərimiz bu günə kimi yaşamazdı. "Ölən dünyam" romanını oxuyub qurtardıqdan sonra, istər-istəməz, məhz bu sayaq düşüncələrə qapılırsan...

İsmayıl Şıxlı macal tapıb "Ölən dünyam" romanının son nöqtəsini qoymaqla, 50 illik yaradıcılıq yoluna da yekun vurdu. Və sanki bundan sonra o da qəhrəmanı Həsən ağa kimi rahatlıq tapıb dünyasını dəyişdi, əbədiyyətə qovuşdu.

Tez-tez eşidilən belə bir deyim var, deyirlər: "yazıçının əsərləri oxunursa, deməli, o, yaşayır". Bunun belə olub-olmadığını mən bilmirəm. Amma onu qəti bilirəm ki, İsmayıl Şıxlı – əsərləri oxunan və sevilən yazıçıdır...

***İntiqam Qasımzadə***

# AYRILAN YOLLAR

## 1

Gün qalxdıqca gecə şaxtadan donan yolların qarı əriyirdi. Arxların kənarındakı buzlar istinin təsirindən çatlayıb ovxalanırdı. Göz işlədikcə uzanan düzlərin üzərinə yorğan kimi sərilən qar nazilir, bəzi yerlərdə isə yuxalıb xal-xal olurdu.

Şəhərdən çıxıb uzanan asfalt yol ağ çölləri qara xətt kimi yarıb keçirdi. Yaz aylarında gurlayıb-çağlayan Alagöz çayı indi sap kimi nazilib sakit-sakit axırdı. O tayda, bağların içində kənd evləri görünürdü. Bacalardan burula-burula qalxan tüstü duman kimi kəndin üzərinə yayılmışdı. Uzaqdan qara nöqtələri andıran heyvanlar çöllərə səpələnmişdi.

Qatardan düşəndən sonra çamadan əlində şəhərin kənarındakı təpədə dayanmış İmran birdən gülümsündü. Ayrılıqdan sonra doğma yerlər ona daha gözəl göründü. Ətrafdakı ağaclar, çayın üzərindəki dəmir körpü, yolun kənarındakı qoşa çinar belə İmrana əziz və mehriban gəldi. O, aşağı endi. Körpünü keçib asfalta çıxdı. Maşınlara əl qaldırmadan, doğma yerlərə doyunca baxmaq məqsədi ilə sağa burulub kənd yoluna düşdü. Donu açılan yolun palçığı saqqız kimi ayağa yapışırdı.

İmran palçığa düşməmək üçün yaxındakı arxın yaxası ilə getdi. Bir azdan o üzə adlayıb, qarla örtülü qoruğa keçdi. Qar ayaqlarının altında xarıldayır, islanmış ot kökləri əzilirdi. Arxın dumduru suyu sır-sır buzları yığışdırıb apardıqca, onlar çiliklənmiş şüşə kimi cingildəyirdi. Qar adamın gözünü qamaşdırırdı.

Bu cığır İmrana çoxdan tanış idi. Məktəbdə oxuduğu vaxt, qış və yay tətillərində yoldaşları ilə şəhərə həmin bu kəsə cığırla gəlib-gedərdi.

İmran dayanıb qərb tərəfdəki Dəlidağa baxdı. Sonra sarı meşin paltosunun cibindən papiros çıxardıb yandırdı və yoluna davam etdi.

Aram-aram vurulan zəng səsi onu fikirdən ayırdı. Başını qaldırıb ağ daşdan tikilmiş böyük məktəb binasına baxdı. Həyəti səs-küylə dolduran uşaqlar bir-birini qovur, qar topu oynayırdılar.

İmran öz uşaqlığını xatırladı. Məktəbə gedib-gəldiyi günləri, qışda bir-birlərini qara basdıqlarını, yaz aylarında çəmənlikdə oynayıb, kolların dibindən bənövşə yığdıqlarını yadına saldı. Onlar hər səhər günəşlə birlikdə oyanar, al-əlvan çiçəkli meyvə ağaclarının altından keçərək məktəbə gedərdilər. Zəngdən əvvəl məktəbin həyətində qoşa-qoşa gəzərək dərslərini təkrar edərdilər. Uşaqların səsləri bir-birinə qarışardı. Tənəffüslərdə həyətə qaçar, turnikdə fırlanar, top-top oynayardılar. Havanın ətri otaqlara dolur, sinfi bəzəyən qızılgüllərin rayihəsinə qarışıb adamı məst edirdi. Hələ qızlar!.. Onlar yenicə açılan güllərdən daha təravətli olurdular. Gözləri qaynayır, yanaqları rəngdən-rəngə düşürdü. Aşağı sinifdə oxuyarkən atılıb-düşərək dəcəllik edən bu şıltaq qızlar, doqquz-onuncu siniflərdə ağırlaşır, adam çox olan yerlərdə özlərini sakit aparır, tək qalanda isə yenidən şaqqıldayıb gülürdülər. Umu-küsülər, mübahisələr, qaşqabaq töküb dodaq büzmələr o qədər olurdu ki!

"Eh, uşaqlıq!" – deyə pıçıldayan İmran kəndin ortasından keçən arxın üstündəki körpüyə yaxınlaşdı. Qabaq tərəfdən gələn bir qız İmranı görcək kəlağayısını düzəltdi, başını aşağı salaraq, ötüb keçmək istədi. İmran cığırdan kənara çıxdı. Nəyi isə səliqə ilə qəzetə büküb qolu üstündə sinəsinə sıxan qız, onun bərabərinə çatanda gözaltı İmrana baxdı. Birdən onun iri qara gözləri təəccüblə genişləndi. Ayaq saxlayaraq, gülümsədi. Yanaqları daha da allaşdı.

– İmran, sənsən?

İmran qımışdı.

– Xoş gördük, Zeynəb.

Qız gözlərini yerdən ayırmadan dinməzcə onunla görüşdü. İmran başdan-ayağa qızı süzdü. Zeynəb xeyli dəyişib gözəlləşmişdi. İmran Zeynəbi uşaqlıqdan tanıyırdı. O, məktəbdə həmişə dəcəllik etməyi, kiçik bir bəhanə tapıb adamlara sataşmağı, müsahibinin utandığını, yaxud da azacıq tutulduğunu görəndə şıltaqlıq edərək, gülməyi çox sevərdi. İmranın özü də çox zaman onun zarafatına dözə bilməyib qaşqabağını sallardı. Bunu görən Zeynəb: "İmran, sən allah, həmişə belə dur, qaşqabaqlı olmaq sənə yaman yaraşır, onda mənim səndən daha çox xoşum gəlir" deyər və gülməyini güclə saxlayardı. İmran daha da əsəbiləşib:

– Sən bu xasiyyətindən nə vaxt əl çəkəcəksən? – deyərdi.

Zeynəb şıltaq uşaq ədası ilə:

– Allah verən xasiyyəti dəyişmək olarmı? – deyərdi.

Çox vaxt də İmranın anası Tükəzban xala söhbətə qarışardı:

– Ay şeytan, gədədən əl çəksənə, nə istəyirsən?

İndi İmran, qarşısında dayanan Zeynəbə baxırdı. Onun ayağında uzunboğaz rezin çəkmə, əynində göy mahud palto, başında yaşıl yelənli qara kəlağayı vardı. Hiss olunurdu ki, uşaqlıq günlərindəkindən fərqli olaraq, indi Zeynəb üst-başını səliqəyə salmış, həmişə gözünün üstünə tökülən saçını sığallamışdı.

– Biz elə bildik sən daha buralara gəlməyəcəksən. Tükəzban xala hər gün arxanca gileylənirdi, – deyə o, sükutu pozdu.

– Heç elə şey olarmı?

– Niyə olmur, böyüyüb kəndi bəyənməyənlər azdırmı?

– Məni nahaq yerə onlara oxşadırsan.

– Sən göydən düşməyibsən ki, – nəhayət, Zeynəb nəzərlərini yerdən çəkib onun üzünə baxdı, – heç səndən də gözüm su içmir.

O həmişəki kimi astadan, ancaq ürəkdən güldü. İmran azacıq pərt oldu: "Bu qız heç vaxt düzəlməz".

Zeynəb elə bil birdən-birə dəyişdi. Bir az bundan əvvəl utanıb qızaran qızdan əsər qalmadı. Gözünün ucu ilə İmranın çamadanına baxdı.

– Elə indimi gəlirsən? Yəqin Tükəzban xalanın xəbəri yoxdur. Qaçıb muştuluqlayacam.

– Lazım deyil.

Zeynəb üz-gözünü turşutdu:

– Düz deyirsən, sənin gəlməyin heç muştuluğa dəyməz.

İmran təəccüblə ona baxdı. Zeynəb isə uğundu. İmran onun yeni bir söz deyəcəyindən qorxaraq tez çamadanını götürdü.

– Burda niyə durmuşuq, qayıt, bizə gedək.

Zeynəb yol uzunu oğrun-oğrun onu süzdü. Birdən dayandı. Diqqətlə İmranın üzünə baxdı. Qızın gözlərində aşkar seçilən şıltaqlıq, dodaqlarındakı kinayəli təbəssüm onun nəyəsə hazırlaşdığını göstərirdi. Doğrudan da elə oldu. Zeynəb qaşlarını dartaraq:

– Bo-o-y, ay İmran, nə yaman qaralıbsan, – dedi.

İmran burnunun ucuna qədər qızardı. Zeynəb isə vəziyyətini pozmadan şaqqıldayıb gülür, sanki müsahibinin pərtliyindən həzz alırdı. İmran özünü topladı.

– Mən əvvəldən qarayam. Qara adamın nəyi qaralacaq?

Zeynəb daha ucadan qəhqəhə çəkdi və hiyləgərcəsinə gözlərini oynatdı:

– Ürəyini sıxma. Evinizdəkinin xoşuna gələrsən. Yəqin ki, sorağını alıbsan...

İmran ona cavab vermək istəyirdi ki, Zeynəb qaça-qaça yolu keçib, ətrafı çəpərli evə yaxınlaşdı. İmran doqqazdan keçib gələnədək Zeynəb çəpərin tapdanmış yerindən adlayıb həyətə girdi. Hələ eyvana yaxınlaşmamışdan: "Ay Tükəzban xala, – deyə çağırdı, – bir tez ol, eşiyə çıx".

İçəridən ortaboylu, dolubədənli, saçları ağarmış bir arvad çıxdı. Onun qolları çirməkli idi.

– Ay qız, nə hay-küy salıbsan?

Zeynəb, doqqazdan keçib gələn İmranı başı ilə göstərdi:

– Bir gör kim gəlir!

Tükəzban xala sakitcə gözlərini qıyıb, gələn adama baxdı və birdən qollarını açıb oğlunun qabağına yüyürdü. İmrana macal vermədən, onun boynuna sarılıb üz-gözündən marça-marçla öpdü.

– Ömrüm-günüm, nə yaxşı gəldin! Adam da qoca anasını yaddan çıxardarmı? Heç demirsənmi anam təkdir, gedim ona baş çəkim. Bəlkə elə başıma bir iş gəlib?! Gözümün ağı-qarası bircə sənsən.

Anasının kövrəlməsindən İmran da qəhərləndi.

– Yaxşı, bəsdir. Görürsən ki, gəlmişəm.

– Xasiyyətini bilmirəmmi, yenə bir gecə qalıb gedəcəksən.

– Yox, daha heç yana gedən deyiləm.

Tükəzban xala diqqətlə oğlunun üzünə baxdı. Elə bil onun doğru deyib-demədiyini gözlərindən oxumaq istəyirdi.

İmranın üstü xəmirə bulanmışdı. Tükəzban xala sevindiyindən özünü itirib əli ilə xəmirli-xəmirli oğlunun boynunu qucaqlamışdı. Bunu görən Zeynəb gülə-gülə Tükəzban xalanın qoluna toxundu.

– Bircə belə dur görüm, kişi özünə təzəcə paltar alıb, sən də onu bələm-bələm eyləyibsən. Qoy təmizləyim, yoxsa xoşa gəlməz.

Zeynəb İmranın etirazına baxmadan onun üstünü təmizlədi, sonra da Tükəzban xalaya üzünü tutdu:

– İndi ürəyin yerinə düşdümü? Hazır, qəzetdə şəkli çıxanda sənə demədimmi gələcək? Gördün ki, mən deyən oldu. Söz verdi, kişi kimi də sözünün üstündə durdu.

Tükəzban xala ətəyinin ucu ilə gözlərini sildi.

– Canım sənə sadağa olsun, ay bala, eşikdə durma, keç içəri, hava soyuqdur, dərdin alım.

İmran çamadanını götürüb pilləkəni çıxmaq istəyirdi ki, eyvanda dayanan qızı gördü. Boynunu azca yana əyib dirəyə söykənmiş bu qızın kəlağayısı sürüşüb çiyninə düşmüşdü. Sarışın saçları tən ortadan ayrılmışdı. Telləri yanaqlarında qıvrılmışdı. Nazik, qara qaşları çatılmışdı. Çənəsinin sağ tərəfində, buxağında, balaca xalı da vardı. Qızı başdan-ayağa süzən, onun gözlərinə kölgə salan kirpiklərinə diqqət yetirən İmran qeyri-ixtiyari olaraq: "Zalım balası nə qəşəngdir!" – deyə xəyalından keçirdi.

Səs-küyə eyvana çıxıb, ana ilə balanın görüşünə tamaşa edən qız isə hərəkətsiz dayanmışdı. Kənarda dayanıb İmranın qıza necə diqqətlə baxdığını müşahidə edən Zeynəb:

– Niyə durubsan, yuxarı çıx, tanış ol! – dedi.

Öz əlini İmranın iri ovcunda hiss edəndə Nərgiz müəllimənin yanaqları xəfifcə qızardı. Zərif dodaqları azca aralandı. Dişlərinin parıltısı dodaqlarında əks olundu. Öz adını deyərkən səsi titrədi. İmrana elə gəldi ki, Nərgiz müəllimənin dalğın gözlərində nə isə bir məhzunluq, məlulluq var.

Yenə Zeynəbin səsi eşidildi:

– Keçin içəri, hava soyuqdur.

İmran dönüb Zeynəbə nə isə demək istədi, amma Tükəzban xala ona macal vermədi. Cavanları içəri apardı. Ocaq qalayıb, çay-çörək tədarükünə başladı. Zeynəb də boş dayanmadı. Tez-tez qapını açıb-örtməyə, gülə-gülə stəkan-nəlbəki silməyə, arabir də İmrana söz atıb, Nərgiz müəlliməyə sataşmağa başladı.

İmranın gəlişi ilə elə bil ev-eşik canlandı. Tükəzban xala hər dəfə İmranın yanından ötdükcə dönüb baxır, "boyuna sadağa olum, oğul" – deyə onu oxşayır, siniləri, qazanları danqıldadırdı.

Nərgiz müəllimə işə qarışdı. Onlar düyü arıtlamağa başladılar.

İmran anasını narahat etməmək, yanında oturtmaq istədi. Mümkün olmadı. Axırda özü də onlara qoşuldu. Otağı gülüş səsləri doldurdu...

Qapıda at fınxırdı, kiminsə xırıltılı səsi eşidildi. Zeynəb dərhal bayıra çıxdı.

– Ay qız, harda itib-batmısan? Səhərdən çağırmaqdan boğazım yırtılıb, nə vaxt bu gəzəyənliyindən əl çəkəcəksən?

Zeynəbin sifəti dərhal ciddiləşdi.

– Artıq-əksik danışma, de görüm sözün nədir?

– Sözüm odur ki, az gəz. Sonra da, axşam idarəyə gəl! İclas var. Şəxsən Qurban qağa özü tapşırıb.

– Yaxşı, gələrəm, sonra?

– Sonra da... – deyə atlı səsini uzatdı və gözünü pəncərədən içəri zillədi. Deyəsən, qulağı nə isə almışdı. – O nə səs-küydür? İçəridə kişimi var?

– Bəli.

– Kimdir?

– İmran...

– İmran? O, bəyəm buradadır?

– Bəli, buradadır!

Bayıra çıxıb hara isə tələsən Tükəzban xala atlını görüb dayandı.

– Ay oğul, niyə qapıda durursan? Düş atdan, evə gəl. Dərdini aldığım İmran da gəlib. Oturun, söhbət eyləyin...

– Yox, Tükəzban qarı, – oğlan üz-gözünü turşutdu. – İşim var. Qurban qağa şəxsən məni gözləyir.

O, atın başını geri döndərdi və sürüb doqqazdan aralandı.

Zeynəb otağa qayıtdı. İmran onun tutqun sifətinə baxdı.

– Xeyir ola, kimlə söhbət eləyirdin?

– Heç, bizim briqadirlə.

– Hansı briqadirlə?

– Xır-xır Kazımla.

Onlar yenə baş-başa verib düyü təmizlədilər. Birdən Zeynəb dayanıb diqqətlə İmranın üzünə baxdı.

– Özün bir şey olmasan da şəkildə qiyamət çıxmışdın.

– Hansı şəkildə?

– Qəzetdəkində.

– Nə qəzet? – deyə İmran qaşlarını çatdı.

– Özünü niyə bilməməzliyə qoyursan? Bir ay bundan əvvəl çıxmamışdımı? Kəsib saxlamışam, bax budur, – deyə o, cəld ayağa durdu. Bayaq qəzetə büküb gətirdiyi kitabı açıb arasından səliqə ilə qatlanmış şəkli çıxartdı. – Hamıdan qəşəng sən düşübsən. Elə qəzeti alan kimi Tükəzban xalanın yanına qaçıb dedim ki, muştuluğumu ver. İmran ərizə yazıb kolxoza işləməyə gəlir. Arvad inanmadı ki, yalandır, o hələ oxuyacaq. Axır şəkli göstərib güc-bəla ilə inandırmışam. Doğrudan şəkildə qəşəng düşübsən, amma...

O yenə güldü. İmran azacıq qızarıb, başı ilə ehmalca Nərgiz müəllimәni göstərdi. “Ayıbdır, yad adam var” demək istədi. Zeynəb onun ürəyindən keçəni dərhal başa düşüb daha bərkdən güldü.

– Nə olsun, sözün düzünü deyəndə acığın niyə tutur? Qoy elə Nərgiz müəllimə də bilsin ki, özün bir şey deyilsən.

– Yaxşı, az şitlik elə!

– Deyəsən, Kosaoğlu kimi doğru sözdən sənin də xoşun gəlmir.

– Kosaoğluyla nə işin var?

– Nə tez tərəf durdun? Amma o sənin gəldiyini eşidəndə, ağlım kəsmir ki, sevinsin. Hələ özünü görməmişdən qəzetdəki şəklinə baxıb ağız-burnunu əyirdi.

İmranın qaşqabağının töküldüyünü görən Zeynəb güldü.

– Ürəyini sıxma, ona elə sözlər dedim ki, daş dəymiş ayı kimi donquldana-donquldana qaldı.

– Ağsaqqal kişidir, elə söz danışma. Əlbət zarafat eləyirmiş. Kosaoğlu dünya görmüş kişidir. Gözümüzü açandan onu kolxozda görmüşük. Pis sədr deyil.

– Sən deyən olsun, – Zeynəb çiynini çəkdi. – Görükən dağın dibi yaxındır.

Tükəzban xalanın eyvandan səsi gəldi. Zeynəb çayniki götürüb çıxdı.

“Bu qızdan heç nə başa düşmürəm” – İmran fikrə getdi...

## 2

Gurhagur yanan dəmir peçin istisi otağı bərk qızdırdı. Çarpayıda, yumşaq yorğan-döşəkdə yatan Qurban Kosaoğlu yuxulu-yuxulu sinəsini qaşıdı, arxası üstə döndü. Qolları çarpayıdan sallandı. Azacıq sonra otağı fısıltı götürdü.

Bədənnüma güzgünün qabağında oturub qaş-gözünə sığal verən Sayalı ərinin səsini eşidib geri döndü. Onun üstünün açıldığını görüb ayağa durdu. Döşəməyə düşmüş yorğanı götürüb ərinin üstünə örtdü. Onun iri döşləri Qurbanın sinəsinə toxundu. Sayalı xeyli ərinin başı üzərində dayandı. Qurban nəfəs aldıqca qalın dodaqları aralanır, papiros çəkməkdən saralmış dişləri görünürdü. Ətli gözlərinin yanları qırış-qırış idi. Ülgüclə qırxılmış başı yastığın üstündə parıldayırdı. Nəfəs aldıqca xırıldayırdı.

Sayalı ərini silkələdi.
– Əyə, yatmaqdan doymadınmı?
Qurban dodaqlarını marçıldadıb mızıldandı:
– Sən atanın goru, qoy bir az çimir eləyək.
– Günorta olub axı, acından-suzundan öldün.
Qurban yerin içində qurcalanıb, gözlərini açdı. Hava çatışmırmış kimi dərindən nəfəs aldı.
– Yenə ocağı çatıbsan?
– Bircə dur. Özünü xora-xoşa qoyma.
Arvadının xasiyyətini bilən Qurban, yerin içində gərnəşdi. Bərk əsnəyib gözlərini ovuşdurdu.
Sayalı onun paltarlarını gətirdi. Qurban könülsüz ayağa durdu. Öskürüb boğazını arıtladı. Paltarını geyinib eyvana çıxdı. Arvadı boynu dərili yarımkürkü onun çiyninə saldı.
Həyətdə qan-tər içində odun yaran Kazım dərhal baltanı kötüyə sancıb qışqırdı:
– Ay uşaq, kişiyə su gətirin üzünü yusun. – Sonra da irişdi. – Sabahın xeyir, Qurban qağa, deyəsən, yuxudan doymayıbsan.
– Qoyurlar ki, adam bir şirin yuxu yata?! Gecə yarıyacan başbeynimizi aparırlar. Hər ağızdan bir avaz gəlir.
– Başına and olsun, düz deyirsən, hərəsi bir hoqqa çıxardır. İllah da Kərim kişi.
– Əyə, Kazım, o nə adamdır ki, sözünü danışırsan? Ə, işində ol.
– Bilirəm, sən olan yerdə o nəkarədir? Amma hər işə başını soxur.
Kosaoğlu çiynini atıb yenə boğazını arıtladı və əsəbi halda Kazıma baxdı.
– Sənə dedim, elələrinin sözünü danışma. Mən Kərim kimilərinin çoxunu yola salmışam. Sən belə işlərə qarışma. Briqadirsən, get briqadirliyini elə.
Kazım təzim edirmiş kimi aşağı əyildi:
– O heykəl başına and olsun, düz deyirsən, bir də belə işlərə qarışmaram.
Kosaoğlunun kiçik qızı sarı aftafada su gətirdi. Kazım dərhal aftafanı və dəsmalı qızın əlindən aldı.
– Qaç get evə, üşüyərsən, mən özüm tökərəm.
Kosaoğlu kürkünü çiynindən alıb Kazıma verdi. O isə dəsmalı sol qolunun üstünə salıb su tökməyə başladı. Kosaoğlu iri ovcunu su ilə doldurub üzünə çırpır, at kimi fınxırıb ətrafa sıçradırdı. Qış, yaz qırxıq

olan başından buğ qalxırdı. Üzünü yuyub quruladıqdan sonra Kazımın odun yardığı səmtə baxdı.

– Deyəsən, qar kəsməyəcək.

– Canın sağ olsun. Odununuz boldur. Hamısı da fıstıq, palıd. Meşədən məktəbə odun gətirməyə gedəndə şəxsən öz əlimlə seçmişəm. Hələ o biri qışa da çatar. Tezdən gəlib iki-üç günlük yarmışam. Axşam da gələcəyəm. Qoy uşaqlar əziyyət çəkməsin.

– A kişi, nə əziyyət çəkirsən?

– Nə zəhməti var, Qurban qağa, odun yarmaq bir böyük iş deyil.

Kosaoğlu əlini belinə qoyub, həyətdə ilanyalı yığılmış odunlara, iri meyvə ağaclarına, talvarın altındakı yük maşınına, bir az bəridəki "Pobeda"ya baxıb, adəti üzrə boğazını arıtladı. Sonra gümüş qutusunu çıxardıb papiros eşdi və məmnuniyyət ifadə edən nəzərlə Kazıma baxdı.

– Qiyamət oğlansan. Gərək sənin bu yaxşılıqlarının əvəzini çıxam.

– Əşi, nə yaxşılıq, Qurban qağa? Böyüyünə qulluq eləmək hər kəsin borcudur.

– Borc öz yerində. Əgər sözümə qulaq assan, lap geroy da olarsan...

Kazımın gözləri parıldadı.

– Hə, bəs necə bilirsən, hər şey öz əlimizdə deyil? İstəsəm səni lap günü sabah Moskvaya delaqat da göndərərəm.

– Elədir, Qurban qağa. Şəxsən sənin əl qatdığın işi heç fələk də poza bilməz.

Kosaoğlu qarşısında dayanmış oğlanı təpədən dırnağa süzdü. Onun dəyirmi papağı gözünün üstünə enmişdi. Ucu şeşmər, qara bığları vardı. Qarabuğdayı sifətinə dənəbir çopur səpələnmişdi. Boyu uca olmasa da, yaraşıqlı idi. Amma beli azca qabağa əyilmişdi. O, həmişə Kosaoğlu ilə söhbət edəndə qurbanlıq qoyun kimi boynunu büküb, yazıq bir görkəm alardı. Elə buna görə də sədrin ondan xoşu gəlirdi.

Kosaoğlu qarşısında dayanan briqadirə baxıb gülümsündü:

– Pambıq əkininə başlanan kimi Yan arxın altındakı xam yeri şumlayıb briqadanın torpağına qatarsan. Suyun gözüdür. Orda bir pambıq olacaq ki, gəl görəsən! Bildin?

– Bildim, Qurban qağa, ancaq...

– Nə ancaq?

– Ora mənim briqadamın yeri deyil.

– Nə olsun ki? Əkərsən, artıq pambıq götürərsən. Sonra da baxarıq. Keçən il zərərmi çəkdin?

– Allah ömrünü uzun eləsin, Qurban qağa, sən olan yerdə adam zərər çəkərmi?

Eyvandakı samovar qaynayıb poqquldadı. Sayalı samovarı götürüb içəri aparmaq istədi. Ancaq Kazım özünü qabağa verdi.

– Sayalı bacı, qoy mən götürüm.

– Sənə zəhmət olar.

– Əşi, nə zəhmət?.. Elə sözü niyə danışırsan, ayıb şeydir.

O, samovarın qulplarından yapışıb içəri apardı. Gözucu süfrəyə düzülmüş yeməklərə baxıb bayıra çıxdı. Yenə odun yarmağa başladı.

Yarım saatdan sonra qapını aralayıb başını içəri saldı.

– Ay qağa, idarəyə gələcəksənmi?

– Hə, hə, get Gövhər qarıya kömək elə, peçi-zadı qala.

– Baş üstə, ay qağa!

O, qapını örtüb getmək istədi. Amma nə isə xatırlayıb dayandı. Bunu hiss edən Kosaoğlu:

– Nə var, sözlü adama oxşayırsan?

– Heç. Elə birdən yadıma düşdü. Dünən İmran gəldi.

– Hansı İmran, ə, Tükəzbanın oğlu?

– Bəli.

Kosaoğlu bir anlığa fikrə getdi. Sonra səsini uzada-uzada soruşdu:

– Deyəsən, o, ağranomluq məktəbində oxuyurdu?

– İndi qurtarıb. Özü də deyirlər yaxşı ağranom olub.

– Olsun də. Guya ki, məktəb qurtaranda mənə ağzı ilə quş tutacaq. İndi məktəb qurtaranların başında beş qəpiklik şey yoxdur.

– Deyirəm, əşi, doğrudan da bu dünyanın işi lap qəmədiyədir. Ağzı qatıqlı uşaqlar da özünü adam cərgəsinə qatır. Heç dul Tükəzbanın oğlundan ağranom olar?

– Olanda gəlib xonçamızın başını ha dağıtmayacaq. Heçi ayrı, köçü ayrı, bizə nə var! Qapını ört, get işində ol, mən də bir azdan gələcəyəm.

Kazım qamətini düzəldib qapıdan çəkildi. Papağını gözünün üstünə endirib nazik bığlarını eşdi. Çəpərin yanında, payaya bağladığı ata yaxınlaşıb belinə sıçradı. Şinelinin ətəyini yığıb idarəyə doğru çapdı.

* * *

Gövhər qarı səhər tezdən idarəni silib süpürəndən sonra qapını bağlayıb getmək istədi. Ancaq Nəsib dayı açarı ondan alıb dedi ki, “rayona zəng vuracağam”. Gövhər qarı əvvəlcə açarı vermək istəmədi. Kosa-

oğlu ona tapşırmışdı ki, "mən olmayanda idarəni açıb içəri adam buraxma". Amma qarı Nəsib kimi hörmətli adamın sözünü yerə sala bilməzdi. "İndi mən neyləyim, bu boyda kişiyə necə yox deyim?"

Nəsib dayı qapını açan kimi, həyətə toplaşanları içəri çağırdı. Gövhər qarı lap əlacsız qalıb partiya təşkilatçısının qabağında dillənə bilmədi. Nəsib dayı rayona zəng elədi, kiminləsə danışdı, sonra atını minib harayasa getdi. Gövhər qarı içəri toplaşanları bayıra çıxartmaq istədisə də, mümkün olmadı. Əksinə, idarəyə gələnlərin sayı daha da çoxaldı.

İndi o, otaqda hərlənib tez-tez çölə baxır, Kosaoğlunun yolunu gözləyir, dilinə kəlmeyi-şəhadət gətirirmiş kimi, öz-özünə "allah, sən saxla" – deyə donquldanırdı. İçəridəkilər isə qızğın söhbət edir, klubdan, tarla düşərgələrindən, əkindən, biçindən danışırdılar. Kərim kişi tez-tez peçə odun qoyurdu. Gövhər qarı gözaltı ona baxır, dişi bağırsağını kəsirdi.

Kərim kişi yenə əyilib peçin altındakı odunlardan birini götürdü. Əlindəki yaş əski ilə sədrin stolunun üstündəki şüşənin tozunu silən Gövhər qarı özünü saxlaya bilmədi:

– Bircə yerinə qoy, səndən ötrü yarıb yığmamışam!

– Bəs kimdən ötrü yığıbsan, ay imanına qurban? – deyə Kərim kişi rişxəndlə soruşdu.

Gövhər qarı odunu alıb yerinə qoydu və tərs-tərs Kərim kişiyə baxdı.

– Ağzını farağat qoy. Mən səndən ötrü oyun-oyuncaq deyiləm. Bu saat dünyanı başına dar elərəm. Bu zəhrimarı da az fısqırt, indicə kişi gələcək.

– Gəlsin də, biz də elə onu gözləyirik.

– Bilmirəm viranxanalarında niyə oturmurlar?! Xoruz banından idarəni kəsdirirlər. Özləri də hey danışırlar. Heç çənələri yorulmur,

– qarı deyintisinə ara vermirdi.

O, yenə kolxoz sədrinin stolunun ətrafında fırlanmağa, mürəkkəbqabılarını, qələmləri səliqəyə salmağa başladı.

Qarı kabinetdən çıxandan sonra Kərim kişi üzünü küncdə oturan İmrana tutdu:

– Bacıoğlu, sənin dediklərin pis deyil. Amma heç başını ağrıtma. Bizim kolxozda belə şeyləri yada salmasan yaxşıdır.

İmran təəccüblə soruşdu:

– Niyə?

– Ondan ötrü ki, onun xeyrindən çox şəri var.

– Kərim dayı, axı mən başa düşə bilmirəm, məhsuldarlığı artırmağın kolxoza nə zərəri ola bilər? Hər hektardan iyirmi yox, əlli, altmış sentner pambıq götürsək, kolxoz zərər çəkər?

– Bəli, çəkər, – Kərim kişi cadar-cadar olmuş baş barmağı ilə qəlyanın külünü basdı. – Sən, oğul, hələ bizim adamları yaxşı tanımırsan. Elə lap rayonun bəzi rəhbərlərini də deyirəm.

İmran maraqla qocaya baxır, onun boş-boşuna danışmadığını duyurdu. O, lap uşaqlıqdan Kərim kişinin ağıllı sözlər söylədiyini, iclaslarda çıxış edib, heç kəsin ağlına gəlməyən məsələləri açdığını bilirdi.

– Kim çox işləyirsə, onu daha çox yükləyirlər. Geridə qalanlarla heç kəsin işi yoxdur, – deyə Kərim kişi sözünə davam etdi. – Sən bu il hər hektardan qırx sentner pambıq verərsən, gələn il əlli olar, o biri il altmışa qalxar. Amma heç kəs fikirləşmir ki, bunu necə becərmək olar. Molla Nəsrəddin kimi elə mıxdakını döyürlər. Geridə qalanların borcunu da qabağa gedənlərin boynuna yükləyirlər ki, rayonun planı dolsun. Amma bir maraqlanan yoxdur ki, niyə kolxozun biri planı doldurur, o biri yox? Bax mən bunu deyirəm, bala. Tutaq ki, bu il bizim kolxoz irəli gedəcək. Raykom Kosaoğlunu çağıracaq. O da sinəsinə döyüb səksən sentnerə söz verəcək. Sonra deyəndə ki, ay sədr, səksən sentnerdən ötrü filan-filan şeylər lazımdır, qulaq ardına verəcək. Ona nə var, bir "malades"dən ötrü kəndi alt-üst elər.

– Bura bax, ağsaqqal vaxtında yenə nə demaqoqluq eləyirsən? – deyə, içəri girən Kazım ucadan səsləndi: – Biz həmişə canla-başla işləyirik, yenə də işləyəcəyik. Hökumətimiz hər hektardan lap yüz əlli sentner istəsə də verəcəyik...

Kərim kişinin gözləri qıyıldı. O, əlində qamçı, qapı ağzında duran Kazıma baxdı.

– Əlbəttə, sən lap iki yüz sentner də verərsən.

Kazım onun səsindəki kinayəni duymadı.

– Verə bilmərəm?

– Yüz hektarın əvəzinə yüz əlli hektar əkəndə nənəm də verər.

Kazım, ilan çalmış kimi, dik atıldı.

– Heç olmasa çal saqqalından utan, yalan danışma!

– Bala, saqqalın çallığı baş töhməti deyil. Baş töhməti camaatı aldatmaqdır.

– Camaat, – deyə Kazım istehzalı nəzərlə qocanı təpədən dırnağa süzdü. – A kişi, sən kimsən ki, camaat dərdinə qalırsan? Özünə umac ova bilmirsən, özgəyə əriştə kəsəcəksən?

Kərim kişi qəlyanını peçin dəmirinə vurub külünü boşaltdı. Tənbəki kisəsini çıxartdı. Adəti üzrə, gözlərini qıyıb başını azca yana əyərək briqadirə baxdı. İmran gördü ki, kişinin əlləri əsir.

– Düz deyirsən, bala, mən nəçiyəm ki? İndi kolxozumuzun ağası sizsiniz. Amma mən bu kənddə kolxoz quranda, sinəmi qayalara verib beşaçılan dalında yatanda, qaçaqlarla atışanda sən yalda-yamacda gəzirdin. Əlbəttə, indi mən lazım olmaram. Ağzınız genişliyə çıxıb.

Qoca qəlyanı damağına aldı.

İmranın kişiyə yazığı gəldi. Onun azacıq əyilmiş beli Kazımın sözlərindən sonra elə bil bir az da əyildi. O, peçin ağzını açdı. Göz götürüb qəlyanın üstünə qoydu. “Eh, qocalıq!” – deyib köksünü ötürdü. Bayaqdan olub-keçənlərə göz qoyan İmran söhbəti təzələmək istədi.

Elə bu vaxt qarı yara-yara gələn “Pobeda” idarənin qabağında dayandı. Qış-yaz, nədənsə həmişə kürkünü çiynində gəzdirən Kosaoğlu maşından düşüb eyvana çıxdı, gəldiyini xəbər verirmiş kimi, bir-iki dəfə bərkdən öskürdü, hamı dərhal ayağa qalxdı.

Kosaoğlu bir anlığa qapının ağzında dayanıb içəridəkiləri süzdü.

– Ə, nə olub, ağac başında ha yatmayıbsınız, nə tezdən idarəyə doluşubsunuz? – deyə gülümsədi. Onun salam əvəzinə zarafatla dediyi bu sözlərə təbəssümlə cavab verənlər də oldu.

Kosaoğlu yerinə keçib, stolu altına çəkdi. Hələ də ayaq üstə duranları görüb amiranə səslə:

– Ə, oturun, niyə ayaq üstə durubsunuz, – dedi.

Gövhər qarı, sədrin yerinə keçib əyləşdiyini görəndə sevindi. “Allah, sənə şükür, deyəsən kişinin bu gün kefi sazdır. Dava, qalmaqal salmayacaq”.

Kosaoğlu yerini rahatlayandan sonra stolun üstündəki kağızları əlləşdirdi. Sonra telefonun qulpunu hərləyib zəng etdi. Dəstəyi götürüb qulağına yaxınlaşdırdı. Bir iki dəfə “allo, allo” – dedi. Cavab verən olmadı. Qaşqabağını sallayıb fısıldadı. “Bu zalım uşağı da adama bir dəfə düz-əməlli cavab vermir”, – deyə öz-özünə deyindi və dəstəyi yerindən asdı.

İmran durub sədrə yaxınlaşdı. Kosaoğlu onu yenicə görürmüş kimi yerində qurcalandı.

Ə, İmransanmı? Xoş gördük, bala, nə vaxt gəlibsən? – deyə gülə-gülə ona əl uzatdı, – otur, otur, söylə görək nə var, nə yox?

Telefon zəngini eşidən Kosaoğlu, sözünü yarımçıq qoyub dəstəyi götürdü.

– Hə, haradı? Sıntralnıdı? Hə, mən zəng eləmişdim. Ay qız, Nura, zolotqa, mənə yoldaş prokuroru ver. Deyinən sənnən Kosaoğlu danışmaq istəyir... idarədə yoxdur? Evi olsun, neylək.

Sədr sakitcə gözlədi. Birdən onun sifəti qəribə şəklə düşdü. Kiçik gözləri qıyılıb daha da balacalaşdı. Yanaqlarındakı qırışlar çoxaldı, iri, qalın dodaqları aralandı, saralmış dişləri göründü.

– Sabahınız xeyir, yoldaş Əsədov, sizi narahat edən Kosaoğludur. Bəli? Hə, mənəm, kefimmi? Sağ ol, çox yaxşıdır. Bir də ki, təki sizin kefiniz yaxşı olsun. Biz bir təhər dolanacağıq. A kişi, heç belə şey olar? Hə... elə evdə də deyirəm. Bizi bir yolluq yaddan çıxartdınız ki... A kişi, nə olsun, çovğun-zad qopmayıb ki? İstəyirsiniz maşın göndərim, hə? Yaxşımı? Yox, sakitlikdir. Bir şey olsa xəbər verərəm. Yaxşı. Gözləyəcəyəm. Elə uşaqlar darıxıblar. Sağ olun, çox sağ olun. Evdəkilərə salam deyin.

Kosaoğlu dəstəyi asıb kabinetdəkiləri qürurla süzdü.

Kərim kişi peçin yanından durub sədrin stoluna yaxınlaşdı. Bunu görən Qurban qaşqabağını tökdü:

– Bir az gözlə.

Kərim kişi Kosaoğlunun onunla danışmaq istəməyib, üzünü yana çevirdiyini görsə də, yerindən tərpənmədi.

– Nə qədər gözləmək olar?

Elə bil Kosaoğlunun yağırını basdılar. Yerində qurcalanıb tərs-tərs qocaya baxdı.

– Gün günorta olub, – deyə Kərim kişi sözünə davam etdi. – Xalqın işi var, gücü var.

Kosaoğlu hirsini güclə boğub:

– Mən nə edim? – deyə cavab verdi. – Gecə yarıya qədər iclasda baş-beynimizi aparanda bilmirdinmi belə olacaq? Zəhmət çəkib dünən az danışaydın, indi də günortaya qədər gözləməyəydin.

– Dərd danışdırır adamı, a Qurban, dərd...

Kosaoğlu Kərim kişinin çox danışdığını hiss edib susdu. Qonaq hesab etdiyi İmranın yanında bu cür söhbəti eşitməmək üçün qocanın sözünü yarımçıq kəsdi:

– Yaxşı, nağıl açma, de görüm nə istəyirsən?

Kərim kişi əlindəki vərəqi stolun üstünə qoydu.

Kolxoz sədri tərs-tərs kağıza baxdı.

– Bu nədir?

– Ərizə.

– Nə ərizə?

– Taxılım qurtarıb, avans istəyirəm.

Kosaoğlu kağızı kənara itələdi.

– Ə, mən anbarçıyam? Taxılın qurtarıb, get anbara.

– Getmişəm, sənin qolun olmasa vermir.

– Vermir, vermir. Mən neyləyim?

– Axı, sən bizim sədrimizsən.

– Nə demək istəyirsən?!

– Demək istəyirəm ki, camaat səni özünə sədr seçib, sən də böyüklük elə. Xalqın haqqını vaxtında özünə çatdır.

– Bura bax, get işində-gücündə ol, mənə ağıl öyrətmə. Bu da axşamkı deyil ki, ağlına gələni danışasan. Ə, xalq səni özünə vəkil seçib? Toy toğlusu kimi nə düşübsən ortalığa? Sənə neçə dəfə demişəm, ağlını başına yığ, get yıxıl öl bir yerdə. Hər yerə özünü soxma. Sonra peşman olarsan ha!

– Sən sağ ol, elə peşman olmuşam.

– Nəyə?

– Sənə barmaq qaldırmağıma.

Kosaoğlunu od götürdü. Bu qədər adamın içində deyilən sözlərə dözə bilmədi. Bu saat ona həddini bildirməsə ürəyi partlayacağını hiss etdi. Əllərini stola söykədi, bədənini irəli verib çığırdı:

– Nə dedin?

– Səsindən xoşun ha gəlmir, boğazını niyə yırtırsan? Nə dediyimi çox yaxşı başa düşdün...

– Yaxşı! – dişlərini bir-birinə sıxan Kosaoğlu ərizəni götürüb parça-parça elədi, ovcunda övkələyib peçə atdı.

– Di get! Taxsır məndədir: səni indiyə kimi niyə kənddə qoymuşam ki, sən də belə eləyirsən?!

Kərim kişi bir peç tərəfə, bir də pörtmüş sədrə baxdı.

– A Kosaoğlu, bir şey demirəm. Görürəm çox havalanıbsan. Amma onu bil ki, İskəndər Zülqərnəyə qalmayan dünya sənə də qalmayacaq. Eybi yoxdur...

Kosaoğlu daha da qızardı. Boğazının damarları qabardı.

– Kərim kişi, bax ha, saqqalının ağlığına baxmaram. Səni bu camaatın içində biabır elərəm!

Kərim kişi çiynini çəkdi və təhqir olunmuş halda, ağır-ağır idarədən çıxdı.

Xeyli keçdi. Hamının susduğunu görən Kazım irişərək Kosaoğluya yalmandı:

– Lap ürəyimdən tikan çıxartdın. Elə səndən qabaq da burda artıq-əskik danışırdı.

Kosaoğlu: "Hələ harasıdır! İclasda danışmağı mən ona öyrədərəm. Başına bir oyun açım ki, yarandığına peşman olsun" – deyə ürəyindən keçirdi, sonra da ucadan əlavə etdi:

– Ə kişi, demaqoqlar olmasa, dolanmağa nə var? Zalım oğlu çənəsini boş qoyub, ağzına gələni danışır.

O, məxmər köynəyinin döş cibindən zənciri sallanan gümüş saatını çıxarıb baxdı. Bir az sakitləşəndən sonra üzünü İmrana tutdu:

– A bala, sən belə şeylərə məhəl qoyma, evləri yıxılmışlar aman verirlər ki, adam bir düz-əməlli iş görsün? Qapıdan girən kimi zəli olub yapışırlar boğazımıza. Mən də ki, axır vaxtlar bir az kəmhövsələ olmuşam, hə... Söylə görək nə var, nə yox? Yəqin anana baş çəkməyə gəlibsən. Sözün düzü, iş-güc başımı o qədər qatıb ki, heç gedib arvadın halını-zadını da xəbər ala bilmirəm. Anan necədir?

– Çox sağ ol, yaxşıdır.

– Yaxşı olsun. Amma daha sən də onu tək qoyma. Qoca arvaddır. Yanına apar, qoy ömrünün axırına yaxın beş-on gün dincəlsin.

– Mənim də fikrim elə idi. Ancaq deyəsən, tərsinə oldu. Mən anamın yanına gələsi oluram.

– Nə olar, lap yaxşı. Kənddə çoxmu qalacaqsan?

– Deyəsən, daha həmişəlik qalacam. Anam da ayrılığa dözmür.

Kosaoğlu gözlərini qıyıb fikirli-fikirli İmrana baxdı.

– Ə, yoxsa kənddə işləmək istəyirsən?

– Bəli.

– Sənə çətin olmazmı, a bala? Oxumuş adamsan, kənddə-kəsəkdə dolana bilərsənmi?

– Niyə dolanmıram, kəndçi balası deyiləmmi?

– Orası elədir... – Kosaoğlu səsini uzatdı.

Ortalığa sükut çökdü. Sədr İmranın nə üçün kəndə gəldiyini başa düşsə də, söhbətə əvvəlcə başlamaq istəmirdi, gözləyirdi ki, İmran özü söz açsın, kolxozda ona bir iş düzəltməyi xahiş etsin. Belə olsa, Kosaoğlunun dili onun üstündə uzun olardı. Əslinə baxsan, Kosaoğlu İmranın heç burada qalmasını istəmirdi. Onun, ümumiyyətlə, oxumuş adamlardan xoşu gəlmirdi. Onlarla bir az söhbət edəndə özünün çox şeyləri bilmədiyini hiss edirdi. Qəlbinin dərinliklərində bunu etiraf etsə də, üzdə özünü şax tutur, arabir də zarafata salıb "indiki oxumuşların yüzünü suya susuz aparıb, susuz da qaytararam" – deyirdi. İndi o, qarşısında oturan İmranı gözucu süzüb öz-özünə düşünürdü: "Nə olsun ki, diplomu var. Yenə də ki, işi məndən keçir. Boynunu büküb əlimin altında işləmək istəyir. İstəsəm heç kolxoza yaxın qoymaram, istəsəm birtəhər yola verib dolandıraram". Bu cür fikirlər içərisində sükut edən Kosaoğlu, nəhayət, dilləndi:

– Neylək, bala, gəlibsən, yaxşı eyləyibsən. Bir az dincəl, sonra fikirləşərik, hər halda səni işsiz qoymaram. Bir yerə düzəldərəm.

– Burada fikirləşəsi bir şey yoxdur, Qurban qağa, – İmran gülümsündü və əlini qoltuq cibinə salıb bir kağız çıxartdı, – buyurun.

– Bu nədir?

– Təyinnamədir.

– Hə... – deyə Kosaoğlu səsini uzatdı və dərhal ciddiləşib kağızı gözlərinin qabağına tutdu. Xeyli baxdıqdan sonra orada yazılanların və möhürün doğru olub-olmadığını yoxlayırmış kimi kağızı bir-iki dəfə o üz-bu üzə çevirdi. Sonra nəzərlərini kağızdan çəkib İmrana baxdı.

İmran meşin paltosunun yaxasını açıb oturmuşdu. Onun zil qara saçları dağılıb alnında qıvrım-qıvrım olmuşdu. Qaşları qalın və çatma idi. Sol qaşının qurtaracağında balaca çapıq vardı.

İmranın gözlənilmədən, Kosaoğlundan xəbərsiz təyinnamə alıb gəlməsi sədri qəzəbləndirdi. "Üz-gözündən də zəhər tökülür. Elə baxır ki, elə bil dədəsi Səmədi mən öldürmüşəm. Mənim elə o ildən bundan zəhləm gedir. Uşaq ola-ola məni iclasda biabır elədi, sonra da götürüb qəzetdə yazdı. Gərək elə ondaca dərsini verəydim. Yox, Kosaoğlu, onun uşaqlığına baxma, bu gün ağranom olan, sabah ayrı fikrə də düşər. Yaxşısı budur indidən gözünün odunu al. Qoy çıxıb getsin. Ancaq necə?.." – deyə xəyalından keçirdi.

İmran qaşlarını düyünləyib gözlərini sədrə zillədi. Onun iti və kəskin baxışları Kosaoğlunun nəzərlərilə qarşılaşdı. Onlar bir-birini

sınayırmış kimi, xeyli beləcə dayandılar. İmran sanki onun qəlbindən nələr keçdiyini gözlərindən oxumaq istəyirdi. Kosaoğlu onun kəskin baxışlarına tab gətirə bilməyəcəyini hiss etdisə də, özünü sındırmaq istəmədi. Kişiyə elə gəldi ki, İmranın baxışları onu nizə kimi deşib o üzə keçir. Hətta o, bir az özünü itirən kimi oldu. Kosaoğlu hələ bu cür kəskin və sərrast baxış görməmişdi: "Bundan yaxşı silistçi olarmış. Az qalır gözləri ilə adamı yesin", – deyə düşündü. Düşündüklərini büruzə verməmək üçün zorla da olsa gülümsündü:

– Demək belə, mənim kolxozumda işləmək istəyirsən.

– Bəli, öz kolxozumuzda...

– Çox yaxşı... Amma bir şeyi pis eləyibsən. Adam böyüyə gənəşmədən iş tutmaz. Gərək əvvəlcə mənim yanıma gəleydin. Bəlkə mən səni heç işə götürmək istəmirəm.

– Niyə ki? – deyə İmran təəccübləndi.

– Bunun niyəsi yoxdur ki, – Kosaoğlu ciddiləşdi. Mənim kolxozum rayonda ən böyük kolxozdur. İşimiz ağırdır. Belə bir kolxozda işləmək sənə asan gəlməsin, bala. Bu gün-sabah yaz gəlir. Bunun əkini var, səpini var. Belə işlərə saç-saqqal ağartmış adam lazımdır. Bir də, mənim öz ağranomum pis deyildi. Dünya görmüş adamdı. Bərkdən-boşdan çıxmışdı. Amma sən...

– Qurban qağa, görürəm məni uşaq hesab edirsiniz. Ancaq...

Kosaoğlu onun sözünü yarımçıq kəsdi:

– Uşaq olmayanda nəsən, ə, dünənəcən buralarda baldırı açıq gəzmirdinmi? Yadındadırmı bir dəfə uşaqları da başına yığıb arxda çimişirdiniz? "Ayə pambığın suyunun qabağını niyə kəsibsiniz" – deyib üstünüzə cumanda hərəniz bir tərəfə dağıldınız. Sizi atın qabağına salıb kəndin arasında çılpaq qovduğum yadından çıxıbmı?

Kosaoğlu qəhqəhə çəkib güldü. İçəridəkilərdən də ona qoşulanlar oldu. İmran azacıq pərt olsa da, özünü itirmədi. Papiros çıxarıb yandırdı. Güldükcə qarnı qalxıb-enən Kosaoğlunun sakitləşməsini gözlədi.

– Elə bilirəm, hamının baldırıaçıq vaxtı olub.

Kosaoğlu gülməyinə güclə ara verdi. Cibindən iri bir dəsmal çıxarıb əvvəlcə gözlərini quruladı, sonra da burnunu bərkdən silib otağa səs saldı.

– Ona sözüm yoxdur, oğul, ancaq sən mənnən elə danışdın ki, gülməyim tutdu. Hə... nə isə, zarafat öz yerində, iş də öz yerində. Demək, kəndə işləməyə gəlibsən?

– Bəli, Qurban qağa, mən MTS-ə gedən kimi “İyirmi altılar” kolxozunu məsləhət gördülər. Mən də əmri alıb gəldim.

Kosaoğlu papağını çıxarıb qırxıq başını övkələdi. Sonra da asta-asta sözə başladı.

– Daha keçib, nə deyirəm?! Ancaq, başına and olsun ki, düz sözümdür, başqası olsaydı, heç ayağını kəndə basmağa qoymazdım. Ancaq sən öz uşağımsan. Ətini yesəm də, sümüyünü atmaram. Bir də ki, rəhmətlik dədən Səmədlə duz-çörək kəsmişik. O haqq-salama görə gərək sənə kömək edəm. Fikir eləmə, həmişə gözüm üstündə olacaq. İşimiz ağır olsa da qorxma. Qurban qağan ölməyib ha! Bilmədiyini də öyrədərəm, işləyərsən. Yaxşı, havaxt işə başlamaq istəyirsən?

– Elə günü sabahdan.

– Hm... Onda tapşıraram sənə bir at da verərlər. At minə bilirsənmi? Ə, yoxsa şəhərli olub gedibsən?

– Nə deyim... Atı minmək asandır. Amma qorxuram dəli at ola, mən də sizin gününüzə düşəm. Yıxılıb qabaq dişimi sındıram.

Kosaoğlu üz-gözünü turşudub dilinin ucu ilə qabaq dişinin sınıq yerini yoxladı və dərhal müharibədən əvvəlki bir hadisəni yadına saldı. O zaman onu kolxoz sədrinə müavin seçmişdilər. Kosaoğlu sədrdən, özündən əvvəlki müavininin ayağı səkil kəhərini istəmiş, elə idarənin qabağındaca sıçrayıb atın belinə qalxmışdı. Ancaq beş-on metr getməmiş at şahə qalxıb onu yerə çırpmışdı.

Bunları xatırlayan Kosaoğlu fikrə getdi: “Məni at yıxdığı necə də yadında qalıb! Üz-gözündən çoxbilmişə oxşayır. Elə düz başa düşmüşəm. Deyəsən farağat duran deyil. İndidən köhnə sandıq içi tökür”. Birdən onun rəngi ağardı, ölü sifətinə düşdü. Elə bil ürəyinə buz bağladılar. Canına titrəmə düşdü. Kürkünü çiyninə salıb təlaşla İmrana baxdı. Sanki bu baxışları ilə onun qəlbinə girmək, “söylə, özgə nə bilirsən? Məndən nə eşidibsənsə hamısını söylə ki, ürəyim dincəlsin” – demək istəyirdi. Elə bil köhnə bir yarasının qaysağını qopartdılar. Kosaoğlu acı alma kimi bürüşdü: “Bəlkə elə onu da bilir?” – deyə düşündü.

Nəhayət, özünü toxtatdı. Gizlincə ətrafdakılara baxdı. İmranın sakitcə gülümsündüyünü görüb özünü danladı: “Mən də lap kölgəmdən ürkürəm, o nə uşaqdır ki?” Kosaoğlunun rəngi özünə gəlməyə, sifəti yavaş-yavaş qızarmağa başladı. O, dəsmal çıxarıb alnını sildi.

– Afərin! İndi bildim ki, Səmədin oğlusan. Atan kimi dil altında qalan deyilsən. Nə deyirəm! Gəlibsən, lap yaxşı eləyibsən. Əl-ələ verib işləyərik. Ağranomun öz uşağımız olması daha yaxşıdır.

...İmran gedəndən sonra Kosaoğlu özünü xeyli ələ ala bilmədi. Dalbadal iki papiros eşib yandırdı.

Stolun siyirməsini çəkib kağızları eşələdi, qarşısındakı qəzetləri dəstələyib götürdü, sonra yenə kürkünü çiyninə salıb ayağa durdu. Qapının ağzında məktəb direktoru ilə qabaqlaşdı.

– De görüm, nə istəyirsən?

– Odun, – deyə müəllim qısaca cavab verdi, – məktəbin odunu azalıb, hava da ki, bir təhərdi.

– Odun yoxdur, az yandırın.

– Axı uşaqlar soyuqda dərs oxuya bilməz.

– Mən neyləyim?

– Heç nə, məktəbə borclu olduğunuz odunları verin. Sizdən başqa bütün kolxozlar odun verib. Bizim sovetlikdə bircə siz qalıbsınız.

– İndi bu qarda, boranda mən odunu hardan alım? Bir təhər dolanın, görək hava açılarmı.

– Axı bu işi gərək vaxtında görəydiniz.

– İndi bizi öldürməyəcəksiniz ki, ay direktor?

– Mən adam öldürən deyiləm.

– Yaxşı!.. Bir az möhlət verin, tapıb düzəldərik.

– Yoldaş sədr, bax axırıncı dəfə deyirəm. Əgər bir həftəyə odun gətirməsəniz, məndən inciməyin.

– Şikayət eləyəcəksən?

– Lazım gəlsə.

– Hm... Şikayətdən nə çıxacaq, balam? Rayona məlumat verəcəksən. Onlar da çağırıb işi yenə mənə tapşıracaqlar. Yaxşısı budur nə özünü, nə bizi dağa-daşa sal. Düzəldərik.

Müəllim daha bir söz deməyib getdi.

Kosaoğlu kürkünü geyib maşına oturdu. “Pobeda” qarı tozlayaraq kənd yoluna çıxdı. İdarənin eyvanında dayanan Kazım rayon mərkəzinə doğru irəliləyən maşının arxasınca baxıb, çiynini çəkdi. “Görəsən, belə tələsik haraya getdi?”

## 3

Axşamüstü göyün üzü tutuldu. Bərk sazaq başladı. Eyvanın baş tərəfindəki buxarıda sac asan Tükəzban xala, axırıncı çörəyi qıraqlayıb ayağa durdu. Üst-başını çırpıb sacı çevirdi. Közün həniri onun üzünə vurdu. İsti çörəkləri tabağa yığıb evə apardı, taxtın üstünə sərdi. Sonra ağ samovarı su daşından süzülən dumduru su ilə doldurub buxarının yanına qoydu. Maşanı götürüb sacın altından çıxan közləri qurdaladı. Elə bu vaxt çəpərin o üzündən səs gəldi. Tükəzban xala Zeynəbi səsindən tanıyıb hay verdi.

– Sən Allah, mənə bir xəkəndaz od ver. Peçi qalamaq istəyirəm. Heç bilmirəm spiçkanı hara qoymuşam.

– Gəl apar.

– Eh, bir də kim gəlsin! Doldur, elə çəpərin üstündən bəri ver.

– Oralara od-zad salarsan. Doqqazdan keç, gəl apar. Zeynəb əlini payaya uzatdı. Ayağını çəpərin alçaq yerinə qoyub bəri üzə keçdi və bir göz qırpımında eyvana çıxdı. Tükəzban xala təəccüblə:

– Bıy, başıma xeyir, ay qız, hardan gəldin?

Zeynəb gülə-gülə xəkəndazı doldurdu. Tükəzban xala çəpərin tapdanmış yerinə baxıb başını buladı.

– Bilmirəm nə vaxt ağıllanacaqsan?

– Nə olub ki?

– Daha bundan artıq nə olacaq? Sənin əlindən çal-çəpər də qalmadı. Keçi kimi, hara gəldi dırmaşırsan. Ayaq basmadığın yer yoxdur. Evimizin dörd tərəfində cığır salıbsan. Heç fikirləşmirsən ki, Tükəzban dul arvaddır, bir də kim onun qapısına-bacasına çəpər çəkəcək?

– Bıy!.. – Zeynəb şaqqıldayıb güldü. – Bəs oğlun balacadır?

– Mənim oğlum çəpər çəkəndir?

– Niyə çəkmir, bəyəm oğlun o qədər artıq adamdır?

Tükəzban xala gözlərini qırpmadan diqqətlə Zeynəbə baxıb, bilmək istədi ki, qız zarafat eyləyir, yoxsa İmran barədə doğrudan da bu fikirdədir? Birdən arvad xəkəndazı götürüb közü ocağa tökdü.

– Sənə od-zad verən deyiləm. Çəpəri ayaqladığın yetmir, od da istəyirsən?

Zeynəb qarının könlünə dəydiyini hiss etdi.

– Bir də ayaqlamaram.

– Yalan deyirsən.

– Bəs neyləyim ki, inanasan?

– And iç.
– Nəyə?
– İmranın canına.
Zeynəb azacıq qızardı.
– İmran mənim and yerimdir?
– Bir buna bax! – deyə Tükəzban xala səsini uzatdı. – Ay qız, sən gərək şükür eyləyəsən ki, mən səni İmranın canına and verirəm.
Zeynəb qəfildən qarını qucaqlayıb üzündən öpdü.
– Xətrinə dəyməsin, mən elə-belə dedim, qoy xəkəndazımı doldurum gedim.
– And içmirsən?
Zeynəb gözlərini Tükəzban xalanın üzünə dikdi. Onun saçları ağarsa da, özü gümrah idi. Sifəti hələ gözəlliyini itirməmişdi. Yanaqlarının qızartısı belə getməmişdi. Ancaq gözlərinin ətrafındakı qırışlar çoxalmışdı. Burnu, çatma qaşları, açıq alnı, qonur gözləri İmranı xatırladırdı. O da, İmran kimi, qaşlarını çatıb diqqətlə adama baxırdı. Zeynəb Tükəzban xalanın gözlərinə xeyli baxdı və birdən özünü itirən kimi oldu. Səsi titrədi:
– Mənsiz də onun canına and içən tapılar.
Tükəzban xala qızın bir az tutulduğunu, hətta gözlərinin yaşardığını gördü. Hiss etdi ki, "mənsiz də onun canına and içən tapılar" – deyəndə nədənsə Zeynəb kədərləndi, köksünü ötürdü. Qarının da ürəyi yumşaldı. Axı bu qızı özü böyütmüş, ona analıq etmişdi.
– Yaxşı, əvvəlcə mənə kömək elə, odunu içəri daşı, ocağı qala, sonra od apararsan. İmran da indicə gələcək. Anası ölmüş səhərdən getdiyidir.
– Gəlsin özü ocaq qalasın, mən ona borclu deyiləm ki!
– Ay qız, bəsdir.
– Düz deyirəm də. Ya da arvad alsın. Kimi gözləyir? Balacadır? Onun taylarının iki-üç uşağı var.
– Ay günü ağ olmuş, sənə dedim mənə kömək elə, daha demədim inkir-minkir başla. Di tez ol.
Zeynəb gülə-gülə həyətə düşdü. Yarılıb qalaqlanmış odunlardan bir qucaq götürüb içəri apardı. Tükəzban xalanın peçə doldurduğu közlərin üstünə yığıb üfürməyə başladı. Əyildikcə yoğun hörükləri çiynindən sürüşüb sinəsinə düşürdü. Ocaq közərir, odunlar çatıldaşaraq yavaş-yavaş alışırdı. Qapağın deşiklərindən süzülən işıqlar döşəmədə

oynayanda, Zeynəb saçlarını geri atıb ayağa durdu. Tükəzban xala qızın pörtmüş yanaqlarına, üzünə tökülmüş cığalarına, qalxıb-enən sinəsinə, çirməkli qollarına baxdı. "Uçuq bir evin dirəyidir. Qız deyil, qızıl parçasıdır. Hansı evin qapısından girsə, çıraq kimi işıq salacaq. Halalca uşaqdır". O, üst-başının tozunu çırpan Zeynəbi bir daha nəzərdən keçirdi:

– Bilmirəm oğlanların gözü niyə bağlanıb, səni niyə görmürlər?! Zeynəb daha da qızardı. Hər dəfə Tükəzban xaladan eşitdiyi bu söz onun xoşuna gələrdi. İndi isə özü də hiss etmədən, diksinən kimi oldu. Tükəzban xalanın gözlərinə baxa bilməyib başını aşağı saldı.

– Məni az təriflə.

– Təriflənəsi qızsan, tərifləyirəm, qadan alım. Maşallah, gün kimi şölə salırsan, sənə pis deyənin dili quruyar.

Zeynəb getmək istədi. Tükəzban xala onun qolundan tutub saxladı.

– Başım qarışıb, yadımdan çıxıb. Sən ananın goru, taxtın üstə çıx, çırağın şüşəsini də sil. Qoca arvadam, nə olar, kömək elə.

Zeynəb gülümsədi.

– Yox, daha aldada bilməzsən. Onu da qoy o təmizləsin.

– Kim, ay bala?

– Nərgiz müəllimə, – deyə Zeynəb başı ilə qonşu otağı göstərib bic-bic güldü və tez eyvana çıxıb xəkəndazı közlə doldurdu.

– Ay Tükəzban xala, samovar daşdı.

Qarı çayniki götürüb eyvana çıxanda, çəpərin üstündən adlayıb evlərinə gedən Zeynəbin arxasınca baxaraq köksünü ötürdü: "Dilli də olsa, yaxşı uşaqdır. Bircə belə gəlinim olsaydı, heç dərd çəkməzdim".

Samovar hoqquldayırdı. Deşiklərdən fışqırıb çıxan buxar az qalırdı qapağı atsın. Tükəzban xala çayı dəmləyəndən sonra samovarı silib içəri gətirdi, stolun üstünə qoyub dəmkeşi keçirtdi. Çayniki dəsmalla bürüyüb dəmə qoydu. Süfrəyə stəkan-nəlbəki düzdü...

Artıq hava qaralmışdı. Seyrək qar yağırdı. Bayaqdan həyətdə vurnuxan toyuqlar indi çardağın altındakı tara çıxıb boyunlarını bükmüşdülər. Yerlərini rahatlamaq üçün bir-birini itələyib qığıldaşırdılar. Örüşdən qayıdan mal qapılarda mələşirdi. Yarpağı tökülmüş ağacların arasından güclə seçilən evlərin pəncərələrində titrəşən işıqların sayı getdikcə artırdı.

Tükəzban xala şüşəni silib, otuzluq lampanı yandırandan sonra həyətə çıxdı. Yarılmış odunu daşıyıb eyvana yığdı.

Məktəbin zəngi axırıncı dəfə kəsik-kəsik dilləndi. Azacıq sonra kənd yollarında itlər hürüşməyə başladı.

"Dərs qurtardı. Gedim peçi qalayım. Üşümüş olacaq, qərib adamdır" – deyə fikirləşən Tükəzban xala bir qucaq odun götürüb qonşu otağa keçdi... Ağ yun şala bürünmüş Nərgiz müəllimə içəri girdi. Səliqə ilə qəzetə büküb sinəsinə sıxdığı dəftərləri stolun üstünə qoyub, naxışlı yun əlcəklərini çıxartdı. Şalını açıb paltosunu soyundu. Yanaqları qızarmışdı, əlləri göynəyirdi. Evin ortasında sakitcə dayanan Tükəzban xala Nərgizin hər bir hərəkətinə göz qoyur, onun saçlarını üzündən necə geri elədiyinə, qaloşlarını nə cür çıxardığına tamaşa edir, nazik çatma qaşlarına, iri qonur gözlərinə baxmaqdan doymurdu.

– Deyəsən, möhkəmcə üşüyübsən, qızım, yaxın gəl, otur burda, o otağın peçini yenicə qalamışam, hələ soyuq olar. Bir az dincəl, onacan çay-çörək də hazır olar.

– Yox, yox, Tükəzban xala, sizə zəhmət olar, özüm hər şeyi hazırlaram.

– Hazırlanası bir şey qalmayıb. Samovar qaynayıb, təzə, isti çörəyimiz var, ocağı da ki, qalamışam.

– Axı, siz mənə xəcalət verirsiniz.

– Xəcalət niyə olur, sən də mənim balam.

Nərgiz müəllimə peçin yanına keçdi. Tükəzban xala bir stəkan çay süzüb onun qabağına qoydu.

– Soyuqdan gəlibsən, iç, canın qızsın. Anası ölmüş İmran da bilmirəm harda qaldı...

Evə sükut çökdü. Peçdəki odunlar çatıldayıb yanır, samovar könül oxşayan səslərlə zümzümə edirdi.

– Deyəsən, kiçik çillə qiyamət qoparacaq.

– Görünür, – deyə Nərgiz müəllimə cavab verdi və Tükəzban xalanın əl-ayağa düşdüyünü görüb tez ayağa qalxdı.

– Gəlin oturun, onsuz da səhərdən axşamacan evdə işləyirsiniz.

O tez dəsmalı götürüb stəkanları sildi. İsti çörəkdən gətirib süfrəyə qoydu. Pendiri səliqə ilə doğradı, ev gəlini kimi ortada hərlənib bankadan yağ, bal çıxartdı. Tükəzban xalaya çay süzdü. Qənd doğramağa başladı. Tükəzban xala qurtum-qurtum çay içir, gözaltı Nərgiz müəlliməni süzürdü. Bu qız da onun xoşuna gəlirdi. "Zalım balasının beli üzükdən keçər, qaş-gözünə söz ola bilməz. Ağzı da elə bil qüdrətdən yaranıb, bapbalaca. Mənim oğlumun da bilmirəm gözü hardadır, bu

cür cığalı qızı görmür. Hayıf ki, ata-anasını tanımıram. Amma halal süd əmənə oxşayır. Dili-ağzı özündə, başı aşağı uşaqdır. Neçə aydır mənim evimdədir, başını qaldırıb bir adamın üzünə baxdığını görməmişəm...”

Tükəzban xala çayını içdi. Nərgiz müəllimə cəld stəkanı götürüb çay süzdü. Tükəzban xala gözünü onun əllərindən ayırmadı. “Bir dəli şeytan deyir sandıqdakı üzüyü götür, keçir bunun barmağına... Oğlum fərsizin biridir. O fikirləşənə qədər iş-işdən keçəcək. Bir də gördün boz-yoluğun biri, ley cücə götürən kimi, qızı götürüb apardı...”

Bayırda itlər hürüşdü. Nərgiz müəllimə diksindi. Dərhal şeylərini yığışdırdı:

– Mən öz otağıma gedim, yəqin İmran gəlir.

– Gələndə nə olar, qızım, o da sənin qardaşın.

– Yox, yox, işdən gəlir, bəlkə dincəlmək istəyir.

Tükəzban xala onu saxlamaq, İmran gələndə də çay süzüb qulluq etməsini görmək istəyirdi. Amma Nərgiz müəllimə dayanmadı, tələsik öz otağına keçdi. Bir xeyli sakitcə durub bayır qapısının açılacağını gözlədi. Lakin heç kəs gəlmədi. O, şagirdlərin dəftərlərini qabağına qoyub, bugünkü imlanı yoxlamaq istədi. Ancaq nədənsə həvəsi gəlmədi. İki-üç dəftəri yoxladıqdan sonra əlini saxladı. Birdən-birə evdə darıxmağa başladı. Pəncərənin qabağına gəlib pərdəni yığdı. Şüşənin tərini silib çölə baxdı. Asta-asta qar yağırdı. Evlərin çoxu gecənin qaranlığında ərimişdi. Bəzi evlərdən gələn işıqlar da bir-bir sönür, kəndi ağır sükut bürüyürdü. Bir az da keçdi. Qonşu otaqda səs-səmir kəsildi. Nərgiz müəllimə barmaqlarının ucunda qapıya yaxınlaşdı. Gecədən xeyli keçənə qədər oğlunu gözləyən Tükəzban xalanı yuxu aparmışdı. Samovar soyuyub zümzüməsini kəsmiş, süfrəyə əl vurulmamışdı.

Nərgiz müəllimə sakitcə arvada yaxınlaşdı. Əvvəlcə onu oyatmaq istədi, sonra fikrini dəyişdi. Yun şalı ehmalca Tükəzban xalanın üstünə örtüb, otağına qayıtdı. Ocaq sönmüşdü. Bir az əvvəl peçin altına sərilib, xorhaxor yatan boz pişik büzüşmüşdü.

Nərgiz müəllimə üşüdü, ocağı qalamaq istədi. İçəridə odun olmadığını görüb fikrindən daşındı. Səs-küy salıb ev sahibəsini yuxudan oyadacağından ehtiyat edərək, orta qapıdan keçib eyvana odun gətirməyə getmədi. Çırağın piltəsini aşağı çəkib yerinə girdi. Soyuq yorğan-döşəkdə daha da üşüdü. Nəfəsini yorğanın altına verib yerini birtəhər isitdi. Gözünə yuxu getdi.

Birdən Nərgiz üzünə yumşaq bir şeyin dəydiyini hiss edib dik atıldı. Boz pişik özünü onun qucağına saldı. Yerini rahatlayıb xoruldadı. Nərgiz onu tumarladı, yenə gözlərini yumub, yatmaq istədi.

Stolun üstündəki saat yeknəsəq ahənglə çaqqıldayırdı. Bu çaqqıltı get-gedə daha da güclənirdi.

Nərgiz o biri üzü üstə çevrildi. Yorğanı başına çəkdisə də, yata bilmədi. Ona elə gəldi ki, saat çaqqıltısı olmasa rahatca yuxuya gedər. Hətta bir-iki dəfə durub saatın səsini kəsmək istədi. Təklik, pişiyin xorultusu, saatın səsi onu darıxdırdı. Nərgizi xəyal götürdü. Məktəbə getdiyi, institutda oxuduğu günlər yadına düşdü. O vaxtlar Nərgiz nə qədər qayğısız idi! Qızlarla gəzir, bəzən kitab üstə mürgüləyib, yuxusuz gecələr keçirir, imtahan verir, kursdan-kursa adlayıb institutu qurtarmağa çalışırdı. Nərgiz müəllimə dostlarını – qızları, oğlanları yadına saldı. Görəsən indi haradadırlar? Leyla nə edir? Teymur necədir? Kəndə gələndən bəri Nərgiz onların heç birindən xəbər tutmamışdı. Nə məktub yazmış, nə də cavab vermişdi. O istəyirdi ki, keçmiş günləri unutsun. Heç nəyi, heç kəsi yada salmadan, kənddə tək-tənha yaşasın, lakin mümkün olmurdu. Xatirələr həmişə onu çəkib ötən günlərə aparırdı.

Nərgizə elə gəldi ki, Teymur otağın küncündə dayanıb baxır. Əvvəlcə mehribanlıqla gülümsəyir, nəzərləri ilə Nərgizi oxşayır, qəlbinə hərarət verir, lakin sonra bu baxışlar yavaş-yavaş soyuyur, buza dönür. Başqalarını görəndə qaynayan bu gözlər nədənsə Nərgizə baxanda şüşə kimi cansız və soyuq olurdu. Nərgiz dillənmək, ürəyini boşaltmaq, Teymurun nəzərlərinin nə üçün belə soyuq olduğunu soruşmaq istəyirdi. Lakin gözlər ondan uzaqlaşır, getdikcə kiçilir və qaranlıqda görünməz olurdu.

Nərgiz yerin içində dirsəklənərək, lampaya baxdı. İşıq zəifləyib titrəyirdi. Şüşənin içindəki piltənin alovu can verirmiş kimi, bir neçə dəfə pırıldayıb söndü. Otağa qaranlıq çökdü. Nərgizin qulağı cingildədi.

Birdən kəndin başında itlər hürüşdü. Səs-küy qalxdı, Nərgiz qulaq asdı. "İdarədən gəlirlər. Görünür iclasda imişlər" – deyə düşündü. O, kəndə gəldiyi beş ayda çox şey öyrənmişdi. Adətən camaat iclasdan çıxanda, ya da klubdakı tamaşadan dağılanda gecə yarıda kənd birdən canlanır, itlər səs-səsə verir, doqqazlarda bir-biri ilə xudahafizləşənlərin səsi ətrafa yayılırdı. Qızlar cingiltili səslə gülüşüb, oğlanlara söz atırdılar. Kəndin mərkəzindən başlayan bu hay-küy getdikcə ətrafa

yayılır, evlərin çoxunda işıqlar təzədən yanırdı. Bir azdan isə yenə hər yer sakitləşirdi.

İndi də elə oldu.

Nərgiz müəllimə ürək döyüntüsü ilə İmranın ayaq səslərinə qulaq asdı. İmran eyvanda dayandı. Görünür, üst-başının qarını təmizləyirdi. Qapı açıldı. Nərgiz meşin paltonun xışıltısını eşitdi.

Tükəzban xalanın yuxulu səsi gəldi:

– Ay bala, heç canına yazığın gəlmir, səhərdən harada qalıbsan?

– Olmur, ay ana, iş o qədərdir ki...

– Elə bu işin hamısı səni ha gözləmirdi. Özünü niyə əldən salırsan? Bircə tez ol soyun, lap islanıbsan. Deyəsən, yaman qar yağır. Qulaqların gör necə qızarıb! Mənciyəzi də yuxu aparıb, ev-eşik soyuyub buza dönüb. İstəyirsən paltonu çıxartma. Ocağı qalayım, sonra...

– Heç nə olmaz, ana. Amma yaman acmışam.

Bundan sonra qarışıq səslər eşidildi. Stəkan-nəlbəki cingildədi. Odunların çıtırtısı eşidildi. Deyəsən, ocağı bərk qaladılar. Bir azdan səs-səmir kəsildi.

Nərgiz qəzet xışıltısından başqa heç nə eşitmədi. "Yəqin yenə oturub qəzet oxuyur. Yazıq arvad yer salır, o isə elə stolun üstündəcə mürgüləyir".

Nərgiz axır vaxtlar İmranın çox gec yatdığını hiss edirdi. Bəzən onun ayaq tappıltısı az qala xoruz banına qədər qızı yatmağa qoymurdu. Nərgizə elə gəlirdi ki, İmran tez-tez onun qapısına yaxınlaşır, dayanıb qulaq asır, bəlkə də qapını aralayıb içəri baxır. Belə hallarda Nərgiz qalxıb yerin içində oturur, qorxulu-qorxulu, yorğanı açıq sinəsinə çəkir, gözünü zilləyib qapının açılacağını, İmranın içəri girəcəyini gözləyirdi. Lakin heç kəs onun mənzilinə girmirdi.

Qəribə idi. Axı ona nə olmuşdu? Nə üçün İmranın səsini, ayaq tappıltısını eşidəndə yuxusu qaçırdı? İmran ki, hələ ona toxunan bir söz deməmişdi, bircə dəfə onu narahat etməmişdi. Bəs səbəb nə idi ki, əvvəllər Tükəzban xala ilə birlikdə sakitcə yaşayan Nərgiz İmran gələndən sonra özünü narahat hiss edirdi?

Bunu Nərgiz özü də başa düşürdü. O ancaq bircə şeydən qorxurdu: sevə bilər. Bakıdan kəndə işləməyə gələndə özünə söz vermişdi ki, heç kəsin üzünə baxmayacaq, heç kəsi qəlbinə yaxın buraxmayacaq, elə ömrünün axırına qədər tək-tənha yaşayacaqdır. O, ikinci dəfə sevməkdən qorxurdu. Əvvəllər Nərgiz ikinci dəfə sevməyin mümkün

olduğuna inanmazdı, hələ institutda oxuyanda Leyla onu danlayardı ki, "ağlını başına yığ, əsl sevgi sonra gələcək, ilk məhəbbət uşaqlıq xatirəsindən başqa bir şey deyil". O isə sözündən dönmür, kitabları vərəqləyib, romanlardan misal gətirirdi.

Əslinə baxsan, o, kəndə elə təkliyə çəkilmək üçün gəlmişdi. Bu məqsədlə də Tükəzban xalanın evini seçmişdi. "Sakitlikdir, bir qarıdır, bir də mən, qonşuluqda da oğlan yoxdur" – deyə özünə təskinlik vermişdi. Doğrudan da ilk günlərdə o, sakit dolanır, dərsdən sonra kitab götürüb bağa gedir, qaranlıq qarışanda pəncərə qabağında oturub yenə oxuyurdu. Hər səhər Tükəzban xala onun yastığının altından vərəqləri cırılmış kitab götürüb, stolun üstünə qoyurdu. Sonra da başını tərpədib öz-özünə pıçıldayırdı: "Bilmirəm bu qız cırıq kitablarda nə görüb? Dükanlarda satılan təzə kitablardan niyə alıb oxumur?"

Nərgizin həyatı bəlkə də belə sakit keçəcəkdi. Ancaq İmranın gəlməsi ilə hər şey dəyişdi. Elə ilk gündən, eyvanda görüşdükləri dəqiqədən o özünü narahat hiss etdi. İki-üç gündən sonra şeylərini yığışdırıb başqa bir evə köçmək istədi. Tükəzban xala qoymadı. İmran özü də xahiş etdi ki, getməsin.

Nərgiz özü də başa düşmədi ki, nə üçün razılıq verdi. İndi isə qəlbində iki hiss çarpışırdı... Nərgiz bəzən öz-özünü danlayırdı. "Təqsir özümdədir. Düz adamsan, onu görəndə özünü niyə itirirsən? Niyə yerin içində uzanıb onun ayaq səslərinə qulaq asırsan? Yıxılıb yata bilmirsən?.. Bir həftə bundan əvvəl gecə ayaqyalın, qonşu otağa keçdin. İmranın çiynindən sürüşüb düşmüş pencəyini götürdün, yavaşca çiyninə toxunub onu oyatdın ki, "dur, soyuq dəyər". Sən belə eləyəndə, əlbəttə, o da gizlincə sənin otağına girə bilər, üstündəki yorğanı düzəldər. Yox, günah məndədir. Özüm bu işləri törədirəm".

Nərgiz nə qədər çalışsa da olmurdu; elə bil dağ seli onu qoynuna alıb aparırdı. Bu işlərin sonu nə olacaqdı, Nərgiz özü də bilmirdi. Ona ancaq bircə şey aydın idi: gecələr yuxu gözlərindən qaçır, çarpayıda uzanıb qonşu otaqdakı İmranın nəfəsini dinləmək istəyirdi. Bəzən onun ağlına çox qəribə bir fikir də gəlirdi: İmranı öz otağında görmək istəyirdi. Belə vaxtlar ürəyi daha şiddətlə döyünürdü. Diksinərək yerindən sıçrayıb lampanın piltəsini qaldırırdı. O, indi də yerin içində çevrilib qonşu otaqdakı qəzet xışıltısına qulaq asırdı.

Bu gecə də Nərgiz dan yeri sökülənə qədər yata bilmədi. Səhər tezdən qalxıb şagirdlərin dəftərlərini yoxlayanda başı ağrıyırdı...

## 4

Kosaoğlu Qurban evə yorğun gəldi. Çay-çörək hazırlayıb gözləyən Sayalı, ərinin hirsli olduğunu görüb, tez ayağa qalxdı. Kişinin yarımkürkünü alıb divardan asdı. Palçığa bulaşmış çəkmələrini soyundurub, qapının ağzına qoydu. Gəbənin üstünə döşəkcə atdı. Yastıq və mütəkkə gətirdi.

– Bir az uzan, dincəl, – o mehribanlıqla dilləndi, – nə yaman gec gəldin? İstəyirsən su gətirim, ayaqlarını yuyum?

Qurban fısıldayaraq mütəkkəyə dirsəkləndi. Qara məxmər köynəyinin yaxasını açdı.

– Sənə neçə kərə demişəm, bu zəhrimar ocağı az qala. İstidən nəfəs almaq olmur.

Ərinin xasiyyətinə bələd olan Sayalı heç nə demədi. Səssizcə qapıya yönəldi: “Görəsən yenə hansı ciyəri yanmış kişiyə söz qaytarıb, gecənin bu vaxtı qanını qaraldıb?”

O, qonşu otağa keçdi. İçəridə oynayıb-gülüşən uşaqlarına acıqlandı. Balacalar susub boyun-boyuna verdilər. Sayalı, güzgünün qabağında oturub saçlarının ucunu oynadan qıza yaxınlaşdı. Aynada onların nəzərləri bir-birinə sataşdı. Qız Sayalıya göz vurdu. Bununla da dayısının kefini açmaq lazım olduğunu başa düşdüyünü ona anlatdı. Şahnaz boğmalı, hacıleylək boğazı kimi uzun və əyri lüləkli sarı aftafa-ləyəni götürüb gülə-gülə dayısı olan otağa girdi. Döşəkcənin üstünə uzanıb qırxıq başını qaşıyan Qurbana yaxınlaşdı.

– Ay dayı, bir az bəri dur, ayaqlarını yuyum.

Qurban yenə fısıldadı. Şahnaz onun corablarını çıxarıb, qalife şalvarının balağını yuxarı çəkdi.

– Nə yaman qaşqabaqlısan, ay dayı, yəqin yorulubsan?

Şahnaz cavab almadısa da, işinə davam etdi. İsti su Qurbanın ayaqlarına dəyəndə dirsəklənib oturdu. Bir xeyli Şahnaza baxdı. Qız isə onun ayağını ovur, barmaqlarını şaqqıldadır, dabanını qaşıyırdı.

Ayağının altı qıdıqlananda Qurban özünü saxlaya bilmədi:

– Ay qız, yavaş.

– Bəs deyirdin qıdığım gəlmir? Gördün ki, səni güldürdüm, ay dayı, – Şahnazın iri, ala gözləri oynadı. – Niyə bikefsən, yoxsa sənə söz deyən olub? Allah vurmuşdu onları! Dayımın qabağında dillənənin dilini dibindən qopardaram!

Qurban qımışdı.
– Yəni məni o qədər çox istəyirsən?
– Dayımın canı üçün, düz deyirəm.
Sayalı çay-çörək gətirdi. Ərinin qaşqabağının yavaş-yavaş açıldığını, Şahnazın onun qılığına girib yumşaltdığını görüb gülümsündü.
– Əyə, bircə dur, acından öldün.
Qurban yerini bir az da rahatladı.
– Arvad, sən atayın goru, nəyin varsa bəri ver, elə buradaca yeyəcəyəm. Bir də kim dursun...
Şahnaz quş kimi yerindən sıçradı. Aftafa-ləyəni aparıb eyvana qoydu. Dərhal geri qayıdıb gəbənin üstünə süfrə saldı, samovarı stolun üstündən endirdi. Qurban mütəkkəyə dirsəkləndi.
Sayalı tez-tez qonşu otağa gedir, qapıları taqqıldadır, xörəkləri daşıyıb süfrəyə düzürdü. Şahnaz nə isə danışır, tez-tez şaqqıldayıb gülür, qaşını oynadıb gözlərini süzdürür, dayısının kefini açırdı. Bu Sayalıya xoş gəlirdi. O, həmişə ərini hirsli görəndə Şahnazı qabağa verər, "bu qız ilanı da yuvasından çıxardar" – deyərdi. Sonra isə özü ərinin dizinin dibini kəsdirər, asta-asta söhbət edər, idarədə nələr olduğunu soruşardı. Kolxozda kimin nə iş gördüyü, haraya gedib, haradan gəldiyi haqqında ərindən məlumat alardı. Sonra ərinə məsləhət verər, kimi işdən çıxardıb, kimi işə təyin etməyin lazım gəldiyini söyləyərdi.
Qurban çox vaxt arvadının məsləhətindən çıxmazdı. Kişiyə elə gəlirdi ki, bu kənddə onu istəyən, işinə-gücünə kömək edən yeganə bir adam varsa, o da Sayalıdır. Sayalı onun hər dərdinə şərik olur, ərinin gündən-günə yüksəlməsini istəyirdi. Əslinə baxsan, Qurbanın sağ qalıb, bu dərəcəyə çıxmasına səbəb Sayalı idi. O öz həyatını Sayalıya borclu bilirdi...
Onlar bir yerdə oxumuşdular. Kənddə yenicə məktəb açılanda bir sinfə düşmüş, üç il bir skamyada oturmuşdular. Sayalı o zaman qırmızı yanaq, dəcəl bir qız idi. Hey atılıb-düşər, tənəffüslərdə oğlanların papağını qoyar, kağızdan özünə bığ düzəldər, ona-buna lağ edərdi. Qurbanın ondan xoşu gəlməzdi. Hətta bir neçə dəfə Sayalını saçlayıb döymüşdü də.
Qurban yalnız üçüncü sinfə qədər oxudu. Sonra atası onu məktəbdən çəkdi. "Yekə oğlansan, çörək qazanmaq lazımdır, – dedi, – dədə-babamız oxumayıb ki, sən də oxuyasan".

Əslinə baxsan, Qurbanın özünün də ürəyindən idi ki, məktəbi buraxsın. Hərfləri höccələməkdən xoşu gəlmirdi. O, atası ilə bərabər yer əkdi, ot çaldı, qapı-baca becərdi. Onları dəfələrlə cərimələdilər: kənd sovetinin milisioneri onu çöldə tutub atın qabağına qatdı, məktəbə gətirdi. Sinifləri gəzdirdi, qulaqlarından dartıb uşaqlara görk elədi. Olmadı ki, olmadı. O, üz-gözü qızarmış, qulaqları yana-yana sinifdə oturdu. Zəng çalınan kimi yenidən qaçdı.

Sayalı isə oxudu. Beşinci sinfi qurtardı. Əməlli-başlı qız oldu. Həmin il kənddə klub düzəltdilər. Sayalı səhnədən düşmədi: hər bayramda oxudu, oynadı. Onun gözəl səsi var idi. Dərsdən sonra qızları başına yığıb oxuya-oxuya gəzərdi. Hər dəfə klubda yığıncaq olanda səhnəyə çıxar, cingiltili səslə deyərdi:

“Bu səhnəmiz aynadır, açmağa xalqın gözünü.
Görəcəkdir bu aynada hər kəs özünü.
Arabir bəzi adam inciyəcəkdir,
Müftəxor mollaları yandıracaqdır...”

Cavanlar ona əl çalar, qocalar narazılıqla başlarını bulayar, “bu kişi qızını niyə özbaşına buraxıb?” – deyərdilər. Az sonra kənd arasında pıçıldaşmağa, Sayalının haqqında cürbəcür sözlər danışmağa başladılar: dünən gecə filan yerdən keçirdi, filankəsin oğlu ilə mazaqlaşırdı. Sayalı isə rayon mərkəzində açılan altı aylıq müəllimlər kursuna getməyə hazırlaşırdı. Ancaq bu, ona müyəssər olmadı.

Bir axşam evə gələrkən, atasının yanında cavan, suyuşirin bir oğlan gördü. O, qonağa qulluq elədi, çay-çörək verdi. Gecədən xeyli keçdi. Qonaq getmədi. Atası Sayalını yanına çağırdı.

– Qızım, – dedi, – özün bilirsən ki, səni mən nə zəhmətlə saxlamışam. Rəhmətlik anan öləndə üç yaşındaydın. İndi, maşallah, böyüyüb yekə qız olubsan. Sənin tay-tuşundan atası evində qalanı yoxdur. Sənin də ev-eşik sahibi olmaq vaxtındır. – O, dərindən köks ötürdü. – Özün bilirsən ki, mənim yurdumda ocaq qalayan adam yoxdur. İndi istəyirəm səni elə adama verim ki, yurdum boş qalmasın. Səni ev qızı, ev gəlini eləmək istəyirəm.

Atası susub çal saqqalını qaşıdı. Sayalı onun dediklərini yaxşı başa düşmədisə də, ürəyi döyünməyə başladı. Kişi qızından gözlərini ayırmadan:

– Oğlan da pis oğlan deyil, – dedi, – elə əsl mən deyəndir. Yetimin biridir. Həm oğlum olar, həm kürəkənim.

Sayalını elə bil ildırım vurdu. Atasının boynuna sarılıb ağladı, yalvardı, oxumaq istədiyini söylədi. Atası əvvəlcə onu dilə tutdu. Qızının inadını görəndə hirslə ayağa durdu:

– Əgər ölmək istəmirsən, səsini kəs! Yoxsa bu saat ayağımın altına salıb, dəli inək buzovunu ayaqlayan kimi ayaqlaram. Ya mən deyən olacaq, ya da səni tikə-tikə doğrayıb qapıdakı itlərə atacam.

Sayalı ərə getdi. Ancaq onlar çox yaşamadılar. Evlənəndən bir-iki ay sonra oğlan gecələr başladı evə gəlməməyə. Bəzən günlərlə yox olurdu. Sayalı hərdən-bir atasının da onunla getdiyini görürdü. O, bir neçə dəfə ərindən hara getdiklərini, gecələr nə iş gördüklərini soruşmuşdusa da, cavab ala bilməmişdi. Əri hirsli-hirsli ona baxıb, gözlərini bərəltmiş, “arvadsan, otur yerində, – demişdi, – kişinin işinə qarışma”, – Sayalının atası da kürəkəninin tərəfini saxlamış, “kişi arvada sirrini verməz” – demişdiz.

Bir gün Sayalının ərini tutdular. Oğurlayıb kəsdiyi camışın gönünü onun çiyninə verib kəndin ortası ilə apardılar. Sayalı utandığından evdən bayıra çıxmadı. Uşaqların “oğru, oğru” – qışqırdıqlarını eşitməmək üçün pəncərəni bağladı...

Aradan bir neçə il keçdi. Kənddə kolxoz təşkil edildi. Sayalının atası kolxoza girmək istəmədi. Tək təsərrüfatçı olaraq da öldü. Sayalı tamam tək qaldı. Ərindən də xəbər-ətər yox idi. O, kolxoza girdi.

Elə bu vaxt Qurbanı briqadir seçdilər. Sayalı onun briqadasında işləyəsi oldu. Onlar hər gün iş yerində görüşər, arabir söhbət edərdilər. Sayalı çox sakit, işlək bir gəlin olmuşdu. Heç kəsin işinə qarışmaz, az danışıb, az gülərdi. Yolu ilə düz gəlib, düz gedərdi. O indi ətə-qana dolmuşdu. Yanaqları qıpqırmızı idi. Zil qara saçları vardı. İri gözləri bir qədər kədərli olsa da, qaynayıb daşır, adamı titrədirdi.

Qurban yavaş-yavaş kənd içində sayılmağa başlayırdı. İclaslarda onu tərifləyir, yaxşı briqadir olduğunu söyləyirdilər. O daha da həvəslənir, hamıdan əvvəl yer əkdirir, səpinə başlayır, pambıq yığdırırdı. Yavaş-yavaş qızlar da ona baxmağa başladılar. Çirkin olduğuna görə əvvəllər heç kəs ona məhəl qoymurdu. Qızlar öz aralarında “yassarın biridir, üzünə baxanda adamın ürəyi bulanır, – deyirdilər, – ev-eşiyi də yoxdur, bir həsirdir, bir də Məmməd Nəsir”.

Qurban kolxoza girəndən sonra ev-eşik tikdirdi. Əyin-başını düzəltdi, hətta özünə yaxşı bir at da aldı. O, hər gün atını minib kəndin arası ilə çapanda, ya da briqada üzvlərini işə çağıranda, qız-gəlinlər onun dalınca baxmağa başladılar.

– Yamanca qoçaqlaşıb, amma bilmirsən niyə evlənmir?

– Ona kim gedər? Qapqara şeydir.

– Kişi gözəl olmasa da olar. Ağlığı nəyə gərəkdir, üzündə qatıq doğramacı yeməyəcəklər ha...

– Ay qız, deyəsən, ürəyinə yatır?

– Pis oğlan deyil ki...

Qızlar gülüşür, onun kimi istəyəcəyini gözləyirdilər. Sayalı isə heç nəyə fikir vermədən işləyirdi.

Amma bir gün kənddə heç kəsin ağlına gəlməyən bir hadisə baş verdi...

Kəndin suyunu kəsmişdilər. Görünür, arxı təmizləyəcəkdilər. Qız-gəlinlər səhər tezdən durub, kənddən xeyli aralı axan çaydan su gətirməyə gedirdilər. Hələ nişanlı seçməyən qızlar səhəngi götürməzdən əvvəl özlərinə sığal verir, qaş-gözlərini düzəldir, gəlinlər onlara sataşır, qarılar isə qibtə ilə cavanlara baxır, öz aralarında pıçıldaşırdılar. Çay kənarına səpələnən qız-gəlin səhəngləri doldurur, hərdən bir-birinin üstünə su atıb zarafatlaşırdılar. Qaqqıltı hər yeri bürüyürdü.

Sayalı qabı yenicə doldurub kənara qoymuşdu ki, kənd tərəfdən qarı tozlaya-tozlaya gələn kəhər atlı bir oğlan çaya yaxınlaşdı. Yaxası açıq idi. Şinelinin uzun ətəkləri havada yellənirdi. Uzaqdan baxanda adama elə gəlirdi ki, nəhəng bir quşdur, qanadlanıb uçmaq istəyir.

Qızların yanından güllə kimi ötən at, özünü suya saldı. Nazik buz çilik-çilik oldu. Oğlan atının başını çəkib, ağzını çay yuxarı saldı. Kəhər başını dik tutub suyu yardı. Daşları şaqqıldada-şaqqıldada iki-üç dəfə çay yuxarı gedib-gəldi. Sahibinin arzusunu bilirmiş kimi sonra birbaş qızların üstünə cumdu. Qızlar çığırışıb ətrafa dağıldılar. Ancaq Sayalı yoldan çıxmadı. Kəhər ona toxunub keçdi.

– Ciyəriyanmış, elə bil havalanıb, gözü ayağının altını görmür.

Oğlan atın başını qanırıb geri qayıtdı. Düz Sayalının qabağında dayandı. Gəlinin dolu sinəsi tez-tez qalxıb enir, burun pərələri genişlənirdi. Yanaqları soyuqdan və həyəcandan qızarmışdı.

– Məni cin atına mindirmə!

– Neylərsən?

Sayalı gözlərini süzdürüb qaşlarını çatdı və altdan yuxarı ona elə baxdı ki, oğlan titrədi: elə bil Sayalını birinci dəfə görür, onun qaynar gözlərinə ilk dəfə baxırdı. Oğlanın qanı üzünə vurdu.

– Vallah, bu saat atın tərkinə alıb apararam.

– Bəyəm halvadır?

– Su içimi kimi.

Sayalının həyəcanı daha da artdı. Dəyirmi papağını gözünün üstünə basmış oğlana və yüyəni çeynəyib fınxıran ata baxdı.

– Yolunla düz get, Qurban, el içində özünü də, məni də biabır eləmə.

Onun səsi titrədi. Bunu hiss edən Qurban daha da ürəkləndi.

– Demək əlinin dalını yerə qoyursan?

Sayalı dik onun gözünün içinə baxdı. Gülümsündü, yanaqları çökəldi, dirsəyini Qurbana göstərib şaqqıldadı.

– Başa düşdünmü?

Qurban heç nə demədən atı məhmizləyib onun üstünə şığımaq istədi. Kəhər yerindən tərpənməmiş Sayalı geri sıçradı. Havalanan at Qurbanı götürüb xeyli aralandı. Qızlar gülüşdülər. Qurban gözdən itəndən sonra qara kəlağayılı, göy koftalı bir qız Sayalıya yaxınlaşdı.

– Qurban kişi kimi sözünün üstündə durub səni aparsaydı, nə yaxşı olardı!

Sənə söz düşmür, kəs səsini!

– Heç çığır-bağır salma, ay Sayalı bacı, pis oğlan ha deyil. İstəsə elə gedərsən ki, vallah, ürəyin tökülür.

Bir neçə gün sonra kəndə səs yayıldı ki, Qurban Sayalını aparıb... Onlar pis dolanmadılar. Elə ilk gündən Sayalı Qurbana kömək etməyə, briqadanın yazı-pozu işlərini düzəltməyə, əmək günlərini hesablayıb nizama salmağa başladı. Az sonra Sayalı Qurbanı gecə məktəbinə göndərdi. “Mən oxuya bilmədim, sənsə oxu” – dedi. O, Qurbana dərslərində də kömək elədi.

İllər dolandı, uşaqları oldu. Qurbanın vəzifəsi yavaş-yavaş böyüdü; onu kolxoz sədrinə müavin seçdilər. Ancaq müharibə hər şeyi yarımçıq qoydu. Qurban əsgər getdi.

İlk günlər Sayalı çox darıxdı. Evə baş sala bilmədi. Uşaqlara baxdıqca gözləri doldu. Hər gün doqqaza – poçtalyonun qabağına yüyürdü, Qurbandan gah hər gün məktub gəlir, gah da aylarla xəbər-ətər olmurdu. Onun məktubları həmişə şikayətlə dolu olurdu. Soyuğa,

əziyyətə dözə bilmədiyini yazırdı. Sayalı hiss edirdi ki, əri döyüşdən çox evə qayıtmaq haqqında düşünür.

Sayalı bəzən gecə səhərə qədər yata bilmir, yerinə qor dolmuş kimi o üz-bu üzə çevrilirdi. Bayırda külək əsən kimi diksinir, adi bir taqqıltıdan oyanır, çox vaxt alt paltarında eşiyə çıxıb çovğuna, qara baxırdı. Qayıdıb yerinə girdikdən sonra da yata bilmirdi. “Görəsən indi hardadır? Bu soyuqda səngərdədir, düzdədir? Yazıq necə dözür? Sağ-salamat qayıdıb gələcəkmi?” O, hər gün qəzetlərə baxır, kənddə gedən söz-söhbətə qulaq verirdi. Kiminin yaralandığını, kiminin qəhrəmanlıqla vuruşub orden aldığını eşidir, onun da ürəyində şirin arzular doğurdu. Qurbanın haqqında şad xəbər eşitmək, bir qadın kimi əri ilə fəxr etmək istəyirdi.

Sayalı Qurbana ərə gedəndən sonra qəlbində qəribə bir hissin baş qaldırdığını duyurdu. O istəyirdi ki, əri adlı-sanlı adam olsun, Sayalını barmaqla göstərib “filankəsin arvadıdır” desinlər. Amma hər dəfə məktub alanda Sayalı məyus olurdu. Qurban hey zarıyırdı.

Sayalı əvvəlcə ürəyində onu asıb kəsir, “tabsız”, hətta “qorxaq” deyə qarasına danışırdı. Bəzən də “neyləsin? – deyirdi, – yazıq çöl görməmişdi”. Gah da o, ərinin qayıtmayacağını təsəvvürünə gətirirdi. Belə hallarda körpələrinə baxıb dəhşətə gəlirdi. “Yox, qoy şikəst olsun, iraq canından, bir qolu, bir qıçı olmasın, amma qayıdıb evinə gəlsin, balalarım yetim qalmasın” – deyirdi.

Qaranlıq bir qış gecəsində, bu cür qarmaqarışıq fikirlərdən sonra Sayalı yenicə yuxuya getmişdi ki, birdən itlər hürüşdü, sonra qapı döyüldü. O səksəkəli halda soruşdu: “Kimsən?” Bayırdan boğuq səs eşidildi: “Mənəm, aç qapını”.

Sayalı qapını açanda gözlərinə inana bilmədi. Gələn Qurban idi. Üzbaşını tük basmışdı. Şineli palçığa bulaşmışdı. Sarıqlı qolu boynundan asılmışdı. Sayalı ərinin boynuna sarılıb ağladı. Qurban onu sakitləşdirdi.

– Uşaqlar hanı?

– Yatıblar.

Qurban taxtın üstündə yan-yana salınmış yorğan-döşəkdə yatan uşaqlarına yaxınlaşdı. Bir anlığa hər şeyi unudaraq balalarına tamaşa elədi. Özünü saxlaya bilməyib hönkürdü.

Uşaqlar oyanıb döyükdülər, gözlərini ovuşdurub mat-mat atalarına baxdılar. Əvvəlcə onu tanıya bilmədilər. Sonra boynuna salırdılar. Evi marçıltı və gülüş səsləri bürüdü.

Sayalı göz yaşlarını silərək lampanın piltəsini qaldırdı, ocağı qaladı. Ev isindi. Hər şey sakitləşəndən sonra Qurban qolunu göstərib yaralandığını söylədi.

– Səni təmizmi buraxdılar?

– Yox, qospitala gedirəm. Yolda maşından düşdüm. Uşaqlardan ötrü burnumun ucu göynəyirdi...

Sayalının qaşları çatıldı:

– Hansı qospitala gedəcəksən?

– Nə bilim, hansı olsa. Elə istəyirəm öz rayonumuzdakında yatam...

Səhər onlar birlikdə rayon mərkəzinə, xəstəxanaya getdilər. Cəbhədən yenicə gətirilmiş yaralıları qəbul edirdilər. Qurban da onlara qarışdı... İki gündən sonra Sayalı yenə əri ilə görüşdü. Bu dəfə Qurbanın rəngi daha da ağarmışdı. Gözləri çuxura düşmüşdü. Dili-dodağı təpimişdi.

O, arvadını bir küncə çəkdi.

– Sayalı, ölmüşəm, meyidimi götür, amanın bir günüdür, məni çevir uşaqların başına.

– Nə olub, a kişi?

Qurban ehtiyatla ətrafa baxdı. Pıçıltı ilə:

– Deyəsən, üstü açılacaq, – o, yaralı qolunu göstərdi, – özüm eləmişəm...

Sayalı ilan çalırmış kimi dik atıldı. Bir-iki addım geri çəkilib ərini nəzərdən keçirdi. Qurbanın elə pərişan görkəmi vardı ki, yağının da yazığı gələrdi. Sayalı dinmək istədi, bacarmadı. Qəhər onu boğdu.

– Məni çevir uşaqlarının başına, – deyə Qurban yenə xırıldadı. – Bir xatadır, əlimdən çıxıb. Gör bir təhər kömək eyləyə bilərsənmi...

Sayalının bədəninə üşütmə düşdü. Çiynindəki ağ yun şala bərk-bərk bürünərək, dinməz-söyləməz, evinə qayıtdı. Taxtın üstünə döşənib hönkürtü ilə ağladı. Uşaqlar onun başına yığışdılar.

– Ana, nə olub?

– Dədəm getdi?

– Dədəmi ürəyim elə istəyir ki!.. Bəs havaxt gələcək?

– Mən dədəmdən küsmüşəm. Bizi qoyub niyə getdi?

– Doktor qolunu sarıdımı, ay ana?

Sayalı dinmirdi, hönkürtüsünü boğmaq istəyirdisə də bacarmırdı, çiyinləri qalxıb-düşürdü.

Uşaqlar da hönkürüşdülər. Sayalı özünü toplayıb ayağa durdu. Göz yaşını silib uşaqlarına baxdı. Onlar boyunlarını büküb dodaqlarını büzmüşdülər. Lap balaca qızın saçı gözünün üstünə tökülmüşdü. Burnundan selik axırdı. O, balaca yumruqları ilə gözlərini ovuşdururdu.

– Dədəm niyə gəlmədi, ay ana?

Sayalı uşaqlarını bir xeyli süzdü. Elə bil onlar analarından imdad istəyir, "bizi atasız qoyma" deyirdilər. Sayalı titrədi, uşaqlarının yetim qalacağını düşünüb dəhşətə gəldi.

Qaranlıq qarışdı. Sayalı ocağı qalamadı, lampanı yandırmadı. Uşaqlarına yer saldı, özü isə gəbənin üstünə uzanıb dirsəkləndi. Səhərə qədər gözlərini yuma bilmədi. "Bəs el-oba bilsə buna nə deyər? El içində rüsvay olaram. Camaatın üzünə necə baxacam? Axı mənim bəxtim niyə qaradır?!" O, əvvəlki ərinin necə tutulub aparıldığını gözünün qabağına gətirdi, ikinci dəfə bu cür rüsvay olacağını düşünəndə bədəni əsdi...

Sayalı qapıdakı camışı və gəbələrdən birini satdı. Hərbi xəstəxananın qapısına ayaq döyməyə başladı, çətinliklə də olsa, istədiyi adamı tapdı...

Bir aydan sonra Qurban yarım illik möhlət alıb evlərinə qayıtdı. Kənddə ona hörmət etdilər. Hətta arvadlar yığışıb onu sədr seçdilər. Qurban o qalmaqla qaldı.

İlk günlər o hamının hörmətini qazanmağa çalışdı. Əsgər ailələrinə kömək etdi, otu olmayana ot, taxılı olmayana taxıl payladı. Kolxozun sulu yerini əl altından bölüşdürüb istədiyi adamlara payladı. "Qarğıdalı əkin, bostan becərin, – dedi, – birtəhər başınızı dolandırın". Bəzən Sayalı ərinin hərəkətlərinin səbəbini soruşanda "arvad, sən qarışma, – deyə Kosaoğlu cavab verirdi, – mən nə elədiyimi bilirəm".

Yavaş-yavaş kənddə Kosaoğlunun başına and içənlər çoxaldı. Arvadların dili ağzına sığmadı: "Allah onun ömrünü uzun eləsin, o olmasa axırımız itərdi".

Kosaoğlu öz hərəkətlərindən məmnun qalır, "belə etməsəm olmaz, – deyirdi, – yoxsa ağzıgöyçəyin biri məsələni öyrənər, gedib xəbər verər. Ondan sonra tribunaldan yaxamı qurtara bilmərəm. Bir də ki, mən nə itirirəm, kolxozun varı-dövlətidir, paylayıram".

Aylar keçdikcə Qurban yerini möhkəmlədirdi. Onun qapısına gəlib-gedənlər çoxaldı.

Kazımla Kosaoğlunun dostluğu da elə bu vaxtdan başlamışdı. Soyuq bir qış axşamı Kazım boynunu büküb sədrin evinə gəldi. Onun qabağına çay-çörək qoydular. Ancaq Kazım dilinə heç nə vurmadı. Bunu görən Kosaoğlu:

– Ə, boğazın tikilməyib ha, niyə çörək yemirsən?

– Vallah düz deyirsən, elə boğazım tikilmiş kimidir, bu saat gözümə çörək-zad görünmür.

– Ə, nə olub?

– Qurban qağa, paveska gəlib, deyəsən, əsgər aparacaqlar, – Kazım doluxsundu. – Mənə kömək elə, birtəhər vayonkomla danış, möhlət versin.

Kosaoğlu ona söz verdi, səhəri rayona getdi. Hamıdan xahiş etdi ki, heç olmasa qoyun, kolxozda bir kişi briqadiri qalsın. Bir sədr kimi onun sözünü eşitdilər. Bundan sonra Kazım Kosaoğlunun qarşısında əlibağlı qula döndü. Qurban yavaş-yavaş onu özünə köməkçi etdi. Kolxozun sulu yerindən ona da bir hektar verdi. "Özünə bostan ək" – dedi. Kazım sevinə-sevinə həmin yeri becərdi. Payızda isə qarpızları şəhərə satmağa apardı. Kəndə bir ətək pulla qayıtdı.

Bir gün Kosaoğlu onu yanına çağırdı:

– Bəs mənim payım?

Kazımın məsələni başa düşmədiyini hiss edən Kosaoğlunun qaşları çatıldı:

– Özünü niyə qanmazlığa qoyursan? Səni əsgərlikdən saxladım, kolxozun yerini verdim, bostan əkdin. Elə bilirsən bunlar müftə başa gəlir? Təkcə sən yox, elə hamınız beləsiniz. Heç olmasa sənə çəkdiyim xərci ödə.

Kazım heç nə demədi. Dinməz-söyləməz evə qayıtdı, bostandan qazandığı pulun yarısını gətirib Kosaoğluna verdi.

Var-dövlət artdıqca Kosaoğlu özünə dost tutmağa çalışır, rayondan kolxoza gələnləri dərhal evinə aparır, onları yedirib-içirməmiş buraxmırdı. Ortada əl iyi kimi fırlanan Kazım gah dükana, gah anbara qaçır, gah da kolxozçuların birinin qapısını döyüb, "kişinin rayondan qonağı gəlib, bir heyvan ver" – deyirdi.

Bəzi rayon işçiləri bu evə ayaq açandan sonra Kosaoğlu daha da dirçəldi.

Sayalı evinin cah-cəlalını gördükcə sevinir, Qurbanın başına pərvanə kimi dolanırdı. Əvvəllər qonaqlara özü qulluq edən Sayalı yavaş-

yavaş əlini işdən çəkdi. Nə çox idi qonum-qonşuda bir qarın çörək üçün kömək istəyən...

Sayalı nəyinki ev işindən, kolxozun işindən də əl çəkdi. Qurban ona dedi ki, “evdə otur, heç yerə getmə. Görürsən ki, qapımızdan qonaq əksik olmur”. Aylar ötdükcə Sayalı ətə dolub qəşəngləşir, ipək paltarın birini soyunub, o birini geyinirdi. Kənddə bir toy, bir məclis onsuz keçmirdi. Oğluna nişan qoyan da, qızını ərə verən də, evinə gəlin gətirən də, əsgərlikdən oğlu gələn də əvvəlcə onunla məsləhətləşməliydi, yoxsa Sayalının burun-damağını yığıb-yığışdırmaq olmazdı.

Müharibədən sonra da bu vərdiş bir müddət davam etdi. Onsuz bir iş olanda Sayalı əlini belinə qoyub qışqırırdı: “Nə tez yadından çıxdı? Dava vaxtı səni mən saxlamadımmı? Neçə dəfə qapıma gəldin, çörəkləyib yola saldım. İndi ağzınız genişliyə çıxıb? Qurban olmasa idi heç sümüyün də qalmamışdı. Yoxsa axsaya-axsaya gəlib yalvardığın, məni uşaqların başına çevir dediyin yadından çıxıb?” Kosaoğlu da arvadından geri qalmırdı. Müharibə dövründə kəndə hökmranlıq edən bu adam heç kəsi tanımaq istəmir, nəyin hesabına olursa-olsun sədrliyi əlində saxlamağa çalışırdı.

...Çay-çörəkdən sonra Şahnaz süfrəni yığışdırıb qonşu otağa keçdi. Ər-arvad tək qaldı. Qurban gümüş qutusunu çıxardıb sarı saçaqlı tütündən papiros eşdi.

– Bu gədə bizim başımıza oyun açmasa yaxşıdır. Sayalı təəccüblə ərinin üzünə baxdı.

– Hansı gədə?

– Tükəzbanın oğlunu deyirəm. Deyəsən, atası kimi tərsin biridir.

– Elə şey olmaz, a kişi, dünən yolda gördüm, yaman xoşuma gəldi. Deyəsən, mərifətli uşaqdır. Heç inanmazdım ki, dul Tükəzban belə oğul böyüdə.

Kosaoğlu istehza ilə güldü:

– Eləliyinə baxma, şuluq uşaqdır.

– Olmaya aranızda söz olub?

– Yox, – deyə Qurban sakitcə cavab verdi, – hələ heç nə olmayıb. Amma ağzının havasından görürəm ki, bizimki tutmayacaq. Mən belə fikirləşmirdim.

Bir anlığa aralığa sükut çökdü.

– Bəs necə fikirləşirdin, a kişi?

Kosaoğlu köksünü ötürüb mütəkkəyə dirsəkləndi, ayaqlarını uzadıb yerini rahatladı, sağ əlini qırxıq başında gəzdirdi.

– Doğrusu, yaman diribaş uşaqdır. Elə bil od parçasıdır. Elə ürəyimə yatırdı ki...

O, papirosunu sümürdü. Gözlərini qıyıb otuzluq lampaya baxdı. Sayalı ərinin fikrini başa düşən kimi oldu. Nədənsə Şahnaz gəlib gözlərinin önündə dayandı.

– Düz deyirsən, əyə, birlik olmasa iş yeriməz. İllah da ki, kənd yerində.

– Nə isə, arvad...yer sal yataq. Yaman yuxum gəlir.

Sayalı yer saldı. Lampanın piltəsini aşağı çəkdi. Bir azdan Qurban xoruldadı. Sayalı isə gözünü tavana zilləyib, işə necə başlayacağını fikirləşdi...

## 5

Zeynəbi od götürmüşdü. Bir az bundan qabaq arxın üstündə Gövhər qarıdan eşitdiklərinə əvvəlcə inanmaq istəməmişdi. “Onun peşəsi elə aralıqda söz gəzdirməkdir” – deyə düşünmüş və səhəngini götürüb geri qayıtmışdı. Ancaq yolda öz manqasının üzvü Gülsümə rast gəlmişdi. “Ay Zeynəb bacı, bu nə işdir? Belə olsa heç mən də orda qalmayacam,” – deyə Gülsüm kövrəlmiş halda, eşitdiklərini ona danışmışdı. Zeynəb yenə də sakitliyini pozmamış, “işində ol, belə boş sözlərə inanma” – deyə Gülsümə təskinlik vermişdi. Amma evə gəldikdən sonra təsirlənmiş, düşündükcə odsuz-ocaqsız alovlanmağa başlamışdı. “Bu kişi lap ağlını itirib. Kefi nə istəyirsə onu eləyir. Heç buna qoruq-qaytaq edən yoxdur. Sataşmadığı adam qalmadı. İndi də mənə əl uzatdı. Axı niyə ey, nədən ötrü? Nə əsasa görə?..”

O, evdə hərlənir, mütəkkələri çırpıb taxtın üstünə düzür, qab-qacağı danqıldadırdı. “Özü də onun-bunun sözü ilə iş görür. Bilirəm, o elə əvvəldən də buna razı deyildi”.

Zeynəb bir yerdə durub sakitləşə bilmirdi. Tez-tez eşiyə çıxır, qapıları taqqıldadır, eyvanda hərlənir və öz-özünə deyinirdi: “Gör bir mənim yol göstərənim kim olub? Xır-xır Kazım! Hamısını da eləyən o Kosaoğludur. Zərər yoxdur. Görünür, o hələ məni yaxşı tanımayıb. Mən onu bir Kosaoğlu elərəm ki, biri də yanından çıxar”.

Zeynəb içəri girdi, şalını başına örtüb bayıra çıxdı. Çəpəri ayaqlayıb qonşu həyətə keçdi, Tükəzban xalanı çağırdı. Arvad eyvanda göründü.

– İmran evdədirmi?

– Yox, səhərdən getdiyidir. İdarədə olar. Neyləyirdin?

– İşim var.

– Gəl otur, indicə gələr, şər qarışır.

– Yox, Tükəzban xala, gözləyə bilmərəm.

O, dönüb aralandı.

Qaranlıq düşürdü. Qapı-bacalarda qaraltılar çoxalırdı. Baltalar taqqıldayır, dallarında səbətlə saman gətirən uşaqlar tövlələrə yaxınlaşırdılar. Arvadlar buzovu əmizdirdikdən sonra çəkib mıxa bağlayır, südü evə qoyub qayıdır və qarın üstündə ot yeyən inəkləri haylayıb dama salırdılar. Bəzi qapılarda itlər yal üstündə boğuşurdu. Yavaş-yavaş sazaq başlayır, göy üzündə təkəmseyrək ulduz görünürdü. Dərsdən qayıdan uşaqlar tələsir, özlərini evə salmağa çalışırdılar. Onların bəziləri soyuqdan büzüşür, bəziləri də papaqlarının qulaqları atıla-atıla qaçırdılar. Pəncərələrdə titrəyən işıqlar çoxalır, bacalardan çıxan tüstü axşam toranlığına qarışıb yox olurdu.

Zeynəb heç nəyə fikir vermədən irəliləyir, öz-özünə Kosaoğlunu asıb-kəsirdi: “Gərək elə hamı Kosaoğlunun qohumu olsun? Kolxozun xeyir-şərində biz də iştirak etsək dünya dağılmaz ki! Elə gərək hər şeyi qamarlayıb özləri götürsün? Kənd onların adına ha yazılmayıb! Daha bəsdir! Hər şeyi açıb lap gözünün içinə deyəcəm. İslanmışın yağışdan nə pakı? Onsuz da mənə dəli Zeynəb deyirlər”.

Zeynəb kolxozun xırman yerinə çatdı. Saman tığlarının yanında kişilər çənələrini yabaya söykəyib söhbət edirdilər. Onlar saman keşikçisinə nə isə deyir, o da qışqırırdı ki, “olmaz”. Başqa vaxt olsaydı Zeynəb bəlkə də dayanıb söhbət edənlərə salam verər, sinə-sinə tayalara yaxınlaşaraq səbətlərini samanla doldurub qaçan uşaqlara acıqlanar və keşikçiyə sataşıb “gözlə özünü də səbətə qoyub aparaarlar”, – deyərdi. Ancaq indi hövsələsi yox idi.

O, xırmandan tələsik keçib idarəyə doğru addımladı. Xəstəxananın yanında, əyninə qara xəz palto geyinmiş Şahnazla rastlaşdı. Onlar sakitcə bir-birini başdan-ayağa xeyli süzdülər. Şahnaz birdən qəhqəhə çəkdi.

– Ay qız, şala nə yaman bürünübsən?

– Hamı sənin kimi şuba geyinməz ki, Şahnaz xanım!

– Bıy, xətrinə niyə dəyir, sözdür dedim. Bir də şuba geyinmək pis şeydir? Hələ dayıma demişəm birini də alsın. Bunu bildir Bakıya gedəndə almışdı. Elə yaxşı isti olur ki. Bir də, belə paltar geyinəndə hamının gözü səndə qalır. Bütün oğlanlar dalınca baxır. Ağızlarının suyu axır, sən də ki, onlara məhəl qoymayıb yanlarından keçirsən. Bilirsən adama nə ləzzət verir! Yeriyəndə gərək dabanlarını yerə bərk vurasan ki, bədənin titrəyə. Yoxsa elə-belə yeriməkdən nə çıxar?

– Doğru sözündür?

– Bəs nə? Elə dayımın da yaxşı paltardan xoşu gəlir.

– Yəni o da belə şeyləri qanır?

– Mənə deyir, nə qədər sağam, qoymaram ki, korluq çəkəsən. Ürəyin nə istəyir alacam. Nə cür istəyirsən geyin, gəz. Qoy düşmənlər kor olsun. Mən də ki özün bilirsən, gündə bir paltar geyinməsəm ürəyim partlayar. Hələ qoy yaz gəlsin. Elə nazik paltarlar tikdirmişəm ki, baxanda adamın ağlı gedir. Hamısı da təzə fason. Belləri dar, qolları açıq.

Zeynəb dodağını gəmirdi. Bir istədi onun üstünə atılıb boğazından yapışsın və süpürləyib qara bassın, o ki var əzişdirsin. Amma özünü saxladı.

– Sonra neyləyəcəksən?

– Neyləyəcəm? Nə qədər ömrüm var, gəzib dolanacam. Kefimi sürəcəm. Bu dünya bizə qalmayacaq ki... Ay qız, dəli olma, işləmək-zad boş şeydir. Dünyada adama kef qalacaq. Nə qədər ki cavanam, geyinib-kecinəcəm, kişilərə yanıq verəcəm. Yorulanda da çıxıb gözəl-göyçək oğlanlardan birinə gedəcəm. – O, Zeynəbə daha da yaxınlaşdı. – Heç bilirsən bu oğlanlara nə dağ çəkirəm?!

– Sən canın, düzmü deyirsən?

– Özüm ölüm, düz sözümdür. Bura bax, mənə niyə belə baxırsan?

– Deyirəm, ay Şahnaz, görəsən səndə bircə tikə ağıl varmı?

– Kimdə, məndə?

– Bəli, səndə! Kosaoğlunun bacısı qızı Şahnaz xanımda.

– Bura bax ey, – deyə Şahnaz ciddiləşdi, – mən səndən ötrü toxa vuran qızlardan deyiləm. Gözünü aç, mənə yaxşı bax. Yoxsa başına bir oyun açaram, adın da yadından çıxar.

Zeynəb eyni sakitliklə soruşdu:

– Nə qayırarsan?

– Belə dayıma deyərəm...

– Uzun donumu gödək elər?

– Bəs eləməz?

– Mənim ha?

– Bəli, sənin!.. Sən nəsən ki?

– Əgər o, yaxşı kişidirsə, qoy əvvəlcə bacısı qızının başına ağıl qoysun.

– Mənə nə olub ki, mən ağılsızam?!

– Bəs nə təhər ki... Lap kamal dəryasısan.

– Bura bax, məni dolama!

– Özündən xəbərin yoxdur, ay yazıq, dolanası günlərə qalıbsan. Şahnazın burun pərələri genişləndi. Sinəsi enib-qalxdı. Gözləri oynadı.

– Mənə nə olub ki, yazıq oluram? Dayımın canı sağ olsun. Yazıq sənsən, a yetim!

Zeynəbin yumruqları düyünləndi. Bir addım irəli gəlib onun gözlərinin içinə baxdı. Şahnazın bədənini titrətmə götürdü. O, geri çəkilib cığıra düşdü və bir ayağını qaçaraq qoydu.

– Bax, əlini-ayağını fərağat qoy. Mən sənə toxa vuran qızlardan deyiləm ki, saçından tutub horabel çəkəsən.

– Kəs səsini! Yoxsa bu saat allahın da, bəndənin də hayıfını səndən alaram. Arsız!

Şahnaz ondan aralanıb özünü xəstəxanaya saldı. Zeynəb bir xeyli yerindəcə dayandı. Onun dodaqları səyridi. Gözləri yaşardı. Güclə hirsini boğub özünü ələ aldı, şalını düzəldə-düzəldə xəstəxananın yanından ötüb idarəyə yaxınlaşdı. Birbaş Kosaoğlunun yanına getmək istədi. Ancaq partiya təşkilatçısının otağından işıq gəldiyini görüb ayaq saxladı, nəfəsini dərdikdən sonra üst-başını düzəldib içəri girdi. Nəsib dayı qapıya tərəf baxdı. Zeynəb özünü itirən kimi oldu. Qıza elə gəldi ki, hirsli olduğunu, hətta Şahnazla deyişdiyini Nəsib dayı bilir. O, həyəcanını gizlədib sakitləşmək istədisə də bacarmadı, yanaqları daha da qızardı. Zarafatcıl, gülərüz Nəsib dayı Zeynəbi bu vəziyyətdə görüb gülümsündü.

– Qızım, nə yaman bürünübsən, lap qarıya oxşayırsan.

– Soyuqdur.

– Yaxşı, çovğun qoparma görək, şalını aç, otur.

Zeynəb peçin yanındakı skamyada əyləşdi.

Nəsib dayı Zeynəbi hər dəfə görəndə bir an sakitcə dayanıb, dinməz söyləməz onun üzünə baxardı. Bu vaxt Nəsib dayının sifətində və gözlərində kədər qarışıq bir sevinc sezilirdi. Elə bil ki, kişinin fikri

haraya isə, uzaqlara gedirdi. Bəzən Zeynəb ondan bir söz soruşanda Nəsib dayı heç nə eşitmirmiş kimi susur, haçandan-haçana, yuxudan ayılmış kimi, fikrini toplayıb Zeynəbə cavab verirdi. Bu vaxt Zeynəb onun azacıq qızardığını hiss edirdi. Əvvəllər Zeynəb bunun fərqinə o qədər də varmazdı. Sonralar, Nəsib dayının onunla qabaqlaşarkən özünü itirdiyini, hərəkət və baxışlarında bir qəribəlik olduğunu aydınca görməyə başladı. Zeynəb çox zaman ondan qaçmağa çalışırdı. Lakin Nəsib dayı qızı harda görsə dayanıb kefini soruşurdu. O, elə mehriban olurdu ki, Zeynəbin qəlbindəki şübhələr dərhal dağılırdı. İndi də elə oldu.

Nəsib dayı bir az sakitcə baxdı. Sonra ayağa durdu. Zeynəbin şalını alıb divardan asdı. Yenə stolun arxasına keçdi. Fikri dağınıq halda kağızları, qəzetləri qurdaladı. Sonra üzünü Zeynəbə tutdu.

– Xeyir ola, a komsomol, bu qarda-boranda Nəsib dayını nə yaxşı yada saldın?

Zeynəb onun sualına sualla cavab verdi:

– Deyin görüm, məni manqabaşçılıqdan niyə çıxardıbsınız? Nəsib dayı heyrətlə qaşlarını çatdı.

– Kim çıxardıb?

– Nə bilim kim? Siz, kolxozumuzun böyükləri kimdirsə, onlar.

– Mənim heç nədən xəbərim yoxdur.

– Niyə yoxdur? Bəs kolxoz sədri bir iş görəndə partkomla məsləhətləşmir? İdarə heyətinin üzvlərini yanına çağırıb onların fikrini soruşmur? Yoxsa kefi nə istəyirsə onu da eləyir?

Nəsib dayı Zeynəbin getdikcə həyəcanlandığını, hirsindən ağlayacağını gördü, onu sakitləşdirməyə çalışdı:

– Axı bu xəbəri sənə kim deyib? Belə iş olsa gərək biz səndən əvvəl bilək, yox? Mən bilmirəm, demək, yalandır. Sən də nahaq yerə özünü üzmə.

– Nəsib dayı, sən bilməsən də, mən hər şeyi bilirəm. Bunun hamısını eləyən Kosaoğluyla xır-xır Kazımdır. O, ilana ağı verən kərtənkələ kimi həmişə Kosaoğlunun yanında hərlənir. Bizim kolxoz sədri də onun dediyi ilə oturub-durur. Daha bir fikirləşmir ki, axı adamdan haqq-hesab soruşarlar, yoxsa kim nə istəsə, eləyə bilər?

– Əlbəttə.

Nəsib dayı Zeynəbə yaxınlaşdı. Xeyli, dərin həsrətlə qızın üzünə baxdı. Sifəti mülayim, mehriban və hüznlü bir görkəm aldı.

– Kimin haqqı var sənin təki qızı incitsin? Sən kəndimizin gülüsən. Keçən il kolxozumuzda hamıdan əvvəl planı sən ödədin.

– Elə ona görə də qədrimi bilirsiniz! Biz söz vermişdik ki, gərək bu il rayonda hamını ötək, bizim kimi pambıq becərən olmasın. Qızlar indidən fikirləşirlər ki, çayırı, çör-çöpü necə təmizləyəcəyik, alağı necə vuracağıq, nə vaxt pambığı suvarıb dərimə başlayacağıq, siz də ki, belə... – Zeynəb kövrəldi.

– Bax, buna yoxam. Uşaqlığı burax. Ağlamaq nədir?!

– Neyləyim, Nəsib dayı? Adamı odsuz-ocaqsız yandırırlar! – O birdən-birə sərtləşdi. – Bax, düzünü deyirəm, mənim çox ağlım yoxdur. Özün işə qarış, yoxsa Kosaoğlunu bir Kosaoğlu qayıraram ki, adı da yadından çıxar. Ona de ki, gözünü silsin, mənə düz-əməlli baxsın. Yoxsa bütün rayonu bura tökərəm. Daha bəsdir. Kəndi barmağına az dolasın!

Zeynəbin sözləri Nəsib dayını düşündürdü. Doğrudan da axır vaxtlar Kosaoğlu özünü pis aparır, heç kimlə hesablaşmır, hətta partiya iclaslarının qərarlarına fikir vermək istəmirdi. Onun bu cür yekəxanalığı, kolxozun idarə heyətinə belə fikir verməməsi Nəsib dayını narahat edirdi. O bir neçə dəfə Kosaoğlu ilə təklikdə söhbət etmiş, bu cür işlərin yaxşı nəticə verməyəcəyini demişdi. Nəsib dayını ən çox təəccübləndirən o idi ki, Kosaoğluna bir söz deyəndə gülür, laqeydliklə “nə qayıracaqlar ki?” – deyirdi.

Nəsib dayı çalışırdı ki, onu başa salsın, kolxozun daxilində ikitirəlik və ziddiyyət olmasın. Ancaq deyəsən bu mümkün deyildi.

Zeynəbin dediklərinə diqqətlə qulaq asdıqdan sonra o yenə öz-özündən soruşdu: “Axı bu niyə belə olsun?”, lakin cavab tapa bilmədi.

– Qızım, – deyə nəhayət o, sözə başladı, – sən çıx get evə. İşində ol. Heç kəs sənin manqanı əlindən ala bilməz. Səni manqabaşçılıqdan çıxartmaq üçün əldə heç bir əsas yoxdur. – O, bir qədər duruxdu. Azacıq fikrə getdi və sınayıcı nəzərlərlə Zeynəbi süzdü. – Yaxşı, bəs Kazım nə üçün sənin əleyhinə çıxır? O ki keçən il harda olsa, səni tərifləyirdi, briqadamın gözüdür, deyirdi. İndi nə oldu?

Zeynəb qızardı. Ürküdülmüş kimi yerindən qalxdı. Nəsib dayının üzünə baxmaqdan utanıb başını aşağı saldı.

– Mən nə bilim?

Nəsib dayı qızın yaralı yerinə toxunduğunu hiss etdi.

– Yaxşı, arxayın ol. Mən özüm hər şeyi ayırd edərəm.

– Bax, sənə ümidliyəm. Mən Kosaoğlunun yanına getsəm, biabırçılıq olar.

– Yaxşı, yaxşı. Bizi qorxutma.

Zeynəb şalına bürünüb idarədən çıxdı. Nəsib dayı fikri dağınıq halda bir xeyli onun arxasınca baxdı. Sonra asta-asta otaqda gəzinməyə başladı...

* * *

Onlar at tövləsinin yanında rastlaşdılar. İmran sahələri gəzməkdən yenicə qayıdırdı. Ayaq tappıltısı eşidən mehtər, dərhal bayıra çıxıb, İmranın atının başını tutmaq istədi.

– Zəhmət çəkmə, Abdı dayı, – deyə İmran cəld yerə sıçradı, qocaya əziyyət verməmək üçün özü atı tövləyə çəkdi, yəhər-yüyənini aldı.

Mehtər qarnı kürəyinə yapışmış atı nəzərdən keçirib başını buladı:

– A bala, nə gec gəldin? Səhərdən getdiyindir.

İmran, axurda yem axtaran ata baxdı.

– Elədir, atı da əldən salmışam. Abdı dayı, sən allah, onun axurunu dolu elə.

Mehtər dillənmədi.

İmranın çəkmələri, sırıqlı gödəkcəsinin ətəyi palçığa bulanmışdı. O, papağını peysərinə itələyib, əlindəki balaca çubuğu oynada-oynada idarəyə sarı addımladı. Yolda Zeynəblə qabaqlaşdı.

– Axşamın xeyir, ay qonşu, hara belə? – deyə İmran gülə-gülə ona yaxınlaşdı.

Zeynəb:

– Evə, – dedi, sonra əlavə etdi. – Deyəsən, kefin doxsan doqquzdur.

– Əcəb doxsan doqquzdur! Səhərdən çöllərdəyəm.

– Yazıq arvad eşiyə çıxıb, içəri girməkdən yorulub.

İmran ciddiləşdi:

– Yaxşı, onda istəyirsən bir azca gözlə, idarəyə dəyib qayıdıram. Bir yerdə gedək.

– Mən də kooperativə gedirəm. Orada səni gözləyəcəm. Ancaq tez gəl. Ləngisən, çıxıb gedəcəm...

Zeynəb kooperativdə işini qurtarandan sonra qapıda dayanıb qızlarla xeyli söhbət elədi. İdarəyə doğru baxa-baxa gözlədi. İmranın ləngidiyini görüb, dalınca idarəyə getmək istədi, sonra fikrindən daşındı. “Kosaoğlunun sifətini görməsəm yaxşıdır”.

Bir az da keçdi. İmran gəlmədi. Zeynəb təkcə yola düşdü. “Onun ki ağzı qızışdı, gəlib çıxmaz”.

O, kəndin ortasından keçən böyük yolla evlərinə tərəf addımladı. Məktəbin yanında Kazıma rast gəldi. Qız Kazımın üzünə baxmadan ötüb keçmək istədi. Ancaq briqadir onu saxladı:

– Yenə nə olub, ay qız? Haqq-salamı havaxtdan kəsibsən?

– Sən aralıqda quyruq bulamağa başlayandan.

Kazım tutuldu, qaşqabağını salladı.

– Yenə nə olub?

– Mən hardan bilim?

– Doğrudan bilmirsən?

– Çörək haqqı, düz deyirəm.

– Arvad kimi and içməkdənsə, kişi kimi üzə söz danış. Gedib orda-burda qeybət qırıb əl altından iş düzəltmə.

– Mən nə iş düzəltmişəm ki?

– Özün yaxşı bilirsən. Kosaoğlunun çənəsinin altını mən ha kəsdirmirəm.

– Kəsdirəndə nə olar? Kişi ilə şəxsən dostam. Evinə də gedib gəlirəm. Bunun heç kəsə dəxli yoxdur. Bunu şəxsən o, bir də mən bilərəm.

– Kolxozun işini də şəxsən siz həll edirsiniz?

– Bəs kim həll eləyəsidir?

– Məni də manqabaşçılıqdan şəxsən siz çıxardıbsınız?

Kazım ürəyində sevindi: “Belə əl-ayağa düşərsən! Adamı saymayanda başına bu oyunu açarlar! İndi sənin canın mənim əlimdədir! Hara istəsəm sürüyəcəm. Heç atılıb-düşmə”. Zahirdə isə özünü bilməməzliyə vurdu.

– Yalan sözdür. Qurban qağa elə iş tutmaz.

– Amma tutub. Burda sənin də barmağın var.

Kazım Zeynəbə daha da yaxınlaşdı. Qaranlıqda onun gözləri parıldadı. Səsinə mülayim, nəvazişli bir ahəng vermək istədi.

– Bura bax, Zeynəb. Mən həmişə sənin tərəfini saxlamışam. Keçən il hər yerdə adını birinciliyə çəkdim. Amma sən mənim qədrimi bilmədin. Axır vaxt adama heç məhəl də qoymursan. Zərər yoxdur, mən yenə sənə kömək elərəm. Qoymaram səni manqabaşçılığından çıxarsınlar. Qurban qağamla şəxsən danışaram.

– Qorxuram, əziyyətə düşəsən.

– Nə əziyyəti var, özün bilirsən ki, Qurban qağam mənim bir sözümü iki eləməz. Kişinin yanında xətir-hörmətim var.

– Allah özü sizi bədnəzərdən saxlasın. Həmişə xətir-hörmətli olun. Biz də sizin kölgənizdə dolanaq.

Kazım Zeynəbin səsində aşkar sezilən kinayəni anlamadı. Xırıltılı səslə gülüb ona daha da yaxınlaşdı.

– Elə əvvəldən beləcə yumşalsan nə olardı ki? Gəl, əl-ələ verib işləyək. Onda Qurban qağamın da gözü üstümüzdə olar.

Hər ikisi susdu. Zeynəb başını aşağı saldı. Kazım bir-iki dəfə udqunub ətrafa boylandı. Nə isə demək istədi. Səsi xırıldayıb tutuldu. Zeynəb gülümsündü. Kazımın gözləri işıldadı. Dişlərini ağardıb hırıldamağa başladı. Zeynəb əvvəlcə astadan, sonra bərkdən güldü, onun qaqqıltısı getdikcə ucalıb ətrafa yayıldı. Əvvəlcə sevinən Kazım yavaş-yavaş ehtiyat eləməyə başladı. Özünü yığışdırıb soruşdu:

– Bura bax, nəyə gülürsən?

– Gülməli adama gülərlər.

– Mən gülməliyəm? – Kazım daha da ciddiləşdi. – Gəl ətəyindən daşı tök, sonra peşman olarsan.

– Bircə onu görməzsən!

Zeynəb dirsəyini göstərdi və dabanı üstündə fırlanıb cəld aralandı. Kazım papağını başına basdı.

– Yaxşı, borc olsun!

Zeynəb itləri duyuq salmaqdan qorxub çəpərin dibi ilə səssizcə yeriyirdi. Döngədəki teleqraf dirəyinin yanına qədər nəfəsini belə dərmədi. Sonra yoldan çıxıb, kəndin aşağısındakı evlərinə doğru uzanan cığıra düşdü və yalnız bu vaxt ayaq saxlayıb ətrafa göz gəzdirdi.

Çöllərdə heç kəs görünmürdü, təkcə aramsız güyüldəyən teleqraf dirəkləri, bir də quru pambıq kollarının ucları nəzərə çarpırdı...

O, üç il bundan əvvəl orta məktəbi qurtarandan sonra pambıqda işləməyə başlamış və rayonlararası yarışlara qoşularaq, öz manqası ilə birlikdə hər hektardan qırx beş sentner pambıq verməyi öhdəsinə götürmüşdü. İlk günlərdə öz-özünə inanmamış, sözünün yalan çıxacağından qorxmuşdu. Ancaq onun manqası sözünə əməl etmişdi. Bu il onlar hər hektardan əlli sentner pambıq yığmaq ümidində idilər. İndi, Zeynəbin arzu ilə yaşadığı bir vaxtda, onu öz manqasından ayırmaq istəyirdilər.

Zeynəb teleqraf dirəyinə söykənib dayandı. Yanaqlarının istiliyini, ürəyinin çırpındığını hiss etdi. Bayaqdan qəlbində coşan qəzəb birdən-birə yox oldu. Nəyinsə intizarını çəkən adam kimi, özünü na-

rahat hiss etdi, yalqızlığını yeni görürmüş kimi, ürkək baxışlarla ətrafına boylandı. Səbəbini özü də bilmədən qəlbini bir kədər bürüdü. Vahimələnən kimi oldu.

Birdən o, təəccüblə çiyinlərini çəkərək "mənə nə oldu?" – dedi. Heç nə düşünməmək, tez evə çatmaq üçün addımlarını yeyinlətdi. "Gərək İmranı gözləyəydim. Bəlkə birdən qabağıma it-pişik çıxdı?"

O, evlərinə yaxınlaşanda özünü tam yalqız hiss etdi. Birdən-birə onda İmranı görmək arzusu doğdu. Hətta İmranı tapıb "ay yalançı, niyə məni tək qoydun? Bir az tez gəlsəydin xəncərinin qaşı ha düşməzdi" – deyə danlamaq istədi. Azacıq sonra qızın qaşları çatıldı. "Mən lap gülməli olmuşam" – dedi və addımlarını yeyinlətmək istəyirdi ki, birdən arxadan kiminsə gəldiyini hiss edib geri çevrildi.

Qaranlıqda papiros işıldadı, kim isə astadan öskürdü. Zeynəb ürəyinin quş ürəyi kimi çırpındığını hiss etdi. Həmişə sevinəndə olduğu kimi, şıltaqlıq etmək arzusu doğdu. Arxasına baxmadan sürətini artırdı. İmranın yetişdiyini gördükdə saymazyana kənara çəkilərək ona yol verdi. Gələn adamın kim olduğunu bilmirmiş kimi, başını qaldırmadan onun keçib getməsini gözlədi. Lakin İmran dayandı, yavaşca onun qolundan tutub:

– Özünü palçığa salma, – deyə cığıra çəkdi.

Zeynəb qolunu onun əlindən çıxartdı.

– Zəhmət çəkmə, yalançı...

– Özün qaçıbsan. Mənim günahım nədir?

Onlar kəndin ortasından keçən, burulub bağların arasında yox olan arxın kənarına çatdılar. Zeynəb qabağa adlayıb ayaq körpüsünə yaxınlaşdı. Tir islandığından keçmək mümkün deyildi.

– Geri qayıt, sürüşüb yıxılarsan, gedək böyük körpüyə.

Zeynəb ona əhəmiyyət vermədən, körpünün üstünə çıxdı. İki addım atmamışdı ki, ayağı sürüşdü. İmran özünü yetirənə qədər qız buzun üstünə düşdü. Zərbdən sınan buz xırıldadı. Zeynəbin ayaqları islandı. İmran əl atıb onun qolundan yapışdı.

– Sözə niyə baxmırsan?

Zeynəb onun qolunu itələmədi, əksinə, ona qısıldı. İmran qızın ılıq nəfəsini öz özündə hiss etdi. Qızı sinəsinə basacaqmış kimi, özünə doğru çəkib sudan kənara çıxaranda onun titrədiyini duydu. Zeynəb əsəbiliklə gülüb qolunu onun əlindən çəkdi:

– Səndən adama xeyir gələr?

– Mənim günahım nədir, özün tərslik edirsən.
– Bir buna bax, – deyə Zeynəb islanmış ayağını göstərdi.
Onlar arxın yaxası boyunca körpüyə doğru getdilər. Susurdular. Yalnız ayaqlarının altındakı qarın xırıltısı eşidilirdi. Zeynəb körpüyə çatıb məhəccərə söykəndi. Gözlərini buzun arası ilə şütüyüb axan suya zillədi. Birdən başını qaldırıb İmrana baxdı:
– Yadına düşürmü?
İmran ani olaraq ötən günləri xatırladı. Çox vaxt gecə məktəbdən, yaxud klubdan evə qayıdanda onlar burada, körpünün üstündə yanaşı dayanardılar. Sonra Zeynəb yüngül addımlarla, arxın yaxası boyu salınmış bağa girər, ağacların arasında gah xəyal kimi görünür, gah da yoxa çıxardı. İmran sakit dayanıb qızın arxasınca baxar, Zeynəb bağın ayağındakı evlərinə girincəyə qədər onu gözdən qoymazdı. İmran yarpaqların pıçıltısını dinlər, şırıltı ilə axan suda əks edən titrək ulduzlara, saçaq-saçaq olub sallanan söyüd ağaclarının qatı kölgəsinə baxardı. İmran beləcə dayanmağı, təbiətin bu sakit gözəlliyinə tamaşa etməyi xoşlardı. O, şirin xatirələri yadına sala-sala Zeynəbə baxdı:
– Yadımdadır.
– Bəs may bayramı necə? Sən də Gəncədən qonaq gəlmişdin...
– O da yadımdadır.
Onlar yenə susdular. Zeynəb üç il bundan əvvəl keçirilən may bayramını yadına saldı.
Gözəl bir yaz günü idi. Ağaclar, çöllər, çəmənlər bir-biri ilə bəhsə girmiş kimi gül-çiçək açmışdı. Hava elə təmiz, sərin və ətirli idi ki, nəfəs almaqdan doymaq olmurdu. Bütün kənd çay kənarındakı meşəyə toplaşmışdı. Cavanlar atları qoşalaşdırır, xəndəklərdən atlanaraq tel-tel olmuş zəmilərin arası ilə çapıb gözdən itirdilər. Zurnaçılar cuşa gələrək daha da zilə çəkir, cıdıra çıxanların qayıtmasını gözləyirdilər. Oğlanlardan bəziləri atlarını zurnaçıların lap qabağında saxlayırdı. At fınxırır, yerində fırlanıb yüyəni çeynəyir, şahə qalxaraq kişnəyirdi. Al-əlvan geyinmiş qızlar çöllərə səpələnib gül-çiçək dərir, sinəsi qızaran taxılların arası ilə qaçıb laləlikdə görünməz olurdular. Hamı çalıb oynayırdı. Əlində uzun bir tənək çubuğu tutan Kərim dayı:
– Ay uşaq, dala durun, – deyə qışqırıb çubuğu hərləyirdi. Uşaqlar gülüşüb geri çəkilir, meydan böyüyürdü. Kərim dayı əvvəlcə özü qabağa düşür, çiynini çəkib dayanır və birdən əllərini qoşalayıb qaldıraraq silkələnə-silkələnə, sevdiyi "Uzundərə" havasını oynayırdı. Kə-

rim dayıdan sonra oğlanlar kəndin naz-qəmzəli, qənirsiz gözəlləri ilə ortada fırlanırdılar. Kəlağayılar dalğalanır, gözlər gülür, yanaqlar qızarırdı. Nədənsə o gün Zeynəb heç ortadan çıxmırdı. Zurnaçıları yormaq istəyirdi. Qızlar yorulub çıxdıqda Zeynəb təzəsini çağırır, arabir də kənarda durub oyunçulara tamaşa edən İmrana gizli-gizli baxırdı. Birdən Zeynəb ona yaxınlaşdı. “Oynamaqdan yoruldum” – deyə dərindən nəfəs aldı. Onlar kənara çəkilib ağacların arasında gəzməyə başladılar. Nədənsə Zeynəb susur, başqa vaxtda dil-dil ötdüyü halda, indi deməyə söz tapmırdı. İmran sükutu pozdu:

– Niyə danışmırsan?

– Nə danışım?

Söhbət baş tutmadı. Onlar yenidən susdular. Bir azdan İmran dilləndi:

– Məktəbi qurtarandan sonra hansı instituta gedəcəksən?

– Heç birinə.

– Niyə, ali təhsil almaq istəmirsən?

– Bilirsən nə var, İmran? – Mən bu qərara gəlmişəm ki, kəndimizdə qalım. Bəziləri var ki, onilliyi qurtarandan sonra nə oxumağa getmək istəyir, nə də işləyirlər. Kərim dayının sözü olmasın, qulluq axtarırlar. Amma mən kolxozda işləyəcəm.

İmran sınayıcı nəzərlə ona baxdı:

– Ancaq hər halda orta təhsil azdır.

Zeynəb onu mənalı-mənalı süzdü:

– Yoxsa ali təhsil almayan qızlar xoşuna gəlmir?

Zeynəb mənasını o qədər də fikirləşmədən dediyi sözdən qızardı. Bunu İmrana sezdirməmək üçün üzünü yana çevirib, yaxındakı çiçəyi qopartdı və başını qaldırıb döyükmüş kimi ətrafa baxdı. Dodaqlarını büzüb təəccübləndi:

– Boy, gör hara gəlib çıxmışıq, – dedi, – indi yəqin qızlar məni axtarır...

Arxın buzu çatlayıb sındı. Diksinib xəyaldan ayrılan Zeynəb, körpünün üstündə yanında dayanan İmrana baxdı. O da fikirli idi. “Görəsən nə düşünür? Bəlkə mənim onda dediyim sözü yadına salır? Bəlkə doğrudan da ali təhsili olmayan qızlardan xoşu gəlmir? Elə ona görə də...” – bu sözləri xəyalından keçirən Zeynəb çiyninə saldığı şala daha möhkəm büründü...

İşıqlar bir-bir sönür, teleqraf dirəkləri həzin-həzin güyüldəyirdi.

## 6

Hava çox gözəl idi. Axşamkı sazaqdan əsər qalmamışdı. Uşaqlar sürüşə-sürüşə məktəbdən qayıdırdılar. Bəziləri yoldan kənara çıxıb qarın təmiz yerində arxası üstə uzanır, öz şəkillərini qara salırdılar. Ağaran çöllər işıldayıb, adamın gözünü qamaşdırırdı. Camaatın çoxu kürək götürüb damların qarını kürüyürdü. Gümüşü tozcuqlar havaya qalxıb bərq vururdu. Uşaqlar malları qabaqlarına qatıb suvarmağa aparırdılar. Kənddən xeyli aralı olan düzənlikdə uşaqlar qaçışır, itlər nəyi isə qovurdu. Deyəsən, qara düşmüş dovşana rast gəlmişdilər.

Tükəzban xala səhəngini dalına alıb asta-asta arxa doğru gedirdi. O, şad idi. Qarıya elə gəlirdi ki, göyün tərtəmiz olması, neçə gündən bəri görünməyən günəşin indi parıldaması, quşların çəpərin üstünə qonub civildəşə-civildəşə özlərini günə verməsi oğlunun ayağının sayəsindədir. İki aya yaxındı ki, o, kəndə gəlmiş, özü ilə bərabər ana qəlbinə istilik gətirmişdi.

Tükəzban xala arxa yaxınlaşdı. Səhəngini düşürüb yerə qoydu. Dolçanı buzun sınmış yerindən su ilə doldurub səhəngə boşaltdı. Qabı kənara çəkib ağzını tıxacla bağladı. Getməyə hazırlaşırdı ki, uzun və gen donunun ətəyi yerlə sürünən, başını çalmalamış Gövhər qarı böyürdən çıxdı.

– Ay Tükəzban, sən də mənim kimi sonsuz ha döyülsən, nə vaxta qədər özün su daşıyacaqsan?

Gövhər qarı səhəngi açıb yerə qoydu. "Bəduğur, heç ağzını xeyirliyə açmır, elə bayquş kimi ulayır" – deyə fikirləşən Tükəzban xala acıqlı-acıqlı:

– Sonsuz niyə oluram, – dedi, – sağ olsun İmranım.

– Mən də deyirəm sağ olsun. – O, Tükəzban xalaya bir az da yaxınlaşdı. – Ay qız, kimi gözləyirsən, gözünü allah niyə yumubdur? Bu gözəl-göyçək qızların birini aparıb qoysana evə... Nə vaxta qədər su daşıyıb, ev süpürəcəksən? Dünyanı tutub durmayacaqsan ha, heç olmasa ölməmişdən nəvə gör, ay batmış! Qoy sənin də ətəyini uşaq islatsın.

Qarı xırıltılı səslə güldü. Əgər bu sözləri başqa birisi desəydi, Tükəzban xalanın ürəyinə yatar, bəlkə də o, həmin adamla ağız-ağıza verib danışar, oğlunun toyundan, nəvəsini necə oynatmaq istəməsindən söhbət açardı. Amma onun-bunun qapısında qulluqçuluq edən Gövhər qarı ilə bu barədə söhbət eləməyi o, ağlına belə gətirmirdi. Əslinə baxsan, Tükəzban xalanın elə cavanlıqdan Gövhərdən xoşu gəlməzdi.

Bu qarı ilə iki kəlmə danışdın qurtardı: gərək qulaqlarını tutub qaçasan. Tükəzban xala ona ağızucu cavab verdi.

– Hər şeyin vaxtı var.

– Bəs nə vaxt? Oğlun gələndə mən elə bildim toy eləyəcəksən. Elə qulağım səsdəydi, deyirdim bu gün, ya sabah məni çağırtdıracaqsan, məsləhləşəcəyik. İmrana özüm su sonası kimi qəşəng bir qız seçəcəm.

– Özü balaca deyil. Ürəyi kimi istəyər, onu da alar.

– Ay Tükəzban, niyə uşaq kimi danışırsan? Gədə cavandır, beyni qandır, o nə qanır yaxşı-yaman nədir? Gərək ortada mənim kimi diləvər bir adam ola ki, tükü-tükdən seçə bilə. Yoxsa, allah eləməmiş, birdən gedib eləsini alar ki, el içində biabır olarsız. Atalar nahaq yerə deməyib ki, xasiyyətini bilmədiyin atın dalına keçmə. İndi, ağrın ürəyimə, gərək qızın əslini-nəslini biləsən, qohum-əqrəbası ola. Yoxsa bildirçin kimi ortada tullanan saçıkəsik qızlardan birini gətirib qoydun evinə, ondan nə çıxar? İki gündən sonra səni saçlayıb döyər. Yox, ay Tükəzban, İmran yaxşı uşaqdır. Onun boyuna qurban olum. Gül kimi baladır. Əhd eləmişəm, gərək qızı ona özüm seçəm. – Qarı, Tükəzban xalanın qaşqabağını tökdüyünü və getmək istədiyini görüb, onun biləyindən yapışdı.

– Bircə sözümə qulaq as! Mən deyənə baxsan, zərər çəkməzsən. Kimin işinə qarışmışamsa, hamısı oğullu, uşaqlı, ev-eşik sahibi olubdur. Yoxsa inanmırsan? Xoşqədəmin oğluna qızı mən tapmadımmı? İndi pis dolanırlar? Alqazaxlıların Mədədini də mənciyəz evləndirmədimmi? Yetimin biri idi. İndi dalını dağa söykəyib. Qurban kimi bir kişinin baldızı qızını alıb. Elə yuxarı obadakı Səməd kişinin oğlunu götür, onu da mən adam eləmədimmi? Evində bir cırıq palazı da yox idi, indi sədrin “Pobeda”sında gəzir. Hələ dul Yetərin oğlunu demirəm. Hə, indi nə deyirsən? Sən bir balaca mənə him elə, sonrasıynan işin yoxdur. Ona elə bir qız tapım ki, kəklik kimi səksin. Su içəndə boğazında görünsün. Tükəzban xala lap darıxdı.

– Ay arvad, qurtar görək, – dedi, – tələsirəm, evdə işim var.

– Bir buna bax ey, beləsinə deyiblər ki, dazın daznan yatdığı, dazın da naz atdığı. Ay qız, evdə körpə uşağın var? Qoy mən də sənəyimi doldurum da.

– Di tez ol.

Gövhər qarı bir-iki dolça su götürüb səhəngə tökdü və dayanıb Tükəzban xalaya baxdı.

– Yoxsa bir gözaltın var, məndən gizlədirsən? Sonra ağlını oğurladıb dağa-daşa əl atarsan ha! İmranı mən səndən də çox istəyirəm.

“Allahın xatası, işə düşmədik... Bu imansız əl çəkməz ki!”

– Tükəzban xala ürəyində deyindi.

– Ay arvad, bircə tez ol!

Gövhər qarı tələsdi, səhəngini hıqqına-hıqqına dalına qaldırıb çatı ilə sarıdı. Yola düşəndə yenidən başladı:

– Sonra ürəyinə ayrı fikir-zad gələr. Qızım yox, ona verəm, bacım yox, evinizə göndərəm. Mən səndən ötrü deyirəm. Bir olan allah özü şahiddir ki, mən həmişə İmranı öz balam hesab eləmişəm. Maşallah, ağıllı-kamallı uşaqdır. Allah bədnəzərdən saxlasın. Tükəzban xala titrək səslə:

– Amin, – dedi.

– İndi mənim dediyim odur ki, özünə layiq bir qızla evlənsin. – O, səsinə daha mehriban ahəng verdi. – Bir-iki gün bundan əvvəl bizim Sayalını gördüm. Onun da İmrandan yaman xoşu gəlir. Deyirdi, yetişmiş qızım olsaydı, elə ona verərdim. Tükəzban xala yavaş-yavaş ehtiyat eləməyə başladı:

– Ay arvad, sən allah, belə sözləri danışıb uşağı dilə-ağıza salma.

– Bıy, başıma xeyir! Ay qız, mən nə dəyirəm ki? Xalq oğlunun tərifindən xoşlananda, bu da burun-qulaq sallayır. Bircə bunun pirinə təpik atmağına bax. Sayalının ərlik qızı olub, sənin oğluna versəydi, gərək papağını göyə ataydın. Xalq allahdan istəyir ki, elə bir adamnan qohum olsun. Kişinin adını bir karvan dəvə çəkmir, irayonla bir olub, az qalır Moskoydan bəri hər yeri ağzına götürsün. Tükəzban xala daha dözə bilmədi:

– İndi məndən nə istəyirsən, ay arvad? Nə Sayalının ərlik qızı var, nə mən ona elçi gedirəm. Daha baş-beynimizi niyə tökürsən? Hər kəs yaxşıdır öz evində. Mənə nə?

– Kiri, kiri, ay qız, bu sözünü eşidən olsa səni qınayar. Onlar doqqaza çatdılar. Tükəzban xala yaxasını qarının əlindən qurtarmaq istədi. Ancaq Gövhər qarı əl çəkmədi.

– Qoy sizin qapıdan keçib bağların arasıynan evə gedim. Bura kəsədir. Bir də palçığa bata-bata yolnan kim getsin... hə, onu deyirdim. Qoyursan ki, bir sözümü qurtarım!.. Hə...nə olar, Sayalının qızı yoxdur, baldızı qızı var. Maşallah tavus quşuna oxşayır. Cığalarının

hər birini bir oğlana dəyişməzsən. Qaşını süzüb gözünü oynadanda adamın canını alır.

Tükəzban xala birdən geri dönüb, Gövhər qarının düz gözlərinin içinə baxdı. Onun dodaqları titrədi:

– Bir də bu sözü ağzına alsan, ağbirçəkliyinə baxmaram. Eşitdinmi? Bir daş altda, bir daş üstə. Yoxsa gen dünyanı başına dar elərəm!

Qarı səsini xırp kəsdi, cücə gözlərini oynadıb mat-mat baxdı. O, elə bilirdi ki, bu sözü eşidən kimi Tükəzban xala onun əl-ayağına düşəcək, "amanın bir günüdür, bunu düzəlt!" – deyəcək. Amma tərsinə oldu.

– Yaxşı, yaxşı, aləmi başına tökmə, görək. Bir sözdür dedim. Xata ha olmadı. Bir də, elə onu sənin oğluna verən vardı.

Onlar həyətə girdilər.

Gövhər qarı hıqqana-hıqqana səhəngini düşürüb pilləkəndə oturdu.

– Yaman yoruldum. Bir az dincimi alıb gedəcəm.

Nərgiz müəllimə həyətə çıxdı. Əlində balta vardı.

– Qızım, neyləmək fikrindəsən?

– Bir az odun yaracam.

– Sən bacarmazsan. Əlini-ayağını kəsərsən! İmran gəlib özü yarar.

– Zərər yoxdur. Qoy mən də öyrənim.

– Yaxşı, özün bil. Amma ehtiyatlı ol.

Nərgiz müəllimə çardağın altındakı odunlardan birini götürüb kötüyün üstünə qoydu. Çətinliklə də olsa yarmağa başladı. Taqqıltını eşidən Zeynəb çəpərin yanında göründü və cəld qarı yara-yara Nərgizə yaxınlaşdı. Bir qədər sakitcə dayanıb müəllimənin odunu necə yarmağına tamaşa etdi.

O hər dəfə baltanı endirəndə odunun bir yerinə dəyirdi. Bunu görən Zeynəb:

– Ay Tükəzban xala, mişarı bəri ver, – dedi və üzünü Gövhər qarıya çevirdi: – Ay imansız, sən burda nə gəzirsən? Yenə hansı küpə girəcəksən?! Qarı qorxusundan səsini çıxartmadı. Zeynəb sualını bir də təkrar edəndə dilləndi:

– Qoysana bir az nəfəsimizi dərək, ay günü ağ olmuş, yorulmuşam, daha dizlərim taqətdən düşüb...

Zeynəb mişarı götürüb Nərgiz müəllimə ilə üz-üzə dayandı.

– Mişar çəkmək bilirsənmi?

– Bilməsəm də öyrənərəm.

– Başa düşmürəm, şəhər qızları niyə belə olur? – deyə Zeynəb güldü. Onlar mişar çəkməyə başladılar. Elə bu vaxt İmran gəldi. Qızlara tamaşa edib gülümsündü:

– Hə, qoçaqlar, görüm hansınız üstələyəcəksiniz. Nərgiz müəllimə qızarıb başını aşağı saldı.

Zeynəb:

– Evdə sənin kimi kişi olanda, odunu biz yaracağıq da, – dedi.

– Bəh-bəh, ayda, ildə bir dəfə şeytanın ayağını sındırıb iş görürsən, onu da dava-şava ilə.

İmran geri dönərkən, eyvanda oturan Gövhər qarını gördü:

– Xoş gördük, ay nənə, niyə burda oturmusan, keç içəri.

– Sağ ol, ömrün uzun olsun. İndicə durub gedəcəm. Yenə Zeynəbin səsi eşidildi:

– Zarafata salma, gəl odun yar.

İmran pencəyini çıxarıb məhəccərin üstünə atdı. Yaxınlaşıb mişarı Nərgiz müəllimədən aldı:

– Di möhkəm dur! – deyə Zeynəbi sınayıcı nəzərlə süzdü.

Mişar cingildəməyə, qarın üstünə ovuntular səpələnməyə başladı. Odunlar doğrandıqca Zeynəbin yanaqları qızarırdı. O yorulsa da, üstünü vurmurdu. İmran gözaltı onu süzür, oğrun-oğrun qımışırdı. Bir azdan Nərgiz müəllimə Zeynəbi əvəz etdi. Ancaq tez yoruldu, mişar ağırlaşmağa başladı. Elə bu vaxt İmranın boynuna yüngül bir qar topası dəydi. O üşüyüb boynunu qısdı, dönüb dala baxdı. Zeynəb dirəyin arxasında gizləndi:

– Mən deyildim.

İmranın yerdən qar götürdüyünü gördükdə, qız əllərini üzünə tutdu.

– Qurban olum, vurma, bir də dəymərəm.

İmranın qolları boşalıb yanına düşdü. Nərgiz müəllimə ətəklərini çırpıb, pörtmüş halda belini düzəltdi və Zeynəbin dirəyin arxasından parıldayan gözlərinə baxdı. Gövhər qarı ağır-ağır yerindən durdu, səhəngini götürüb hıqqandı, Nərgiz müəllimə ilə İmranı gözaltı süzüb, eyvanda ocaq qalayan Tükəzban xalaya mənalı bir nəzər saldı.

– Ay qız, ay bəxti qara gəlmiş, olmaya...

O, sözünü qurtara bilmədi. Tükəzban xalanın qəzəbli baxışlarını görüb səsini içinə saldı...

# 7

Kosaoğlu oturmaq istəmədi. Otağın ortasında dayanıb, etinasızcasına divardakı şəkillərə, kitab şkafına, qalaq-qalaq yığılmış qəzetlərə, kitabçalara baxdı. O özünü elə aparırdı ki, guya buraya təsadüfən gəlmiş və bir-iki dəqiqədən sonra çıxıb gedəcəkdir. Nəsib dayı da ona fikir vermir, qəzetləri çevirib nə isə axtarırdı. Onlar zahirən özlərini nə qədər laqeyd aparsalar da, bir-birini gizlin-gizlin süzür, hər kiçik hərəkəti belə gözdən qoymurdular. Kosaoğlu idarədəki qəzet və kitabları nəzərdən keçirdikdən sonra acı-acı gülümsədi. "Bu kişi təzədən alimmi olacaq, bu qədər kitab-dəftəri neyləyir?" – deyə fikirləşdi. Özünü saxlaya bilməyib soruşdu:

– A Nəsib, bu kağız-kuğazla əlləşməkdən doymadınmı? Elə mən gözümü açandan səni belə görmüşəm.

Nəsib dayı Kosaoğlunu yenicə görürmüş kimi dedi:

– Niyə ayaq üstə durursan? Otur, bir az söhbət eləyək.

– Nə söhbət eləyəcəyik?

– Tapılar. O qədər iş-güc var ki.

Kosaoğlu könülsüz stul çəkib əyləşdi. Nəsib dayı stolun siyirməsini açıb papiros çıxartdı. Papirosu barmaqları arasında tutub fikirli-fikirli yumşaltmağa başladı. Deyəsən, söhbətə necə başlayacağını bilmirdi. Əlbəttə, o birdən-birə əsl məsələyə keçə bilərdi, ancaq belə etmək istəmirdi. Ümumiyyətlə, Nəsib dayı sözün, təbliğatın gücünə inanırdı. O həmişə ən çətin, mübahisəli məsələləri də sakitliklə həll etməyi lazım bilirdi. Onun əqidəsincə, bəzi adamlar iş başına keçəndə, onlara verilən hüquq və imtiyazları görərkən özlərini itirir, bütün bunların nə üçün verildiyini, xalqa xidmətin, xalq etimadının nə demək olduğunu unudurlar. Onlara elə gəlir ki, hamıdan güclü və ağıllıdırlar. Özlərini yüksək rütbədə görəndə gözləri ayaqlarının altını seçmir, başları hərlənir və gec-tez bu bədgümanlığın qurbanı olurlar. Nəsib dayı düşünürdü ki, vəzifədən havalanmaq, bəzən iş üçün çox faydalı adamları belə məhv edir. Buna görə də özünün dediyi kimi, "yolunu azmış adamları" hövsələ ilə başa salmağa çalışırdı. O, Kosaoğlunu da bu cür yolunu azan adamlardan hesab edirdi.

O bir neçə dəfə Kosaoğlu ilə təklikdə söhbət eləmişdi. Lakin görünür, deyilən sözlər təsirsiz qalmışdı. İndi Nəsib dayı Qurbanla

axırıncı dəfə söhbət eləmək istəyirdi. Amma söhbəti haradan başlayacağını bilmirdi. Uzun sükut Kosağlunu darıxdırdı.

– Ə, nə fikrə gedibsən?

– Heç, ötən günlər yadıma düşdü.

Nəsib dayı papirosunu çəkib dərindən nəfəs aldı.

– Səndən bir şey soruşmaq istəyirəm.

– De görüm!

– Camaatın hörmətini necə qazanmaq olar?

Gözlənilməz sual Kosaoğluna yersiz və gülməli gəldi.

– Bu nə deməkdir, zarafat eləyirsən?

– Yox, düz sözümdür.

Kosaoğlu diqqətlə müsahibinə baxdı və laqeydliklə sözə başladı:

– Deyəsən, sən dünyadan xəbərsizsən. Nə hörmətbazlıqdır, ə! Dünyada heç kəs heç kəsə boş-boşuna hörmət eləməz. Kim ki birindən asılıdır, ona işi düşüb, ondan qorxur, hörmət də eləyir. Uşaq nədi, ona da gözünü ağartmasan, sözünə baxmır. El içində hörmətinin olmasını istəyirsənsə, gərək özünü göstərəsən, gərək səni saysınlar. Boş yerə deməyiblər ki, ilan ulduz görməsə ölməz. Yoxsa işmi gedər? İllah da bizim camaatla...

– Sənin sözündən belə çıxır ki, hamını döymək, qorxutmaq lazımdır?

Kosaoğlu Nəsib dayının söhbəti hara gətirəcəyini duyub ehtiyat etdi:

– A kişi, sən mənim sözümü niyə pis yerə yozursan? Mən deyirəm ki, gərək böyük-kiçik olsun. Səni iş başına qoyanda bir az zəhmli olasan. Mənim ölüvay adamdan xoşum gəlmir.

– Evdə də beləsən?

– Necə?

– Uşaqlarını qorxudursan?

– Nə demək istəyirsən?

– Bilmək istəyirəm ki, sənin uşaqların səni sevirmi?

– Uşağın ağzı nədir atasını sevməsin, ə! Mənim yanımda cınqırlarını çəkmirlər! Bir dəfə gözümü ağardanda siçan deşiyini satın alırlar.

– Sən də buna məhəbbət deyirsən?

Kosaoğlu çiyni atıla-atıla güldü.

– Ay Nəsib, sən də lap gülməli adamsan. Bu sözləri bir evli-eşikli, arvadlı-uşaqlı adam desəydi, dərd yarı idi. Mən də deyərdim başına gəlib. Ə, Həcdən gələn mən, xəbər verən sən?

Nəsib dayı azca tutuldu. Kosaoğlunun nəyə işarə etdiyini anlasa da, üstünü vurmadı və birdən-birə söhbəti dəyişdi:

– Əsgərlikdə olduğun günləri yada salırsanmı?

Kosaoğlu diksindi. Bir-iki dəfə udqundu, gözlərindən ani bir kölgə keçdi.

– Nə olub ki?

– Komandirlərin yadındadırmı?

– Olanı da var, olmayanı da.

– Hansı komandiri çox sevirdiniz?

Kosaoğlu sakitləşdi.

– Kombatı.

– Niyə?

– Necə niyə? Yaxşı adam idi. Həmişə saldatın dərdinə qalırdı. Onun səsi gələndə aşpazlar tir-tir əsirdilər ki, xörək pis olsa, atamızı yandıracaq. Çox vaxt da elə bizimlə yeyib-içirdi.

– Demək, camaatla öz arasında ayrı-seçkilik qoymurdu, ona görə də hörmət eləyirdiniz?

– Heç, bir sözünü iki eləyən vardı ki!..

Nəsib dayı kələfin ucunu tapıb sevindi:

– Bəs sən neyləyirsən? Heç xəbərin varmı ki, camaatdan ayrı düşübsən?

– Səhərdən mus-mus deyincə, bir yolluq Mustafa de, mən də başa düşüm də.

– Dərd ondadır ki, başa düşmək istəmirsən!

– Mən neyləmişəm ki, ə? – Kosaoğlu əsəbiləşdi. – Kimdən geriyəm? Planı vaxtında doldurmuşam? Hazırlıqları vermişəm? Daha nə istəyirsən? Rayonda hamı mənim kolxozumu tərifləyir, sən də gündə cəfəngiyat açırsan! Mən səndən ötrü uşaq-muşaq deyiləm ki, hər gün üzümü danlayasan. Mən öz işimi çox yaxşı bilirəm.

– Plan... Bir şey olan kimi plandan yapışırsan. Əvvəla, o planı sən ödəməyirsən. İkinci, plan ödəməklə iş qurtarmır. Əsas məsələ plan ödəyən camaatın qeydinə qalmaqdır.

– Ə, elə mən də camaatdan ötəri çalışmırammı?

– Çalışmağına sözüm yoxdur. Amma, axı biz belə danışmamışdıq. Özün mənə dedin ki, Nəsib, gəl əl-ələ verək, işləyək. Məsləhətsiz iş görməyək. Amma belə getsə, deyəsən, aramız dəyəcək.

– A kişi, ortada nə var ki, dava-dalaşdan söz salırsan? Bir də mən belə şeylərdən qorxan deyiləm. Nə olub?

– O gün Kərim kişini niyə bihörmət edibsən, heç sənə yaraşarmı?

– Günah özündə oldu.

– Yox, Qurban, günah bizdədir. Axı, camaat bizə ümid eləyir. Bizi özünə ağsaqqal seçib. Anbar dolu ola-ola, indiyə qədər taxıl niyə paylanmasın? Niyə Kərim kişi əlində ərizə səndən avans istəsin, sən də ona artıq-əskik söz deyəsən? Axı onun anbarda halalca taxılı var. Heç bilirsənmi sənin bu hərəkətlərin hara aparıb çıxardır?

– Hara aparıb çıxardır?

– Düşmənçiliyə!.. Sən belə hərəkətlərinlə camaatı partiyamızdan, dövlətimizdən narazı salırsan. Bu saat bütün diqqət kəndə, kolxozlara verilir. Yeni maşınlar, mütəxəssislər göndərilir. Sən isə söz deyəndə sinənə döyürsən, deyilənə qulaq asmırsan.

– Sən də hər şeyi şişirtmə görək. Kərim kişi köhnənin demaqoqudur.

– Yox, Kərim kişi demaqoq deyil. O, sözü adamın gözünün içinə deyir. Sənin də bundan xoşun gəlmir. Tənqidi sevmirsən, çünki yarana toxunur.

– Tənqidi kim sevir ki, mən də sevəm?

– Sevmirlər, ancaq nəticə çıxardırlar. Bəs Zeynəbi niyə manqabaşçılığından çıxardıbsan?

– Ay Nəsib, sən də adam sözü danış. O ki allahın dəlisidir.

– Qurban, adam da elə qoçaq qıza dəli deyərmi? Kosaoğlu başını aşağı salıb papirosunu sümürdü. Nə cavab verəcəyi haqda fikirləşdi. Əvvəlcə qalxıb getmək, “sən kimsən ki, mənim işimə qarışırsan, sədr mənəm, özüm bilərəm” – demək istədi. Ancaq fikrindən daşındı. Axır vaxtlar o, yeri gələndə ehtiyatla iş görməyin lazım olduğunu yəqin etmişdi. Buna görə də kimlə, harada nə cür danışmağı ölçüb-biçirdi. Tez-tez “ovu barəsində vurmaq lazımdır, – deyirdi. – Yoxsa hər şey korlanar. Dünya siyasət dünyasıdır”. O indi də siyasət işlətməyi lazım bildi. Çünki partiya təşkilatçısı ilə aranı vurmaq istəmirdi. O, Nəsibin yumşaq xasiyyətli olsa da, yeri gələndə sözündən dönmədiyini çoxdan bilirdi. “Nəsib koramal kimi adama dəyməz, dəyəndə də tas-tas edər”. Kosaoğlu fikirləşdi ki, arada söz-söhbət olsa və bunlar rayona gedib çıxsa pis olar. “Sabah mənim namizədliyimi bir yerə versələr, irəli çəksələr, ağzıgöyçəyin biri bunları yada sala bilər. Çibin murdar olmasa da könül bulandırır”. Son vaxtlar, belə məsələlər meydana çıxanda

Kosaoğlu deyirdi: “Evimizin sirrini niyə çölə salaq?” O çalışırdı ki, qazandığı ad-san, hörmət yox olmasın.

O sakitcə:

– Yaxşı, indi mən neyləyim? – dedi. – Sən də partkomsan.

Nəsib dayı, sözlərinin ona necə təsir etdiyini yoxlayırmış kimi diqqətlə Kosaoğluna baxdı. Əlindəki sönmüş papirosu peçin içinə atdı.

– Mən hər şeydən əvvəl, məsləhət görürəm çox oxuyasan. Bir qəzetlərə bax, jurnallara bax, gör dünyada nələr olur.

– Məni də öz gününəmi salmaq istəyirsən? – deyə Kosaoğlu gülüb vəziyyətdən çıxmaq istədi. – Bilsəm ki, oxumaqla kolxozun işi düzələcək, gecəni gündüzə qataram.

– Zərər çəkməzsən, işə də köməyi olar.

Kosaoğlu bu söhbətdən darıxdı.

– Yaxşı, deyirsən Zeynəb öz yerində qalsın, hə? Axı mənim ondan zəhləm gedir. Elə dəli keçi kimi ortada hərlənir. O gədəni də yoldan çıxardır. Hara gedirəmsə bir yerdə görürəm. Qulağıma artıq-əskik söz dəyir. Deyəsən, İmran da ona uyub. Öz iş-gücünü bir yana buraxıb, dərə-təpə gəzir. Nə bilim bağ belə gəldi, bostan belə getdi, klub yoxdur, anbar açılmır. Axı ona nə var? Bunların hamısını onun qulağına pıçıldayan Zeynəbdir. Ağzını farağat qoymur. Bilmirəm, sən də onun nəyinə aşiq olmusan?

– Yaxşı işləməyinə. Keçən il ən qabaqcıl manqabaşçısı olub. Sən nahaq yerə ara sözlərinə fikir verirsən. O çox təmiz uşaqdır. Nə əsasla onu işdən çıxardırsan? Onu iclas təsdiq eləyib.

– Briqadirlə yola getmir.

– Kazımlamı?

– Bəli.

– Kazımın özünü yoxlamaq lazımdır.

– O, mənim sağ əlimdir. Ona heç kəs toxuna bilməz.

– Lazım gəlsə toxunarıq.

– Hələ mən ölməmişəm.

Kosaoğlu ayağa durdu, kürkünü çiynində silkələyib düzəltdi. Nəsib dayı onun getmək istədiyini görüb:

– Otur, – dedi, – hələ söhbətimiz qurtarmayıb.

Kosaoğlu lampaya yaxınlaşdı, damağındakı papirosu çıraqdan yandırıb yenə öz yerində oturdu. Bir-iki qullab vurub ayağını ayağının üstünə aşırdı və arxayın-arxayın soruşdu:

– De görüm, nə istəyirsən?
– Zeynəb öz yerində qalacaq.
– Sonra?
– Kərim kişinin taxılını verəcəksən.
– Sonra?
– Bir də onu camaatın içində təhqir eləməyəcəksən.
– Təhqir yox, canını da alacam.
– Buna ixtiyarın yoxdur.
– Var. O, demaqoqun biridir.
– O, bu kolxozda can qoyub.
– Can qoysaydı, ac qalmazdı.

Nəsib dayı artıq dözə bilmədi. Özü də hiss etmədən əlini stola çırpdı.

– Qurban, bəsdir! Kərim kimilərini ac qoyan sənsən!
– Kim, mən?
– Bəli!

Kosaoğlu ayağa durdu. Çiynindən sürüşüb düşən kürkünü geydi. Papirosunu hirsli-hirsli sümürdü. Tüstü burun pərələrindən fısıltı ilə bərabər bayıra çıxdı.

– Mən ona borcluyam? Canı çıxsın işləsin.
– O işləyir, ancaq haqqını yeyirsiniz.
– Belə de, indi məsələ aydındır. – O, papirosu axırıncı dəfə sümürüb yerə atdı. Kötüyü dabanı ilə tapdalayıb söndürdü. Səsinə və hərəkətlərinə təmkin verdi. – Bura bax, Nəsib, mənim artıq-əskik danışan adamlardan zəhləm gedir! Məsləhət bilirəm ki, ağlını başına yığıb mənimlə düz dolanasan. Mənə Kosaoğlu deyərlər. Bu kolxoz mənimdir, mən nə istəsəm, o da olacaq.
– Yox, daha olmayacaq.
– Necə, yoxsa mənim əleyhimə birləşib intriqa düzəldirsiniz? Məsləhət bilmirəm, Nəsib, xeyir tapmazsınız.
– Mənə hədə-qorxu gəlmə. Qurban, sənin dediyinlə yox, qanunla iş görəcəyik. İndi ki mənim sözlərim ağlına batmır, onda məsələni ümumi iclasda müzakirə edərik.
– Nə iclasbazlıqdır, ə, bu köpəkoğlunun kolxozunun sədri mənəm, yoxsa sən?
– Sənsən.
– Bə, onda sən kimsən ki, mənə göstəriş verirsən?
– Bu mənim borcumdur.

Kosaoğlunun dodaqları xeyli titrədi. Kürkünü geymiş olsa da, adəti üzrə çiyinlərini tərpədib onu düzəltmək istədi. Əlini cibinə atıb papiros qutusunu çıxartdı. Sonra nə isə fikirləşib açmadı. Qaytarıb yenidən cibinə qoydu. Gözünü Nəsib kişiyə zillədi. O da baxışlarını yayındırmadı. Döyüşə hazırlaşan buğalar kimi üz-üzə dayandılar. Elə bil ki, hər ikisi buynuzlaşmazdan əvvəl öz gücünü yoxlamaq istəyirdi. Kosaoğlu gördü ki, Nəsib kişinin baxışları aydın və kəskindir. Kirpiklərini qırpmadan baxır. O da özünü şax tutmaq istədi, ancaq bacarmadı. Gözləri bulandı, bəbəklərində ürkək bir kölgə oynadı. Ancaq bu, uzun sürmədi. Kosaoğlu özünü toxtatdı və büzüşmək üzrə olan qamətini düzəltdi. Yenə əvvəlki kimi amiranə bir görkəm aldı. İçini arıtlayıb bərkdən öskürdü.

– Neylək, aləmi çaxnaşdır, görək kimə nə olacaq, altda qalanın canı çıxsın. Kosaoğlu iri addımlarla qapıya yaxınlaşdı. Cəftədən yapışmazdan əvvəl dönüb bir də Nəsib kişiyə baxdı. Alt dodağını dişi ilə sıxıb, səyriməyi güclə saxladı.

* * *

İmran idarədə olan söhbətləri unuda bilmirdi. Kərim kişinin eyhamlı danışması, Kazımın qocanın üstünə qışqırması, Kosaoğlunun ərizəni cırıb kişini idarədən qovması İmranın yadından çıxmırdı. Bütün bunlar nə demək idi? Doğrudanmı Kosaoğlu pis işləyirdi? Buna inanmaq olardımı? Axı onu nəinki rayonda, hətta respublikada da tanıyırdılar. Rayondan bir nümayəndə gələndə birinci növbədə ona baş çəkər, tarlaları onunla birlikdə dolaşıb düşərgələrə baxardı. Müxbirlər neçə dəfə Kosaoğlunun çıxışını mərkəzi qəzetlərdə vermişdilər.

İmran kəndə gələndən sonra özü də çöllərə getmiş, səliqə ilə tikilən tarla düşərgələrinə, at tövləsinə, hətta fermaya da baş çəkmişdi. Bəs Kərim kişi niyə belə narazılıq edərdi? Zeynəb nə üçün tez-tez Kosaoğlu haqqında atmacalı sözlər deyirdi? Nə olar, hərənin bir cür xasiyyəti var. Yaşa dolmuş adamdır, özü demişkən, bir az kəmhövsələ olub. Bir də, bəlkə doğrudan da iş-güc onu yorub? Bəs o artıq yer əkmək söhbəti nə idi? Axı İmran Kərim kişini də yaxşı tanıyırdı. O, deyəndə ki, bizim kolxozun torpağında hər hektardan səksən sentner pambıq götürmək olmaz, demək, bir şey bilirdi. Kərim kişi ona demişdi ki, oğul, Kosaoğlu hökumətin verdiyi plandan artıq o qədər yer əkdirir ki,

payız olanda pambığı yığa bilmirik. İdarələri bağlayırlar, hamını işdən-gücdən edib çölə tökürlər, məktəb uşaqlarını da dərs oxumağa qoymurlar. O öz-özünə düşünür, bu cür avralçılığın səbəbini kolxozda kənd təsərrüfat maşınlarından pis istifadə edilməsində görürdü. Hərgah pambıqyığan maşınlardan geniş istifadə edilsəydi, bunlar olardımı?

Kərim kişi isə məsələni başqa cür izah edir: "Gücümüzə görə yer əksək, əkdiyimizi də adam kimi becərsək belə olmaz". Hətta o bir dəfə söhbətinin axırında gözünü qıyıb İmrana baxmış və mənalı-mənalı gülümsünmüşdü. "İndi ciyərli bir oğul istəyirəm ki, döşünü qabağa verib hər şeyi açsın, raykoma desin ki, sənin tərifli Kosaoğlunun kolxozunda iş düz aparılmır. O da inanmasa, Bakıya, lap mərkəzə getsin".

Bu cür söhbətlər İmranı rahat buraxmırdı. Ancaq o qəti qərara da gələ bilmirdi. O, kəndə gələndən sonra bir neçə qonaqlıqda olmuş, kəndin bəzi məclislərində iştirak etmişdi. Orada eşitdiyi söhbətlər də onu çaşdırırdı. O, bir çoxlarının Kosaoğlunun başına and içdiyini görmüşdü. "Dişli adamdır", "müharibədə kəndi saxladı", "rayonda kişinin ad-sanı var", "heç kəs onun qabağına çöp sala bilməz". "Bu cür sözü ötən sədrimiz olmasa, işimiz yeriməz" kimi sözləri az eşitməmişdi. Hətta bir dəfə qəribə bir hadisənin şahidi də olmuşdu.

İmran rayon mərkəzinə getmişdi. Bazar günü olduğundan, şəhərdə adam çox idi. Üzünü qırxdırmaq üçün dəllək dükanına girdi. Növbə saxlayıb, özünə oturmaq üçün yer tapdı. Qəzetlərdən birini götürdü.

Birdən içəridəkilər ayağa durdu. Dəlləklər işlərini dayandırıb qapıya tərəf baxdılar. İmran da qəzeti yerə qoyub qeyri-ixtiyari ayağa durdu. Kosaoğlu qapı ağzında dayanıb gülümsünürdü. Ona yer göstərdilər. Kürkünü çiyindən götürdülər. Növbəsiz, üzünü qırxdırmağa icazə verdilər. Kosaoğlu ərklə güzgü qabağında oturdu. Usta onun tüklənməkdə olan başını sabunlayıb ülgücləyincə, beş-altı adam ayağa durub həmin dəlləyə yaxınlaşdı. İmran bir neçə iyirmibeşliyin xalatın cibinə qoyulduğunu gördü.

Kosaoğlu əlini təmiz qırxılmış başına çəkdikdən sonra ayağa durdu. Saat zənciri sallanan məxmər köynəyinin döş cibini açıb bir əllilik çıxartdı. Dəllək gülümsünüb baş əydi:

– Zəhmət çəkməyin, pulunu artıqlaması ilə veriblər.

– Ə, kim? – deyə Kosaoğlu amiranə səslə soruşdu.

– Nə çoxdu dostunuz...

Kosaoğlu gözucu içəridəkiləri süzdü.

– Zərər yoxdur, bunu da al, mən başımın qiymətini bilən adamam.

O, əlliliyi dəlləyə verib bayıra çıxanda kim isə "yaman cahi-cəlallı kişidir" dedi.

İmran bütün bunları xatırlayır və heç nə başa düşə bilmirdi. Bu nə idi? Doğrudanmı hamı ona hörmət edirdi?

Bir gün İmran çöldən qayıdanda Nəsib dayıya yoldaş oldu. Onlar kolxozun işindən, gələcək planlardan xeyli danışdılar. Nəhayət, İmran neçə vaxtdan bəri ürəyini deşən sözü açdı.

– Nəsib dayı, Kosaoğlu necə adamdır?

– Nə olub ki, – deyə kişi təəccüblə soruşdu.

– Heç bir şey olmayıb, elə belə, bilmək istəyirəm.

– Bir az tündməcaz olsa da, qoçaq adamdır. Camaatın ürəyinə girib.

– Doğrudanmı?

– Yoxsa şübhə edirsən. Kosaoğluna inanmırsan?

– Bəs siz inanırsınız?

Nəsib dayı qəti verilmiş suala qətiyyətlə cavab vermədi, sakitcə: – Biz bir-birimizi çoxdan tanıyırıq, – dedi.

**8**

İmranı pis qarşılamadılar. Doqqazda görünən kimi Şahnaz eyvandan düşüb kəlağayısının ucları yellənə-yellənə onun qabağına gəldi. Gülə-gülə salamlaşdı və kənara çəkilib İmrana yol verdi.

– İt bağlıdır, qorxma...

İmran yanaşı gedə-gedə Şahnazı gözaltı süzdü. Onun kəlağayısı sürüşüb çiyninə düşmüşdü. Zil qara saçları tən ortadan ayrılmışdı. Əynindəki zolaqlı qırmızı jaket köksünü sıxırdı. Qız yeridikcə, sinəsini yarıb irəli çıxan döşləri jaketin altında titrəyirdi. Havanın soyuqluğuna baxmayaraq, Şahnaz corab geyməmişdi. Ətli baldırları qızarmışdı.

Şahnaz açıq qollarını ata-ata yeriyib, boynunu yana əyərək, gözünü İmrana zilləyib qımışırdı.

– Nə yaxşı gəldin, mən dedim gəlməzsən.

– Niyə? – İmran təəccüblə onun üzünə baxdı.

Şahnaz utancaq qızlar kimi başını aşağı salıb həyalandı.

– Nə bilim.

Onun əzildiyini görən İmran ürəyində "keçmə qızların bu xasiyyətindən" – dedi, sonra ucadan əlavə etdi:

– Çağırılan yerə ar eləməzlər.

– Eləmi? – deyə Şahnaz səsini uzatdı və dayanıb İmrana baxdı. Onun gözlərindəki qaynarlıq İmranın nəzərindən yayınmadı. Şahnaz həmişə oğlanlarla danışanda etdiyi kimi, dilinin ucu ilə dodaqlarını islatdı və alt dodağını büzüb gülümsündü. Yanaqlarında qırmızı ləkələr əmələ gəldi. Gicgahlarındakı zəif damarlar qabarıb tez-tez vurmağa başladı.

– Mən səni çoxdan gözləyirdim. Elə Sayalı bibim də istəyirdi səni qonaq çağırsın. Axırda yenə dayım qoçaq çıxdı. Bizdən qabağa düşdü.

Onlar eyvana çatdılar. Ətli-canlı Sayalı irəli yeriyib ərklə İmranın boynunu qucaqladı.

– Maşallah, yekə oğlan olubsan, torpağı sanı yaşayasan, lap atan Səmədin yerini tutubsan. Bəxtəvər Tükəzbanın daha nə dərdi var?! Neçə vaxtdır kənddəsən, bəs bizə niyə gəlmirdin? Yoxsa qorxursan gözümüz dəyə, hə? Ay qırışmal, adam bir az böyüyəndə uzaq gəzər? Yad da deyilik. Ürəyin nə vaxt istəyir, gəl də, get də. Elə gərək dilimizlə çağıraq? Qurban qağan da axşamlar evdə tək olur. Gəlin oturun, çaydan-zaddan için. Bilirəm, şəhər adamısan, darıxırsan. Radiomuz da var. Nə vaxt ürəyin istəsə gəl qur, qulaq as. Keç içəri. Elə Qurban qağan da içəridədir, oturub səni gözləyir. Ay qız, Şahnaz, gəl İmranın paltosunu tut. Şahnaz qımışa-qımışa İmranın paltosunu aldı. Sayalı qızı yenicə görürmüş kimi başdan-ayağa süzdü.

– Ay dəli, əyninə paltar geysənə, bu soyuqda baldır-başı açıq niyə gəzirsən? Üşümürsənmi?

Şahnaz yerində yırğalanıb, dabanı üstə geri döndü. Hörükləri kürəyinin ortasında oynadı.

– Niyə üşüyürəm, qocalmamışam ha...

O, ləngər vura-vura o biri otağa keçdi. Sayalı qapını açdı.

– A kişi, qonaq istəmirsənmi, bir dur bax, gör kim gəlib.

Kosaoğlu qapıya doğru qanrıldı və radionu söndürüb ağır-ağır ayağa qalxdı. İmranla görüşdü.

– Keç, a bala, yuxarı adla. Harada oturaq? İstəyirsən döşək saldırım, elə gəbənin üstündə əyləşək. Mənim mütəkkəyə dirsəklənməkdən yaman xoşum gəlir. Elə gəbənin üstündə bir-iki çay içib söhbət elərik.

– Nə cür istəyirsiniz.

Kosaoğlu bir az duruxdu. Yerə döşənmiş gəbələrə, stolun ətrafına düzülmüş stullara baxdı.

– Yaxşı, qoy sən deyən olsun. Stulda oturaq. Görürəm şəhərli olub gedibsən. Yəqin bardaş qurmağı da yadından çıxardıbsan.

Onlar stul çəkib qabaq-qabağa əyləşdilər. Kosaoğlu yavaşca papiros eşməyə, İmran otağı nəzərdən keçirməyə başladı. Divarlara vurulmuş xalçaların üstündən cürbəcür şəkillər və işləməli tikişlər asılmışdı. Balıq bədənli qızlar, uzunboğaz hacıleyləklər, topla oynayan pişiklər... Görünür, Şahnaz öz zövqünə görə tikdiyi tikişləri və şəkilləri bir-birinə yaraşdıraraq divardan asanda da heç kimlə məsləhətləşməmişdi. Bir az aşağıda çoxlu foto-şəkil vardı. İmran müxtəlif şəkillər içərisindən əllərini çarpazlayaraq sinəsinə dayamış Şahnazın ona baxdığını gördü. Qızıl dişinin parıltısı da nəzərə çarpırdı. Ondan sağda Kosaoğlunun, Sayalının, uşaqların və İmranın tanıya bilmədiyi başqa adamların şəkilləri vurulmuşdu. Evin içi başdan-başa gəbə ilə döşənmişdi. Aşağı küncdə güzgülü paltar şkafı, onun yanında müxtəlif şüşə qablarla dolu bufet qoyulmuşdu. Pəncərə tərəfdə batareya ilə işləyən “Rodina” radioqəbuledicisi yerləşdirilmişdi.

Kosaoğlu gözaltı İmranı süzüb gülümsündü. Sanki öz cah-cəlalı ilə onu heyran etdiyindən həzz alırdı.

Qapı açıldı. Şahnaz stolun ətrafında dolanıb bufetə doğru getdi. Otağı ətir bürüdü. O indi dikdaban qara lak ayaqqabı, nazik corab və son dəbdə tikilmiş şifon don geyinmişdi. Elə bil onun beli bayaqkından xeyli nazilmişdi, gözəlləşmişdi. Bu nazik paltarda qızın titrəyən bədəni, ağ, ətli qolları daha qəşəng görünürdü. Bacısı qızını gözdən keçirən Kosaoğlu özünü saxlaya bilmədi:

– A bala, yaylamayıbsan ha, əyninə özgə paltar geyinsənə!

– Heç nə olmaz, istidir, – deyə Şahnaz bufeti açıb qabları cingildətdi. O fırlanıb otaqdan çıxarkən Kosaoğlu yenə dilləndi:

– Bibinə de, çaydan-zaddan qoysun.

– Özüm hamısını bilirəm.

Ortalığa yenə sükut çökdü. İmran nə üçün çağırıldığını düşünür, ona göstərilən bu mehribanlığa bir məna verə bilmirdi. Kosaoğlu isə söhbətə necə başlayacağını fikirləşdi. Arada Şahnaz otağa gəlməsəydi, onlar uzun zaman beləcə qalacaqdılar. Şahnaz, əlində iri bir albom, içəri girdi. Üzünü dayısına tutub dedi:

– Bu saat hər şey hazır olacaq, – o, albomu İmranın qabağına qoydu. – Al bax, darıxma. Bilirəm şəhər adamları belə şeyləri çox xoşlayırlar.

O, "şəhər adamları" sözünü xüsusi əda ilə dedi. Lakin İmran heç nəyə əhəmiyyət vermədi. Albomu vərəqləməyə, oradakı şəkillərə baxıb xatirələri oxumağa başladı: "Ömür bir sudur daim axar, saxla bu şəklim qalsın yadigar". "Əziz bacı, müvəqqəti həyatımın əbədi yadigarı bu əksimi sənə verirəm". "Baxıb xatırlama, xatırlayıb bax". "Küsgün bacından". "Talesiz qızlardan"... İmran bunları oxuduqca başını bulayır, süni ah-uflarla dolu olan bu qeydləri yazanlara acıyırdı. Şahnaz otaqda hey fırlanır, arabir də İmranın çiyni üstündən əyilib şəkilləri göstərirdi. "Bu mənim bacılığımdır, bir yerdə oxumuşuq, bu da onun padruqasıdır. O xalası qızıdır. O biri də onun nişanlısıdır". Şahnaz aşağı əyildikdə İmran onun ılıq nəfəsini üzündə hiss edirdi. Bu yaxınlıq və təmasdan özünü itirən kimi olurdu. Şahnaz dayısından belə çəkinmədən oğlana daha çox yaxınlaşırdı. Hətta bir-iki dəfə təsadüfənmi, yoxsa qəsdənmi, Şahnazın döşləri İmranın çiyninə toxundu. İmran çiynini çəkmək istədikdə, Şahnaz aşağı əyilib şəkli götürdü və sinəsini ona daha da sıxdı. İmran qızın ürək döyüntülərini kürəyində hiss etdi.

Onların bu cür baş-başa verdiklərini görən Kosaoğlu sakitcə stuldan qalxdı, gəbənin üstünə uzanıb mütəkkəyə dirsəkləndi.

– Məni qınamayın, a bala, stulda otura bilmirəm.

– Sən elə gərək bizi qonaq yanında biabır eləyəsən.

– Qonaq niyə olur, öz uşağımızdır.

Şahnaz İmrana daha da yaxınlaşdı. Qızın yanağına düşmüş qıvrım tel İmranın üzünə toxundu. İmran bədəninin qıdıqlandığını və qulağının dibində həyəcanlı nəfəs alan Şahnazın azacıq titrədiyini duydu. Bu qızın gözlərində həm açıq bir həyasızlıq, həm ehtiras, həm məğrurluq, həm də özünə inam vardı. İmran diksinərək stulu geri çəkdi və albomu örtdü. Şahnaz qaşlarını dartıb nəm dodaqlarını büzdü. İmran onun gözlərində ani bir qığılcım parıldadığını gördü. Şahnaz dikəldi. İmranı tora düşən bir balıq zənn edib şaqqıltı ilə güldü və ondan aralandı, bir göz qırpımında otaqdan çıxdı. İmranın pərt olduğunu görən Kosaoğlu dilləndi:

– A bala, nərd oynamaq bilirsənmi?

İmran başı ilə təsdiq elədi.

– Onda zəhmət çək, sən məndən cavansan, şkafın başından nərdi gətir, bir-iki əl oynayaq. Deyəsən, bunların çörəyi gec olacaq.

Şahnaz bir də otağa qayıdanda Kosaoğlu ilə İmran oyunu qızışdırmışdılar. Zərlər ortada fırlanır, daşlar şaqqıldayırdı. Şahnaz yenə sağa-

sola keçir, arabir ayaq saxlayıb oyuna diqqət edir və İmrana sataşırdı. Hətta bir-iki dəfə dayanıb İmrana kömək də elədi.

Otağa toyuq qızartmasının ətri dolan kimi Şahnaz nərdi yığışdırdı. Kosaoğlu ilə İmran xörək yeməyə başladılar. Şahnaz əvvəlcə patefon oxutmaq istədi, sonra fikrini dəyişib radioqəbuledicini qurdu. Yaşıl lampa bir-iki dəfə titrəyib göz qırpdı. Cihaz xırıldadı. Şahnaz düyməni hərlədi. Müxtəlif səslər bir-birini təqib etdi və birdən xırıltı kəsildi, otağa məlahətli bir səs yayıldı.

“Kəndimizə gələn ağranom oğlan,
Ürəyim titrəyir görəndə səni...”

Elə bil bu mahnını qəsdən oxuyurdular. Şahnaz havanın lap yerinə düşdüyündən uşaq kimi sevindi. Kosaoğlu dodaqlarını silib mahnıya qulaq asdı və söhbətə mövzu tapıb dərhal dilləndi.

– Görürsənmi, kəndə gəlməmiş sizə mahnı da qoşublar.

– Özü də qızın dili ilə.

– Elə onu de. İndiki qızlar hər şeyi yaxşı ölçüb-biçirlər. Görürlər ki, bu saat ağranoma yaman fikir verirlər. O saat ürəkləri keçir, oturub şer qoşurlar. – Kosaoğlu gözlərini qıyıb mənalı-mənalı İmrana baxdı. – Yəqin kəndimizdə sənə də bu cür şer qoşan qız var.

– Hələ ki, şer qoşulası bir iş görməmişəm.

– Rəhmətliyin oğlu, qız neyliyir sənin işini? Görür yaxşı oğlansan, demək qurtardı. İndi sən kimdən əskiksən? Kəndimizdə kimi istəsən sənə gələr. Ürəyini sıxma, özüm burda deyiləmmi? Havaxt toy eləmək istəsən, mən hazır.

– Qurban qağa, – deyə İmran utana-utana cavab verdi, – hələ toydan əvvəl görüləsi işlərimiz çoxdur.

Kosaoğlu azacıq fikrə getdi.

– Düz deyirsən, bala, əvvəla, gərək ev-eşiyi sahmana salasan. Atan çoxdan rəhmətə gedib. Anan da ki, neyləsin, qoca arvaddır. Səni ancaq oxutdu. Amma fikir eləmə. Özün bilirsən ki, hökumətimiz qərar çıxarıb ki, ağranomlara kənddə ev-eşik tikilsin. İndi sən də bizim ağranomumuzsan. Gərək hökumətin qərarını yerinə yetirək. Bir də, sən özgə deyilsən ki, öz uşağımızsan...

– Çox sağ olun, mənə ev lazım deyil.

– Niyə lazım deyil? Bir sağmal inək də verərik.

– İnəyimiz var. Evimiz də ki, pis deyil, hələlik dolanarıq. Sonrasına baxarıq.

– Bunun sonrası yoxdur ki... Yoxsa kəndimizi bəyənmədin, ə? Bəlkə çıxıb getmək fikrindəsən, elə ona görə ev-eşiyə yapışmaq istəmirsən?

– Yox, Qurban ağa, mən heç yana gedən deyiləm. Gəlmişəm, burda da işləyəcəm. Amma kəndimiz doğrudan da xoşuma gəlmir.

– Niyə? Hamı bizim kolxozu, bizim kəndi tərifləyir, nə oldu ki, sən bəyənmədin? – Kosaoğlu yavaş-yavaş əsəbiləşdiyini və səsini ucaltdığını duymadı.

İmran isə çox soyuqqanlılıqla dedi: – Mən də elə onu bilmirəm ki, bizim nəyimizi tərifləyirlər?

– Neçə nəyimizi, bala? Planı hamıdan qabaq yerinə yetiririk. hamıdan çox bizim kolxoz mükafat alır. Biz milyoner olmuşuq.

– Bütün bunların faydası azdır. Qonşuluğumuzdakı kəndlərin çoxu bizdən az qazanır, amma yaxşı dolanır. Bizdə isə köhnə hamam, köhnə tas.

– Bəs sən nə istəyirsən, oğul?

– Çox şey!.. Deyin görüm... Bax, kolxoz plan doldurur, mükafat alır, camaat gecə-gündüz əlləşir, nədən ötrü? Hökumətimiz kənd haqqında bu qədər qərar çıxardır, maşınlar buraxır, kənd təsərrüfatını mexanikləşdirir. Bunların hamısı kimdən və nədən ötrüdür?

Sual, əlbəttə, çox adi sual idi. Kosaoğlu qarnı qalxa-qalxa güldü.

– A bala, bunların hamısı plandan ötrüdür. Bəs sən hələ bunları bilmirsənmi? Doğrudan da uşaqsan. Hamısı ondan ötrüdür ki, plan dolsun, hökumətə də, camaata da plan lazımdır. Plan doldu, hamının gözünün işığısan. Dolmadı, hamının səndən zəhləsi gedəcək.

– Demək, planı doldurdun, hər şey qurtardı?

– Bəs nə?

– Yox, Qurban qağa, elə dərd burasındadır ki, biz nədən ötrü işlədiyimizi yaxşı bilmirik. Belə getsə, kommunizmə keçə bilmərik.

– Elə keçəcəyik ki!.. Lap oğul balası kimi. Özü də hamıdan qabaq mənim kolxozum keçəcək. Kommunizmi əvvəlcə mən quracam.

İmran özünü gülməkdən saxlaya bilmədi.

– Necə keçəcəksən?

– Lap hava kimi. – O ciddi bir kəşf etmiş kimi İmrana doğru əyildi. – Kommunizmə keçməyin birinci şərti odur ki, kolxozçu gərək qapı-bacadan, mal-qaradan əl çəksin. Elədirmi?

İmran dinmədi. Kosaoğlu əlini döşünə vurdu:

– Bax, əgər mən istəsəm, elə günü sabahdan hamı mal-qaranı gətirib kolxoza verər. Xüsusi mülkiyyətdən əl çəkər.

İmran maraqlandı:

– Nə təhər elərsən?

– Bu sirdir, heç kəsə demərəm, – Kosaoğlu özünü çəkdi.

– Burda heç bir sirr olmamalıdır. Ümumi qayda-qanun var.

– Ümumi qanun öz yerində, Kosaoğlunun qanunu öz yerində, bildin?

– Mən bircə şeyi bilirəm ki, bizim kolxozda bu mümkün deyil.

– Məni hirsləndirmə. Sabah briqadirlərə tapşıraram, norma mallarını kolxozun yerində otarmağa qoymazlar. Görüm onda malları necə saxlayacaqlar? Ot-ələf də olmayanda malı qırmayacaqlar ki? Əlacları kəsiləndə qulağından tutub özləri könüllü gətirib fermaya təhvil verəcəklər.

Əvvəlcə İmrana elə gəldi ki, Kosaoğlu zarafat eləyir. Lakin sədrin qürurla, İmranı yuxarıdan-aşağıya kinayə ilə süzməsi göstərdi ki, o heç də zarafat eləmir; bu onun qənaətidir və imkan tapsa, elə sabahdan işə başlayar. İmran Kosaoğlunun az savadlı və kobud olduğunu bilirdi, ancaq belə kütlüyünü ağlına gətirmirdi. O bir daha Kosaoğluna baxdı. Sədr gözünü aqronoma zilləyib gülümsünür, sanki "hə, görürsənmi, dünyada necə ağıllı adamlar var!" demək istəyirdi. Birdən İmranı gülmək tutdu. Kosaoğlu da ona qoşuldu. Bayaqdan onlara qulaq asan Şahnaz da özünü gülməkdən saxlaya bilmədi. Süfrəni yığışdırmağa gələn Sayalı təəccüblə dayandı:

– Ə, nə olub, otağı başınıza götürübsünüz?

– Heç, – deyib Kosaoğlu üzünü İmrana tutdu. – Gördün ki, oğul, işi necə görürlər! Sən Kosaoğlunun kəndçitəhər olmasına baxma, çox oxumuşları yorub yolda qoyar. Kitab oxumaq azdır. Gərək bir az özündə də olsun.

İmran Şahnazın gətirdiyi çayı qabağına çəkib təmkinlə dedi:

– Kitabı oxumaq azdır, gərək oxuduqlarını başa düşəsən, həyata tətbiq eləyəsən. Amma xatirinizə dəyməsin, siz nə kitab oxuyursunuz, nə də deyilənləri başa düşürsünüz, ona görə də qaş qayırdığınız yerdə vurub göz tökürsünüz!

Bayaqdan İmranın onunla razılaşdığını zənn edən Kosaoğlu, birə sancmış kimi yerində qurcalandı.

– Necə?

İmran sözünə sakitcə davam etdi:

– Siz kolxozçuların vəziyyətini yaxşılaşdırmaq əvəzinə, zorakılıq etmək istəyirsiniz. Bu nə nizamnaməyə sığar, nə də qayda-qanuna.

– Demək, mən nizamnaməni bilmirəm, bala? Kosaoğlu saç-saqqalını kolxoz işində ağardıb, indi nə oldu ki, məktəbdən dünən gələn bir uşaq ondan çox bildi? Bugünkü sərçə dünənkinə cip-cip öyrədəcək!

– Sözün düzünü deyəndə acığınız niyə gəlir? Əgər siz qəzetləri oxuyub, partiya və hökumətin qərarlarını yaxşı öyrənsəydiniz, belə sözlər deməzdiniz.

– O qərarlarda nə yazılıb ki, biz bilmirik?

İmran Kosaoğlunun səsindəki istehzanı duyub ciddiləşdi:

– Orda yazılıb ki, kolxoz kolxozçuların norma heyvanlarına örüş və ələf verməlidir.

– Bəs onda onlar xüsusiyyətçilikdən əl çəkərlər?

– Çəkərlər. O bizim necə işləməyimizdən asılıdır.

– Onda bir bizi başa sal görək, necə işləmək lazımdır, yoldaş aqronom?

– Baş üstə, yoldaş sədr, – İmran da kinayəyə kinayə ilə cavab verdi, – gərək elə eləyək ki, kolxozçu qapıda inək saxlamağa ehtiyac hiss eləməsin.

– Bunu nə təhər eləmək olar?

– Var-dövləti artırmaqla. Deyin görüm əməkgününə yağ-pendir paylayıbsınızmı?

– Nə? Yağ-pendir? Başına söz qəhətdir? Ə, o qədər yağ-pendir hardadır ki, hazırlığı da ödəyək, əməkgününə də paylayaq?

– Demək, pis işləyirik. Anbarda yağ da, pendir də, ət də, yumurta da, lap alma-armud da olmalıdır ki, kolxozçular əməkgünə alsınlar. Bax, onda kolxozçu qapı-bacadan əl çəkəcək. İnəyi gətirib kolxoza təhvil verəcək və deyəcək ki, alın bunu məndən, onsuz da hər şeyi hazır alıram. Amma siz neyləmək istəyirsiniz? Kolxozdan heç nə vermirsiniz, normalarını da əllərindən alırsınız. Bəs camaat nəylə dolansın? Sizin belə hərəkətiniz hökumətin, partiyanın siyasətinə ziddir.

– Avazın yaxşı gəlir, oxuduğun Quran olsa. Ə, bunları hardan alım?

– Kolxozumuzun ferması varmı? Bağımız varmı?

– Var ey, nə olsun, lap arı yeşiklərimiz də var.

– Çox yaxşı. İndi deyin görüm, yayda bostan əkməyə altmış-yetmiş hektar torpaq ayırmaq olarmı?

– Ə, hardan alım, heç pambıq əkməyə yer çatmır.
– Çatar. Özüm hamısını yoxlamışam. Yan arxın altında sulu yer var.
– Onda işin olmasın. O yeri zapas saxlamışam.
– Nə zapas?
Kosaoğlu duruxdu. Əvvəlcə İmranla açıq danışmaq istədi, ancaq etibar eləmədi. “Beləsinə sirr vermək olmaz” – deyə düşündü.
– Nə bilim, dedim, ora qalsın... dincə qoymuşam. Gələn il əkərik, – Kosaoğlu İmranın fikrini yayındırmaq üçün sözü dəyişdi: – Yaxşı, bala, fermanı, bağı nədən ötrü soruşursan?
İmran fikirli-fikirli cavab verdi:
– Bilmək istəyirəm görüm, bunların məhsulu hara gedir?
– Necə yəni hara gedir? Hara lazımdırsa, ora da gedir.
– Yox, Qurban qağa, – deyə İmran eyni ciddiyyətlə davam etdi, – biz kolxozçuların zəhmətini itirib-batırırıq. Əgər biz yaxşı işləsək, yağ-pendir bir yana, əməkgünə meyvə də paylarıq. Pismi olar, arı pətəklərinin sayını artıraq, əməkgünə bal da bölək? Toyuq ferması da onun kimi.
– Balam, sən lap kefdən danışırsan...
– Niyə danışmayım? Əlimizdəki imkanlardan niyə istifadə etməyək? Heç gecələr kəndə fikir veribsinizmi?
– Nə olub ki?
– Nə olacaq, günün qulağı batan kimi hamı evə çəkilir. Bir əyləncə yox, kino yox, konsert yox.
– Klubumuz ki, var!
– Elə klub kimə lazımdır? Qapının dabanı çürüyüb, qıfılı pas atıb.
– Gedən yoxdur, mən neyləyim?
– Axı nəyə getsinlər, gərək orda bir əyləncə olsun ki, camaat da getsin. Yoxsa boş divarlara tamaşa eləməyəcəklər ki!
Kosaoğlu söhbətin dərinləşdiyini görüb susdu. Fikirli-fikirli çayını qabağına çəkdi. “Bu gədə, deyəsən, hər şeyə başını soxur. Bağ belə gəldi, bostan elə getdi... Onun nəyinə lazımdır ki, anbarda yağ-pendir var, ya yox... Ağranomdur, getsin ağranomluğunu eləsin. Əkinində-biçinində olsun, başını dolandırsın. Yoxsa müfəttiş kimi hər şeyə göz qoyur. Yox, deyəsən, bununla ayrı cür danışmaq lazım gələcək. Bəlkə tamahı var? İnsandır, nə desən olar. Belə olsa hər şey düzələr. Amma ürəyini necə bilim? Nə soruşursan axırını gətirib qanuna, qərara çıxardır”. O bir az da susdu. Qutum-qutum çay içdi.

– Yaxşı, bala, indi sən nə istəyirsən?

– Mənə heç nə lazım deyil, – deyə İmran sakitcə cavab verdi,

– kəndimizdə camaatın dolanacağı yaxşı olsa...

– Olar, olar, – Kosaoğlu onun sözünü kəsdi. – Amma bir şərtim var. Gərək heç kəs heç kəsin işinə qarışmasın. Bax, sən ağranomsan, get öz işini gör. Pambığını becər. Mən də sədrəm, sədrliyimi eləyim. Yoxsa sən işini-gücünü buraxıb anbar yoxlasan, klubu gəzsən, onda nə sən deyən olar, nə də mən deyən. Gərək hər evin bir başbiləni olsun. Yoxsa dolanmaq olmaz.

– Demək, mən gərək kolxozun başqa işləri ilə maraqlanmayam?

– A bala, səni bura təftiş qəmisyəsi göndərməyiblər ha, – Kosaoğlu söhbəti zarafata salmaq istədi, – nə deyirlər ona qulaq as də.

– Yox, mən onu bacarmayacam. Kolxozun hər işi mənim işimdir.

– Demək, köhnə bazara təzə nırx qoyacaqsan? – deyə Kosaoğlu ürəyində yığılıb qalan sözləri açıb tökməyə başladı. – Səndən əvvəl ağranom yox idi? Atını minib səhərdən axşama qədər çölləri gəzərdi. Bir şey lazım olanda da gəlib anbardan alıb aparardı. İlin başında da ki, pulu pul idi, taxılı taxıl. Kefi kök dolanırdı. Bəs sən nə istəyirsən? Sənə də dolanmaq lazım deyilmi? Ev deyirsən, tikdirək. Taxılın yoxdur, verim. Yağ lazımdır, onu de. Bəs nə gündə lazımıq? Bilirəm, cavan oğlansan, əyər-əskiyin çoxdur. Hələ ev-eşiyini sahmana salmayıbsan. Gəl əl-ələ verək, işləyək.

– Ə kişi, niyə işləmir, – samovarın yanında oturub çay süzən Sayalı sözə qarışdı. – Özgəsi ha deyil. A bala, ay İmran, and olsun o yeri-göyü yaradana, düz deyirəm. Məktəbi qurtarıb kəndimizə gəldiyini eşidəndə elə sevindik ki, dedim, şükür yaradana, Tükəzban muradına çatdı. Axır ki, İmranı böyüdüb boya-başa yetirdi. Elə Qurban qağan da sevindi. Dünən deyirdi, ay Sayalı, gərək ona kömək eləyək, tək oğlandır, arxa duraq. Allaha and olsun, o səni atadan az istəmir. İndi nə olar, sən də ona oğulluq elə, böyükdür, sözünə bax, məsləhətə yat. Dağ boyda kişidir, sənə söz deyir, sən də uşaqlığına salıb kəcinə çəkirsən. Ağıllı ol, bala, əl-ələ verin, işləyin.

– Sayalı xala, mən buraya işləməyə gəlmişəm. Nə qədər bacarıram, işləyəcəm. Qaldı ki, mənə hörmət eləməyiniz, çox sağ olun, çox razıyam. Ancaq... – İmran tutulub qızardı, – mənə heç nə lazım deyil. Özüm özümü dolandıraram.

– Ona kim nə deyir ki...maşallah, sənin tayların üç-dörd ev saxlayır. Ancaq ağzı bir olsanız yaxşıdır.

– Mənə qulaq asmayan xeyir tapmaz, bala, – deyə Kosaoğlu qaş-qabaqlı halda dilləndi. – Yenə deyirəm, köhnə bazara təzə nırx qoyma. Orda-burda ağzına gələni danışma. Nə qədər ki, burda kolxoz sədri mənəm, mən deyən də olacaq. Eşitdinmi? Səni çağırmaqda da məqsədim odur, deyəm ki, başını aşağı sal, işində ol. Ağranomsan, ağranomluğunu elə. Daha o yan-bu yana əl atıb, ona-buna qoşulma, sonra peşman olarsan. Gözünü sil, mənə düz bax, mənə Kosaoğlu Qurban deyərlər! Kosaoğlu artıq hədəyə keçmişdi. Qəribə bir vəziyyət əmələ gəlmişdi. Nə qonaq qonağa bənzəyirdi, nə də ev sahibi qonaq sevənə.

İmranın pərt olduğunu görən Şahnaz sözə qarışdı:

– Ay dayı, sən Allah, qoy görək, evdə də iclas açmasan olmur? İmran, sən ona fikir vermə. Dayımın xasiyyətidir. İdarədə o qədər dava salır ki, evdə də dinc dura bilmir.

– Düz deyirsən, a bala, – deyə Sayalı onun sözünü təsdiq etdi, – bu kişi lap xarab olub. Patefondan-zaddan oxutdur.

Şahnaz dərhal valları İmranın qabağına tökdü.

– Yaxşı havalardan seç.

Lakin Şahnazın səyi hədər idi.

İmran durub paltosunu geydi. Bununla belə, Şahnaz yenə geri çəkilmədi, qapının ağzında sinəsini qabağa verib onun yolunu kəsdi.

– İti açmışam, heç yerə gedə bilməzsən.

İmran qızın yanından keçib həyətə çıxdı.

**9**

Son günlər Zeynəbi tanımaq olmurdu. Onun yanaqları daha da allaşmışdı, qaynar gözləri alışıb-yanırdı. Uşaq kimi atılıb düşür, bir yerdə qərar tuta bilmirdi. Elə bil qızın qəlbinə nə isə könülaçan, adamı fərəhləndirən bir hiss dolmuşdu. Bu hiss coşqun dağ çayı kimi kükrəyib-daşır, öz yatağına sığmırdı. Ona nə olmuşdu? Nə üçün sifəti rəngdən-rəngə düşürdü? Nə üçün bəzən ürəyi tutulmuş quş ürəyi kimi yerindən oynayırdı? Bunu Zeynəb özü də bilmirdi. Bəlkə havaların yaxşılaşması, çöllərdən qarın götürülməsi, ağacların yavaş-yavaş puçurlaması, otların cücərməsi ona təsir etmişdi? Axı yaz gəlirdi. Bu gün-sabah çöllər al-yaşıl geyinəcək, quşlar səs-səsə verəcək, bağlar-bağçalar çiçək içində üzəcəkdi. Zeynəb manqa üzvləri ilə səhər-səhər

çöllərə gedəcək, yol uzunu qızlar zarafatlaşıb qaqqıldaşacaq, gecəli-gündüzlü bir yerdə olacaqdılar.

Bəlkə də... Yox, Zeynəb heç nə bilmirdi. O yalnız bunu hiss edirdi ki, evdə darıxır, tək otura bilmir. Hətta manqa üzvləri onun yanına gələndə də sakit ola bilmirdi. O, itiyi itmiş kimi darıxır, qapıdan kölgə keçəndə, yaxud bir şıqqıltı gələndə pəncərədən boylanır, elə bil kimi isə gözləyirdi. O, kimin həsrətini çəkirdi? Zeynəb yalnız onu duyurdu ki, axır vaxtlar tez-tez Tükəzban xalagilə qaçır, oradan ayrıla bilmirdi. Yaxşı, burada təəccüblü nə vardı ki? Zeynəb elə uşaqlıqdan o evə gedib-gəlmirdimi? Məgər o, Tükəzban xalanı doğma anası kimi sevmirdi? Gözünü açandan ana üzü görməyən Zeynəb, Tükəzban xalanın qucağında böyüməmişdimi? Bütün el-oba bilmirdimi ki, ata-anadan yetim qalan Zeynəbi Tükəzban xala uşaq evinə göndərməyə qoymamış, “elə billəm, balamın biri də artıqdır” demişdi. Zeynəb onun laylası ilə yuxuya getmiş, onun nəvazişkar səsi ilə yuxudan oyanmışdı. Qız böyüyəndən sonra Tükəzban xala onun saçını sığallayıb: “Qızım, yenə gözüm üstündə olacaq, amma yurdunuzu boş qoyma” – demişdi. Zeynəb öz evlərində yaşamağa başlamışdı.

Zeynəb əvvəllər ötən günləri yadına salmazdı. İndi özü də bilmədən hər gün, hər dəqiqə o günləri xatırlayır və çalışırdı ki, hər şeyi xəyalında canlandırsın. İndi bu xatirələr ona xoş gəlirdi. Çox qəribə idi: hara gedirdisə, İmran gözünün qabağında dayanırdı. Onun səsi gecə-gündüz qulaqlarından getmirdi. Hətta bir gecə qəribə bir yuxu görmüşdü. Görmüşdü ki, yazdır, əyninə nazik paltar geyib, başına həsir papaq qoyub. Ayağında ağ, yüngül çust var. Bir çəmənlikdədir. Otların arasındakı cığırla qaça-qaça dağa sarı gedir. Birdən göz işlədikcə uzanan taxıl zəmisinə rast gəlir. Zəmi dəniz kimi dalğalanır, ləpələr bir-birini qovur.

Zeynəb birbaş taxılın içinə qaçdı; dayanıb sünbülləri sinəsinə basdı. Birdən onun qulağına tanış bir səs gəldi. Donub qaldı. Özündən xeyli aralı taxılın içində dayanan İmranı gördü. Qaçıb yanına getmək istədi. Amma qüruruna sığışdırmadı. “Qoy o mənim yanıma gəlsin, mən qız ola-ola onun ayağına getməyəcəm ha”.

Lakin İmran ona ötəri bir nəzər salıb uzaqlaşdı. Zeynəb buna dözə bilmədi. Taxılın arasından çıxıb çaya tərəf qaçdı. Elə bu vaxt zorba bir it onun üstünə atıldı. Zeynəb ancaq bircə dəfə qışqırdı. Səsə özünü yetirən İmran, Zeynəbin boğazından yapışmaq istəyən iti qovdu. Onlar

çaya qədər sakitcə getdilər. Sahildə ayaqqabılarını çıxartdılar. Zeynəb donunun ətəyini dəstələyib, İmranın qolundan tutdu. Su elə duru idi ki, çayın dibindəki daşlar, sürü ilə qaçan balıqlar aydın görünürdü. Ortalara getdikcə çay dərinləşirdi. Zeynəbin ayağının altından daşlar qaçır, qum ovulurdu. O yıxılmamaq üçün İmrana daha möhkəm qısılırdı. İmran qolunu onun belinə doladı. Zeynəb üşüdüyündənmi, yoxsa nədənsə titrədi. İmran dönüb onun gözlərinə baxdı.

– Zeynəb...

– Nə var?

– Mən səni ölümdən qurtardım, eləmi?

– Elədir.

– Burdan birbaş bizə gedəcəyik.

– Niyə ki?

– Anama deyəcəm ki, bax bu telli qızı gözüm tutub. Elçiliyini elə.

Zeynəb nə isə demək istədi, amma birdən su onun ayağını yerdən üzdü. O özünü İmranın qucağında gördü. Deyəsən, İmran onu sinəsinə sıxıb öpmək istəyirdi. Zeynəb qışqırdı...

O, yuxudan ayılandan sonra bir müddət yerindən tərpənmədi, gözlərini qırpmadı. Nə qədər şirin yuxu idi!..

Səhər tezdən qaça-qaça Nərgiz müəllimənin yanına getdi. İçəri girən kimi hər şeyi ona söyləmək istədi, ancaq özünü toxtatdı. “Deməsəm yaxşıdır. Sonra ağlına gələr ki, yüngüllük eləyirəm”. Nərgiz müəllimə onun sözlü adam olduğunu duydu. Zeynəbdən əl çəkmədi. Zeynəb əlacsız qalıb utana-utana, yuxuda gördüklərinin hamısını danışdı. Axıra çatanda susdu. Nərgiz müəllimənin üzünə baxdı, ancaq onun qızardığını, həyəcandan tez-tez nəfəs aldığını duymadı, gözlərində aşkar sezilən maraq və narahatlığı görmədi. Üzünü Nərgiz müəllimənin sinəsinə yapışdırdı.

– Mənə nə desə yaxşı idi?

– Nə dedi?

– Eh, utanıram.

– Ay qız, nədən utanırsan? Yuxudur də...

– Dedi ki, səni sevirəm. Bilirsənmi, Nərgiz müəllimə, özümü necə itirdim! Yadıma düşəndə indi də titrəyirəm. Üzümə elə baxırdı ki...

Nərgiz müəllimə fikrə getdi. Onun gözləri hara isə uzaqlara baxırdı. Sifəti rəngdən-rəngə düşürdü. Nəhayət, Zeynəb bunu sezdi. “Görəsən ona nə oldu, qəlbinə toxunan bir söz demədim ki?”

– Nərgiz bacı.

Elə bil Nərgiz yuxudan oyandı. Fikrini toplayıb gülümsündü:

– Ay qız, olmaya...

Sanki Zeynəbin bədənində alov gəzdi. Yanaqları qıpqırmızı oldu.

– Heç elə şey olarmı, ay Nərgiz bacı, nə danışdığındır? – deyib, başını aşağı saldı...

...Amma bu şadlıq uzun sürmədi. Dünən idarədən qayıdanda eşitdiyi sözlər elə bil onu yerə çırpdı.

Zeynəb dükanın qabağından keçəndə bir dəstə qıza rast gəldi. Onlar öz aralarında danışıb-gülürdülər.

– Siz də bu İmranı az tərifləyin.

– Nə olub ki?

– Nə olacaq? – deyə qızlardan biri rişxəndlə dilləndi, – Kosaoğlunun evinə yamanca ayaq açıb. Deyirlər qapının dabanını yağır eləyib. Görərsiniz, bu gün sabah toy-düdük çalınacaq.

– Ay qız, bəsdir, sən allah, gədəni bəzəməyin, yazıq başını aşağı salıb işini görür.

– Elə başıaşağı adamdan qorxmaq lazımdır. Suyun lal axanı, adamın yerə baxanı. Onu elə qaradinməz bilməyin. Yamanca şeydir. Zalım oğlu az qalır gözü ilə adamı yesin.

– Ay qız, ətimizi tökmə görək. Sən elə köhnənin yalançısısan. Hansı oğlanı görsən o saat deyirsən ki, gözü ilə məni yedi. Amma heç üzünə baxan da yoxdur.

– Tapılar, heç darıxmayın. Amma mən düz deyirəm.

– Axı bu xəbərləri sən hardan eşidirsən?

– Hardan eşidəcəyəm, özləri danışırlar.

– Kim?

– Necə yəni kim? Belə Sayalı, Göhər qarı, lap Şahnazın özü.

– Sən də onların sözünə inanırsan?

– Niyə inanmayım? Şahnaz kimi ağca mayadan kim keçər? Zalım qızı elə bil quzu quyruğudur, yırım-yırım yırğalanır. İşi-gücü də özünə sığal verməkdir. Özü də Kosaoğlunun bacısı qızıdır...İmrana da elə bu lazımdır... Yağ içində böyrək kimi bəslənmiş qızı kim ağzından çıxardar?

Zeynəb dözə bilməyib dəstəyə yaxınlaşdı. Qızlar susdular. Zeynəbin sinəsi qalxıb-enirdi.

– Yenə nə çərənləyirsən?

– Heç nə, camaat nə deyirsə, onu...

– İşin-gücün yoxdur? Xalqın dərdi sənə qalıb?

– Bura bax!.. – bayaqdan qızları başına yığıb danışan Sevgili dilləndi. – Sənə nə düşüb? İmranın vəkilisən? Mən bilərəm, o bilər. Yoxsa onda gözün var? Ay qız, ağlını başına yığ, ali təhsilli oğlan səni alarmı? Sənə, olsa-olsa, xır-xır Kazım kimisi müştəri çıxar. Get otur yerində.

Zeynəb dodaqlarını çeynəyə-çeynəyə dəstədən aralandı.

## 10

Eyvanın dirəyinə söykənmiş Şahnaz, əlini qoynuna qoyub, başı üzərindən keçən qaranquşlara tamaşa edirdi. Bir həftəyə yaxın idi ki, bu quşlar onların eyvanında məskən salmışdı. Səhərdən axşama qədər civildəşə-civildəşə ağızlarında ot, palçıq gətirib yuva tikirdilər. İlk günlər Şahnazı cəlb edən bu göyçək quşlar, indi onu darıxdırırdı. Şahnaz onların qoşa dayanıb oxumalarını görəndə qəfəsə salınmış quş kimi çırpınır, qapı-bacada dura bilmirdi. "Quş quşluğu ilə tək yaşamır, qoşa gəzir. Bəs mən?.."

O tez-tez güzgü qabağında hərlənir, qaş-gözünə sığal verir, saçlarının ucunu burub sinəsinin üstündən sallayır, paltarının birini soyunub o birini geyinirdi. Bəzən dabanı üstündə fırlanır, güzgüdə ətli əndamına, nazik belinə, yoğun topuğuna baxır, gülümsəyərək öz-özünə göz vururdu: "Doğrudan da qəşəng qızam, mənim kimi gözəl də evdə oturar?"

Yaşının az olmasına baxmayaraq, Şahnaz çox oğlanlarla oturub-durmuşdu. Hətta bəzilərinin dərdini ürəyinə salmışdı. Lakin bu, uzun sürməmişdi. Ya oğlan ondan uzaqlaşmış, ya da Şahnaz özü onu yola salmışdı. Neçə ildən bəri onun dalınca sürünən şofer Məmməd belə ona təsir edə bilməmişdi. Ancaq İmran... Şahnaz durub-dincələ bilmirdi. Ogünkü əhvalatdan sonra elə zənn edirdi ki, hər şey düzələcək; İmran ona meyl edəcək, ancaq tərsinə oldu. İmranın soyuqluğu onu təşvişə salırdı. "İndiyə qədər bir başıpapaqlı mənim yanımdan düz keçə bilməyib, dalımca həsrətlə baxıblar. Amma bu..."

Şahnaz necə olur-olsun İmranın diqqətini cəlb etməyə çalışırdı. Tez-tez Gövhər qarının yanına qaçıb fala baxdırırdı. Qarı, qızın ürəyinə yatan şirin sözlər deyib, onunla İmranın birləşəcəklərini söyləyirdi. İndi o, eyvanda dayanıb bunları düşünür, düşündükcə də darıxırdı.

Kəndin üstünə axşam qaranlığı çökürdü. Yavaş-yavaş çıraqlar yanır, mal-qara örüşdən qayıdırdı.

Gövhər qarı sakitcə Şahnaza yaxınlaşıb dayandı.

– Bayramın mübarək, qızım, bu şər vaxtı boynunu niyə bükübsən?

Şahnaz köksünü ötürdü:

– Nə bayram, ay nənə?

– Bıy, başıma xeyir, ay qız, nə danışdığındır!

Bu gün ilin axır çərşənbəsi deyilmi? Bircə tez ol gedək tonqal qalayaq, üstündən atdan, günahların yox olsun.

Şahnaz oyuncaq tapmış uşaq kimi sevindi. Onlar küləş gətirib həyətin ortasında od vurdular. Qatı ağ tüstü burula-burula havaya qalxdı. Tonqal birdən-birə pırıltı ilə alovlandı. Qırmızı dilli alovlar göyə ucaldı. Qonşu uşaqları tökülüb gəldilər. Tonqalın ətrafında atılıb-düşməyə başladılar. Gövhər qarı ətəyini belinə sancdı. Qızlara göz eləyib irəli yeridi.

– Günahlarınızı təmizləyin, ay qızlar!

– Bizim nə günahımız var ki?

– Elə demə, qızım, allaha ağır gedər, tez ol atdan! Şahnaz şaqqıldayıb güldü və sıçrayıb tonqalın üstündən keçdi. Qızlar da ona qoşuldular. Qarı özü də geri çəkildi, gözlərini yumub, alovun üstündən atılmaq istədi. Ancaq birdən ayağı büdrədi, qorun içinə düşdü. Donquldanıb kənara sıçradı. Qırçınlı donunun uzun, gen ətəyi alışdı. Qarı özünü itirdi. Ortada fırlanıb qışqırdı:

– Ay qız, qoymayın yandım!

Qızlar onun atılıb-düşməyinə baxıb gülüşdülər. Qarı isə əyilib donunun ətəyini döyəcləyə-döyəcləyə qızları söydü:

– Ləçərlər, həyasızlar, nə hırıldaşırsınız...cin yosunlular, qoymayın...yanıram!.. Qarının ayağı nəyə isə ilişib yıxıldı. O, başı kəsilmiş toyuq kimi atılıb-düşdükcə, balaqlarından, belindən tüstü çıxırdı. Gözləri yaşarınca gülən Şahnaz qarının boğulduğunu görüb irəli yüyürdü. Qarı çeçəyə-çeçəyə deyirdi:

– Hamısının baisi sənsən... Ayğır kimi nə kişnəyirsən?

Şahnaz qarının yanıb xal-xal olan donunu dartıb çıxartdı. Tumanının alovunu söndürdü. Su gətirməyə qaçan qızlardan biri özünü yetirib vedrəni qarının üstünə boşaltdı. Gövhər qarı balıq kimi ağzını açıb-yumdu.

Onu ayağa qaldırdılar. Səs-küyə yığışan qonşular qarıya baxıb gülüşdülər.

– Günahların lap əməlli-başlı təmizləndi. Həm odda yandı, həm də suda yuyuldu.

– Axı, ay kaftar, sənin nə işin var bu uşaq-muşağın içində?

– Lap suya basılmış toyuğa oxşayırsan.

– Yox, ay qız, quyruğu yolunmuş sağsağana oxşayır. Qızlar gülüşə-gülüşə onu evə gətirdilər. Şahnaz köhnə paltarlarından birini çıxarıb qarıya geyindirdi. O daha da gülməli oldu. Güzgüdə qarı özünü tanımadı. Ağlamsındı:

– Günü qaralar, niyə pıqqıldaşırsınız?

– Qiyamət yaraşır, ay nənə.

– Gedin özünüzə lağ eləyin, sel aparmışlar! Sayalı köhnə paltarlarından üç-dördünü gətirib verincəyə qədər qarının qaşqabağı açılmadı. Tez birini geyindi. O birilərini də dəstələyib qoltuğuna vurdu:

– Evə dəyib gəlirəm, – deyə üzünü Şahnaza tutdu. Xörəkdən-zaddan bişirərik. Gərək, bu gecə sizə kef verəm.

Qarı başmaqlarını şıppıldada-şıppıldada evdən çıxdı. Şahnaz onun dalınca qışqırdı:

– Ay nənə, sən allah, tez gəl, evdə sənsiz darıxıram. Qızlardan rastına düşən olsa, çağır gəlsinlər...

Çox çəkmədi ki, Gövhər qarı qayıdıb bir neçə qızla içəri girdi. Şahnazın boynunu qucaqlayıb, üz-gözündən öpdü.

– Belə, dayının canı üçün, hər şey düzələcək. Heç ürəyini sıxma, hansı qapını pusdum, qulağıma yaxşı söz dəydi. Birində dedilər: "A qızım, dur qapını aç, içəri sərin hava gəlsin". Demək, qapı üzünə açılacaq...

Sonra getdim Tapdıq kişigilin qapısına. Mən çatan kimi içəridən səs gəldi: "Arvad, heybəni aç, uşaqlara şirindən-zaddan ver". Dedim bu da yaxşıdır. Şirinlik yeyəcəyik, ay Şahnaz! Özü də lap tezliklə!

– O, Şahnaza göz vurdu. – Daha nə istəyirsən? Görürsən ki, xeyir xəbərlə gəlmişəm. Gərək Gövhər nənənə bir xələtlik alasan. Hə, indi siz oturun, mən də xörək hazırlayım. Sonra da iynəlik salarıq. Bu gecə hamınızın bəxtini sınayacam!

Qarı çıxandan sonra qızlardan biri güldü.

– Ay Şahnaz, sən də onun dediklərinə inanırsan?

– Niyə inanmıram? Dediyinin çoxu düz çıxır.

– Ay qız, bəsdir, sən allah, ətimizi tökmə, getdikcə lap ağlın azır. Fal nədir? Elə bizi buna çağırtdırmısan?

– Patefondan-zaddan qur oxusun, bir az kefimiz açılsın. Yoxsa Gövhər qarı bütün şeytanları, cinləri bura yığıb bizi dualıq eləyəcək. Molla-zad da yoxdur ki, tas qurduraq.

Onlar yenə şaqqıldayıb güldülər.

Şahnaz ürəyində qızlardan incisə də, heç nə demədi. Patefonu qurdu. Qızlar çalıb-oynamağa başladılar. Həyətdə eşələnən Gövhər qarı gecədən xeyli keçmiş xörəyi gətirdi. Qızlar onu dövrəyə aldılar. Gülüşə-gülüşə plov yedilər.

Süfrəni yığışdırandan sonra Gövhər qarı gəbənin üstündə bardaş qurub oturdu. Qabağına su ilə dolu bir kasa qoydu.

– Hərəniz bir sancaq çıxardın, atın suya.

Qızlar duruxdular. Şahnaz hamıdan qabaq sancağını çıxardıb suya atdı. Gövhər qarı bir-birinə göz vuran qızlara hirsləndi:

– Nə durubsunuz? Tez olun!

Onlar gülüşüb sancaq çıxartdılar. Qarı yerini rahatladı:

– Bax, mən bir mahnı oxuyacam. Siz də mənim səsimə səs verəcəksiniz. Mən əlimi salıb sudan bir sancaq çıxardacam. Sancaq kiminki olsa, demək, mahnı onun bəxtinədir. İndi başa düşdünüzmü? Hə, başlayırıq.

Qızlar oğrun-oğrun Şahnaza, qarıya baxıb şaqqıldadılar. Qarı qızların onu ələ salmağa hazır olduqlarını hiss etsə də, özünü o yerə qoymayıb oxumağa başladı:

Göydə ulduz ləng gedər,
Gah əylənər, gah gedər.
Qorxma, ürəksiz oğlan,
Üstüncə Allah gedər.

Qarı sancaqlardan birini çıxardıb Şahnaza göz vurdu.

– Qorxaq olsa da, gələcək. Sən işində ol, qorxaq olduğu yaxşıdır, hə indi dalına qulaq asın.

Aşağıdan gələn Eyibdimi?
Başına papaq geyibdimi?
Saqqalı bülbül yuvası,
Bığını siçan yeyibdimi?

Qızların qəhqəhəsi otağı bürüdü. Onlar bir-birini itələyə-itələyə suya baxdılar. “Görək bu kimdir?” deyə pıçıldaşdılar. Sudan çıxarılan sancaq yenə Şahnazın idi. Qızlar gözləri yaşarınca güldülər.

– Elə lap düzdür. Evinizin geri yanındakı o kosa oğlandır. Doğrudan da elə bil zalım oğlunun bığını siçan yeyib. Cəmi iki-üç tükü var. Ürəyini sıxma, elə yaxşıdır. Saqqalı üzünü dalamaz.

Şahnaz qızların rişxəndindən inciyib sancağı yenə suya atdı.

– Sən də oxumağa söz tapdın! – deyə qarıya acıqlandı. Arvad:

– Heç nə olmaz, dərdin alım, dalına qulaq as.

Eləmi nə şüşəsən,
Lampada nə şüşəsən,
Saçım üzəngin olsun,
Atlananda düşəsən.

– Pəh-pəh, – qızlardan biri dilləndi, bu deyəsən qulluq adamına oxşayır.

– Dayan, dayan, bu yəqin ya maliyyə agentidir, ya da ki, cuvar.

– Yoxsa, ay qız, bizim briqadir Kazım olacaq?

– Sən də adam tapdın!

Qarı yenə oxudu:

A qızlar, qaçın oğul gəlir,
Qapını açın, oğul gəlir.
Məxmər döşək, gül yastıq,
Arasını açın, oğul gəlir.

– Hə, necədir? – deyə Gövhər qarı qaralmış mırıq dişlərini göstərdi və əlini salıb bir sancaq çıxartdı. Yaşıl kəlağayılı bir qız utanıb gülümsündü. Ürəyinə yatırmı? İndi dalına qulaq asın.

Ay gedir batan yerə,
Mələklər yatan yerə,
Sinəmi nişan qoyum,
Yar oxun atan yerə.

– Ay qarı, nə qayırdığındır, birçəyinin ağ vaxtında sinəni deşdirərsən, – deyə qızlardan biri ona sataşdı.

Qarı qıza gözünü ağartdı.

– Mənə nə var, ələyim ələnib, xəlbirim göydə fırlanır. Sizi qayğı götürsün ki, hələ başınıza çox işlər gələcək...

Gecədən keçirdi. Qızlardan bir neçəsi getmişdi. Bu işlərin başçısı Gövhər qarı, qalan qızların da yorulduğunu, sözlərinin qurtardığını hiss edirdi. O, nə qədər çalışırdısa, istədiyinə nail ola bilmirdi. Şahnazın rəngi açılmırdı. Gövhər qarı bunu görürdü. Lakin o yenə işin altından çıxmağa çalışdı. İki iynə götürdü. Uclarına pambıq doladı.

– Hər kəs ürəyində istədiyi oğlanı tutsun, – dedi, mən bir-bir iynələri suya salacam, görək kim-kimə qovuşacaq. Çox sınamışam. Bu lap doğru faldır. Əvvəlcə kimdən başlayaq? Deyirəm Şahnaz yaxşıdır. Bax, ay qız, bu sağ əlimdəki iynə sənsən, o biri də ürəyindəki kimdirsə odur. Tutdunmu? Amma elə adam olsun ki, biz də tanıyaq.

– Uzaqda nə işi var, yan-yörədə hərlənən aqranomdan-zaddan biri olar. Sən iynəni suya sal, görək.

Qarı iynələri suya saldı. Qızlar bir-birini dümsükləyib pıçıldaşdılar. İynələr suya düşən kimi fırlanıb hərəsi bir tərəfə getdi. Sonra bir-birini qovurmuş kimi, qabın içində fırlandı. Qızlar yenə pıçıldaşdılar: "Şahnaz dayandı, daha getmir". "Yox, gözləyir, bu saat oğlanın dalınca cumacaq". "Bax, bax, qaçdı, gör necə də gedir". "Hı, gözünə dönüm, qoyma. Aha, az qalıb. Yox, yenə aralandılar. İndi də qız qaçır".

Beləliklə, "oğlanla qız" bir-birini xeyli qovdu. Gövhər qarı gizlincə Şahnaza baxdı. Qızın rəngi kağız kimi ağarmışdı. Elə bil, bütün həyatı bir qab suyun içində hərlənən bu pambıqlı iynələrdən asılı idi. Gövhər qarı gözlərini qaba zilləyib aşağı əyildi, nəfəsini suya verdi. Suyun üzü xəfifcə titrədi. İynələr tərpənib yavaş-yavaş bir-birinə yaxınlaşdı. Qarı nəfəsini dərdi. Şahnazın rəngi özünə gəldi. Qızlar bir-birinə göz vurub gülüşdülər.

– Bax, bu fala söz olmaz. Daha işin düzəldi, ay Şahnaz. Gərək Gövhər qarıya xələt verəsən.

Şahnaz gülümsündü.

## 11

Prokuror Əsədov əllərini qalife şalvarının cibinə qoyub otaqda hirslə gəzinirdi. Pəncərədən süzülüb düşən günəş şüaları onun təzəcə silinmiş uzunboğaz, xrom çəkmələrində əks edirdi. Əsədov parıldayan çəkmələrini döşəməyə daha bərk basır, yeridikcə ləngərlənirdi.

Pəncərənin yanında oturan Nəsib dayı çox fikirli idi. İmran da burada idi. O, divar tərəfdəki skamyada kolxozçularla oturub papiros çəkirdi. Onun saçı uzanmış, üzünü tük basmışdı. Üzünün sümükləri görünürdü. Başını qaldırıb adamların üzünə baxmırdı, sanki onlardan çəkinirdi. Hamı susurdu. İçəridəkilər, eyvana yığılan kolxozçular söhbətin nə ilə qurtaracağını gözləyirdilər.

Rayondan "İyirmi altılar" kolxozuna təhkim edilmiş Əsədov düz bir saat idi ki, camaatı idarəyə yığıb sorğu-sual açmışdı. Gün günorta yerinə qalxmışdı. Kolxozçular işə tələsir, prokuror isə heç kəsi buraxmaq istəmirdi. Nəhayət, o, otağın ortasında dayandı, əlini göy şevyot köynəyinin üstündən çəkdiyi enli qayışa keçirdib, qəzəblə Nəsib dayıya baxdı.

– Mən tələb edəcəyəm ki, sizin məsələniz raykomun bürosunda həll edilsin. Kolxozun dağılmasına yol verə bilmərik. Sizə kim ixtiyar verib ki, yaz əkin planını srıvat eləyəsiniz?! De görüm, indiyəcən yeri niyə şumlamamısınız? İki gündən sonra səpin başlayır, bəs hanı şumunuz?

– Yaxşı olar, bunu MTS-dən soruşsanız.

– Nə?! MTS mənim nəyimə lazımdır? Mən sizi tanıyıram, siz də cavab verəcəksiniz.

– Yoldaş Əsədov, boş yerə niyə çığır-bağır salırsınız? Raykom sizi bizim kolxoza göndərib ki, işə kömək edəsiniz, dava-dalaş salmağın nə mənası var?

– Bəs nə edək, yoldaş Nəsib? Siz kolxozu dağıdacaqsınız, biz də durub baxacağıq? Yox, bu işə hamıdan qabaq sən, bir də ağranomunuz cavab verəcək. Mən yenə soruşuram ki, de görüm pambıq sahələri indiyəcən niyə əkilib qurtarmayıb?

– Yenə deyirəm, bunu MTS-dən soruşun.

– MTS-in bura nə dəxli var?

– Var, özü də lap çox. Direktor bu boyda kolxoza ayrılan traktorları verməyəndə, işimiz əlbət geri qalacaq...

– Vaxtında gedib alaydınız.

– Getmişdik, – bayaqdan söhbətə qulaq asan İmran dilləndi, – əliboş qayıtdıq. Vermədi.

– Niyə?

– Bilmirəm. – İmran çiynini çəkdi.

Əsədov yuxarıdan aşağıya kinayə ilə İmranı süzdü.

– Amma boş-boş danışmağı bilirsən.

– Bu nə deməkdir?

– Bu o deməkdir ki, nə özün bir iş bacarırsan, nə də başqalarını işləməyə qoyursan.

– Düzdür, – idarədə oturanlardan kim isə dilləndi. Dərhal otağa səs-küy düşdü.

– İndiyəcən bizim kolxozda belə biabırçılıq olmamışdı.

– Əkini də, səpini də hamıdan əvvəl qurtarardıq.

– Bəs indi nə oldu? Kim əlinizi tutdu?

– Nə bilim, hərə bir söz deyir. Kolxozda böyük-kiçik tanınmır.

– Sən də söz danışdın!

– Düz deyirəm də, İmran kəndə gəldi-gəlmədi işimiz düz gətirmədi.

– Ə, onda nə günah var, o neyləsin?

– Bacarmadığı işə özünü soxmasın. Allahın beş traktorunu ala bilmir, yeni üsuldan, aqrotexniki qaydada becərmədən danışır.

Əsədov deyilənləri dinlədikdən sonra İmrana baxdı. O, başını aşağı salıb dalbadal papiros sümürürdü.

– Eşidirsən ki?

– Eşidirəm...

İmran daha bir söz demədi. Doğrudan da kolxozun bu ilki vəziyyəti ağır idi. Artıq havalar düzəlmişdi. Çöllərin qarı təmiz götürülmüş, təpələr, yamaclar yaşıllaşmışdı. İndiyəcən şum işi çoxdan qurtarmalıydı. Bəzi kolxozlar artıq səpinə başlamışdı. Ancaq "İyirmi altılar" kolxozu artıq səpiləsi yerin heç üçdə birini də şumlamamışdı. Nəsib kişi ilə dalaşandan və axırıncı iclasdan sonra Kosaoğlu heç nəyə qarışmaq istəmirdi. İmran isə MTS-ə ayaq döyməkdən yorulmuşdu. Direktor hər gün bir bəhanə ilə onu əliboş qaytarırdı. Nəsib dayı bir neçə dəfə raykoma gedib, katibə şikayət etmişdi. Direktor cavab vermişdi ki, günah özlərində olub, vaxtında gəlmədilər, traktorların hamısını kolxozlara payladıq, indi fürsət düşən kimi o biri kolxozlardan bir neçə traktor alıb "İyirmi altılara" göndərəcəyəm. lakin günlər gəlib keçmiş, direktor vədinə əməl etməmişdi.

Briqadirlər hər gün İmranın üstünə düşür, "mənim yerim qaldı" – deyə hay-haray salırdılar. İmran tez-tez Nəsib dayının yanına qaçıb kömək istəyirdi. Aqronom hiss edirdi ki, camaat yavaş-yavaş ondan üz döndərir. Hətta o bir-iki dəfə arxasınca ağız büzüb gileylənənlər olduğunu da görmüşdü. Suya gedən arvadlar qulağı eşidə-eşidə İmranı asıb-kəsirdilər.

– Deyəsən, bu il zəhmətimiz hədər gedəcək, bildir bu vədə Kosaoğlu hər yeri əkdirmişdi.

– Ay qız, adam uşağa iş tapşıranda elə olar də. İmranın ağzına kim baxacaq? Onu kim tanıyır?

– Vallah düzcə deyirsən. Kosaoğlunun ağzının kəsəri var. Haraya getsə sözünü tuturlar. Amma bu...

– Siz Allah, bəsdi, o neyləsin? Rayona yeni gəlib, kimdi onun sözünə baxan?

– Bəs Kosaoğlu niyə qıraqda durur?

– Nə bilim, deyirlər ki, acıq eləyib.

– Ay qız, kimdən?

– İmrandan, Nəsibdən. Kişini qoymurlar öz ağlıynan iş görsün.

– Kosaoğlu işə qarışmasa çətin olacaq.

– Kişini iclasda biabır eləməsəydilər, indi traktorları yan-yana düzmüşdü.

– Haradan alacaqdı o qədər traktoru?

– Ay qız, uşaq olma, bütün MTS direktorları onun dostu deyilmi? İmran bu cür sözləri eşitdikcə duz kimi əriyir, camaatın gözünə belə görünmək istəmirdi.

Onu ən çox narahat edən MTS direktorunun hərəkəti idi. Axı o niyə belə inad edirdi? Nə üçün "İyirmi altılar" kolxozuna barmaqarası baxırdı? Axı, deyirlər, o, Kosaoğlunun dostudur. İndi nə olub? Bəlkə də burada elə Kosaoğlunun da əli var?

İmran bir dəfə şübhələrini Nəsib dayıya açmışdı. Nəsib dayı isə gülümsünüb:

– Ağlım kəsmir ki, o belə iş edə, – demişdi. – O, öz əli ilə öz işini dala salmaz. Təqsir direktordadır. Plansız iş görüb, traktorları düz bölməyib...

...Ortada təkəbbürlə gəzinən Əsədov, nəhayət, sükutu pozdu.

– Axşam açıq partiya iclası çağır, görək bu işə camaat nə deyir? İclasda da eyni sözlər təkrar edildi. Əsədov əlini stola çırpıb Nəsib dayının, İmranın üstünə qışqırdı. Camaat bir-birinə qarışdı. Kimi onları müdafiə edir, kimi də Kosaoğlunu təqsirləndirirdi.

– Kişini niyə incidirsiniz?

– Neçə ilin sədridir, qoyun işini görsün!

– Ona söz verin, görək nə deyir?

– Bu saat, – deyə Əsədov iclası sakitləşdirdi. – Buyur görək, yoldaş Kosaoğlu. Qurban ağır-ağır ayağa durub xitabət kürsüsünə yaxın-

laşdı. Bir-iki dəfə içini arıtlayıb susdu, camaatın nəfəsini dərmədən ona qulaq asdığını yəqin edəndən sonra sakitcə sözə başladı.

– Mən sizdən küsməmişəm. Məni yandıran qədirbilməzlərdir. Deyin görüm indiyəcən sizə bir pislik eləmişəmmi? Həmişə planı doldurmuşuq. Pulumuz pul olub, mükafatımız da mükafat. İndi siz özünüz soruşun, bunlar məndən nə istəyirlər? Stol istəyirlərsə, buyursunlar. Onsuz da mən yorulmuşam. İmran cavandır, qoy indi o işləsin.

– Mən stol davası eləmirəm və sizin yerinizə də keçmək fikrim yoxdur.

– Olsa da bacarmazsan. Tutduğun iş göz qabağındadır.

– Düzdür, – deyə yerlərdən qışqırdılar, – o, uşaqdır, özün işə qarış. Kosaoğlu məğrur bir görkəm aldı:

– Mən işə qarışanda gərək əl-ayağa dolaşan olmasın.

– A kişi, nə əl-ayağa dolaşan? Sən nə danışırsan? Bizə bu saat iş lazımdır. Raykom məni bura göndərəndə deməyib ki, dəfədaraq açın. Mənə deyib ki, yerin deşiyindən də olsa traktor tap, yeri şumla. Vəssalam. De görüm fikrin nədir?

– Fikrim odur ki, onlar əlinin arxasını yerə qoyub geri dursunlar. İki gündən sonra mənim kolxozumda əkilməmiş bir çərək yer tapsanız, boynumu vurun. Mən kişi adamam. Tüpürdüyümü yalamaram.

– Sən arxayın ol, – deyib Əsədov mübahisəni yekunlaşdırdı, – işə mane olanlarla haqq-hesab çəkəcəyəm.

* * *

Onlar məktəbin alt tərəfindəki təpənin üstündə dayandılar. Qabaqdakı arxın o tayında Tiflisə doğru uzanan asfalt yolda maşınlar hərəkət edirdi. Fanarlar uzaqdan bir cüt göz kimi parıldayır, get-gedə güclənərək gecənin bağrını dəlir, dərələri, təpələri işıqlandırırdı; maşınların arxasındakı qırmızı işıqlar getdikcə kiçilir, mayböcəkləri kimi işıldayıb yox olurdu. Yol boyunca düzülmüş kəndlərin, Dəlidağın döşünə səpələnmiş fermaların işıqları titrəşirdi. Harada isə, lap uzaqda tənha bir traktorun ahəngdar tırıltısı eşidilirdi. İlıq yel əsirdi. Havada ruhu oxşayan rütubət qarışıq ətir vardı. Torpağın rayihəsi havaya hopmuşdu. İmran dərindən nəfəs alıb köksünü ötürdü. Onunla yanaşı dayanan Zeynəb İmranın qoluna toxundu.

– Hava torpaq ətri verir, ay İmran, daha yazdır...

– Hıy?..Hə... doğrudan da...
– Ə, fikrin hardadır?
– Fikrimmi?
– Bax, ay da doğub, gör hava nə gözəldir!
– Bilirəm.
– Bilirsən, bəs burnunu niyə sallayıbsan?
– Bəs nə edim, oynayım?
– Nə olub ki, lap oyna da, hələ bir az o yana da öt.
– Nə üzlə?
– Bəsdir, sən Allah.

İmran dinmədi. Cibindən papiros çıxardıb yandırdı. Sonra da təpənin döşündə, göy otluqda uzandı. Zeynəb dinməz-söyləməz onun yanında oturdu. Qız İmranın fikrini dağıtmağa çalışsa da, söz tapmırdı. Əslinə baxsan, onun özü də kədərli idi. Dükanın yanında olan söhbətdən sonra tutqun gəzir, qız-gəlinlərin yanında özünü təhqir olunmuş hesab edirdi. Onun şuxluğu birdən-birə yox olmuşdu. İmranın Kosaoğlugilə getməsi xəbəri və Şahnazın ona yanıq verə-verə gəzib-dolanması Zeynəbi pərt edirdi. "Gədəni tora salmasalar yaxşıdır" – deyə düşünürdü. Bəzən də özünü danlayırdı: "Nəyimə lazımdır, özü uşaq deyil ki..." Zeynəb hətta İmranı az görməyə cəhd edirdi, ancaq mümkün olmurdu. Onlar idarədə, çöldə rastlaşırdılar.

Zeynəb köksünü ötürüb, yanında uzanan İmrana baxdı. "Allah Kosaoğlunun dilini ağzında yandırsın. Gədəni odsuz-ocaqsız yandırırlar".

İmran papirosunu atıb arxası üstə çevrildi. Əllərini başının altında çarpazlayıb, gözünü sonsuz boşluqlara zillədi. Ulduzlar necə də parlaq və cazibədar idi! Onlar sakit-sakit sayrışır, elə bil ki, hirsindən, izzətinəfsinin tapdanmasından az qala ürəyi partlayan İmrana gülümsünüb göz qırpırdı. Hava ayazıdıqca onlar daha parlaq olurdu. Zeynəb yavaşca onun qoluna toxundu:

– Dur gedək, yer nəmdir, soyuq dəyər.

İmran dinmədi. Zeynəb ay işığında onun gözlərinin yaşardığını zənn etdi:

– Ə, sənə nə olub?

İmran udqundu.

– Heç nə, Zeynəb.

– Bıy, yerinə utanım, ə, bu nədir? Nə tez mısmırığını salladın? Yekə kişisən, bizi biabır eləmə. Ə, dur gedək. Hələ belə şeyləri çox görəcəksən.

Onlar yola çıxdılar.

İmran yenə də susur, Zeynəb isə atmacalı sözlərlə onu güldürməyə çalışırdı. İmranı qaşqabaqlı görmək ona hər şeydən ağır gəlirdi. Zeynəbi məyus edən də o idi ki, İmran ilk zərbədən sonra sarsılana oxşayırdı.

– Yəqin ki, daha kənddə qalmazsan, çıxıb gedərsən?

Barı gedəndə xəbər elə, gəlib yola salaq.

– Hara gedəndə? Sən nə danışırsan?

– Nə bilim, başqa yerə, nə çoxdur yaxşı yerlər.

İmran dayanıb diqqətlə qızın üzünə baxdı.

– Bu fikir sənin ağlına hardan gəldi?

– Heç hardan, elə sir-sifətinə baxanda görürəm ki, gec-tez qaçacaqsan. Zeynəbin sözləri sanki İmranı yuxudan oyatdı. "Yəqin ki, indi çoxları belə düşünür. Bəlkə elə Kosaoğlu da bu fikirdədir. Yəqin bu saat məni əzişdirib sıradan çıxartdığını zənn edib sevinir".

– Ancaq, sən Allah, qaçanda asta qaç ki, dalınca çata bilək. Zeynəbin, yenə köhnə adəti üzrə, xısın-xısın güldüyünü görən İmran əsəbiləşdi. O, hiss etdi ki, bu sakit gülüş qaqqıltıya çevriləcək. "Bu qızın da qəribə xasiyyəti var. Keçi can hayındadır, qəssab piy axtarır".

İmran özünü ələ aldı.

– Mən qaçan deyiləm, ancaq sən özündən qorx.

– Yox əşi, yalan demirsən ki?

– Bəsdir.

– Yəni deyirsən, sözünə inanmaq olar?

– Zeynəb...

– Hirslənmə... İnandım ki, düz sözündür. Heç yana qaçan deyilsən. – O şaqqıldayıb güldü. İmran da özünü saxlaya bilməyib qımışdı.

– Yaman əməlbazsan ha...

– Hər halda dostun Kosaoğlundan əməlbaz olmaram.

– Yaman dostuq!

– Bəs necə, heç aranızdan su keçmir. İndi mən deyənə gələrsən. Görürsən ki, ona inanmaq olmaz? Vaxtında sözümə baxmadın.

– Nə edim? Nəsib dayı kimi kişi də ona inanır.

– Yaxşımı eləyir? Sən elə bilirsən Kosaoğlunun onunla bağrı badaşdır? Əlacı olsa, Nəsib dayını kənddən günü bu gün qovar.

– Bəs Nəsib dayı bunları bilmir?

– Bilsə belə arxayın olmaz. Köhnə yoldaşdırlar. Bir də, o kişi sakit adamdır. Kosaoğlu da bundan istifadə edir.

İmran xeyli susdu.

– Zeynəb, doğrudan Kosaoğlu iki-üç günə yeri şumladacaq?

– Yəqin.

– Axı necə?

– Nə bilim, onun at işləməz yolları var.

Onlar yenə susdular.

– Demək qaçmayacaqsan?

– Yaxşı, zarafatı burax.

Zeynəb yenə nə isə demək istədi, ancaq bu vaxt ayaq səsləri eşidildi. Arxadan onlara yaxınlaşan Nərgiz müəllimə adəti xilafına:

– Yenə də qoşalaşıbsınız? – dedi.

– Təbiəti seyr edirik. Bizim bu ağranom oğlan bahara vurulub.

– Təbiətə aşiq olmaq pis deyil.

İmran Nərgizin yumşaq, titrək səsini eşidəndə bir az həyəcanlandı. Bu səsdə nə isə qəribə, adamı sakit edən, az qala ona layla çalan bir qüvvə vardı. Ortalığa çökən ani sükutu Zeynəb pozdu:

– Təbiət aşiqi, bəs bu zaman hardan gəlirsən?

– Məktəbdən. Dərnəyimizin məşğələsi vardı.

– Nə dərnəyi?

– Dram. Axı qabaqdan may bayramı gəlir.

– Teatr verəcəksiniz?

– Özü də lap yaxşısını.

– Allaha şükür, axır ki, klubumuzun qapısı açılacaq.

– Bilirsən, Zeynəb, elə yaxşı çalıb-oxuyan uşaqlarımız var imiş ki...mən heç bilmirdim, onlara baxdıqca, qulaq asdıqca adama ləzzət verir. İmran papiros çəkir və qızların söhbətinə qulaq asırdı.

Nərgiz müəllimə ayaq saxladı. Qaranlıqda bozaran çöllərə, sakit yatan kənd evlərinə baxdı.

– Kənd axşamları doğrudan da gözəl olurmuş! Mən əvvəllər təsəvvürümə gətirə bilmirdim ki, gurultulu şəhər həyatından sonra kənddə necə dolanacam. Romanları oxuyanda kənd xoşuma gəlirdi. Oradakı sakitlik məni həm cəzb edir, həm də qorxudurdu. Sən demə, qorxulası bir şey yox imiş. Gəldim, lap valeh oldum. Buradakı sakitlik də, axşam qaranlığı da mənə xoş gəlir.

– Amma bizim ağranoma xoş gəlmir.

– Niyə ki? – deyə Nərgiz müəllimə ehtiyatla soruşdu.

– Nə bilim? Qoy özü desin.

– Nərgiz müəllimə, siz ona fikir verməyin, yenə şitliyi tutub.

– Yox, düz sözümdür. Bizim kənd onun xoşuna gəlmir.

– Bax, burda haqlısan. Bizim kənd o qədər də xoşuma gəlmir.

Nərgiz müəllimə İmranın fikrini bilirdi. Söhbət zamanı İmran dəfələrlə ona demişdi ki, "saat on olmamış kənd yuxuya gedir, qapı-bacalardan işıq kəsilir. Amma gərək belə olmasın. Mən istərdim ki, başqa kolxozlardakı kimi, bizim kolxozun da klubu hər gecə açıq olsun. Tamaşalar göstərək. İdarənin qabağında boş yer var, oranı park eləsək pismi olar? Cavanlar hər axşam işdən sonra ora toplansa, danışıb-gülsə kimə zərəri dəyər? Heç kimə".

Əslinə baxsan, məktəbdəki dram dərnəyinin işinə qoşulmaq fikri Nərgizdə bu cür söhbətlərdən sonra əmələ gəlmişdi.

– Xoşuna gəlmir, düzəldərik, – deyə Zeynəb İmrana cavab verdi.

– Elə dərd də bundadır ki, adamın arzusunu ürəyində qoyurlar.

Onlar evə çatdılar. Zeynəb doqqazda ayaq saxladı. İmran onun qolundan tutdu:

– Gedək bizə. Yəqin anam bir şey bişirib bizi gözləyir.

Zeynəb yenə müəmmalı gülümsədi. – Bir şərtlə gedərəm.

– O nədir?

– Qorxub kənddən qaçmayasan.

Tükəzban xala qaqqıltıya bayıra çıxdı.

* * *

Elə həmin axşam Kosaoğlu qonağı prokuror Əsədovu yedirib içirəndən sonra hesabdarla anbardar Musanı yanına çağırdı. Onlar qapıdan girən kimi:

– Kassada nə qədər pul var? – dedi.

– Nə qədər lazımdır? – deyə Musa soruşdu.

– Otuz min.

– O qədər olmaz.

– Olmaz, düzəlt. Sonra gedib bankdan alarsan.

– Axı, Qurban qağa...

– Ə, uzun eləmə... Get evdən gətir, yoxdur, koperativdən-zaddan tap düzəlt, yarım saata burda ol, yola çıxacam.

Musa getdi. Kosaoğlu sakitcə dayanan hesabdara üzünü tutdu:

– Sən də çek yaz, sabah bankdan avans pulunu alın. Sonra da cədvəl tut.

– Bəs otuz mini hara yazım?

– Necə hara yazım? Uşaq deyilsən, adam başına neçə düşürsə, böl, yaz vedomosta, pul paylananda kolxozçulardan çıxılar.

– Axı daha qorxuram, söz-söhbət olar.

– Nə söhbət, ə?! Gözünüz kordur? Mən bu işləri dədəmin xeyrinə ha görmürəm. Yeri! Nə deyirəm, ona bax.

Hesabdar qorxa-qorxa qapıya yaxınlaşdı.

– Bir şey demirəm. Amma Nəsib...

– Nəsib kimdir? – deyə Kosaoğlu onun sözünü kəsdi, – gördük sənin Nəsibini.

Yarım saatdan sonra gətirilən pulu Kosaoğlu sayıb on minini kənara qoydu.

– Arvad, gəl bunu apar saxla, – Sayalını səslədi. Yerdə qalanını isə iki yerə bölüb kürkünün iç cibinə qoydu. Sonra da eyvana çıxıb şoferi səslədi.

– A bala, a Məmməd, maşını bəri çək.

Şofer kənd yolundan çıxıb asfalta düşəndən sonra:

– Hara gedirik? – deyə soruşdu:

– MTS direktorunun evinə.

– Nə var, xeyirdimi, a Qurban qağa?

– Xeyirdir. Traktor alacam.

– Bəyəm, traktoru satırlar?

– Ə, çox danışma, əlində maşınını sür.

...Direktor Kosaoğlunu yataq otağında qəbul etdi.

– Ə, bu gecə vaxtı nə olub?

– Nə olacaq, traktordan ötəri gəlmişəm.

Kosaoğlunun vaxtsız gəlməsindən onsuz da narazı olan direktor üz-gözünü turşutdu.

– Traktor hardadır, ay rəhmətlik oğlu, heç indi boş traktor tapılar?

Qurban onun könülsüz cavab verdiyini görsə də, üstünü vurmadı. Gözünü qıyıb, çarpayıdan ayaqlarını sallayan direktoru süzdü.

– Ə, səni tanımırammı? İstəsən lap yerin deşiyindən taparsan. Bir də ki... – Kosaoğlu səsini uzadıb sözünü mənalı bir tərzdə tamamladı. – Allaha şükür, sən ki, məni yaxşı tanıyırsan.

Direktor, Kosaoğlunun eyhamını başa düşüb susdu. Onsuz da o, sabah "İyirmi altılar" kolxozuna traktor göndərməli idi. Bu gün səhər

tezdən raykom katibi onu yanına çağırıb abrını ətəyinə bükmüş və demişdi ki, "traktorları düzgün bölmədiyinə görə səninlə sonra danışarıq. İndi isə boşalan traktorlardan tez "İyirmi altılara" göndər". Bundan başqa katib qonşuluqdakı rayona zəng vurub xahiş etmişdi ki, bir neçə traktor göndərsinlər.

Əkin işlərini vaxtından əvvəl qurtaran qonşu MTS-in direktoru katibin xahişini yerinə yetirib, iyirmi traktor göndərmişdi. Həmin traktorlardan da "İyirmi altılar" kolxozuna göndərmək direktora tapşırılmışdı.

Hər il əkin zamanı Kosaoğlu direktorun yanına hamıdan qabaq gəlib istədiyi qədər traktor aparardı. Sonra da, necə deyərlər, bu yaxşılığın əvəzini çıxardı. Amma bu il Kosaoğlu yerindən tərpənməmişdi. Direktor bir neçə gün onu gözləmiş, axırda da acıqlanıb traktorları başqa kolxoza vermişdi. Nəsib dayını və İmranı əliboş qaytarmışdı ki, gecikibsiniz. Əslində isə o, Kosaoğlunu görmək, onunla danışmaq istəyirdi. Kosaoğlu da bunu bilirdi. Öz qüdrətini göstərmək, İmranla Nəsib dayını pis vəziyyətdə qoymaq üçün qəsdən işə qarışmırdı.

İndi isə o gəlmişdi.

Kosaoğlu necə olursa-olsun traktor almağı qət etmiş, direktor isə qanuni düzələn işi minnətsiz yerinə yetirmək istəmirdi.

Ortalığa çökən sükutun uzun çəkdiyini görən Qurban darıxdı.

– Ə, nə fikir edirsən, yoxsa elə bilirsən Kosaoğlu sənin xəcalətindən çıxa bilməz?

Bir oxla iki dovşan vura biləcəyini hiss edən direktor gülümsündü:

– A kişi, bu nə sözdür, danışırsan? Mən səni tanımırammı? Yaxşı, de görüm, yeddi traktor göndərsəm, bəs edərmi?

– Nə qədər çox olsa, sənin adınadır.

Direktor çarpayıdan düşüb şifonerə yaxınlaşdı. Pencəyinin cibindən papiros çıxarıb qayıdınca Kosaoğlu güzgü stolunun siyirməsini açıb cibindəkiləri ora qoydu. Direktor onun hərəkətlərini şifonerin aynasında görsə də, üstünü vurmadı. Yandırdığı papirosu bir-iki nəfəs alıb gülümsündü:

– Yaxşı, sən deyən olsun.

İşin düzəlməsindən kefi açılan Kosaoğlu ayağa durdu. Xudahafizləşmədən əvvəl:

– Ağlın nə kəsir, o biri MTS-ə də dəyimmi, yoxsa elə özün... – deyə soruşdu.

Direktor sədrin fikrini başa düşdü:

– Yox, yox, sonra özünü biabır edirsən. Təzə direktor sən deyənlərdən deyil. Özüm düzəldərəm.

...Səhər tezdən traktorların gurultusuna oyanan Əsədov, başının üstündə dayanan Kosaoğluna baxıb gülümsündü.

– Deyəsən, kefin doxsan doqquzdur?

– Sağ olsun, məni əliboş qaytarmadı.

Prokuror dərhal durub geyindi. Yarım saat keçmiş idarədən camaatın gözü qarşısında raykoma zəng etdi.

– Bəli, özüm işə qarışmasam, heç nə düzələn deyildi. Dünən ikisinin də abrını aldım. Bəli? Hə... sözünə əməl elədi. Qonşu MTS-dən aldığı traktorlardan da göndərib. Kosaoğlu özü getmişdi. Arxayın olun. Əkin qurtaranacan özüm burda olacam. Daha elə biabırçılıqlara yol vermərəm.

## 12

Kosaoğlu kürkünü çiyninə salıb anbara tərəf getdi. Neçə gündən bəri rayon mərkəzində olan anbardar yenicə qayıtmışdı. Onun yolunu gözləyən kolxozçular qapının ağzında dayanmışdılar. Kərim kişi ucadan gileylənirdi. Kosaoğlu ayaq saxlayıb qulaq verdi.

– A bala, camaatın halalca haqqını niyə qarın ağrısı ilə verirsən? Yarım aydan çoxdur cədvəl tutulub, pulu niyə paylamırsan? Hökumət avansı ona görə verməyib ki, ağzını bağlayıb saxlayasan. Kimin payına nə düşür, payla. İş-güc vaxtıdır. Camaatı yola sal.

Anbardar əllərini yoğun qarnının üstündən kip çəkdiyi enli kəmərinə çəkib, kişini başdan-ayağa süzdü.

– Ə, paylamayanda sənin pulunu yeməyəcəyəm ha, boğazını niyə yırtırsan?! Vaxtında gəlib almayıbsan, mən neyniyim?

– Səni tapmaq olur bəyəm?.. Bir ayağın Tiflisdədir, bir ayağın Bakıda. Bilmək olmur işçisən, yoxsa alverçi.

Musa qocanı tərs-tərs süzdü. Onun uzun çal saqqalına, əlindəki çəliyinə baxdı.

– A Kərim kişi, deyirdilər, inanmırdım, sən əməlli-başlı demaqoqsanmış ki.

Kərim kişi, şapkasının uzun günlüyünü qaşlarının üstünə basmış anbardarın qırmızı sifətinə, köynəyinin yaxasından pırtlayıb çıxan

boyun ətinə baxdı. Nəfəs aldıqca köpmüş pota kimi fısıldayırdı. "Lap dayısı Kosaoğlunun yerini tutacaq" – deyə Kərim kişi düşündü.

– Yaxşı, cədvəli bəri ver!

Anbardar hirslə kağızları eşələdi. Üstünə toz qonmuş çötkənin altından iri bir kağız çıxartdı:

– Al, sox gözünə!

– Bala, ağıllı danış, mən atan yaşdayam.

– Sənin kimi atam olsaydı, qarnımı dörd yerdən cırardım, tez ol, familini tap!

Kərim kişi əlləri əsə-əsə kağızı o üz-bu üzə çevirdi. Adını tapıb qabağında qol çəkdi.

Musa pulları sayıb kişinin qabağına atdı. Qoca dağılıb yerə səpələnən əllilikləri yığıb yoxladı və təəccüblə çiynini çəkdi.

– Bala, bəs bunun beş yüz manatı hanı?

– Nə beş yüz, a kişi?!

– Axı mənə min beş yüz çatasıdır.

– Nə çatasıdırsa, onu da alıbsan.

– Oğul, qoca olanda nə olar, haqq-hesabımı bilmirəm? Neçə manata qol çəkmişəm, onu bəri elə. Bu nədir verirsən? Uşaq aldatmırsan ki?

– Ə, mən adam aldadanam? Utanmırsan? Qoca kişisən, imanın olsun, mən sənin qəpik-quruşuna qalmışam?..

Musa getdikcə qızışıb səsini ucaldırdı. Kərim kişinin əlləri titrəyirdi. Bayaqdan mübahisəyə qulaq asan kolxozçulardan biri söhbətə qarışdı.

– Ə, nə xoruzlanırsan, kişini döyməyəcəksən ki, düz deyir də, nə yazılıbsa onu da ver. Haqq sözü deyəndə yağırını niyə basır?

Ucaboy, enlikürək bir oğlan qabağa keçdi. İri yumruğunu stolun üstünə qoydu. Qəzəbli gözlərini anbardara zillədi.

– Gözünü sil, mənə düz bax! Bəsdir camaatı barmağına doladığın. Mən də sənə Kərim kişi deyiləm, qoca görüb üstünə şeşələnəsən. Bu saat dərini boğazından çıxardaram! Cədvəli bəri ver. Pulları say ovcuma. Cibgirin biri, cibgir!

– Cibgir özünsən?

– Nə dedin? Bir də de görüm!..

Onun boğazının damarları şişdi. Sifəti boğuq qırmızı rəngə çaldı. Musa çətinə düşdüyünü görüb sözün dalını qısdı:

– Ə mənim üstümə niyə düşübsünüz? Ağa deyir sür dərəyə, mən də sürürəm. Məndən nə istəyirsiniz? Gedin böyüyünüzün yanına.

– Böyük kimdir?

– Kəndimizdə bircə böyük var. O deyib pulu belə payla, mən də paylayıram.

– Kosaoğlu nə haqla elə deyir, balam, dərəbəylikdir?

– Hünəriniz var, gedin özüylə danışın.

Söhbətin ciddiləşdiyini görən Kosaoğlu fikrə getdi. O, sədrliyə keçəndən bəri kolxozda hərdən belə hadisələr baş verirdi. Lazım olanda Kosaoğlu cədvəl tutdurub camaata qol çəkdirir, "MTS-in traktorçularına pul paylamışıq, onun kağızıdır" deyirdi. O, Musaya tapşırmışdı ki, "gözün su içmədiyi adamları yanına çağır, xəlvətcə pullarını ver, özlərinə də de ki, heç kimə bildirməsinlər". Beləliklə cədvəllər hazır olub işə tikilir, pullar da yığılıb qalırdı. Kolxozçular çox sorğu-sual edəndə isə Kosaoğlu hirslənir, "bəs MTS bu yerləri sizə müftə əkir? – deyirdi. – Bir yandan istəyirsiniz plan dolsun, mükafat alasınız, bir yandan da qəpik-quruş davası eləyirsiniz. Mən sizin pullarınızı cibimə ha qoymuram!"

Əslində isə bu pullar gecələr Kosaoğlunun evində bölüşdürülürdü. Əvvəllər camaat belə hadisələrə az əhəmiyyət verir, Kosaoğlunun dəlillərinə inanırdı. İndi isə vəziyyət dəyişmişdi.

Kosaoğlu yenə köhnə adəti üzrə hərəkət etmək istədi, ancaq fikirləşib qərarını dəyişdi. İrəli yeriyib bərkdən öskürdü. Adamlar dönüb baxdılar. Kosaoğlu onları ağayana süzüb, yol vermələrini gözlədi. Camaat onu qabağa buraxdı. Kosaoğlu ağır-ağır keçib, anbardarın yanında dayandı.

– Yenə nə olub, ə, nə qalmaqal salıbsınız?

– Avans almağa gəlmişik, – Kərim kişi dilləndi.

– Avans, avans, – deyə Kosaoğlu təkrar etdi. – Elə sənin günün avans dalında keçdi. Bu zaman nə avansdır?

– Özün məndən yaxşı bilirsən.

Kosaoğlu gözünü qıyıb qocanı süzdü. Kərim kişi hiss etdi ki, bu saat sədrin dişi bağırsağını kəsir, əlacı olsa, üstünə atılıb onu parçalar.

Kosaoğlu dərindən nəfəs aldı. Sanki bununla da Kərim kişiyə "yaxşı, səninki ilə mənimki qalsın sonraya" – dedi və üzünü Musaya tutdu:

– A bala, xalqın pulunu niyə vermirsən?

– Verirəm, Qurban qağa, özləri almır.

– Nə deyib almırlar?

– Nə bilim?

– Pulları əskik verir, hərədən beş yüz manat tutur. Axı bu nə deməkdir?! Belə iş bir dəfə olar, iki dəfə olar, hər il bizim başımıza niyə bu oyunu açırsınız? Adamdan nə qədər pul çıxarlar?

– Həəə... indi başa düşdüm. Musada taqsır yoxdur. Onu mən tapşırmışam.

– Niyə?

– Niyəsini gedin ağranomunuzdan soruşun.

– Ağranomun bura nə dəxli var?

– Var. Kərim kişi, çox yaxşı var. Onun başımıza açdığı oyunu görmədin? Sinəsinə döyüb "mən" deyə-deyə bizi az qalmışdı biabır eləsin. İndi bax bu cərimə də onun cəriməsidir ki, çəkirsən. Sən elə bilirsən adama müftə iş düzəldirlər? Bu traktorlar öz başına gəlib?

– Kosaoğlu üzünü ətrafdakılara tutdu: – Ə, mən yoruldum, bunu siz başa salın.

Kolxozçular əvvəlcə heç nə demədilər. Sonra yavaş-yavaş öz aralarında pıçıldaşdılar.

– Bir yana baxanda kişi düz deyir, xərc çəkməsən bir gündə on dörd traktoru adama kim verərdi?

– Özü də deyirlər, öz MTS-mizdə traktor yox imiş, gedib qonşu rayondakı MTS-dən xahiş eyləyib.

– Çox böyük iş görüb?

– Böyük döyülmü, əyə, bəs el içində biabır olmağımız yaxşı idi?

– Vaxtında iş görsə, belə də olmazdı.

– O nə qayırsın, kişinin əl-qoluna dolaşdılar.

– Mən heç nə bilmirəm, pulumu alacam.

– Bəs Kosaoğlu cibindən xərc çəkəcək? Dədəsinə ehsan ha deməyib.

– Yaxşı, dava salmayın, adama beş yüz manatdır, elə billik heç yox imiş.

– Maya qoymasan, qazanc götürməzsən, – deyə hətta biri zarafata da başladı.

Kosaoğlu deyilənlərə qulaq verdikcə ürəyi şadlanırdı. Əslinə baxsan, məsələnin altından bu qədər asanlıqla çıxdığına o heç də inanmırdı. Ancaq Kosaoğlu deyilənlərin hamıya eyni cür təsir etmədiyini, bəzi üzlərdəki narazılığı da görürdü. O bu fürsətdən də istifadə etməyi lazım bildi. Yarızarafat, yarıciddi:

– Hə... nə davanız varsa, gedib ağranomla eləyərsiniz. İndi cədvələ qol çəkin, nə verirlər dinməz-söyləməz alıb evinizə gedin. İstəmirsinizsə, ayrı məsələ. Onda, a bala, a Musa, pullarını qaytar ver özlərinə, o zərəri mən çəkərəm. İnsan oğluna yaxşılıq yoxdur.

Kosaoğlunun sözləri təsirsiz qalmadı. Camaat sakitləşdi. Hətta bu saat İmranın yanına gedib ondan haqqını tələb etmək fikrinə düşənlər də oldu. Ancaq Kərim kişi yerindən tərpənmədi.

– Ay Kosaoğlu, sən gəl, bizə kələk qurub, MTS-i bura qatma.

– Kərim kişi!.. – Kosaoğlunun gözləri bərəldi. – Deyəsən, sənin başın bədəninə ağırlıq eləyir axı. Bax, axırıncı dəfə deyirəm sənə, yığışdır özünü! Sonra peşman olarsan! Bəsdir, camaatı az çaxnaşdır!

Musa nə edəcəyini bilmirdi. Əlində qıfıl döyükürdü. Bu, Kosaoğlunu daha da hirsləndirdi.

– Ə, mal kimi gözünü niyə döyürsən? Qapını bağla, cəhənnəm ol, get! Yoxsa allahın da, bəndənin də hayfını səndən alaram. İstəmirlər, istəməsinlər.

– Baş üstə, dayı...

Musa cəld adamları bayıra çıxartdı. Qapını bağlayıb uzaqlaşdı. Adamlar da bir-bir dağılışmağa başladılar. Kosaoğlu anbarın qabağında bir qədər də dayandı. Gözünü qıyıb Kərim kişinin arxasınca baxdı. Qoca çəliyini belinin ortasına keçirmişdi. Pencəyinin dirsəyi yırtıldığından pambığı ağarırdı. Beli azacıq əyilmişdi. Kosaoğlu onu nifrətlə gözdən keçirib dişini qıcadı. Dodağının altında nə isə dedi. Cibindən bıçaq çıxardıb, yerdən götürdüyü çubuğu yona-yona idarəyə sarı addımladı.

O sakitləşə bilmirdi. Son zamanlar kimi dindirirdisə, sözü yerə düşürdü. Halbuki əvvəllər onun ağzından nə çıxsa idi, danışıqsız yerinə yetirirdilər. Gözü su içmədiyi adamları müxtəlif yollarla kənddən uzaqlaşdırırdı. Kimisini neft mədənlərinə işləməyə göndərər, kimisini Mingəçevirə, ya Daşkəsənə yola salırdı. Çalışırdı ki, bir oxla iki hədəf vursun: həm "nadinc adamlardan" canını qurtarsın, həm də rayonda sinəsinə döyüb desin ki, "mən öz kolxozumdan mədənlərə köməyə filan qədər adam vermişəm".

Əvvəllər o, bu işi çox asanlıqla görə bilirdi: müharibə dövründə işçi qüvvəsi çatışmadığından, çox vaxt bu işlər səfərbərlik şəklində həyata keçirilirdi. Kosaoğlu fürsətdən istifadə edir, kimdən xoşu gəlmirdisə, səfərbərliyə salırdı. Ancaq son vaxtlar vəziyyət dəyişdi. Bu il

isə lap çətinləşdi. İlin əvvəlində Nəsib dayını ilk partiya təşkilatına katib seçdilər. Kosaoğlu elə zənn edirdi ki, Nəsib rayon mərkəzini buraxıb kəndə gəlməyəcək, lakin o, məmnuniyyətlə kəndə qayıtdı.

Nəsib dayı işi çox adi bir şeydən başladı. Partiya təşkilatı üçün otaq ayırdı. Kabineti səliqəyə saldı, hər axşam idarədə oturub camaatı başına yığmağa, vacib məsələlər haqqında onlarla söhbət etməyə başladı. Elə bu vaxtdan Kosaoğlunun suyu bulandı. Bu tərəfdən də İmran gəldi. O da elə ilk gündən ayrı hava çaldı.

Kosaoğlu idarəyə girdi. İçəridə heç kim yox idi. Pəncərədən süzülən günəş şüaları döşəmənin ortasına düşmüşdü. Bir az əvvəl idarəni süpürən Gövhər qarının qaldırdığı toz işıq zolağında qaynaşırdı. Aftafanın lüləyindən tökülmüş əyri-üyrü su zolaqları da tozu yatırmamışdı. Kosaoğluna elə gəldi ki, bir az da burada dayansa boğulacaq. O, eyvana çıxıb dirəyə söykəndi. Yenə də əlindəki çubuğu yonmağa başladı. Günün istisi onu əzirdi. Bir-iki dəfə gərnəşib əsnədi. Yuxudan ayılmış kimi ətrafa baxdı.

İdarənin qabağındakı arxın suyu şırıltı ilə axırdı. Cərgə ilə düzülmüş qələmlər yarpaqlamışdı. Meyvə ağacları çiçək açmışdı. Alçalar ağ dona bürünmüşdü. Arılar vızıltı ilə uçuşur, çiçəkdən-çiçəyə qonurdu. Harada isə hop-hop oxuyurdu. Günəş altında yatan itlər hərdən başlarını qaldırıb tənbəl-tənbəl hürürdülər.

Kosaoğlu burada da darıxdı. Eyvandan enib xırman yerinə getdi. Orada da kimsə gözə dəymirdi. Saman yığılan yerlərdə zərif, yamyaşıl buğda cücərmişdi. Quşlar dəstə ilə orada eşələnir, pırıltı ilə uçuşub ağaclara qonurdular.

Kosaoğlu veyllənə-veyllənə gəlib təpənin üstündə dayandı. Təpənin döşü yamyaşıl idi. Balaca bir oğlan dizinin üstünə qoyduğu kitabı yeknəsəq ahənglə bərkdən oxuyur, arabir də göylükdə otlayan ala quzulara, atılıb-düşən təpəl çəpişə baxırdı.

Aram-aram vurulan zəngin səsi gəldi. Məktəbin həyəti uşaqlarla doldu. Kosaoğlu çantasını qoltuğuna vurub ötüşən oğlanlara, başı kəlağayılı balaca qızlara baxdı. İndi də ona səs-küy xoş gəlmədi. Asta-asta təpədən endi. Nəhayət, Kosaoğlu evə qayıtdı. Armud ağacının altında, "Pobeda"nın yanında dayanmış şoferi çağırdı:

– Məmməd, maşını yola çıxart!

Bir az sonra Kosaoğlunun maşını kənd yollarında cücərən zərif otların üstündə qoşa iz saldı. Kosaoğlu şoferin yanında yayxanıb otur-

muşdu. Maşın quş kimi uçduqca çöllərin gül-çiçək ətri ilə dolu olan təmiz havası Kosaoğlunu xumarlandırırdı.

Qarşıda geniş tarlalar görünürdü. Traktorlar şumun içində hərlənirdi. Ortada qaçışıb, çiyid daşıyan qızların al-əlvan paltarları yellənirdi. Maşın arxların yaxasınca gedirdi. Şofer hərdən sürəti azaldır, cücərən pambıqları sədrə göstərirdi.

Yaşıl yemişan pöhrənliyinin arxasından ipək paltarlı bir qız çıxdı. Əlindəki günlüyü yelləyib dayandı. Maşın silkələnib durdu.

– Şahnaz, hara belə? – deyə şofer soruşdu.

– Briqadalara.

– Gəl otur, aparım.

– Yox, özüm gedərəm.

Kosaoğlu başını pəncərədən çıxartdı.

– Sənin pay-piyada bu çöllərdə nə işin var?

– Bəs neyləyim? Evdə oturmaqdan adamın bağrı çatlayır.

– Evdə niyə, xəstəxanan var, otur işini gör.

Şahnaz əzilib, yerində silkələndi.

– Belə havada xəstəxanada oturub onun-bunun yarasına baxmaq olar?

– Di yaxşı, burnunu sallama. Hansı briqadaya gedirsən?

– Nə bilim, hansına olsa.

– Di gəl otur.

Şahnaz qapını açıb arxada əyləşdi. Məmməd güzgünü düzəldib yerini rahatladı. Sonra qapını örtmək bəhanəsi ilə geri dönüb Şahnazın üzünə baxdı və bənövşə dəstəsini onun qucağına atdı. Şahnaz bənövşəni götürüb qımışdı.

Məmməd gözünü güzgüdən ayırmadı. O, qabaqdakı yoldan çox güzgüdə gülümsəyən Şahnaza, onun qaynar gözlərinə baxırdı. Şahnaz da bunu hiss edərək əzilir, maşın atıb-tutduqca ağız-burnunu büzüşdürürdü.

Kosaoğlu isə fikrə getmişdi: “Yox, işi axıra çatdırmaq lazımdır. Ağzı qatıqlı bir uşaq mənim kimi adamı camaat içində biabır etmək istəyir. Nəsib də o deyəni deyir. – O, dərindən köksünü ötürüb çöllərə baxdı. – Heç bilmirəm, bu mərdimazar oğlu haradan gəlib çıxdı? Mağıl işimi sahmana salmışdım. İstədiyimiz qədər əkirdik, plan dolmayanda məntəqədən bir neçə ton satın alırdıq. İndi nə olsun? Artıq yer əkmə, əl-ayağını tərpətmə, özün də plan doldur. Yox, Kosaoğlu, adın-sanın var, ağlını oğurladıb uşaq-muşaq sözünə baxma. Yenə öz bildiyin kimi elə”.

Kosaoğlu İmranı evə çağırmasını, Şahnazın onun ətrafında fırlanmasını yadına saldı. Ovqatı təlx oldu. “Demək belə, yaxasını ələ vermək istəmir. Üstəlik, mənə meydan oxuyur. Yaxşı, eybi yoxdur!” – Maşın körpüdən keçib Kazımın sahəsinə buruldu. Kosaoğlu hələ uzaqdan İmranı tanıyıb dişini qıcadı: “Köpək oğlunu görəndə elə bil qutuda ilan görürəm”.

Şahnaz yedəyində at düşərgənin yanında dayanmış İmranı görən kimi əlini Məmmədin çiyninə vurdu.

– Saxla!

– Kosaoğlu bir qıza, bir də İmrana baxdı. Maşından çıxıb düşərgəyə yüyürən Şahnazın hərəkətindən dilxor olsa da, üstünü vura bilmədi. Acıqlı-acıqlı Məmmədə sarı döndü:

– Sür görək!

## 13

İmran bir yerdə durub dincəlmirdi. Neçə gündən bəri ata da rahatlıq vermirdi. Özü də sınıxmışdı. Anasının deyinməsinə baxmayaraq üç gecə idi ki, evə getmirdi. Gündüzlər sahələri gəzib səpinə nəzarət edir, axşamlar tarla düşərgələrindən birində, traktorçuların yanında qalırdı.

O, traktorçuların qaladığı ocağın qırağında oturur, onlarla çörək yeyir, gecə yarıya qədər söhbət etdikdən sonra, yalxı palaz üstündə şirin yuxuya gedirdi. Dünən axşam o, Kazımın briqadasında gecələmişdi. Səpin şər qarışana qədər davam etmişdi. Səpilməmiş təkcə Zeynəbin manqasının yeri idi.

İmranın tarla düşərgəsində qalmaq istədiyini görən Zeynəb qızlardan ayrıldı.

“Siz gedin, mən sonra gələrəm” – dedi. İmran onun qəsdən ləngidiyini duydu.

– Sən niyə getmirsən? Yoldaşlarından ayrılma, sonra tək gedə bilməzsən.

– Tək niyə oluram? Yanımda sən boyda kişi var.

– Yaxşı, zarafatı qoy bir yana. Qaranlıq qarışır. Get evə, anama da baş çək.

– Yox, burda qalacam.

İmran tutqun göyə, bir də sonsuz çöllərə baxdı.

– Hava bir təhərdir, soyuq dəyər.
– Heç nə olmaz.
– Qızlar arabaya doluşmuşdular. Sürücü kəndə doğru qanadlanan atları güclə saxlayırdı. Oradan səs gəldi.
– Ay qız, di tez ol.
Zeynəb yavaşca geri döndü. Əvvəl asta-asta yeridi, sonra birdən uşaq kimi götürülüb özünü arabaya yetirdi.
Səhər tezdən isə İmranın başının üstünü kəsdirdi.
Hava yenicə işıqlanırdı. Axşamdan çöllərin üstünə enmiş duman hələ çəkilməmişdi. İmran yorğana bürünüb, düşərgənin qabağındakı otluqda yatmışdı. Üstünə şeh düşmüşdü. Lap tezdən işə başlayan traktorçular aqronomun yorğun olduğunu nəzərə alıb, onu oyatmamışdı.
Əlində bağlama, İmranın başı üstündə sakitcə dayanan Zeynəb, onun mışıltısına qulaq asırdı. İmranın başı sürüşüb otluğa düşmüşdü. Qıvrım saçları daha da pırpızlanmışdı. O, yorğanın altında yumaq kimi büzüşmüşdü. Deyəsən, üşüyürdü. Zeynəb yavaşca aşağı əyildi. Bağlamanı yerə qoydu. İmranın başını qaldırmaq istədi. Elə bu vaxt oğlan arxası üstə çevrildi. Zeynəb diksinib geri çəkildi. Tez ətrafa boylandı. Yaxında heç kəs yox idi. Qızlar hələ gəlməmişdilər. Traktorçular uzaqda idilər. Zeynəb ehmalca sırıqlı pencəyi İmranın başının altına qoydu. Nəfəsini dərmədən dayanıb ona tamaşa elədi. O, İmranın bu cür bərk yatdığını əvvəllər də görmüşdü. İmtahanlardan sonra yay tətillərində evlərinə gələn İmran, gün yayılana qədər yatardı. Tükəzban xala onu yerini eyvandakı taxtın üstündə salar, səhər tezdən, əlində ağac, toyuq-cücələri qovardı ki, "gədəni oyatmasınlar". Gün İmranın üstünə düşəndə qarı dirəklərin arasına pərdə tutardı. Sonra isə yavaşca onu silkələrdi.
– A bala, qurbanın olum, dur, sərfən qarışar.
Oğlan güclə gözlərini açardı.
– Ana, qoy doyunca yatım.
Həmişə Tükəzban xalanın yanında olan Zeynəb çox vaxt İmrana rişxənd edərdi:
– Ə, dur, yekə oğlansan, az nazlan.
Bəzən də Zeynəb səhər tezdən durar, bağlarından yetişmiş gilas dərib İmrana gətirərdi. Onun şirin yuxuda olduğunu görəndə gilası taxtın yanında qoyub gedərdi. Həm Tükəzban xala, həm də İmran gilasın haradan gətirildiyini bilməzdilər. Bəzən də o, İmranın üstünə

su töküb qaçardı. Amma bir dəfə özünü yuxuluğa vuran İmran Zeynəbin biləyindən yapışıb stəkanı almış və onun özünü islatmışdı.

İndi o nədənsə bunları xatırladı. Birdən onda İmranın başını sığallayıb sinəsinə basmaq arzusu doğdu. İmran gərnəşib oyanmasaydı, bəlkə də belə edəcəkdi.

İmran oyananda Zeynəb dərhal özünü yığışdırdı.

– Ədə, bu zamanacan yatmaq olarmı? Günortadır.

İmran gözlərini ovuşdurub qalxdı. Doğrudan da yatıb qalmışdı. Tez ayağa durdu. Yaxındakı arxa doğru qaçdı. Köynəyini soyundu. Ayağının birini arxın bu qırağına qoyub yuyunmağa başladı. Gün yenicə qalxırdı. Havanın soyuq olmasına baxmayaraq İmran ləzzətlə yuyundu. Qurulanıb köynəyini geyəndən sonra Zeynəbin yanına qayıtdı.

Qız süfrə açmışdı. Ocaqda çörək kövrəltmiş, çay dəmləmiş, Tükəzban xalanın göndərdiyi pendiri, yağı süfrəyə qoymuşdu. İmran otun üstə sərilmiş süfrədəki səliqəni görüb zarafat elədi:

– Belə qızdan kim inciyər?

– Dil tökmə, otur çörəyini ye.

– Niyə acıqlanırsan?

– Bəs neyləyim? Lap çöl quşu olubsan. Yazıq arvadın gözünün yuxusu da qaçıb.

– Heç nə olmaz.

– Eh, siz oğlanlara nə var, daş kimi şeysiniz, nə dil anlayırsınız, nə söz qanırsınız.

– Bura bax, deyəsən sözlü adama oxşayırsan?

– Sözüm odur ki, səpinim geri qalıb, – deyə Zeynəb söhbəti dəyişdi. – Tez ol, çayın soyuyur.

İmran traktorçuları çağırdı:

– Gəlin, Zeynəb sizi qonaq eləyir. Rüşvət verir ki, çiyidi yaxşı səpəsiniz. Çay-çörəkdən sonra dərhal işə girişdilər. Bir azdan İmranı üçüncü briqadaya çağırdılar.

Günortadan gün əyiləndə Kazım gəldi. Bir qədər düşərgənin ətrafında fırlandı, çiyidləri yoxladı, səpilən yerlərə baxdı və traktorçuların yanına getdi. Zeynəbin sahəsi səpilib qurtarırdı. Traktor iki dəfə o başa qayıdandan sonra dayandı.

– Bu da Zeynəbin yeri! – deyə traktorçu Əli dərindən nəfəs aldı. Kazım sakitcə ona yaxınlaşdı. Cibindən qutunu çıxarıb papiros təklif etdi, özü də birini yandırıb qutunu şaqqıltı ilə örtdü.

– Yox dostum, hələ bir az qalıb, – deyə o, sözə başladı. – Bax o tərəfdəki şumlanmış yer də mənim briqadamındır. Oranı da səpib qurtarmaq lazımdır. Traktorçu təəccüblə çiynini çəkdi:

– Ağranom mənə o yer barədə heç nə deməyib.

– Yəqin yadından çıxıb. Sür ora!

– Axı, ağranomsuz olmaz.

– Niyə olmur, ə? Şəxsən Qurban qağa tapşırıb, o deyəndən sonra İmran nəkaradır?

– Mən bir şey demirəm. Ancaq bura kimin manqasınındır?

– Ə, neynirsən kimindir? Sən ha becərməyəcəksən!

– Mən bu kolxoza təhkiməm. Kultivasiyanı da mən çəkəcəm, hələ pambıq yığımında da iştirak edəcəm.

– Daha yaxşı. Onda sür.

Əli traktoru işə saldı. Dövrə vurub geri döndərdi və təzə sahəyə tərəf sürdü. Kazım artıq qalan çiyidləri qızlarla bərabər düşərgəyə yığan Zeynəbi səslədi:

– Çiyidi də götürün, bura gəlin, hələ səpilməmiş yer qalıb.

– Hansı yer? – deyə Zeynəb soruşdu:

– Neynirsən hansı yer? Sənə nə deyirlər, ona bax. Tez ol çiyidi gətir.

Zeynəb Kazımın yanına gəldi.

– Göstər, görüm haranı deyirsən?

– Bax, oranı. Arxın altını görürsənmi?

– Görürəm. Oranın mənə nə dəxli var?

– Necə yəni nə dəxli var? Bəs oranın pambığını kim becərəcək? Mən?

– Mən də becərməyəcəm. Gücüm çatmaz. Orda altmış hektar yer var.

– Ay qız, sənə kim deyir hamısını becər. Səndən başqa manqa yoxdur? Öz aramızda bölüşdürəcəyik, qurtarıb gedəcək.

Zeynəb daha da ciddiləşdi:

– Bura bax, mənə neçə adam veribsən?

– Bilmirsən, on adamdır də.

– Yaxşı, atan oldu rəhmətlik. De görüm hər adam neçə hektar becərməlidir?

– Xam-zad deyilsən ki! Hərənin bir hektar yeri var.

Zeynəb onu tərs-tərs süzdü.

– Kazım, bax, birdəfəlik bil ki, mənim manqam normadan artıq bir qarış da yer becərməyəcək!

– Yaxşı, yaxşı, aləmi başına yığma!.. Di qurtar, yoldaşlarını çağır. Vaxt keçir.

Qız yerindən tərpənmədi.

Kazım Zeynəbin tərsləşdiyini görüb səsini yavaşıtdı. Onu dilə tutub yola gətirməyə çalışdı:

– Ağlını başına yığ. Artıq yer əkməsək plan dolmaz. El içində biabır olarıq. Elə briqada yoxdur ki, plandan artıq yer əkməsin.

– Yox, Kazım, keçəl suya getməz, heyət mənim manqama on hektar yer ayırıb, onu da becərəcəm. Öhdəliyi də yerinə yetirəcəm, hələ bir az da artıq pambıq verəcəm.

– Axı hardan verəcəksən?

– Həmin bu on hektardan.

Kazım səsini ucaltdı, indi də ona hədə-qorxu gəlməyə başladı.

– Qurban qağa şəxsən özü tapşırıb, heç o yan, bu yan eləmə! İstəmirsən rədd ol, get! Daha buralarda əl-ayağa dolaşma. Sən olmazsan, başqası olar. O qədər yalvaran var ki!

– Bircə onu görməyəcəksən!

Kazım söhbətin uzanacağını, bəlkə də səs-küy qalxacağını hiss edib susdu. Dolu kisələrdən birini çiyninə aldı, maşının yanına gətirib çiyidi hirsli-hirsli çiyidsəpənə boşaltdı.

– Sür! – deyə traktorçuya əmr etdi.

Traktor nərildəyib ağır-ağır tərpəndi. Zeynəb məsələni qızlara danışdı, dərhal İmranın dalınca adam göndərdi. Aradan heç yarım saat keçmədi ki, İmran gəldi, atını birbaş çiyidsəpən maşının yanına sürüb, üzünü traktorçuya tutdu.

– Maşını şumdan çıxart!

Elə bayaqdan könülsüz işləyən traktorçu Əli maşını geri çevirib şumdan çıxartdı. Bir qıraqda oturub dincini alan Kazım bunu görcək qaça-qaça gəldi. Sifərindən zəhər yağırdı. O, İmrana əhəmiyyət vermədən traktorçuya müraciət etdi:

– Niyə səpmirsən?

– Bilmirəm.

– Necə yəni bilmirəm, ə? Sənə demədimmi səp?!

Traktorçu Əli çox hövsələli oğlan idi. Kazımın qışqırmasına baxmayaraq, heç təhərini də pozmadı:

– Çığır-bağır salma, – dedi, – get ağranomla danış.

– Mən ağranom-zad tanımıram.

İmran atını yaxına sürüb traktorçuya yaxınlaşdı.

– Sür, gedək!

Əli maşını sürüb tarla düşərgəsinin yanında saxladı.

– Demək, sən sədrin əleyhinə gedirsən? Böyüklük satırsan? Bəs sonrasını fikirləşmirsən? – deyə Kazım atdan enən İmrandan əl çəkməyib xırıltılı səslə qışqırmağa başladı. – Mənim briqadamın işinə qarışmağa heç kimin haqqı yoxdur! Briqadir mənəm, mən bilərəm neçə hektar əkdirirəm. Kazım susandan sonra İmran sakitcə soruşdu:

– Qurtardın?

– Qurtardım, bəli!

– Sənin öhdəndə olan altmış hektarın hamısı səpilibmi?

– Səpilib.

– Bəs nə istəyirsən?

– Necə yəni nə istəyirsən? Altmış hektarla plan dolar? Həmişə necə eləmişəmsə, indi də elə eləyəcəm.

– Yox, daha o baban öldü. Altmış hektardan bir qarış da artıq yer üzü görməyəcəksən.

– Bəs plan?

– Zəhmət çək, ağrotexniki qaydalara əməl elə, işini yaxşı tut, məhsulun bol olsun.

– Bəs o yer boş qalacaq?

– Niyə boş qalır, orda da bostan əkərik.

– Yaxşı! – Kazım İmranı hədələməyə başladı. – Qoy olsun! Sədri-zadı sayma. Təqsir səndə deyil. Kəndimizin çörəyi belədir, yeyən qudurur!

İmranın qaşları çatıldı.

– Səninlə insan kimi danışanda özündən çıxma!

– Yaxşı, Qurban qağa buraya gələndə cavab verərsən. Mən bu saat gedib hər şeyi şəxsən ona deyəcəm.

İmran rişxəndlə:

– Xahiş edirəm, şəxsən buradan çıxıb gedəsən!

Kazım getdi... Bir saatdan sonra Kosaoğlu gəldi. O, ağır-ağır "Pobeda"dan düşdü, çiyninə saldığı kürkünü düzəldib çiyidsəpən maşının ətrafına toplaşanlara yaxınlaşdı. Boğazını arıtlayıb, əllərini belinə qoydu:

– Ə, bura niyə yığışıbsınız? Bəs sən niyə buradasan, a bala, işin-gücün qızğın vaxtında maşını niyə dayandırıbsan?

Traktorçu nə edəcəyim bilmədi. Əvvəlcə İmrana, sonra Kosaoğluna baxdı.

– Sözün düzü, heç bilmirəm neyləyim. Yuxarı tüpürürsən bığ, aşağı tüpürürsən saqqal. İndi mən hansınızın sözünə baxım?

– Böyük söz deyəndə cavab qaytarmazlar. Sabaha səpilməmiş yer qalmamalıdır.

– Qalmayıb, – deyə İmran sakitcə cavab verdi, – üç yüz altmış hektarın hamısı səpilib.

Kosaoğlu halını pozmadan sözünə davam etdi:

– Nə vaxt səndən söz soruşsam, onda cavab verərsən, get işində ol.

– Mənim işim elə budur.

– Yox, bu deyil. Belə görürəm sən heç vəzifəni də bilmirsən!

– Kosaoğlu üzünü yana tutdu. – Hər yetən mənə böyüklük eləyəcək! Ə, tez ol, maşını sən işə sal. Uşaq-muşaq əlində qalmışıq də!

– Adam düz söz deyəndə uşaq olar?

– A qız, sən orada nə cırtdayırsan?

– Cırtdamıram, söz deyirəm.

– Gör bir, sən Allah, nə danışır! Ay qız, kişiyə cavab qaytarırsan?

– Ə, belə dur görüm, – deyə Zeynəb qabağını kəsmək istəyən Kazımı itələdi. – Sən get quyruğunu o yanda bula.

Zeynəb qızlardan aralanıb Kosaoğluna yaxınlaşdı. Hirsli-hirsli onun üzünə baxıb əlini səpilməmiş yerə uzatdı.

– Bunu səpdirirsən, sonra kim becərəcək?

– Sən becərəcəksən! Canın çıxacaq, becərəcəksən.

– Mənim canım çıxmayacaq! Evdə yatan arvadının, bir də bacın qızının canı çıxacaq. Bildinmi? Mən işləyəcəm, alın təri axıdacam, səninkilər də kölgədə oturub, əməkgünü alacaq? Ay aldılar ha! – deyə Zeynəb əlini sədrin lap burnunun qabağında yellədi.

– Səsini kəs, ləçər!

– Ləçər səninkilərdir! Özünü başıpapaqlı bilib üstümə xoruzlanma! Mənə dəli Zeynəb deyərlər. Vallah, bu saat səni də kor Hümmətin gününə salaram.

İmran irəli yeridi.

– Plandan artıq yer əkmək nə qanunda var, nə də nizamnamədə. Nə qədər ki mən bu kolxozda aqronomam, partiyanı, hökuməti aldatmağa heç kəsə imkan verməyəcəm. Heç kim bizə ixtiyar vermir ki, iki yüz hektarın əvəzinə üç yüz hektar əkib fırıldaq işlədək. Siz kimi aldatmaq istəyirsiniz? Heç başa düşürsünüzmü bu nə deməkdir?

– Nə deməkdir?
– O deməkdir ki, camaatı müftə işlədirsiniz. Planda olmayan, artıq əkilən yer üçün camaata əməkgünü çatmır.
Kosaoğlu yanıxa-yanıxa sağa-sola gəzindi. İmranın hər şeyi açıq-açığına danışması onu da açıq danışmağa məcbur etdi: – Ə, bura bax, mənə nə leksiya oxuyursan? Heç başa düşürsən hökumətə nə lazımdır? Plan lazımdır ey, plan! Qandın? İndi sənə nə, mən hansı yolla plan doldururam? Necə bilirəm, elə də eləyəcəm. – O, qəti bir hərəkətlə traktorçuya sarı döndü:
– Tərpən!
Traktorçu laqeydcəsinə dedi:
– Əvvəla, şərtinizi kəsin, sonra mənə söz deyin. Mən MTS-ə tabeyəm. Müqavilədə nə qədər yer varsa, hamısını səpmişəm.
Kosaoğlunun gözləri kəlləsinə çıxdı.
– Demək, səpmək istəmirsən? Çox yaxşı, Kazım!
– Bəli, Qurban qağa.
– Tez ol, bu saat bir akt bağla!
– Baş üstə!
– Mən sənin başına bir oyun açım ki, özün də məəttəl qalasan! Demək, sən yaz əkin kampaniyasının qızğın vaxtında sabotajlıq eləyirsən?! Əgər mən səni günü sabah dama basdırmasam, atamın oğlu deyiləm. Aktı bu gün prokurora göndərəcəm. Onda ağıllanarsan. Yəqin sən elə, cəbhədə də əmr-zad qanmayıbsan, dezertir olmusan!
Bayaqdan Kosaoğlunun dediklərinə laqeydliklə qulaq asan, çox soyuqqanlı görünən traktorçu Əli son sözlərə dözə bilmədi. “Necə? Mənə, odlar ayaqlayıb Berlinə qədər gedən tankçıya bu yekəqarın dezertir deyir?”
O, quş kimi sıçrayıb yerə düşdü. Kosaoğlunun önündə dayandı. Bu enlikürək oğlanın geniş sinəsi qalxıb-enməyə başladı. Oğlan döyüşə hazırlaşırmış kimi, sırıqlı pencəyini soyunub kənara tulladı. Sinəsində iki cərgə lent göründü. Kosaoğlu özünü yığışdırdı. Kazım bir az irəli yeridi. Traktorçu güclə özünü ələ aldı.
– Mənim tankım sərhədi o üzə aşanda sən hardaydın? İndi nə yekə-yekə danışırsan! Əgər bu sözü mənə orda, cəbhədə demiş olsaydın, səni tankın altına salıb xurt-xəşil edərdim. Elə indi də əlimdən salamat qurtarmazsan.
– Yaxşı, yaxşı... Sinəni-başını göstərmə. O yerlərdə biz də olmuşuq. Döyüşən təkcə sən olmayıbsan.

Kosaoğlu yaralandığını bildirmək istəyirmiş kimi, sol qolunu yuxarı qaldırdı. Traktorçu onun zəif biləyinə və yarıyumulu barmaqlarına tərs-tərs baxıb üz-gözünü turşutdu. Kosaoğlunu bir daha təpədən-dırnağa qədər süzdü.

– Sənin qolun də özün kimi düz-əməlli deyil. “S-S”-ə oxşayır.

– O nə deməkdir?

– Samostrel.

Kosaoğlunun elə bil ürəyindən beşaçılan gülləsi keçdi. Kişi dik atıldı. Rəngi külə döndü. Dili-dodağı təpidi. Xeyli özünü ələ ala bilmədi. Gecdən-gec özünü toxtatdı.

– Səpmirsən, maşını da götür, hara gedirsən get! Bir də səni buralarda gözüm görməsin.

Traktorçu dərhal sükanın dalında əyləşdi, maşını sürüb uzaqlaşdı.

Kosaoğlu çıxılmaz vəziyyətə düşsə də, özünü sındırmadı, əlini cibinə salıb papiros qutusunu çıxartdı. Sarı saçaqlı tütündən kağıza büküb eşdi, yandırıb hirsli-hirsli sümürdü: Kürkünü düzəldib ortada gəzindi. İndi o, yanında qul kimi boynunu bükən Kazımın da üzünə baxmırdı. Demək olar, Kosaoğlu indiyə qədər belə çətinliyə düşməmişdi. Bir istədi sakitcə maşına minib buradan uzaqlaşsın, ancaq şəninə sığışdırmırdı. “Hamısı sözü bir yerə qoyub, əlbir olub məni yıxmaq istəyirlər... Ancaq onu görməyəcəklər” – deyə düşündü, əlindəki papirosu yerə atıb İmranın üstünə qışqırdı:

– Bu saat rədd ol gözümün qabağından! Görünür, hələ ağıllanmayıbsan. İşin ağız-burnunu yenicə düzəltmişəm, yenə pozğunluq salırsan. Mənə sənin kimi ağranom lazım deyil. Hara istəyirsən çıx get.

İmran sakit addımlarla ondan uzaqlaşdı.

**14**

Yaz aylarında Tükəzban xala həmişə ağac dibində gəbə salıb süfrə açmaqdan ləzzət alardı. Onun xoşu gələrdi ki, ürəyi istədiyi adamlar evinə qonaq gəlsinlər, döşəkcənin üstündə oturub mütəkkəyə dirsəklənsinlər, xoruzquyruğu çay içib söhbət eləsinlər. Qohum-əqrəbanın söhbəti uzandıqca, stəkanlardakı məxməri çay buğlanıb qaysaqlandıqca, Tükəzban xalanın ürəyi də sərinləyirdi. İmran da yazda həmişə çöldə, ağac dibində çörək yeməyi xoşlayırdı.

Tükəzban xala Nərgiz müəllimi də buna öyrətmişdi. Neçə gün idi ki, onlar bağda nahar eləyirdilər. Nərgiz müəllimə dərsdən gələndə hər şeyi hazır görürdü. Tükəzban xala ona ağzını açmağa imkan vermirdi.

– Qızım, içəridə nə var? Bu saat gül-gülü çağırır, bülbül də gülü. Adam heç evə baş salmaq istəmir.

Nərgiz müəllimə onun sözünü yerə salmırdı. İmran işdən gələndə isə Tükəzban xalanın sevinci yerə-göyə sığmırdı. O, bu cavanları yanaşı oturub çörək yeyən görəndə istəyirdi ki, hər şey beləcə dayansın, nə zaman gəlib keçsin, nə də onlar yerindən tərpənsinlər. O isə bir əldən hey çay süzsün. Nərgiz müəllimə arvadın döşünə yaman yatmışdı. O, getdikcə bu sakit qıza mehrini salır, hətta Nərgiz məktəbdən bir az gec qayıdanda darıxmağa başlayırdı. Ona elə gəlirdi ki, evdə gəlini var. Doğrudan da, Nərgiz özünü ev gəlini kimi aparır, Tükəzban xalanın hər işinə qarışır, hər dərdinə şərik olurdu. Tükəzban xala əlinə süpürgə aldımı, Nərgiz dərhal qabağa keçirdi, arvad tikiş tikmək istədimi, əlüstü onun yanında otururdu. Hətta inək sağmağa da kömək edirdi. Tükəzban xalaya da belə bir qız lazım idi.

Əslinə baxsan, arvad öz aləmində hər işi qurtarmışdı. İmranın əvəzində müəlliməyə söz açacağını da qərara almışdı.

Tükəzban xala da bütün analar kimi öz oğlunu evləndirmək arzusunda idi. Gözəl bir qız görəndə dərhal İmranla müqayisə edirdi. Bəzi analar oğlanları üçün gəlin seçəndə çox fikirləşir, qızların hərəsində bir eyib tapır, axırda da ya kora, ya da keçələ rast gəlir. Ancaq Tükəzban xala belələrindən deyildi. Harada gözəl bir qız görsəydi, İmrana almaq istəyirdi. "Elə boyu-buxunu da qəşəngdir, İmrancığazıma yaraşır" – deyə xəyalından keçirdi. Tükəzban xalanın xasiyyətinə bələd olanlar bəzən ona sataşardılar. O isə çiynini çəkib, "neyləyim, Allah məni də belə yaradıb" – deyərdi.

Tükəzban xalanın Zeynəbdən də xoşu gəlirdi. Amma nədənsə uşaqlıqdan yanında böyümüş bu qıza başqa gözlə baxa bilmirdi...

Göyün üzü tər-təmiz idi. Yalnız Dəlidağın başında topa-topa ağ buludlar dolaşırdı. Günəş qərbə doğru endikcə, buludlar çəhrayı rəngə boyanırdı. Çay tərəfdən kəndə sərin meh əsməyə başlamışdı. Axşamın yaxınlaşdığını hiss edən quşlar budaqlarda civildəşirdi. Qarğalar çinarların başına toplaşıb qarıldaşır, bir şaqqıltı eşidən kimi səs-küylə havaya qalxır, dövrə vurduqdan sonra yenə çinarın başına tökülüşürdülər. Qara qarğaların dəstəsinə qoşulan dolaşaların zil səsləri seçilirdi.

Bu gün Tükəzban xala həyəcanlı idi. Uzun-uzadı fikirlərdən sonra hər şeyi oğluna açıb deməyi qərara almışdı. O, İmrana deyəcəkdi: "A, bala, nə vaxta qədər dinməyəcəksən? Kəndimizin gözəl-göyçək qızlarından birini gətirsənə! Axı, mən də gəlin buyurmaq istəyirəm. Oğul-uşaq yiyəsi olmaq istəmirsən? Balaca ha deyilsən! Maşallah, bığlı-saqqallı kişi olubsan, daha bəsdi subay gəzdiyin. Mən də istəyirəm evimizdə uşaq iməkləsin, nəvəmin əlindən tutub gəzdirim".

İmranın ağırtəbiət olması Tükəzban xalanı təşvişə salırdı. "Bu gədənin elə bil dili-ağız yoxdur. Heç başını qaldırıb gözünün ucu ilə bu qızlardan birinin üzünə baxmır. Bilmirəm kimə oxşayıb. Rəhmətlik atası belə deyildi. Oynar-gülər adam idi. Amma bu elə bil daş parçasıdır".

Tükəzban xala çox yaxşı bilirdi ki, qızların çoxunun İmranda gözü var. İmran yoldan ötəndə su quyusunun başına yığışmış qızların onu necə oğrun-oğrun süzdüklərini, hətta pıçıldaşıb köks ötürdüklərini Tükəzban xala görmüşdü. Qızların bəzilərinin aqronomu görəndə üst-başını düzəldərək, sürüşüb çiyinlərinə düşən kələğayılarını irəli çəkdiklərinin, başlarını aşağı salsalar da, gözaltı İmrana baxdıqlarının nə demək olduğunu Tükəzban xala yaxşı başa düşürdü. Arvadın ürəyi dağa dönürdü, sevincindən yerə-göyə sığmır, az qalırdı qanadlanıb uçsun. Tükəzban xala axır vaxtlar qızların ona hörmət etdiyini, bəzilərinin isə həyalandığını görürdü. O, su sonası kimi gözəl-göyçək qızlara baxdıqca gülümsəyirdi. "Şeytanlar lap əməlbazdırlar, özlərini mənə bəyəndirmək istəyirlər. Ölməmişlər elə də qəşəngdirlər ki, adam hayıl-mayıl olur, heç bilmir hansının qolundan yapışsın"...

O, əvvəllər tələsmirdi. Bəlkə də oğlunun bir müddət subay qalmasını istəyirdi ki, qızların gözündən düşməsin. Bəzən onun qəlbində çox qəribə hisslər baş qaldırırdı. "İmran evlənsə, qızların gözündən düşəcək. Onun dalınca həsrətlə baxan olmayacaq". Bəs Tükəzban xala buna necə dözərdi? Yox, yox, qoy İmran evlənməsin. Hamı fikirləşsin ki, görən kimi alacaq. Qoy qızlar gecələr yataqlarında fikrə gedib "kaş məni alaydı" desinlər.

Bəzən öz-özünü danlayırdı: "Havaxta qədər oturacaq? Evlənsə yaxşıdır. Sonra birdən eləsinə rast gələrik ki, heç açıb-ağartmalı olmaz".

Gövhər qarı ilə söhbətindən sonra o, kosaoğlulardan ehtiyat etməyə başlamışdı. "Onlardan nə desən çıxar. Həyasız tayfadır. Sonra o ləçəri gədənin boğazına bağlayarlar. Şahnaz elə bir him axtarır. O saat qır-saqqız olub yapışacaq".

Doğrudan da son vaxtlar kənd arasında dedi-qodu başlayır, Tükəzban xalanın qulağına bəzi sözlər dəyirdi. O, hər şeyi açıb oğluna deməyə tələsirdi. "Qoy biryolluq birini seçsin".

Tükəzban xala səbirsizliklə süfrənin ətrafında fırlanır, əlindəki dəsmalla zümzümə edən samovarı silir, çayniki dəmkeşin üstünə qoyur, iri podnosa yığdığı stəkan-nəlbəkini dönə-dönə təmizləyirdi.

Bu gün hər şey həll olunmalı, ana qəlbi sakitləşməli idi.

Doqqazdan səs gəldi. Tükəzban xala küçəyə çıxdı. Gövhər qarını görəndə istədi geri qayıtsın, ancaq mümkün olmadı. Qarı donunun ətəyini dəstələyib özünü həyətə saldı. Onun rəngi ağarmışdı. Sinəsi qalxıb enirdi.

– Bu köpək uşağı da qudurmuşlarını bağlamırlar. Gün yaxmamış açıb buraxırlar. Yoldan keçmək olmur. Quduz dəymişlər də elə pisdirlər ki. Görmüşük it arvad xaylağına dəyməz, amma bunlar elə birbaş adamın üstünə cumurlar. Yenə allahın yazığı gəldi, yaxşı ki, özümü sizin doqqaza saldım, yoxsa qarnımı dağıdacaqdılar. Lap dilim-dodağım təpiyib. Bəlkə bir qurtum suyun ola, ay Tükəzban.

Qarı səsini kəsib cücə gözlərini oynatdı. Ağacın altındakı süfrəyə, hazır samovara baxdı. Tükəzban xala su gətirənədək hər yeri nəzərdən keçirdi.

– Allah muradını versin. Lap ciyərim yanırdı. Gözüm işıqlandı. Rəhmət atana, çox sağ ol. Yezidə lənət. Deyirəm bu su lap dərdlərə dərmandı. – O, sözünə ara verib ağacın dibinə baxdı. – Deyəsən, hazır çayın var, nə olar bir stəkan verəsən, dədən ehsanına içəm. Su yanğımı söndürmədi. Quduz dəymişlər üstümə elə şığıdılar ki, heç gözümü aça bilmədim. Bir tikə çörəyim ovsanata düşdü. Bu aşağıdakı obadan gəlirəm. Balaxanımın qızının burnunda çöp qalmışdı, onu çıxardırdım... Sən oğlunun canı, tez ol bir stəkan çay ver.

Tükəzban xala könülsüz evə getdi.

– Ay qız, hara gedirsən, budur ey, elə buradaca stəkan var. İstəyirsən özüm töküm.

– O stəkanlarda işini olmasın, uşaqlarındır.

– Kimin? Uşaqların? Ay qız, uşaqlar kimdir? Bıy, hə, heç yadıma düşmür ki... İmranla o müəllim qızı deyirsən. Olsun, olsun, allah boya-başa çatdırsın. Yaxşı balalardır. Amma, ay Tükəzban, sözün düzü, bircə oğlun var, onu niyə belə urvatsız elədin? Belin qırılmamışdı ki, beş şahı pulun yoxdurmu ki, heç olmasa bir aşıq gətirəydin. Adam da toyu belə kirimişcə elər? Əlində yox idi, bizə deyərdin, yoxsa bundan nə çıxdı?

– Nə toy, nə sayıqlayırsan?

– Guya heç nə bilmirik. Ay qız, bizi xam yerinə niyə qoyubsan? Çağırmayıbsan, canın sağ olsun. Daha niyə gizlədirsən?

– Ay qız, sənin başına at təpib nədir, nə toy?! Sən nə danışırsan, yuxu-zad görməyibsən ki?

– Heç ətəyini suya-zada çəkib eləmə. Bütün el-oba bilir, hər yerə car çəkilib. İndi məni ələ salırsan. Nə olar ey, belə iş təkcə sənin başında ha görünməyib. Cavandılar, həlbət özlərini saxlaya bilməyiblər. Vaxtında mən sənə demədimmi odla pambığı bir yerə qoyma, axırı pis olar? İndi gördün? Ancaq ürəyini sıxma, pis uşaq deyil. Görünür qismət buymuş. Amma mən İmrana başqa qız alacaqdım. Sözün düzü, elə Şahnazın da İmrana ürəyi vardı. Xeyrinizi bilmədiniz. Oğlun da bədəməllik elədi. Kişinin üzünə ağ oldu. Xeyirmi tapacaq? At mıxı qopardar, bir yerə dəyər, beş özünə. Görünür, halal çörək sənin oğluyun qarnını deşdi. Rahatca oturub yemədi, özünü dağa-daşa saldı.

Tükəzban xala qəzəbini güclə saxlayıb boğuq səslə soruşdu:

– Nə olub ki?

– Nə olacaq, kişiynən yola getmədi, kolxozu dağıtdı. İndi də deyəsən işdən çıxartmaq istəyirlər.

– Mənim oğlum elə oğul deyil ki, yediyi çörəyə əyri baxa. Onun elə fikri-zikri kolxozdur. Uşağa şər atmayın.

– Ay qız, nəyimizə lazımdır, sədr bilər, o bilər, – qarı səsini alçaltdı. Sürünüb, çay süzən Tükəzban xalaya lap yaxınlaşdı. Onun qulağına pıçıldadı:

– Bəri bax, qızın uşağı neçə aylıqdır?

Tükəzban xala heç nə başa düşmədi. Gözlərini döyüb qarının üzünə baxdı:

– Nə uşaq?

– Ay qız, özünü faqqılığa niyə qoyursan? Qızı deyirəm dayna, müəlliməni, adı da yadımdan çıxır. Çoxdan boyludur?

Tükəzban xala sarsıldı. Bütün bədəni tər tökdü. Arsız-arsız hırıldayan qarının üzünə baxa-baxa qaldı. Bu kaftar nə danışırdı? Kosaoğlular nə fikir edirdilər? İndi Tükəzban xala ona nə cavab versin?

– Bilirəm, bilirəm, – deyə qarı yenidən sözə başladı, – ona görə də səs-küyə salmayıbsınız. Yaxşı da eləyibsiniz. İş işdən keçəndən sonra başqa nə çarə olardı? Barı kəbinlərini kəsdiriblərmi?

Tükəzban xala yerindən durub qarının saçını biləyinə nə vaxt doladığını özü də bilmədi. Bircə onu gördü ki, Gövhər qarı ortada yumaq kimi fırlanır.

– Nə dedin? Bir də de görüm? İndi də mənim oğlumu şərə salırsan?! – deyə Tükəzban xala qarını döyəclədi. – Kaftar köpək qızı!.. Sənin dilin necə gəlir ki, gül kimi qıza elə söz deyirsən, imansız?! Di rədd ol burdan!

Gövhər qarı birtəhər ayağa durdu, başı əsə-əsə doqqaza doğru getdi. Yola çıxanda bir ayağını qaçaraq qoyub qışqırdı:

– Yaxşı, həyasız!.. Gör səni rüsvay eləyirəm, ya yox. Gizlədə bilməyəcəksiniz! Ölsəniz də ört-basdır eləyə bilməyəcəksiniz!

Tükəzban xala iti açıb buraxdı. Gövhər qarı donunun balaqlarını çirməyib qışqıra-qışqıra qaçdı.

Tükəzban xalanın halı özündə deyildi. "İndi mən başıma haranın daşın salım, camaatın üzünə necə baxım? Allah heç bəndənin adını bu imansızın dilinə salmasın. İki gündən sonra kənddə zurna çalınacaq, bunun hamısı o Kosaoğluyla Sayalının işidir. Gədəciyi təkləmək istəyirlər. Ara yerdə qızcığazı bədnam eləyirlər. Kaş bu xəbərləri Nərgiz eşitməyəydi! Bilsə ölüb yerə keçər. Gör bir imansız nə danışır, uşaqların üstünə necə qara yaxır!"

Tükəzban xala dincələ bilmirdi. Qarının dedikləri yadına düşdükcə vahimələnir, ürəyinə yüz cür qara-qorxu gəlirdi. "Allah, sən özün bircə balamın pənahı ol! Yazığam, gözümün ağı-qarası bircə oğlumu dilə-ağıza salma. Min zillətlə böyütmüşəm. Saçımın birini ağ hörmüşəm, birini qara. Boğazımdan tikəmi kəsib ona vermişəm. Balama yetim deməsinlər deyə hər əziyyətə dözmüşəm. Boya-başa çatdırmışam. Sən onun başından bir tük əksik eləmə, ey yeri-göyü yaradan, mənə yazığın gəlsin".

Naxır gəldi. Yolu tozlaya-tozlaya kəndə girən mallar qapı-bacalara dağılışdılar, heyvanların qarnı çıxıb, tükləri sığallanmışdı. Bəziləri buynuzlaşırdı. Kəndi mələşən inəklərin, buzovların, camışların səsi bürüdü. On dörd-on beş yaşlı bir oğlan ağır-ağır gələn camışın belində oturmuşdu. O, qıçlarının ikisini də bir tərəfə aşırıb çəpəki əyləşmişdi. Camış yeridikcə oğlan yırğalanırdı. Çöldən dərdiyi yovşan süpürgəsi də camışın belində idi. Deyəsən, qucağında qulançar var idi.

Naxırın qabağına çıxan Tükəzban xala yolla gedən Nərgiz müəlliməni görüb əl-ayağa düşdü.

– Dərdin alım, nə gec gəldin? Yəqin lap acıbsan. Yeri, yeri, ağacın altına gəbə salmışam, otur, mən də bu saat inəyi sağıb süd gətirim, köpüklü-köpüklü iç.

Nərgiz müəllimə heç nə demədi. Dinməz-söyləməz gedib əyləşdi. Tükəzban xala inəyi sağa-sağa fikirləşirdi: “Niyə qaşqabaqlıdır? Olmaya, imansız qarı ona da deyib?” O, inəyi yarımçıq sağdı, tez gəlib Nərgiz müəllimənin yanında oturdu. Ona çay süzdü, süd verdi, ancaq başını qaldırıb qızın üzünə baxa bilmədi. Tükəzban xala qızdan xəcalət çəkirdi. Elə bil Nərgiz müəllimə də onun ürəyindən keçənləri bilirdi. Dinmirdi. Utanırdı. Anası yerində olan Tükəzban xalanın bu işlərə nə deyəcəyini düşünürdü. “Elə qorxduğum başıma gəldi. Gərək İmran kəndə qayıdan gündən mən özümə başqa ev tapaydım. Bu söz-söhbətdən sonra mən neyləyim?”

Onlar qaradinməz oynayırmış kimi, xeyli oturdular. Söhbətə necə, nədən başlayacaqlarını müəyyənləşdirə bilmirdilər. Nəhayət, Tükəzban xala dilləndi:

– Qızım, çamadanını səhər özün stolun üstünə qoymuşdun? Həmişə axı şkafda olardı.

– Özüm qoymuşam. Paltarlarımı yığışdırırdım... – Nərgiz müəllimə başını aşağı saldı. Gözləri yaşardı. Qırıq-qırıq sözünə davam etdi:

– Tükəzban xala... məndən inciməyin.

– Ağlına gələn dağlara-daşlara, qızım, adam da sənin kimi gül baladan inciyərmi?

– Mən...

O susdu. Arvad ehtiyatlanmağa başladı. “Yəqin qızın da qulağına çatdırıblar”.

– Mən sizin evdən köçmək istəyirəm.

– Olmaya bizdən inciyibsən, dərdin alım, xətrinə-zada dəymişəm, onunçün gedirsən?

– Yox, yox, Tükəzban xala, o nə sözdür! Mən sizin yaxşılığınızı heç vaxt unutmayacam. Bu kəndə gələli siz mənə analıq eləyibsiniz, çox sağ olun.

– Bəs niyə gedirsən, qızım?

– Getsəm yaxşıdır, – Nərgiz tərəddüdlə susdu. Sözünü necə bitirəcəyini düşündü. O, istəyirdi ki, Tükəzban xalanın xətrinə dəyməsin. – Əvvəl İmran yox idi. Onda mən sizə həyan oldum. İndi oğlunuz gəlib. Sözün düzü, yerinizi dar eləmək istəmirəm.

– Yerimizi niyə dar eyləyirsən, a bala?

– Yox, Tükəzban xala, İmran iş-güc adamıdır. Elə onun özünə bir otaq lazımdır. Əvvəl-axır mən getməliyəm, elə indidən getsəm yaxşıdır. Daha havalar da düzəlib.

– Yox, qızım, səni buraxmaram, hara gedəcəksən?

– Məktəbə. Direktor məktəbdə mənə bir otaq verib.

– Tək, qız xeylağı orda neyləyəcəksən?

– Heç nə olmaz.

– Yəni heç olmasa məktəblər bağlanana qədər gözləyə bilməzdin, qızım?

– Yolçu yolda gərək. Nə fərqi var? İndi ya sonra...

– Vallah, heç bilmirəm sənə nə deyim? Dilim razı olsa da, ürəyim “hə” demir. Üzümüz-gözümüz öyrəşmişdi.

– Mən yenə gələcəyəm. Vaxtım olduqca sizə dəyəcəyəm.

Tükəzban xala köksünü ötürdü. “Yox, deyəsən hər şeyi bilir. Söz-gapdan qaçmaq üçün belə eləyir. Yazıq neyləsin? Görüm o Gövhər qarının dilini ilan vursun, göra imansız getsin!”

– Nə deyim, qızım, özün bilən yaxşıdır... Amma...

– Belə yaxşıdır. Bu saat uşaqlar gələcək. Demişəm mənə kömək eləsinlər.

– Yox, yox, qoymaram. Bəs İmranı gözləmirsən? Qoy gəlsin özünə də de.

– Heç nə deməz. Bir də, bu evin böyüyü sənsən. İmran deyil.

Tükəzban xala köksünü ötürdü.

Onlar evə getdilər. Bir azdan şagirdlər gəldilər. Nərgiz müəllimənin yorğan-döşəyini, çamadanını, kitablarını götürdülər. Tükəzban xala Nərgizi doqqaza qədər ötürdü. Ayrılanda qucaqlaşdılar. Arvad kövrəldi. Nərgiz də doluxsundu.

Tükəzban xala evə çox kədərli qayıtdı. Qaranlıq idi, hələ çırağı yandırmamışdı. Arvad lap darıxdı. “Bu gədə də evdə tapılmır. Görəsən, harda qaldı? İndi mən neynəyim?” O, eyvana çıxdı. Əl fanarını yandırıb heyvanları rahatladı. Evə baş sala bilmədiyindən, yenə ağacın dibinə getdi. Fanarı bir tərəfə qoyub oturdu. Samovar çoxdan soyumuşdu. O, dizlərini qucaqlayıb gözlərini fanara zillədi. Göylükdən qalxan xırdaca cücülər, balaca kəpənəklər, boz pərvanələr işığın başına dolanmağa başladılar. Ətrafa ağır sükut çökdü. Kənd qaranlığa büründü...

Tükəzban xala ilk dəfə oğlunun qabağına çıxmadı. Heç yerindən də tərpənmədi. İmran anasının bu vəziyyətini görüb təəccübləndi:

– Ana.

Qarı fikirdən ayıldı.

– Bala, sənsən? Axır ki, gəldin.

İmran ətrafa göz gəzdirdi.

– Bəs Nərgiz müəllimə hanı?

– Nərgiz?.. Nərgiz getdi.

– Hara?

– Bizim evdən köçdü.

– Bəs niyə qoydun?

– Mən nə qayırım? Nə illah elədim, olmadı.

– Heç olmasa, mən gələnəcən buraxmayaydın.

– Dedim. Sözümə baxmadı.

İmran susdu. Cibindən papiros çıxarıb yandırdı.

– Ana...

– Nədir, dərdin alım?

– Ağlın nə kəsir? – O, bir anlığa duruxub asta səslə əlavə etdi:

– Axı Nərgiz müəllimə deyəsən pis qız deyil.

– Ona pis deyənin dili-ağzı quruyar, bala.

– Doğrusu, mənim yaman xoşuma gəlir.

Tükəzban xala dikəldi. Qaranlıqda arvadın gözləri parıldadı. Sevindiyindən nə edəcəyini bilmədi. İmran bunu duyub bir az ürəkləndi, qəfildən anasını qucaqladı.

– Ana, o, gəlinin olsa, yola verərsənmi?

– Sənin ürəyin varsa, mən canımı qurban elərəm. Elə dolanarıq ki, quzu kimi.

– Onda...

Tükəzban xala onun sözünü ağzında qoydu:

– Nə vaxt, bala?

– İstəsən lap günü sabah! Ancaq işim bir təhərdir.

– Doğrudan, oğul, bu nə söz-söhbətdir?

– Eh, ana, məsələ uzundur. Ancaq öldü var, döndü yoxdur. Dur içəri gedək.

Evdə də İmran darıxdı. Anasının xatirinə deyib gülürdüsə də, halı özündə deyildi.

O sakitcə ayağa durdu. Hardansa bir şüşə araq gətirib stolun üstünə qoydu.

– Bu nədir, oğul.
– Heç nə, ana, bir az başım ağrıyır. İçməsəm ürəyim partlar. Tükəzban xala bunun necə "baş ağrısı" olduğunu başa düşdüsə də, üstünü vurmadı. Bir azdan qalxıb papağını başına qoydu.
– Məni gözləmə, ana, yat, – deyib evdən çıxdı...
Ancaq Tükəzban xalanın gözlərinə yuxu getmədi. Əllərini qoynuna qoyub qapının ağzında dayandı. "Allah, sən özün bircə balamın işini avand elə" – deyə pıçıldadı.

## 15

Nəsib dayı sahələri gəzməkdən qayıdırdı. At bürküdən və yorğunluqdan ağır-ağır yeriyirdi. Yəhərdə oturmaqdan bezən Nəsib dayı yorğun nəzərlərlə ətrafa göz gəzdirdi. O gah Ermənistana doğru uzanan yollara, gah Dəlidağa, gah da yaşıl çöllərə baxırdı.
Dalğalanmağa başlayan taxıl zəmilərinin içində quşlar səkirdi. Bəzən qulaqlarını qoşalaşdırıb yolun kənarında oturan dovşan gözə dəyirdi.
Nəsib dayı bu yerlərə uşaqlıqdan bələd idi. Hələ beş-altı yaşında olanda qızların dəstinə qoşulub, buralara pencər yığmağa gələrdi. O, özündən iri olan qızlardan geri qalmamağa çalışır, bıçağını çıxardıb gah taxılın içində qazayağı dərər, gah yol kənarındakı ilanotunu yolar, gah da yemlik yeyərdi. Axşam isə atıla-atıla kəndə qayıdardılar. Uşaqlar gətirdikləri pencərdən anaları dovğa bişirər, kətə salardılar. Bir az böyüdükdən sonra Nəsib öz yaşıdları ilə birlikdə buralara quş tutmağa gələrdi.
Onların hərəsi əlinə bir çomaq alar və qaratikan kollarının arasına dolan quşları qovardılar. Göyün üzündə süzən ley kolluqdakı quş dəstəsinin üstünə şığıyardı. Quşlar qorxudan özlərini tikanlara çırpardılar. Uşaqlar fürsətdən istifadə edərək onları çomaqla vurub yerə salardılar. Bəzən onlar quş yuvasına çıxıb yenicə tüklənən dolaşa balalarını düşürərdilər. Tut yetişəndə bu quşlar sahiblərinin dalınca qaçardı. Uşaqlar əllərindəki tutu yuxarı qaldırıb, "ükkəl, ükkəl" – deyərdilər. Dolaşa isə boğazını uzadıb qanadını çırpardı: "Qa-qa-qa"... Sonralar Nəsib dayı bu çöllərə mal otarmağa gələrdi. Həmin bu çəmənliklərdə ocaq qalayıb çörək qızdırar, qırov düşəndə əlini hovxura-hovxura dana-buzov dalınca qaçardı.

Nəsib dayı əvvəlcə gecə kursunda oxumuş, sonra qonşu kənddəki kəndli-gənclər məktəbini bitirmişdi. Kəndə qayıdanda onu komsomol komitəsinə katib seçmişdilər. Kollektivləşmənin ilk illərində Nəsib dayı komsomolçuları başına yığıb, gecəni gündüzə qataraq taxıl hazırlamağa kömək etmişdi.

Kəndə gələn traktoru ilk dəfə briqadir Nəsib qarşılamışdı. Kolxoz qurulanda dağlarda qaçaqlarla atışmışdı. Hətta bir dəfə az qala çovutma güllənin qurbanı olmuşdu. Nəsib dayı "Komvuza" oxumağa göndərilmişdi. Beləliklə, illər gəlib keçmiş, Nəsib dayının saçlarına dən düşmüşdü. O, müxtəlif vəzifələrdə işləmişdi. Bu il isə yenidən öz doğma kəndinə qayıtmışdı.

O, ilk gündən işin ağır olduğunu, kolxozda dözülməz hallar baş verdiyini duyurdu. Lakin səbr edir, hər şeyi nəzərdən keçirir, ara söhbətləri ilə yox, sübutlarla iş görməyə çalışırdı. O hiss edirdi ki, Kosaoğlu çoxlarının gözünü qorxudub özbaşınalıq eləyir.

Hadisələr getdikcə gərginləşirdi. Nəsib dayı hiss edirdi ki, ciddi tədbirlərə əl atmaq lazım gələcəkdir...

Kəndin girəcəyində o, Zeynəblə rastlaşdı. Nəsib dayı onu görən kimi yenə özünü itirdi. Bir dəqiqə sakit dayanıb diqqətlə Zeynəbin üzünə baxdı. Qızın kədərli olduğunu, ağladığını dərhal sezdi. Atdan düşdü.

– Nə var, nə yox, qızım, gözümə bir təhər dəyirsən?

Zeynəb sirrini gizli saxlamağa çalışan adam kimi diksindi:

– Heç nə yoxdur, Nəsib dayı.

– Bəs niyə bikefsən?

– Bikefəm? Onu sizə kim deyib?

– Mən özüm görürəm. Deyəsən, ağlayıbsan.

Zeynəb qızarıb başını aşağı saldı. Bir istədi hər şeyi boynuna alsın, kolxoz sədri ilə dalaşdığını, İmrandan ötrü gizlincə ağladığını Nəsib dayıya danışsın. Ancaq ar elədi, özünü güclə saxlayıb gülümsündü.

– Niyə ağlayıram, mənə nə olub ki?

"Ağıllı qızdır, lap anasına oxşayır. O da belə idi. Heç kəsə boyun əyməzdi. Onun ürəyini bilmək üçün xeyli əziyyət çəkmək lazımdı" – deyə Nəsib dayı düşündü. Axı, Nəsib dayı onun hər dərdini bilmək, qayğısına qalmaq istəyirdi. Bunu Zeynəb özü də hiss edirdi. Nəsib dayının hərəkətləri qıza qəribə gəlsə də o, bu adamda özünə bir yaxınlıq duyurdu. Bəzən ürkən kimi olsa da, ona qanı qaynadığını hiss edirdi.

Zeynəb Nəsib dayının tutulduğunu gördü.

– Demək, mənə etibar eləmirsən, qızım?

– O nə sözdür, Nəsib dayı? – Zeynəb tərəddüdlə dilləndi və nəhayət, boynuna aldı: – Ağlamışam...

Axır ki, Zeynəb öz təbiətinə zidd gedə bilmədi. Olub keçənləri açıb söylədi. Üstəlik dedi ki: "Partkomsan, ancaq heç şeydən xəbərin yoxdur. İmran kimi ağranomu harda tapacağıq? Sözün düzünü danışır deyə, Kosaoğlu onu işdən çıxardır. Biz də hamımız kiriyib dururuq, bəs nə gündə lazımıq?"

– Susmarıq, qızım, susmarıq, səbr elə. – Nəsib dayı fikirli cavab verdi.

Onlar ayrıldılar. Ancaq axşam üstü idarədən qayıdanda yenə görüşdülər. Yol uzunu qırıq-qırıq söhbət elədilər. Zeynəbgilin doqqazına çatanda dayandılar. Nəsib dayı qızın gah qızarıb, gah ağardığını, nə isə demək istədiyini duydu. Ancaq heç nə soruşmadı.

Zeynəb Nəsib dayının evində heç kəsin olmadığını düşündü. "İndi hara gedəcək? Qapını üzünə açıb qabağına çay-çörək qoyan da olmayacaq. Səhərdən yorğun-arğın gəzir. Bir azdan yəqin yenə idarəyə qayıdacaq, gecə yarıya qədər ac-susuz orada oturub iş görəcək". Zeynəb Nəsib dayının kabinetdə çaydanda çay qoyub içdiyini bir neçə dəfə görmüşdü. "Yəqin çox vaxt elə çörəyi də orada yeyir, bəlkə gecə də idarədə qalır". Zeynəbin qəlbində qayğı və mərhəmət hissi oyandı.

– Nəsib dayı, gedək bizə. Bir-iki stəkan çay iç.

Sanki Nəsib dayı qızın dediyini eşitmədi; gözlərini qızın üzünə dikib dayandı. "O da belə gülərdi. Qaşlarını çatıb gözünü süzdürərdi. Qımışanda şirmayı kimi ağ, incə dişlərinin parıltısı dodağına düşərdi. Onun da telləri yanağında qıvrılardı. Gör necə də oxşayır, elə bil anası ilə bir almadır, yarı bölünüb".

– Yoxsa mənim çayımı bəyənmirsən, Nəsib dayı? – deyə Zeynəb məzəmmətedici bir ahənglə səsləndi. Nəsib dayı elə bil yuxudan ayıldı.

– Sənə əziyyət olar, qızım.

– Nə əziyyəti var? Gedək.

– Yaxşı, sən deyən olsun.

Onlar həyətə girdilər. Zeynəb qapını açdı. Taxtın üstünə döşəkcə saldı.

– İstəyirsən uzan, bir az dincini al, mən də çörək hazırlayım.

Nəsib dayı bir uşaq itaətkarlığı ilə Zeynəbə qulaq asdı. Onun gətirdiyi yastıqlara söykəndi. Qız evdən çıxandan sonra yenə öz-özünə

düşündü: "Səsi də oxşayır". O, evə nəzər yetirdi. Otaq yoxsul olsa da, səliqəli idi.

Nəsib dayı əvvəllər bu evə ayaq basmamışdı. Bura gəlməyə bəhanə tapa bilməmişdi. İndisə oturub ötən günləri, Zeynəbin yaşından da əvvəlki vaxtları xatırlayırdı... O, bu evə ilk dəfə ayaq basan gəlinin necə hallar keçirdiyini düşünməyə və onu təsəvvüründə canlandırmağa çalışırdı.

Zeynəb içəri girdi.

– Yəqin səni çox gözlətdim, Nəsib dayı.

– Yox, yox, qızım.

Zeynəb onu süfrəyə dəvət etdi:

– Çörəyini yeyincə samovar da qaynayar.

Bir azdan balaca ağ samovar da süfrəyə qoyuldu. Zeynəb keçən yay bişirdiyi mürəbbədən çıxartdı. Çay süzdü. Nəsib dayı isə gözaltı ona baxırdı. Qızın gözlərində elə səmimiyyət və mehribanlıq vardı ki, Nəsib dayı baxmaqdan doymurdu. Zeynəb qonağını razı salmağa çalışır, arabir də onun nə üçün belə dalğın olduğunun səbəbini fikirləşirdi.

Zeynəb onu indiyə qədər evinə çağırmadığı üçün xəcalət çəkir, ürəyində "daha rast gəldikcə çağıracağam" – deyirdi.

Birdən Nəsib dayı özünü saxlaya bilməyib soruşdu:

– Qızım, anan yadına gəlirmi?

– Sifəti bir az yadımdadır.

Onlar susdular. Nəsib dayı qızın kədərləndiyini görüb, sual verdiyinə peşman oldu. Lakin gec idi. O yenə üzünü Zeynəbə tutdu:

– Onun heç şəkli varmı?

Zeynəb başını qaldırdı. Ona elə gəldi ki, Nəsib dayının gözlərində bir həsrət var. Bu baxışlar hətta Zeynəbi təşvişə saldı. O, titrəyən kimi oldu. Elə bil Nəsib dayı yalvarırdı...

Zeynəb ayağa durdu, nadir hallarda açdığı sandığa yaxınlaşıb qapağını qaldırdı. Boğçanı açdı, ipək dəsmala bükdüyü şəkli çıxartdı.

– Anamdan qalan yadigar bircə budur.

Nəsib dayı şəkli aldı. Zeynəb onun əllərinin titrədiyini gördü. Kişi elə bil özünü unutmuşdu. O gah gülümsəyir, gah qaşlarını çatırdı.

Zeynəb onun sifətinin hər bir cizgisinə diqqət yetirirdi. Nəsib dayının üzü qırışmışdı. Saqqalına dən düşmüşdü. Saçı da ağarmışdı. Birdən Zeynəbin beynində qəribə bir sual doğdu, özü də hiss etmədən soruşdu:

– Nəsib dayı, indiyəcən niyə evlənməyibsən?

Nəsib dayı diksindi, qıpqırmızı oldu. Zeynəb dediyinə peşman oldusa da, sual və maraq dolu baxışlarını Nəsib dayının üzündən ayırmadı: “Görəsən ona nə oldu?”

...İki gündən sonra Zeynəb Tükəzban xalanın yanına gəldi. Arvad qızın sözlü olduğunu görüb soruşdu:

– Nə var, qızım?

Zeynəb pul kimi qızardı. Başını aşağı salıb saçının ucunu oynatdı.

– Tükəzban xala... Səndən bir söz soruşsam acığın gəlməz ki?

– Acığım niyə gəlir, qızım?!

– Sən Nəsib dayını çoxdanmı tanıyırsan?

– Lap uşaqlıqdan, nə olub ki?

– Heç nə.

– Yenə?

Zeynəb birdən ciddiləşdi. Başını qaldırıb arvadın üzünə baxdı.

– Bəs o niyə evlənmir?

Tükəzban xala cavab vermədi. Zeynəb hiss etdi ki, arvadın fikri uzaqlara getdi...

Onlar bir vaxtın uşaqları idilər. Balacalıqda bir-birlərindən ayrılmazdılar. Gah pencər yığmağa gedər, gah da həyətdə gizlənqaç oynayardılar. Axşamlar Nəsibin başına yığışardılar. O çox gözəl tütək çalardı. Tükəzban xalanın indiki kimi yadındadır, kəndə qaranlıq çökər-çökməz Nəsib tütəyini götürüb damların üstünə çıxardı. Aradan çox keçməmiş, uşaqlar onun başına yığılardılar. Nəsib dəmir tütəyini şalvarının dizinə sürtüb, papağının dalını qaldırardı. Onun barmaqlarını görmək olmazdı. Gah atdandırma, gah çadırhəngi çalar, gah da oynamaq istəyənlərin xahişini yerinə yetirərdi. Qız, oğlan bir-birinə qarışardı. Onlar hələ balaca idilər. Yəqin buna görə də hələlik heç kəs onların xatirinə dəymirdi. Ancaq hərdənbir Nəsibin anası qazma damdan çıxıb, onlara acıqlanırdı.

– A bala, gedin bir az o yanda oynayın. Torpaq başımıza tökülür.

Anasının danlağından sonra Nəsib uşaqları da götürüb xırman yerinə gedərdi. Onlar ay işığında gecə yarıya qədər çalıb-oynayardılar.

O vaxt qızların içərisində ən gözəl oyunçu Tükəzban hesab olunurdu. Ancaq Güləsər də ondan geri qalmırdı. O, balacaboy, sivriburun bir qız idi. İri, badamı gözləri ağ bənizinə çox yaraşırdı. Ağzı, dodaqları elə nəcib idi ki, adam baxmaqdan doymurdu. Yanağında iri

bir xal var idi. Buna görə də anası ona “Xallı” deyərdi. Uşaqlar da onu “Xallı” çağırardılar. Anası həmişə ona qırmızı parçadan büzməli don tikər, göy kofta geydirər, başına da yaşıl yelənli ağ kəlağayı örtərdi. Uşaqlar onu oynamağa çağıranda Xallı əvvəlcə balaca əlləri ilə, gözünün üstünə düşən saçını geri edib, kəlağayısının altında gizlədər, burnunu çəkib bir az gözləyəndən sonra ortaya çıxardı. Yalın gəzməkdən qapqara yanmış balaca ayaqlarının ucunda yaşlı arvadlar kimi asta-asta hərlənirdi.

O həmişə Tükəzbanla oynayırdı. Nədənsə, onlar oynayanda Nəsib daha həvəslə çalardı.

Onda hərəsinin beş-altı yaşı olardı. Nəsib dana otarırdı.

İllər ötdükcə dəstə azalırdı. Qızlar bir-bir nişanlanıb ərə verilirdi. On iki-on üç yaşına çatanda onları evdən bayıra çıxmağa qoymurdular. Qızlar ancaq arx kənarında, quyu başında görüşürdülər.

Xallı gözəllər gözəli olmuşdu. Tükəzban neçə dəfə öz qulağı ilə eşitmişdi ki, arvadlar Güləsərin arxasınca baxıb “zalım balası yamanca gözəldir” deyirdilər.

Qızlar uşaqlıq yoldaşları ilə ancaq kənddən kənarda görüşə bilərdilər. At, mal suvarmağa gətirən oğlanlar qızlarla ötəri salamlaşıb, hal-əhval tuturdular.

Nəsib indi mal otarırdı. Axşamlar yenə damın üstündə oturub tütək çalırdı. Kəndin hər yerində onun tütəyinin səsi eşidilirdi. Qızlar daha onun yanına gedə bilmirdilər. Öz qapılarında iş görə-görə ona qulaq asırdılar.

Güləsərlə Tükəzban qapı-qapıya qonşu idilər. Səhər-axşam bir yerdə olardılar. Onlar suya da birgə gedər, qapı-bacaya da birgə çıxardılar. Bəzən axşamlar evin dalında yanaşı oturub Nəsibin tütəyinə qulaq asar, uşaqlıq günlərini xatırlayardılar. Belə dəqiqələrdə Güləsərin halı yaman dəyişərdi.

Bir axşam o, çalınan havaya qulaq asıb, səsi titrəyə-titrəyə dedi:

– Ay, Tükəzban, ölməmiş yenə nə yaman yanıqlı çalır...

Tükəzban ay işığında onun gözlərinin yaşardığını gördü.

– Ay, qız sənə nə olub?

– Heç özüm də bilmirəm... – Güləsər başını aşağı salıb susdu, sonra öz-özünə danışırmış kimi əlavə etdi: – Gədəni ürəyim yaman istəyir. Uşaqlığımız yadıma düşəndə, burnumun ucu göynəyir. Kaş heç yekəlməyəydik...

Bir dəfə Güləsərgilin atı cidarını qırıb qaçmışdı. Qız qorxusundan tir-tir əsirdi ki, "atam gələndə məni öldürəcək". Gecə vaxtı Tükəzban onu tək buraxmadı. Qoruqlara atı axtarmağa birlikdə getdilər. Süd kimi aydınlıq olmasına baxmayaraq qızlar qorxurdular. Ağacların, çəpərlərin dibi ilə sinə-sinə gedirdilər. Şaqqıltı eşidəndə dayanır, yaxında adam olub-olmadığını yoxlayırdılar. Ürəkləri döyünə-döyünə bir qoruqdan o birinə keçirdilər. Birdən yaxında hənirti eşidildi, at fınxırdı. Onlar gözlədilər. Qaraltı yaxınlaşdı. Tükəzban Nəsibi tanıdı.

– Bu atı hardan gətirirsən?

– Qoruqların aşağısından tutmuşam.

Güləsər dilləndi:

– Çox sağ ol, ay Nəsib.

Oğlan özünü itirdi. O, qızı yenicə görürdü.

– Xallı?.. Belə Güləsər... Sən də burdasan?

– Tükəzbanla atı gəzirdik...

Onlar ağacların arası ilə yanaşı getməyə başladılar. Budaqların arasından düşən ay işığı çiyinlərini bəzəyirdi. Hər üçü susurdu. Birdən Tükəzban təlaşla dedi:

– Vay, evim yıxıldı, anam məni öldürəcək. Südü ocaqda qoyub gəlmişəm. Tükəzban ağaclar arasında gözdən itdi. Nəsiblə Güləsər onun yaxındakı nar kolunun arxasında gizləndiyini görmədilər.

Onlar tək qaldılar. Güləsər bir ayağını qaçaraq qoyub, ətrafa boylandı. O həm qorxur, həm də Nəsibdən ayrılmaq istəmirdi.

– Xallı?

– Nədir?

– Heç balaca vaxtımız yadına düşürmü?

– Deyinən, heç yadından çıxırmı?

– Mənim də...

Onlar armud ağacının dibində dayandılar. Nəsib atın noxtasını Güləsərə verdi. Qız oğlana diqqətlə baxdı. O xeyli böyümüşdü. Bığ yeri tərləmişdi. Kürəyi də enlənmişdi. Nəsib də öz növbəsində, ondan bir az aralı dayanan qızı gözdən keçirdi. O da böyümüşdü. Ay işığında onun yanağına düşən cığaları, açıq sinəsi, koftasını dik tutan xırdaca döşləri aydınca görünürdü.

– Nəsib, sağ ol.

– Sağ ol, Xallı.

Necə oldusa, birdən Güləsər özünü Nəsibin qollarının arasında gördü. Nəsib onu sinəsinə basıb yanağından öpdü. Güləsər onun üzünə bir sillə çəkdi. Nəsib əli üzündə dayanıb, ondan aralanan qızın dalınca baxdı. Peşman oldu. Ona elə gəldi ki, dünya üstünə uçdu, uşaqlıqdan ürəyində bəslədiyi ən əziz bir arzunu özü məhv etdi. Nəsib Xallını bir daha görə bilməyəcəyini, qızın onu ömründə dindirməyəcəyini düşünəndə az qaldı ürəyi partlasın. Kor-peşman evə gəldi. Üzü üstə döşənib yatdı.

O axşam Nəsibin tütəyi dillənmədi. Güləsər həyəcanlanmağa başladı. Nəsibdən ayrılandan sonra o da peşman oldu. Bütün gecə yerin içində uzanıb gözünü tavana zillədi. Xəyallar, düşüncələr onun yuxusunu qaçırtdı. Səhər açıldı. Xallı suya getdi. Qapı-bacada hərləndi. Qaranlıq düşən kimi Tükəzbanın yanına gəldi. Yenə də evin dalında oturub Nəsibin tütəyinə qulaq asmaq istədilər. Lakin Nəsib damın üstündə görünmədi. "Görəsən, gədəyə nə oldu? – deyə Güləsər düşündü. Əlim qurusun, mən onu niyə vurdum?"

O dözə bilmədi.

– Tükəzban, görəsən Nəsib hara gedib?

– Heç hara.

– Bəs niyə səsi-sorağı yoxdur?

– Doğrudan, ay Güləsər, heç səsi gəlmir, – deyə Tükəzban diqqətlə bacılığının üzünə baxdı: – Ay qız, heç soruşmadım, dünən məndən sonra nə danışdınız?

Güləsər qızardı.

– Heç nə. Sən də südü bəhanə eyləyib qaçdın.

– Yox, qardaşımın canı üçün, düz sözüm idi. Gedib gördüm süd daşıb, hələ sənə deməmişəm, anam süpürgəni götürüb mənə bir-iki çaldı da, hə, de görüm o sənə nə dedi?

Güləsər qıpqırmızı olub başını aşağı saldı. Bunu hiss edən Tükəzban daha da maraqlandı:

– Məndən söz gizlədirsən?

– And iç ki, heç kəsə deməyəcəksən?

– Ayıb olsun, mənə inanmırsan?

– Yox, qorxuram. Özün bilirsən, atam xəbər tutsa, məni tikə-tikə doğrayar.

– Qardaşımın canı üçün ağzımdan bircə kəlmə də qaçırtmaram.

Güləsər utana-utana:

– Üzümdən öpdü, – dedi.

– Bəs sən neynədin?

– Nə bilim, heç özüm də bilmədim, nə təhər oldusa üzünə bir sillə çəkdim. Özü də, deyəsən, bərk vurdum.

– Pis iş görübsən. Ürəyini sındırıbsan, allah bilir, indi o nə çəkir. Yəqin naxoşdur...

– Doğrudanmı, ay Tükəzban?

Onlar elə həmin axşam gizlicə Nəsibgilə getdilər. Nəsib həyətdə təkcə oturmuşdu. Başını sarıyıb pencəyini çiyninə salmışdı. Qızları görəndə özünü itirdi. Cəsarət edib onların üzünə baxa bilmədi. Qızlar ona lap yaxınlaşanda özünü güclə ələ alıb başını qaldırdı. Güləsər gülümsəyirdi... Sevincindən özünü itirən Nəsib ancaq bircə kəlmə deyə bildi:

– Xallı...

Nəsibin tütəyi yenidən dilə gəldi.

Aylar keçdi. Bir gün Nəsibi Gəncəyə kursa göndərdilər. O, getməzdən əvvəl Güləsərdən bir il onu gözləməsini xahiş etdi. Qız söz verdi. Ancaq...

Nəsib kursu qurtarıb kəndə gələndə Güləsəri başqasının evində gördü... Onu zorla ərə vermişdilər.

Bu hadisədən sonra Nəsib baş alıb kənddən getdi. Onun sorağı çox uzaqlardan gəldi. Güləsər də xoşbəxt olmadı. “Uşağın yoxdur” – deyə əri onu yola aparmadı. Nəhayət, neçə ildən sonra həsrətliklə bir qız tapdı. Adını Zeynəb qoydu. Qızı ayaq tutub dil açanda Güləsər xəstələndi. Bir axşam can verərkən Tükəzbanı yanına çağırıb qızını ona tapşırdı. Tükəzban da bacılığının yadigarını öz balası kimi böyüdüb boya-başa çatdırdı.

...Tükəzban xala yaşarmış gözlərini silib, ondan cavab gözləyən qıza baxdı. Dərindən köksünü ötürdü.

– Qızım, ona hörmət elə, ata kimi xətrini saxla. Özün də görürsən, səni çox istəyir. Elə rəhmətlik ananı da çox istəyirdi. O çox yaxşı adamdır, qızım...

## 16

Nərgiz müəllimə bu səhər lap tezdən durmuşdu. O, tarlaları gəzmək, tənəffüsdə kolxozçulara qəzet oxuyub, ikinci növbəyə qədər dərsə qayıtmaq istəyirdi. Hava olduqca xoş idi. Çisələmə yağışdan sonra bütün ağaclar, çöllər, taxıl zəmiləri par-par parıldayırdı. Hər şey adamın üzünə gülürdü. Elə bil təbiət yuyunmuş, indi də nazlı gəlinlər kimi səhər-səhər xumarlanırdı. Çiçək açmış meyvə ağaclarının qoynunda yerləşən kəndi ətirli səhər havası bürümüşdü.

Kəndin ortası ilə bir dəstə qız gedirdi. Yaşıl, bənövşəyi, sarı, qırmızı, yelənli kəlağayıların ucları yellənirdi. İpək koftalar, güllü donlar adamın gözünü qamaşdırırdı. Çiyinlərində kətmən qızlar gülüşür, arabir də zarafat edib bir-birini qovurdular.

Bağlardakı ağacların budaqları çəpərin üstündən aşıb yola kölgə salmışdı. Qızlar ağacların altından keçdikcə, çiyinlərində çal-çarpaz kölgələr oynaşırdı. Yolun dar yerlərində ağacların budaqları o tay-bu taydan bir-birinə qarışmışdı. Yollar ala-bəzək idi, ağ, çəhrayı çiçəklər yerə səpələnmişdi.

Nərgiz müəllimə qızlardan bir az aralı asta-asta gedir, hərdən başını qaldırıb, damların üstündə oxuyan sığırçınlara baxırdı. Günəşin şüaları altında parıldayan bu quşlar tüklərini qabardıb dimdiklərini şaqqıldada-şaqqıldada oxuyurdular. Elə bil onları titrətmə tutmuşdu. Boynu göy qurşağı kimi yüz rəngə çalan sığırçınlar susmamış bülbüllər cəh-cəh vururdular.

Nərgiz müəllimə əvvəlcə qızların dəstəsinə qoşulmaq istədi. Ancaq son günlər eşitdiyi söz-söhbəti yadına salanda fikrindən daşındı. Axır vaxtlar o çox qəribə olmuşdu. İki adam söhbət edəndə, yaxud pıçıldaşıb-güləndə dərhal ürəyi döyünür, sifəti od tutub yanırdı. Qıza elə gəlirdi ki, hamı ondan danışır. Get-gedə o, adamlardan qaçmağa çalışırdı. Nərgiz müəllimə başını qaldırıb adamların üzünə baxa bilmir, adamlar isə bunu başqa cür yozurdular. Kəndin qurtaracağında o, sola burulub cığıra düşdü. Bu çığır onu taxılların yanına, sonra biçənəyə apardı. Çöllərə şeh düşmüşdü. Nərgiz müəllimənin ayaqları və paltarının ətəyi islanırdı. Gözləri qamaşırdı. Tez-tez ayağının altından pırıldayıb uçan quşlar havada süzüb, yenə otların içində yox olurdular. Birdən lap yaxınlıqdakı zəmidə bir quş oxumağa başladı. Nərgiz müəllimə dayandı. Quş yenə oxudu:

– Dütdüdüdü, dütdüdüdü...

Quşun nəğməsinə valeh olub hər şeyi unudan Nərgiz arxasında bir hənirti duydu, cəld geri döndü. Zeynəb şaqqıldayıb güldü:

– Olmadı, səni yamanca qorxudacaqdım. Bəs niyə təkcə gedirsən?

– Nə bilim, elə belə... Bəs sən özün niyə burayla gedirsən?

– Kənddən çıxanda taxılların arasında bir qaraltı gördüm, yerişindən tanıyıb dalınca düşdüm. Dedim, bu saat gedib o qızı götürüb qaçacam.

Nərgiz müəllimə qızardı. Zeynəb zarafatının yerinə düşmədiyini duyub susdu. Bayaqkı quş yenə oxumağa başladı.

– Nə gözəl oxuyur! Bu hansı quşdur?

Zeynəb söhbətin dəyişdiyinə sevindi:

– Heç bilirsən o nə deyir?

– Quş nə deyəcək ki?

– Yox, o, quş deyil, gəlindir. Özü də deyirlər, gözəl bir gəlin olub. Elə bir gəlin ki, su sonası kimi, bir qənir üzünə baxmaq olmurmuş.

– Bəs sonra nə olub?

– Sonra gördüyün kimi, həmini gəlin quşa dönüb çöllərdə oxuyur.

Nərgiz müəllimə maraqla Zeynəbin üzünə baxdı, nə isə soruşmaq istədi. Ancaq quş yenə oxumağa başladı.

– Bir qulaq as, lap aydınca deyir.

– Axı nə deyir?

– Eşitmirsən? Taxçada, boxçada, taxçada, boxçada...

Quş pırıltı ilə uçub getdi, səsi taxılların ortasından gəldi. Zeynəb dərindən köksünü ötürdü.

– Bu, uzun nağıldır. Deyilənə görə, bu quş cavan bir gəlin imiş. Əri yaman əzazil imiş. Yazıq gəlinin günü qaraymış. Bir gün əri ona bıçaq verir ki, saxla. Gəlin saxlayır. Kişi hər axşam evə gələndə bıçağı istəyirmiş. Bir dəfə axşamüstü ərinin evə qayıtdığını görüb tez bıçağı axtarır. Amma tapa bilmir. Nə qədər çalışırsa, yadına düşmür ki, haraya qoyub. Gəlin lap özünü itirir. Bilir ki, əri gələn kimi bıçağı soruşacaq, tapmayanda salacaq təpiyinin altına. Əlacı kəsilən gəlin allaha yalvarır ki, məni bu zülmdən qurtar, bir quşa döndər, bu xarabadan uçum gedim. Arzusu yerinə yetir. Gəlin quşa dönüb çəmənlərə uçur.

Nərgiz müəllimə bir uşaq sadəlövhlüyü ilə sevinib dərindən nəfəs aldı.

– Nə yaxşı olub.

– Hələ dalına qulaq as. Gəlin quşa dönüb çəmənə qonandan sonra yadına düşür ki, bıçaq taxçadakı boxçadadır. Elə o vaxtdan oxuya-oxuya gəzir. Bircə qulaq as.

Quş doğrudan da elə bil Zeynəbin dediklərini təkrar edirdi: "Taxçada, boxçada".

– Bəs o gəlinin adı nəymiş?

– Turac.

Onlar pambıq tarlalarına çatmışdılar. Cərgələr artıq qalınlaşmışdı. Qabağa düşən qızlar alaq vururdular.

– Gedək bizim manqaya! – deyə Zeynəb təklif etdi.

– Yox, əvvəlcə o biri manqalara gedəcəm.

– Niyə bizdən qaçaq gəzirsən, müəllimə?

Nərgiz dillənmədi.

– Vallah, adamın səndən ötrü burnunun ucu göynəyir. Mağıl qonşu idik, axşam-səhər görüşürdük. Üzümüz-gözümüz öyrəşmişdi. İndi elə bil bir yanımız köçüb... Tükəzban xala da sənin xiffətini çəkir. Doğrudan, niyə köçdün?

Nərgiz könülsüz cavab verdi:

– Eşitməyibsən nə söz çıxardıblar?

– Belə, ağrım ürəklərinə! O qədər danışsınlar ki... Sizin ki aranızda bir söhbət olmayıb... Yoxsa...

O, diqqətlə Nərgiz müəllimin üzünə baxdı. Ürəyi döyündü. Səbirsizliklə onun nə deyəcəyini gözlədi. Qız elə bir vəziyyət aldı ki, guya bütün həyatı müəllimənin verəcəyi cavabdan asılı idi. Nərgiz də özünü itirdi. Yanaqları xəfifcə qızardı.

– Yox, yox, nə danışırsan, heç elə şey olarmı?

Zeynəbin rəngi açıldı.

– Bəs onda nədən çəkinirsən?

– Dedi-qodudan. Bilirsənmi, Zeynəb, mənim ömrümdə qalmaqalla işim olmayıb. Elə institutda da adətim idi. Qızlar hərdən baş-başa verib qeybət eləyəndə, bir-birinə söz deyəndə kənara çəkilərdim.

– Ancaq sən hərdənbir Tükəzban xalaya baş çək. Elə İmrana da.

Zeynəb İmranın adını eşidəndə Nərgiz müəllimənin birtəhər olduğunu duydu.

– Köçəndən sonra heç onu görübsənmi?

– Yox.

Yenə susdular. Zeynəb arxın üstündəki ensiz körpüdən keçib dayandı, göz işlədikcə uzanan cərgələrə baxdı.

– Xoşuna gəlirmi?

Nərgiz müəllimə yanağında oynayan telini geri sığalladı.

– Çox yaxşıdır! Kollar adamın üzünə gülür.

– Bu il yaxşı pambıq olacaq. Doğrusu, səpinə başlayanda mən özüm də qorxurdum. Amma, bax gör nə gözəldir! Kollar muncuq kimi düzülüb. Kosaoğluyla Kazımın acığına gərək bu il hamıdan çox pambıq verəm.

Birdən Zeynəb tarlanın aşağı tərəfində toz qalxdığını görüb susdu.

– Bıy, görəsən bu bəxtəvər kimdir?

Motosikl gurultu ilə onların yanında dayandı. Zeynəb toza batmış oğlanı təpədən-dırnağa süzüb qaqqıldadı:

– Bu nədir, ay İmran, xalq "Pobeda" alanda sənin də gücün buna çatdı? Bir gör özünü nə kökə salıbsan!

– Ağronom adamam, mənimki elə budur. De görüm yaxşı maşındır?

– Yaxşılığına söz yoxdur. Amma, düzü, mən bu ikitəkərlilərdən qorxuram. Birdən yıxılıb eləyər. Barı yaxşı sürə bilirsənmi?

– İstəyirsən gəl otur, gəzdirim.

– Mən sənin kimi işsiz-gücsüz deyiləm. Xudahafiz!

Zeynəb alaq vuran qızlara doğru qaçdı.

İmran çiynini çəkib onun arxasınca baxdı, sonra üzünü kənardaca başını aşağı salıb duran Nərgizə tutdu:

– Necəsiniz, müəllimə?

– Çox sağ olun. – O, bir az duruxdu. – Anan necədir?

– Niyə, siz görəni pis deyil.

– Yoxsa məndən inciyib?

– Bəs inciməz?

– Mən ki onun xətrinə dəyən bir iş görməmişəm.

– Görmüsünüz. Həm də təkcə anamın yox, mənim də xətrimə dəyibsiniz.

– Mən buna bir səbəb görmürəm.

– Səbəbi böyükdür. – Bu dəfə də İmran duruxdu. – Bəlkə də günahın çoxu məndədir. Gərək mən əvvəldən sizinlə açıq danışaydım...

Qız təlaş içində onun üzünə baxdı. İmran Nərgizin qızardığını, sinəsinin tez-tez qalxıb-endiyini gördü. İmran dəsmalını çıxardıb alnını sildi.

Nərgiz qolundakı saata baxdı:

– Mən geçikirəm, sağ olun, gərək ikinci növbəyə qədər dərsə qayıdam. İmran özünü ələ almamış, Nərgiz arxın üstündəki söyüd ağaclarının arasında gözdən itdi.

## 17

Məktəbin küncündəki otağın pəncərələrindən işıq gəlirdi. Axşamdan xeyli keçmişdi. Məktəbin qabağındakı bağda baş-başa verən çinar ağacları, qollu-budaqlı armudlar, salxım söyüdlər elə bil mürgüləyirdi. Arabir yarpaqlar astadan xışıldayırdı. Ağacların dibindən axan suyun şırıltısı sanki bu sakitliyə layla çalırdı. Lap uzaqda, kəndin kənarındakı gölməçələrdə qurbağalar quruldaşırdı. İmran pilləkənə yaxınlaşdı. Səs salacağından ehtiyat edərək, asta-asta yuxarı qalxdı. Qapının ağzında dayandı. Pəncərədə kitab oxuyan bir adamın kölgəsi görünürdü. "Evdədir" – deyə İmran öz-özünə pıçıldadı. Əlini qaldırıb qapını döymək istədi. "Birdən mənim gəlişimdən incidi, bəlkə də heç qapını açmaq istəmədi, onda nə olsun? – deyə düşündü. – Deməzmi gecə vaxtı sənin qız xeylağı ilə nə işin ola bilər? Nə cavab verərəm?" O qayıdıb getmək istədi. İçəridən ayaq səsi gəldi. Stul tərpəndi və birdən qapı açıldı. Onlar üzü-üzə gəldilər. Qız qəfildən qarşısına çıxan adamı görəndə diksinib geri çəkildi, qapını örtdü.

– Kimdir?

– Mənəm, Nərgiz müəllimə... qorxmayın.

Qız tanış səsə qapını araladı. İçəridən düşən işıq oğlanın üzünü aydınlaşdırdı.

– İmran? – O, dərindən nəfəs aldı. – Elə qorxdum ki...

– Məndən başqa gecə vaxtı sizin qapınızı kim döyər ki?

Nərgiz dinmədi.

– Əgər qorxutdumsa, üzr istəyirəm. Mən qapını döymək istəyirdim, özünüz qabağıma çıxdınız.

Onlar bir az beləcə dayandılar. Nərgiz bir əli ilə qapının dəstəyindən tutub durmuşdu. Qaranlığı yaran işıq zolağı eyvanı və pilləkəni aydınlaşdırıb, həyətdəki yaşıllığın üstünə sərilmişdi. Xırdaca böcəklər işıqda qaynaşırdı. Ortalıqdakı sükut elə dərin idi ki, arxa sıçrayıb düşən qurbağaların suyu şappıldatması eşidilirdi. Elə bil hər ikisi bir anlığa hər şeyi unudub, gecənin sakitliyini dinlədi.

Heç biri cürət edib qabağa düşə bilmirdi. Nə İmran dillənir, nə də Nərgiz onu içəri dəvət edirdi.

Külək otları, yarpaqları xışıldatdı. Nərgiz fikirdən ayıldı.

– Haradan gəlirsiniz?

– İşdən qayıdıram. Gördüm pəncərədən işıq gəlir, dayandım, heç özüm də bilmirəm nə təhər oldusa qapınızın ağzına gəldim.

Nərgizin üzünə kölgə düşdüyündən, İmran onun sifətindəki ifadəni görə bilmirdi. Həyəcandan ürəyi döyünən İmran əlini cibinə salıb papiros qutusunu axtardı.

– Keçin içəri, qapının ağzında niyə durubsunuz, – deyə Nərgiz tərəddüdlə təklif etdi.

– Deyəsən, gecdir axı, sizi narahat eləmərəmmi?

– Gələn qonağı geri qaytarmazlar. Gərək gəlməyəydiniz, gəlibsiniz, içəri keçin. İmran yüngül nəfəs aldı, papiros qutusunu cibinə qoyub içəri keçdi. Nərgiz qapını örtüb stul çəkdi.

– Əyləşin.

O, yarımçıq qoyduğu kitabı götürdü. Pilətənin üstündəki çaydanı yerə qoydu. Çay süzdü, yenə də nə isə axtarmağa başladı. İmran onun bir ev sahibi kimi əl-ayağa düşdüyünü, qonağını razı salmağa çalışdığını görüb:

– Zəhmət çəkməyin, heç nə lazım deyil, – dedi.

– Siz mənim evimə birinci dəfə gəlirsiniz, hörmət eləmək borcumdur. Ancaq günah özünüzdədir. Vaxtsız gələn qonaq kisəsindən yeyər.

– Mən ki qonaq deyiləm.

İmran qurtum-qurtum çay içir, Nərgiz müəllimə gözaltı onu süzürdü. Hiss olunurdu ki, hər ikisi sıxılır, danışmağa söz tapa bilmir. İçəri isti olmasa da, İmran tez-tez tərini silirdi. Nərgiz müəllimənin sifəti alışıb-yanırdı. O nə isə hiss edirdi və bundan qorxurdu. Əslinə baxsan, o çoxdan, elə İmranla birinci dəfə eyvanda görüşən andan qorxurdu. Nərgiz o vaxtdan öz hissləri ilə mübarizə aparırdı. İndi də narahat idi.

İmran da həyəcanlanırdı. Neçə vaxtdan bəri ürəyində coşan hissləri açıb deməyə cəsarəti çatmırdı. Ancaq onu hiss edirdi ki, susmaq mümkün deyil. Madam gəlib, gərək söz açsın. Nəhayət o:

– Heç yaxşı iş görmədiniz, Nərgiz müəllimə, – deyə, tarlada yarımçıq qalan söhbəti yenidən başladı, – mən sizi belə bilmirdim.

Qız heç nə anlamırmış kimi soruşdu:

– Nə olub ki?

– Gərək bizdən köçməyəydiniz. Mən heç... Anamın qəlbinə toxunmayaydınız. O sizi çox istəyir. Lap çox istəyir.

– Bilirəm... O mənə analıq eləyib...

– Bəs niyə ona axıra qədər övladlıq eləmədiniz?

Nərgiz müəllimənin ürəyi daha da narahat oldu.

– İmran... Mən gec-tez sizdən köçməli idim. Həmişəlik orada qala bilməzdim ki?

– Həmişəlik qala bilməzdiniz? – İmran onun sözünü təkrar etdi.

– Niyə qala bilməzdiniz?

– Heç elə şey olarmı?

– İstəsəniz olar. Sizdən asılıdır...

– İmran daha nə isə dedi, ancaq Nərgiz eşitmədi. Onun qulaqları uğuldadı. Otaq başına hərləndi. O, əllərini yanaqlarına apardı. İmran isə hey ona baxır, inadla cavab gözləyirdi.

Birdən Nərgizi titrətmə götürdü, dodaqları səyridi. Özünü saxlamaq istədisə də, bacarmadı. Hıçqırıq onu boğdu. Başını stola söykədi. Saçları çiynindən sürüşüb aşağı sallandı.

İmran çaşıb qalmışdı. Qarşısında hıçqırıb ağlayan qıza nə deyəcəyini, onu necə sakitləşdirəcəyini bilmirdi. "Ona nə oldu, nə üçün belə edir?" – deyə düşündü və titrək əlləri ilə Nərgizin saçlarını geri elədi. Onun başını yuxarı qaldırıb diqqətlə üzünə baxdı. Qızın gözləri yaşla dolu idi. Burun pərələri səyriyirdi. Nazik dodaqları azca aralanmışdı. O, körpə kimi hıçqırırdı.

– Nərgiz... Axı sizə nə oldu?

– İmran, yalvarıram, çıxın gedin, bu saat məndən heç nə soruşmayın.

– Axı niyə?

– Bilmirəm... Heç nə bilmirəm, xahiş eləyirəm çıxın gedin...

– Mən heç yana gedən deyiləm!

Qız İmranın səsindəki qətiyyəti hiss etdi. Özünü toxtatdı. Qızarmış gözlərini İmranın üzünə dikib uzun-uzadı baxdı. Onun baxışlarındakı məlulluq və iztirab İmranı sarsıtdısa da, heç nə soruşmadı. Nəhayət, Nərgiz dilləndi:

– İmran, axı sən məni tanımırsan. – O heç özü də hiss etmədən İmrana "sən" dedi. – Bilmirsən kiməm, nə yuvanın quşuyam...

– Nərgiz...

– Sözümə qulaq as! Yaxşı tanımadığın bir qıza könül bağlamağı sənə məsləhət görmürəm.

– Bunlar artıq sözlərdir, Nərgiz.

– Yox, İmran, bu, ömür-gün sövdasıdır. Əgər sən məni yaxşı tanısan, fikrindən əl çəkərsən.

– Heç vaxt!

– Dedim çəkərsən, İmran. Sən məni sevə bilməzsən!

– Bəs sən necə?

– Mənmi?

– Mən heç nə başa düşə bilmirəm, Nərgiz. Sən nə danışırsan, axı mən səni niyə sevə bilmərəm?

– İmran, yaxşısı budur çıx get, nə özünə, nə də mənə əziyyət ver. Yalvarıram sənə, dur get.

– Nərgiz, dedim sözümdən dönən deyiləm. Məni başa sal görək, bu nə deməkdir?

– Demək, sən hər şeyi bilmək istəyirsən, eləmi?

– Bəli!

Nərgizin yenə fikri dağıldı, nə deyəcəyini bilməyib susdu. Lakin birdən qətiyyətlə ayağa durdu, kitabların arasından bir dəftər götürdü:

– Al... Ancaq məndən bir kəlmə də soruşma.

O yenidən hönkürdü, hıçqırığını boğmaq üçün çarpayının üstünə yıxılıb, üzünü yastıqda gizlətdi.

İmran bir ona, bir də dəftərə baxdı. Qıza yaxınlaşdı. Nərgiz dik atılıb bayıra qaçdı. İmran bir-iki dəfə çağırdısa da, qız geri dönmədi, qaranlıqda gözdən itdi.

Heç nə anlamayan İmran yerə düşmüş dəftəri götürdü, qeyri-ixtiyari vərəqlədi... “İnsanın həyatında çox qəribə, ağlagəlməz hallar olur. Bəzən bir adamla iki il, üç il bir yerdə yaşayırsan, hər gün görüşürsən, lakin ona əhəmiyyət vermirsən, onun varlığını belə hiss etmirsən. Bəzən təsadüfi, ötəri bir görüş ömrün boyu yadından çıxmır...

Biz onunla üç ildir ki, bir kursda oxuyuruq. Hər gün bir-birimizə rast gəlirik, salam veririk. O, o qədər də gözəl deyil. Qarayanız bir oğlandır. Gözlərindən başqa sifətində elə bir cazibədar yeri yoxdur. Bəzən mən ona diqqətlə baxıram, ağzının və burnunun iri olduğunu müşahidə edirəm. Amma nədənsə adama xoş gəlir, necə deyərlər, çox suyuşirin oğlandır. Xasiyyəti də pis deyil, ağır təbiətli cavandır. Çox danışıb-gülməz, kursumuzdakı oğlanlara da o qədər qoşulmaz. Amma hərdənbir zarafat edib ətrafdakıları güldürməyi sevir. İlk baxışda qaradinməz, bir qədər də rəsmi görünür. Hətta adama elə gəlir ki, o eqoistdir. Amma bir az yaxından tanış olanda tamam əksini görürsən. Mən də elə oldum.

Çox qəribədir, mən onu yalnız üçüncü kursda görməyə başladım. Elə bil bu üç ildə o, heç bizim kursda deyilmiş. Mən onun varlığını hiss

etmirdim. İndi hara getsəm, hara baxsam, onu görürəm. Min adamın içində onun boyunu seçirəm, səsini tanıyıram. Bizim yaxınlaşmağımız da qəribə oldu. Bir dəfə necə oldusa mühazirədə o mənim yanıma gəldi, böyrümdəki boş yeri göstərib soruşdu:

– Oturmaq olarmı?

Mən kənara çəkilib ona yer elədim. Bu üç ildə birinci dəfə idi yanaşı otururduq. Mən həmişə qızların yanında olardım, o isə heç bilmirəm kiminlə əyləşərdi. İkinci dərsdə də təsadüfən yenə yanaşı düşdük, hətta o mənə baxıb gülümsündü.

– Bu nədir, – dedi, – bu gün bizə nə olub?

– Bilmirəm, – deyə laqeydcəsinə cavab verdim və dönüb yanımdakı qızlarla söhbətə başladım.

Bu hadisədən bir gün sonra dərsə gələndə özüm də hiss etmədən gözlərimlə onu axtarırdım. Hətta yanımda boş yer saxladım. O, içəri girəndə çağırmaq istədim. Teymur isə mənimlə ötəri salamlaşıb qabaqda əyləşdi. O gün mən dərslərin axırına qədər narahat oldum. Özümün də başa düşə bilmədiyim hallar baş verirdi. Gah darıxır, gah kədərlənir, gah da özümü bu qədər yoldaşın içində tək hesab edirdim. Bu hiss getdikcə qüvvətlənirdi. Günlər ötdükcə özüm-özümü tanıya bilmirdim.

Artıq kursumuzdakı oğlanları gözüm görmürdü. Onların səsi sifətlərinə qarışır, nəzərimdə elə bil dumana bürünürdü. Bu duman içərisində mən həmişə Teymurun gözlərini görürdüm. O harada otursa, mən o səmtə baxırdım, hara dönsə, mən də dönürdüm. Günəbaxan günəşə boylanıb boynunu əydiyi kimi, mən də Teymuru gözümdən qoymurdum. Bəzən evdə özüm-özümü danlayırdım. Axmaqlıq elədiyimi fikirləşir, bir daha onunla maraqlanmayacağıma söz verirdim. Ertəsi günü instituta qəti qərarla gəlirdim ki, bir də ona baxmayacağam, amma mümkün olmurdu. Mühazirə zamanı gözlərim yenə ona dikəlirdi. O isə nəinki mənimlə yanaşı oturmurdu, heç yanıma da gəlmirdi. Yenə əvvəlki kimi, oğlanlarla bir kənara çəkilirdi. Belə hallarda mən hirslənirdim. O öz soyuqluğu ilə məni yandırıb-yaxırdı.

Aradan bir ay keçdi. Mən sınıxmağa başladım. Qızlar məndən soruşdular:

– Nərgiz, sənə nə olub?

– Günü-gündən niyə sınıxırsan?

– Bilmirəm... Heç nə bilmirəm, – deyə cavab verirdim.

Təskinlik tapmaq üçün gecə-gündüz roman oxumağa başladım. Tramvayda, tənəffüsdə də romanlardan ayrılmazdım. Ancaq mümkün olmurdu. Bəzən gecə yerin içinə girib kitab oxuduğum zaman bir də hiss edirdim ki, dayanmışam. Sətirlərin arasından baş qaldıran Teymur gözlərini mənə zilləmişdir...

Bir gün əla oxuduğuna görə qəzetdə onun şəklini vermişdilər. Mən həmin qəzeti götürdüm. Otağıma çəkildim, qapını örtüb qəzeti stolun üstünə sərdim. Baxdım, baxmaqdan doymadım. Qayçını götürüb ehtiyatla şəkli kəsdim. Stolun üstündə, şüşənin altında cürbə-cür şəkillər vardı. Onu da həmin şəkillərin arasına qoymaq istədim, ancaq fikrimi dəyişdim. Şəkli kitabların birisinin arasında gizlətdim. Bəli, mən onu gizlətdim. Niyə? Məgər mən onu başqa şəkillərin yanına qoya bilməzdim? Soruşan olsaydı, "yoldaşımdır" demək olmazdımı? Bəs mən onu nə üçün gizlətdim?

O gündən həmin şəkil gecələr mənim sirdaşım oldu.

Evdə hamı yatandan sonra kitab oxumaq bəhanəsi ilə stolun dalına keçir, onunla üzbəüz otururdum. Onun qaşları çatılmışdı. Boynu azacıq yana əyilmişdi, qıvrım saçlarından bir dəstə sürüşüb alnına düşmüşdü. Mənə elə gəlirdi ki, Teymur ürəyimdən keçənləri duyur. Qəsdən cavab vermir. Gecələrin necə gəlib keçdiyini bilmirdim.

Bir gün dostum Leyla dərsdən sonra məndən ayrılmadı.

– Nərgiz, heç özündən xəbərin varmı? Günü-gündən şam kimi əriyirsən, axı sənə nə olub? Məndən niyə gizlədirsən?

Mən təlaşla:

– Heç nə yoxdur, – dedim, – Heç nə gizlətmirəm.

O, sınayıcı nəzərlə mənə baxdı və mənalı-mənalı başını tərpətdi:

– Mən uşaq deyiləm. Gözünün içinə baxanda ürəyindəkiləri oxuyuram. Sən sevirsən! Mən birdən-birə üstünə soyuq su çilənən adam kimi dik atıldım. Boğazım qurudu, ağzımı açıb ona bir kəlmə də deyə bilmədim. Leylanın sifətindəki narahatlıqdan gördüm ki, halım pisdir. O, mənim qoluma girdi.

– Oh, Nərgiz, Nərgiz, – deyə məzəmmətedici ahənglə səsləndi.

Bulvara getdik. Skamyada oturduq. Mən gözümü dənizə zilləmişdim. Sərin külək əsir, ləpələr bir-birini qovurdu.

Mən ürəyimdə qövr eləyən sirri artıq saxlaya bilmədim. Hər şeyi Leylaya danışdım. O gündən biz sirdaş olduq.

Bir gün Leyla yanıma gəldi. Onun sifəti tutqun idi. Hiss edirdim ki, mənə nə isə acı bir xəbər vermək istəyir. Ürəyim şiddətlə döyündü. Nəhayət, tab gətirə bilməyib soruşdum:

– Leyla nə olub?

– Nə olacaq? – deyə o acıqlı-acıqlı cavab verdi. – Teymura nişan taxıblar.

Özüm güclə saxlayıb pıçıltı ilə xəbər aldım:

– Kimə?

– Bizim institutda oxumur. Mən o qızı tanıyıram. Çox ağıllı və təmiz qızdır.

– Gözəldirmi?

– Sənə nə var, gözəldir ya çirkindir! Sənə deyirəm, ona nişan taxıblar. Ağlını başına yığ!

Leyla nə qədər danlayıb öyüd-nəsihət verdisə, olmadı. O gedəndən sonra oturub gözlərimə dəm verdim. Səhəri uşaqlar Teymuru təbrik edirdilər. Bəziləri də zarafatla "sağ əlin başımıza" – deyirdi. Leyla məni bir küncə çəkdi.

– Özünü biabır eləmə. Gəl gedək sən də onu təbrik elə.

– Yox, bacarmaram.

– Aləmi özünə güldürmə!

Leyla məni zorla Teymurun yanına apardı. Mən onun üzünə baxanda gözlərimə qaranlıq çökdü. Leyla qolumdan tutdu.

– Təbrik edirəm. Xoşbəxt olasınız...

– Çox sağ olun. O gün olsun ki, sizin də başınıza gəlsin.

O gündən yasa batmış kimi oldum. Mənə elə gəlirdi ki, dünya uçub, altında qalmışam.

Aradan bir neçə ay keçdi. Üçüncü kursu bitirdik, yay tətilinə getdik. Leyla məndən ayrılmadı. Birlikdə Şuşada istirahət evində olduq. Payız girdi, yenidən instituta qayıtdıq. Ancaq mən yenə Teymuru qəlbimdən çıxara bilmədim. Bir dəfə Leyla üstümə möhkəm düşdü:

– Mən dünyada ondan başqa heç kəsi sevə bilməyəcəyəm, – deyə cavab verdim, – özüm də bilirəm, mənim məhəbbətim axmaq məhəbbətdir. O məni sevmir, onun nişanlısı var, ancaq olmur, ürəyimə necə hökm edim?!

Bu cavabdan sonra Leyla mənə heç nə demədi.

Aradan bir qədər də keçdi. Mənə elə gəlirdi ki, Teymur xeyli dəyişmişdir. O, daha şaddı, deyib-gülür, oğlanlarla zarafatlaşır, hətta

mənə də mehribanlıq edirdi. Onun bu hərəkəti qəlbimdəki arzuları daha da alovlandırırdı.

Bir gün Leylagilə yığışmışdıq. Onun anadan olan günü idi. Adam çox deyildi. Leyla bu gecə mənimlə mehriban idi. Onun tez-tez saata baxmasından anlayırdım ki, kimi isə gözləyir.

Çox keçmədi ki, qapı açıldı. Teymur içəri girdi. Onu hay-küylə qarşıladılar. Hamı ayağa durdu. Mən isə yerimdən tərpənə bilmədim. Teymur qoltuğundakı kağızı açdı, ordan bir əmzik çıxardıb Leylaya verdi.

– Al, – dedi, – istəyirsən özün sor, istəyirsən saxla, lazım olar. O, mənalı-mənalı gülüb ətrafdakılara göz qırpdı. Otağı qaqqıltı götürdü.

Bilmirəm qəsdənmi, təsadüfənmi Leyla nə təhər elədisə, biz Teymurla yanaşı oturduq. O nə qədər mehriban və nəzakətli idi! Elə səmimi danışırdı, qulaq asmaqdan doymurdum. Hər şeyə göz qoyur, süfrədəki cürbəcür yeməklərdən mənim qabağıma düzürdü. Arabir nə isə deyirdi. Mən heç nə başa düşmürdüm. Daha doğrusu, mən məst idim. Özümü dünyanın ən xoşbəxt adamı hesab edirdim. Vaxtın necə gəlib keçdiyini hiss etmədim.

Biz dağılışanda tramvay işləmirdi. Küçələrdə görünən tək-tük maşınlar fit verib sürətlə keçirdi. Leyla məni tək buraxmaq istəmədi.

– Əgər razı olsa, onu mən ötürərəm. Elə evimiz bir səmtdədir, – deyə Teymur Leylanın, sonra da mənim üzümə baxdı.

Mən heç nə demədim. Ancaq o yadımdadır ki, Leyla güldü və bizim arxamızca:

– Teymur, bax, qızdan muğayat ol ha, sonra əlimdən qurtara bilməzsən, – dedi.

Biz yola düşdük. Nə o danışır, nə mən dillənirdim. Ayaq tappıltılarımız aydınca eşidilirdi. Tramvay yolunu keçib hündür bir yerdə dayandıq. Bakının işıqları sayrışırdı. Şəhərin qucaqladığı dəniz bu işıqların ağuşunda parıldayırdı. Lap uzaqda mayak yanıb-sönürdü. Sərin, aylı bir sentyabr gecəsi idi. Üşüyürdüm. Teymur bunu hiss edib pencəyini soyundu, yavaşca çiynimə saldı. Heç nə demədim. Mənə elə gəlirdi ki, yuxu görürəm, əgər etiraz etsəm, ya ona bir söz desəm, hər şey yox olacaq. Mən bu şirin xəyaldan ayrılmaq istəmirdim. O, yavaşca qoluma toxundu. Biz vağzal körpüsünə çıxdıq. Birdən məndə dənizə yaxından tamaşa etmək arzusu doğdu. Teymur etiraz etmədi. Hökumət evinin yanından keçib yenicə basdırılmış ağacların arası ilə sahilə en-

dik. Soyuq, mamır qoxusu verən nəmli dəniz küləyi üzümə vurdu. Ləpələr narahatlıqla çırpınırdı, sahili yalayırdı. Ay işığı dənizin ortasında uzun bir zolaq salmışdı. Bu zolaq dənizlə bərabər titrəyirdi. Elə bil dənizə gümüş pullar səpələnmişdi. Ürəyim elə döyünürdü ki, az qalırdı sinəmi yarıb çıxsın. Yanaqlarım alışıb-yanırdı. Teymur da gözünü dənizə zilləmişdi. Mən ay işığında onun sifətindəki dalğınlığı gördüm. Nəhayət, o dilləndi:

– Nərgiz, gedək, sənə soyuqdur.

Mən daha dözə bilmədim.

– Yanıram, Teymur, – dedim, – bircə əlini üzümə vur.

O, əlini ehmalca mənim yanağıma vurdu. Dünya başıma hərləndi. Özüm də bilmədən əlini tutub yanağıma sıxdım. Başımı onun qoluna söykədim.

Aradan nə qədər keçdiyini bilmədim. Gözümü açanda Teymurun üzümə zillənmiş gözlərini gördüm. Mən inana bilmirdim ki, bütün bunlar həqiqətdir. Teymur doğrudan da mənim yanımdadır, mən onun sinəsinə qısılmışam. O, tirtrək əlləri ilə saçımı sığallayır.

Xeyli beləcə dayandım. Birdən qəhər məni boğdu. Ağladım, doyunca ağladım.

– Məni bağışla, Teymur. Mən heç təsəvvürümə gətirə bilməzdim ki, biz beləcə yanaşı dayana bilərik. Mənim nələr çəkdiyimi bilirsənmi, Teymur?

– Bilirəm, Nərgiz... Leyla mənə hamısını danışıb, mən səndən də çox əziyyət çəkirəm. Mən əvvəllər bunu hiss eləmirdim. Heç ağlıma da gəlməzdi. Sənin mənə görə əziyyət çəkdiyini görəndə nə edəcəyimi bilmədim.

O məni sahildən uzaqlaşdırdı. Fəvvarənin yanındakı skamyalardan birində oturduq.

Nə isə demək istədi, qoymadım.

– Heç nə lazım deyil, mən sənin ürəyindən keçənləri bilirəm, Teymur, onu da bilirəm ki, bu görüş bir də təkrar olunmayacaq. Mən bir də heç kəsi bu cür sevə bilməyəcəyəm.

– Sevgi... – deyə Teymur pıçıltı ilə təkrar etdi və gözlərini harayasa zillədi. O xeyli dayanıb fikrə getdi. Mən onun kədərləndiyini, əzab çəkdiyini, nədənsə narazı olduğunu hiss etdim. Beynimdə qəribə fikir dolaşdı: “Bəlkə o da məni sevir?”

Mən ona daha yaxın oturdum.

– Teymur, de görüm... azacıq da olsa məni sevirsənmi?

O dönüb üzümə baxdı. Gözlərindəki ifadə məni sarsıltdı. Mən orada mərhəmət oxudum. Bəli, gözlədiyim sevgi əvəzinə mərhəmət! Başa düşdüm ki, Teymurun mənə yazığı gəlir, dərdimi yüngülləşdirmək istəyir.

– Sənin daha xoş dəqiqələrin olacaq, Nərgiz!

– Mən bir də heç kəsi sevə bilməyəcəyəm.

– Sevəcəksən! – deyib ayağa durdu.

Evimizin yanında ayrılanda Teymur mənimlə daha açıq danışdı:

– Gəl bu gündən dost olaq. Hər şeyi unudaq, bir daha bu cür görüşməyək.

Onun dediyi kimi də oldu. Biz bir daha görüşmədik. Ancaq mən sakitləşən kimi oldum. Gecələr rahat yatdım. Elə bil bu görüşümüz mənə ürək-dirək verdi.

Dövlət imtahanını da pis qurtarmadım. Axırıncı imtahandan çıxanda Teymur mənə yaxınlaşıb əlimi sıxdı, təbrik etdi.

Biz ayrıldıq.

Mən ata-anamın etirazına baxmayaraq kəndə gəldim. Burada sakit dolanacağımı qət etdim. Ancaq olmadı. Qəlbim sözümə baxmadı. İndi də başqası...”

İmran axırıncı vərəqi çevirdikdən sonra xeyli hərəkətsiz dayandı. Qəmli bir hekayə oxumuş kimi mütəəssir oldu. Yavaşca əlini cibinə apardı, papiros götürdü, barmaqları arasında xeyli saxladı, sonra damağına alıb ayağa durdu. Onun gözləri bir nöqtəyə zillənmişdisə də, heç nə görmür, heç nə düşünə bilmirdi. O sarsılmışdı. İmran kibrit axtardı, tapmadı. Stolun üstündə yanan lampanı təzəcə görürmüş kimi oldu. Piltəni yuxarı qaldırıb papirosunu yandırdı. Bir nəfəsə yarıya qədər sümürdü. Otağı duman bürüdü. O, qutudan bir papiros da götürdü. Yalnız bu zaman sol ovcunda sıxdığı kibrit gözünə dəydi. Başını bulayıb dəftəri də vərəqlədi. “Belə...” deyib köksünü ötürdü. Qaşqabağını sallayıb, asta-asta pilləkəni endi, otların arasında qıvrılan nazik cığıra düşdü. Arxın üstündəki balaca körpüyə qədər getdi. Ayna kimi parıldayan su onun gözlərini oxşadı. İmran dayandı. Suda ulduzlar sayrışırdı, topa-topa buludları yaran ay qaçırdı. İmrana elə gəldi ki, buludlar ayı bürüyür, onun qabağına keçir, yol vermək istəmir, ay isə çırpınıb gah buludlara baş vurur, gah qılınc kimi sıyrılır, gah da duman içində görünməz olur.

Harada isə qurbağa quruldadı. Yaxındakı çinarın başında anadil ötdü. Kəndin qurtaracağında bir başqası ona cavab verdi. İmran bu səslərdə bir qəriblik, yalqızlıq və şikayət duydu.

İmran papirosunu kötüyünə qədər sümürüb atdı.

Körpüdən aralandı, klubun qabağından keçib evlərinə yollandı. Ayaqları dalınca sürünsə də, geri dönmədi. Evlərinin yanına qədər bu cür səssiz-səmirsiz getdi. Ancaq orada dayandı, papiros qutusunu açdı, əlinə heç nə gəlmədi. Çəpərin dibinə atılan papiros qabı ağardı.

Birdən o sanki yuxudan ayıldı. Ətrafına boylandı. Bəs Nərgiz necə oldu? Hara getdi?

İmran vahimələndi, ağlına pis fikirlər gəldi. "O cür qız hər nə desən eləyər". O, geri döndü. Döngələri necə buruldüğunu çəpərlərdən necə aşdığını, körpünü nə vaxt keçdiyini bilmədi. Qapını taybatay açıb içəri girdi. Otaq bomboş idi.

– Nərgiz!.. – deyib çağırdı. Səs verən olmadı. Bayıra çıxdı. Yenə çağırdı. Heç kəs cavab vermədi. İmran başı alovlu bağa qaçdı. Ağacların dibini axtardı. Hər tərəfə göz yetirdisə də, Nərgizdən cavab çıxmadı. O, arxın yaxası ilə yuxarı qaçdı. Çiçəklənmiş iydə kollarının dibində dizlərini qucaqlayıb arxın suyuna baxan Nərgizi gördü. Ürəyi sakitləşmək əvəzinə daha şiddətlə döyündü. Qızı ürküdüb qaçıracağından ehtiyat edirmiş kimi asta addımlarla ona yaxınlaşdı.

Nərgiz yerindən tərpənmədi. İmran onun yanında oturdu. Bir neçə saniyə nə deyəcəyini bilmədi. Sonra əlləri yavaş-yavaş qalxdı. Nərgiz çiynində ağırlıq hiss edib diksindi. Dönüb İmranın üzünə baxdı və birdən başını onun köksündə gizlətdi.

– İmran...

– Heç nə lazım deyil.

– Axı...

İmran qıza imkan vermədi, onun başını sinəsinə daha bərk sıxdı.

Hava elə gözəldi ki...

## 18

Onlar idarədən birgə çıxdılar. At tövləsinin yanında Nəsib dayı İmranın qolundan tutdu.

– Getmə, səninlə işim var.

İmran onun arxasınca tövləyə girdi.

Bir azdan atlanıb yola düşdülər.

Kənddən çıxandan sonra Nəsib dayı atın başını döndərib, Alagöz çayına doğru uzanan cığıra saldı. İmran atını onunla yanaşı sürdü. O, gözlərini partiya təşkilatçısının tutqun sifətindən ayırmasa da, heç nə soruşmurdu. Gözləyirdi ki, Nəsib dayı sözü açsın. Lakin İmran səbr edə bilmədi. Dərəyə enib çayın sahilinə çatanda soruşdu:

– Biz hara gedirik?

Nəsib dayı yüyəni boşaltdı. At çayın daşlarını şaqqıldadaraq dərinə girdi, dodaqlarını suya yapışdırdı. Sonra başını qaldırıb o taya baxdı və bərkdən kişnədi. Nəsib dayı cilovu yığışdırdı və ancaq bu vaxt İmrana cavab verdi:

– Pis işləyirik, bala, çox pis işləyirik. Kolxozda otururuq, ancaq işimizdən xəbərimiz yoxdur.

– Axı nə olub?

– Nə olacaq, Kosaoğlu yenə bildiyini eləyib, meşədə artıq yer əkdirib.

İmran təəccüblə qaşlarını çatdı. Nəsib dayı kəhəri məhmizləyib qabağa düşdü. At özünü suya salıb qulaqlarını şəklədi və fınxıra-fınxıra üzdü. İmran atını bir az aşağıdan sürdü. Onlar qarşı sahildə yenə birləşdilər. Atların islanmış yanbızları parıldayırdı. İmranla Nəsib dayı suya batmışdılar. Lakin yayın isti havasında bu, onlara xoş gəlirdi.

Meşənin dərinliyinə gedən cığıra düşəndə Nəsib dayı atın cilovunu buraxıb papiros yandırdı və sözünə davam etdi:

– Mən bunu ancaq bu səhər eşitmişəm.

İmran elə əsəbiləşmişdi ki, nə oxuyan quşların səsini, nə də meşənin xışıltısını eşidirdi. Başqa vaxt olsaydı, dayanıb iri palıd ağaclarına, baş-başa verən qoca qovaqlara doyunca tamaşa etməmiş keçməzdi. Ancaq indi onun gözləri atın yalına zillənmişdi.

Onlar talada əkilmiş pambıq sahəsinə çatdılar. Kollar xeyli qalxmışdı. Bir dəstə qadın alaq vururdu. Nəsib dayı ilə İmran tarlanın kənarındakı palıdın yanında düşüb atları ağaca bağladılar. Qadınların yanına getdilər.

– İşiniz avand olsun, – deyə Nəsib dayı işləyənləri salamladı.

– Ömrün uzun olsun. Axır ki, bizi də yada saldınız.

Nəsib dayı bu sözdən tutulsa da, üstünü vurmadı.

– Manqabaşçınız kimdir?

Yaşlı bir qadın:

– Mənəm, – dedi.

– Bəs bu nədir, ay Yasəmən, belə də pambıq becərərlər? Alaq qurşağa çıxır.

– Nə qayırım, – arvad yanıqlı-yanıqlı səsləndi, – gətirib tullayıbsınız meşənin ortasına, nə traktor var, nə də kultivator. Kətmən vurmaqdan yorulmuşuq.

Doğrudan da pambığın yavaş-yavaş çiçək açmasına baxmayaraq, hələ kətmənləmə qurtarmamışdı. İmran kolların dibini yoxlayıb şaxlara baxırdı. Torpaq daş kimi idi. Cərgələrin arası isə yetmiş santimetr idi. O, başını bulayıb manqabaşçısına baxdı.

– Bəs niyə seyrəltmə aparmayıbsınız?!

– Dərdin alım, kimdi bizə baxan? Nə qədər çalışdıqsa, Kazım razı olmadı. Elə Kosaoğlu özü də onun tərəfini saxladı. Dedi bura xam torpaqdır, heç nə lazım deyil. Üstəlik bizi tovladı ki, buranın pambığını yığıb-yığışdıra bilməyəcəksiniz. Amma işin təhərindən görürəm ki, zəhmətimiz hədər gedəcək.

– Kazım buralara gəlirmi?

– Gəlir, niyə gəlmir, – deyə Yasəmən cavab verdi və Nəsib dayını bir kənara çəkdi. – O gün Kosaoğlu da gəlmişdi. Pambığa baxdılar. Sonra Qarabulağın üstünə getdilər. Beş-altı dənə qırqovul vurmuşdular.

Nəsib dayı daha heç nə soruşmadı. Arvaddan aralanıb, pambığın içində dolaşan İmranı səslədi.

– Gördün bunlar başımıza nə oyun açıblar? – Nəsib dayı yola düşəndə hirsli-hirsli sözə başladı. – Kəndə çatan kimi təftiş komissiyasının sərdini, briqadirlərdən birini, bir də bizim komsomol Həsəni götürüb geri qayıdarsan. Yeri ölçüb akt bağlayarsan.

Onlar idarənin yanında ayrıldılar.

...Elə həmin gecə əhvalatdan xəbər tutan Kazım özünü Kosaoğlunun yanına saldı.

– Qurban qağa, amanın bir günüdür, qoyma akt bağlasınlar. O, nəfəsi tutula-tutula əhvalatı danışdı. Kosaoğlu təşvişə düşdüsə də, özünü sındırmadı.

– Get işində-gücündə ol, hay-küy salma. Özüm hər şeyi düzəldərəm.

Kosaoğlu o gecə səhərə qədər yerin içində çöyrükdü. “İndi mən neyləyim? İmrana bir söz demək olmaz. Ona baxanda yenə Nəsib yaxşıdır. Köhnədən bir yerdə işləmişik, tay-tuşuq. Bəlkə o, sözümə baxdı. Bircə bu zəhrimar pambığın üstünü basdırsaq, hər şey düzələrdi.

Məsələ böyüyüb bir də yuxarılara gedib çıxsa, bütün rayonda biabır olaram. Bəs Nəsibi necə yola gətirim? Gedib desəm ki, ay Nəsib, bu işin üstünü vurma, mənim xətrimə keç, onda necə olar? Deməzmi ki, hərif qorxur? Yox, yox, mən Kosaoğlu Qurban onlara boyun əyməyərəm. Bəs necə olsun?"

O, bu cür düşüncələr içində səhərəcən yata bilmədi. Səhər tezdən isə idarəyə yollandı. Partiya təşkilatçısının kabinetinə çatanda dayanıb gözlədi. Boğazını arıtlayıb qapını açdı. Nəsib dayı onun salamını çox könülsüz aldı. Kosaoğlu stul çəkib oturdu. Pencəyinin cibindən qutunu çıxarıb arxayın-arxayın papiros eşdi.

– Eşitdiyimə görə, dünən o taya gedibsənmiş.

– Sənin əməllərinə baxmağa getmişdim.

– Mənim niyə olur, elə sənin də əməlindir. Sabah bir şey olanda kolxoza məndən qabaq sən cavab verəcəksən, elə deyilmi, yoldaş siyasi rəhbər? Odur ki, adam bir şey görəndə məsləhətləşər.

– Səninki məsləhətdən keçib.

– Bax, bu olmadı. Uşaq ha deyilsən. Bir iş görəndə adamdan soruşarlar. Yoxsa bu nədir? Kolxozun sədri mənəm, heç nədən xəbərim yoxdur. Amma siz özbaşına qəmisiyə düzəldirsiniz, akt bağladırsınız. Biz də bir kişiyik, ya yox, kolxozun işini mən də bilsəm olmazmı?

– Sən bu işləri çoxdan bilirsən, – deyə Nəsib dayı sakitcə cavab verdi. – O yerləri ki, özün əkdiribsən...

– Əvvəla, bu işdən mənim xəbərim yoxdur. İkincisi də, sən ora gedəndə gərək İmranı yox, məni aparaydın. – O, irəli əyilib səsini alçaltdı. – Ə, bu kolxozun yiyəsi sənlə mənəm. Gərək sirrimiz də bir olsun. Yoxsa İmran nə uşaqdır ki, onunla əlbir olursan? Sabah bir iş olsa, sənin dalında mən duracam ey, mən!...

Nəsib dayı Kosaoğlunun qızarmış sifətinə baxıb üzünü turşutdu.

– Yaxşı, de görüm nə istəyirsən?

– Aktı ver görüm, orda nə yazılıb.

– Komissiya gələndə biləcəksən. Özün də qol çəkəcəksən!

– Düz şeyə niyə qol çəkmirəm?! O yeri kim əkdiribsə, cəza da verərik.

– Əlbəttə verəcəyik. Birinci cəzanı sən alacaqsan!

– Nədən ötrü?

– Kolxozun idarə heyətinin qərarına tabe olmaq istəmədiyin üçün.

– Ə, nə kolxoz, nə idarə heyəti?! – deyə Kosaoğlu səsini ucaltdı.

– Kazım o yeri özbaşına əkməyib, Kosaoğlu! Qurban qağası deməsəydi, o bu qələti eləməzdi.

– Ə, sən nə təhər adamsan? Sənə dedim mənim xəbərim yoxdur. Bu saat o Kazımın atasını dalına şələləməsəm, məndən pis adam yoxdur!

Kosaoğlu ayağa durdu, qapıya yaxınlaşıb üzünü həyətdə dayananlara tutdu.

– Ə, görün o Kazım ölmüş buralarda varmı?

O, geri qayıdıb yerində oturmamış, Kazım özünü içəri saldı.

– Nə deyirsən, Qurban qağa?

– Canına dərd deyirəm, boğazına boğma! Ə, gərək elə həmişə sənin üstündə başımız ağrısın? Ə, nə özbaşınalıq eləyirsən? Sənə kim demişdi ki, gedib meşədə pambıq əkibsən? Səni adam yerinə qoyanda gərək boynumuza minəsən? Utanmaz!.. Təqsir məndədir ki, sənin kimi axmağı briqadir qoymuşam. Səndən briqadir-zad olmaz. Di rədd ol burdan!

– Qurban qağa...

– Kəs səsini, haramzada! Sənin burada qağan-zadın yoxdur! İtil gözümdən!

Kazım Kosaoğlunun özündən çıxdığını görüb dinməz-söyləməz idarədən getdi. Qurban bir xeyli otaqda gəzindi. Papirosunu yanıqlı-yanıqlı sümürüb atdı. Sonra Nəsib dayı ilə üz-üzə oturdu.

– Beləsini adam yerinə qoyursan, sonra da səni biabır eləyir. Əslinə baxsan, sən düz deyirsən, gözündən boğazlanası haramzadadır. İstəyirsən, elə bu saat briqadirlikdən qovaq, getsin işinə.

– Onu qovmaqla hər şey düzələcəkmi?

– Niyə düzəlmir?

– Bəs əkilən pambıq?

– Eh, rəhmətlik oğlu, ona nə var! Beş on hektar yerdir, heç bir yazı-pozuya da düşməyib, elə billik, heç əkməmişik. Kim nə bilir bizim meşədə pambığımız var?

– Bəs öz vicdanın?

– Ə kişi, qoy görək sən də!.. Nə vicdanbazlıqdır?! Bir də, balam, artıq yer əkiləndə hökumətə nə zərər olur?

– Görürəm səninlə danışmaq çox çətindir, Kosaoğlu. Sən başa düşmürsən ki, hökuməti aldadıb gözdən pərdə asmaq ən böyük cinayətdir?!

– Ə, qanmaz ha deyiləm, niyə başa düşmürəm? Mən dedim hazır pambıqdır, əkilib, qoy dursun. İndi ki razı deyilsən, sabah bir çeteze göndərərəm. Hamısını alt-üst elər.

– Yox, Kosaoğlu, – Nəsib dayı ayağa durdu, – o arşınla sənə heç kəs bez verməz. Pambıq əkilib, özü də becəriləcək.

– Mən də onu deyirəm də. Qoy dursun. Aktı da cıraq.

– Qurban, bəsdir özünü bilməməzliyə vurduğun. Bu iş kolxozun işidir. Komissiya gələr, heyət qərar çıxardar, ona müvafiq də hərəkət edərik

– Bəs sənin öz fikrin nədir?

– Mənim fikrim budur ki, akt bağlayıb həmin yeri kolxozun planına daxil edək.

– Yox, Nəsib, mən buna qol qoya bilmərəm. Sənin fikrin bizi bütün rayonda biabır eləməkdir.

– Bunu gərək əvvəlcədən fikirləşəydin.

Kosaoğlu ayağa durdu, onun alt dodağı sallandı.

– İndi nə demək istəyirsən?

– Bəs sən nə demək istəyirsən?

– Mən dedim, gəl bu işi açıb-ağartma. Öz aramızda Kazımın cəzasını verərik.

– Bu işdə müqəssir təkcə Kazım deyil.

– Yoxsa məni də ona qatmaq istəyirsən? Yox, Nəsib, onu bacarmazsan. Səninlə belə yavaş danışmağıma baxma. Mən istəyirəm aramızda ziddiyyət olmasın. İndi ki belədir, özünü gözlə, mənə də Kosaoğlu deyərlər!

– Kosaoğlu, – deyə gözlənilmədən Nəsib dayı qımışdı. – Gəl sən artistlik eləmə. Mən sənin bu üzündən baxanda o üzünü görürəm. Ümumi iclasda məlum olar.

– Məni iclasla qorxudursan?.. Mən elə şeyləri çox görmüşəm. Qoy olsun. Gərək camaat kimin tükünü didəcək. Sizin, yoxsa mənim!

– Qurban, bunları çox eşitmişik, təzə sözün varsa, onu de.

Kosaoğlu qapını hirslə çırpıb çıxdı...

## 19

Rayonda açılmış tibb məktəbi şəhərin qurtaracağında, pambıq məntəqəsinin qarşısındakı ikimərtəbəli binada yerləşmişdi. Tibb məktəbində oxuyan qızlar elə burada da yaşayırdılar. İkinci mərtəbə onların yataqxanası idi. Hər gün dərsdən sonra qızlar məktəbin həyətində,

arxın kənarında oturub kitab oxuyur, səhərlər isə dəsmal, sabun götürüb yuyunmağa gəlirdilər. Arabir zarafatlaşıb bir-birinin üstünə su atanlar da olurdu.

Məktəb direktoru qızları şəhərə az-az buraxırdı. Dörd divar arasında darıxan qızlar, pəncərələrdən küçəyə çıxır, pencəklərini çiyinlərinə salıb qapı ağzında dayanırdılar. Hörüklərini döşlərinin üstündən qabağa sallayan bu qızlar əllərini qoyunlarına qoyub elə məlul-məlul dayanırdılar ki, baxanda adamın onlara yazığı gəlirdi.

Şahnaz bu məktəbdə oxumuşdu. İlk günlərdə özünü sakit aparmağa çalışan Şahnaz, az sonra həmişəki adətini əlinə aldı. Tez-tez güzgü qabağında dayanıb özünə sığal verdi. Yoldaşlarının bəziləri onun saçını, başqaları qaş-gözünü tərifə başladılar. Şahnaz özü də yavaş-yavaş hiss etdi ki, gözəldir, pəncərə qabağından çəkilmədi. Saatlarla dayanıb asfalt yola, məntəqəyə pambıq gətirənlərə, dayanan maşınlara, bir-biri ilə zarafatlaşan cavanlara baxdı. Çayxanada aşıq oxuyanda o, pəncərəni açardı. Gözəllərə söz qoşmağı sevən aşığın da gözü ona qulaq asan qızı almışdı. Hətta bir dəfə Şahnaz aşığın sazı sinəsinə basıb titrək səslə:

Pəncərədən baxan qız,
Sular kimi axan qız,
Məni oda yaxan qız,
Düş bəri, qadan alım.

– deyə oxuduğunu gördü. O dərhal əzilib-büzüldü və pəncərədən geri çəkildi. “Aşıq, qızı hürkütdün” – deyə cavanlar gülüşdülər.

Günlər keçdi... O, yavaş-yavaş həyətə, küçəyə çıxdı, bəzənib-düzəndi. Dayısı Kosaoğlu ondan heç nə əsirgəmədi.

Üç-dörd aydan sonra Şahnaz təkcə gözəlliyi ilə deyil, geyimi-kecimi ilə yoldaşlarından seçildi. O, şəhər cavanlarının gözündən yayınmadı. Hamı tibb məktəbinə təzə, gözəl bir qız gəldiyini söyləyirdi. Şahnaz küçələri, mağazaları gəzməyə başladı. O, bir dükandan o birinə girir, satılan şeylərə baxır, qiymət soruşur, bir sözlə, şəhərin başından vurub ayağından çıxırdı. Kiçik rayon mərkəzi elə bil ona dar gəlirdi. Bir gündə hər küçəni iki-üç dəfə dolanırdı.

Bir-iki ayın içində hamı onu tanımışdı. Oğlanlar arxasınca baxaraq, baş-başa verib pıçıldaşır, o isə kəlağayısı yellənə-yellənə gəzib küçələri ətirlə doldururdu.

Şahnaz diqqət mərkəzində dayandığını hiss etdikcə, özünə daha çox sığal verirdi. O, yerişini-duruşunu da dəyişdi. Arvadların dediyi kimi, "erkək at təki ayağını yerə döyüb, gumbur-gumbur gumbuldamağa" başladı. Dəftər-kitab Şahnazın yadından çıxdısa da, dayısı onu darda qoymadı. Ayaqqabısı köhnəlməmiş təzəsini aldı. Donu solmamış yenisini tikdirdi. "Nə qədər ki sağam, geyin, gəz" – dedi. Şahnaza da elə bu lazımdı.

Onun ətrafında fırlanan oğlanların sayı artdı. Hətta bir-birləriylə mərc gələnlər, onun üstündə vuruşanlar da oldu. Şahnaz kinoya, teatra dadandı. Yaz aylarında şəhər kənarına, Ermənistana gedən yolun üstündəki Qarabulaq tərəfə ayaq açdı. Bir azdan onun daha uzaqlara, Alagöz çayının sahilindəki çəmənliyə getdiyini də görənlər oldu.

Onun dalınca düşənlər içərisində ortaboy, tökməbədən bir oğlan vardı. Bu oğlan tez-tez "Moskviç"ini məktəbin qabağında saxlayar, zəncirli açarını əlində oynada-oynada pəncərəyə boylanardı. Şahnaz hər dəfə onu görəndə qımışıb gizlənirdi. Şofer onun dalınca çox düşdüsə də, tuta bilmədi. Əlini üzdü. Ancaq bir dəfə, istirahət gününün axşamı Şahnazın iki qızla piyada getdiyini gördü. Maşını onların dalınca sürdü.

– Ay qızlar, kəndə gedirsiniz?

– Sənə nə var?

Mən də kəndə gedirəm. Gəlin oturun. Piyada yorularsınız. Qızlar əvvəlcə çəkindilər. Sonra maşına yaxınlaşdılar. Şahnaz qabaqda, şoferin yanında oturdu. Oğlan qapını bağlayıb yola düşdü.

– Bəs niyə piyada gedirsiniz, Şahnaz?

– Mənim adımı hardan bilirsən?

– Sənin adını bilməyən tapılarmı?

– Niyə?

– Necə niyə, ay qız! Şəhərimizdə bircə gözəl var, onu da tanımasaq ayıb olar ki.

Şahnaz dinmədi. Gizlincə gülümsündü.

– Səni də tanımayan yoxdur, ay Məmməd.

– Əşi, mən şofer adamam. Şofer Məmmədi tanımasalar da olar. Təki siz gözəllər tanınasınız.

Bundan sonra onların dostluğu möhkəmləndi. Şahnaz bir yana getmək istəyən kimi Məmməd öz "Moskviç"i ilə hazır olurdu. Gah stansiyaya gedir, gah dağlara sarı üz tutur, gah da elə-belə, maşında oturub

saatlarla gəzirdilər. Şahnaz yaz aylarında yaşıllaşan çölləri, rəngbərəng çiçəkləri gördükcə cuşə gəlir, qolunu maşının pəncərəsindən çıxardıb ətrafa baxmaqdan doymurdu. Maşın isə sürətini artırır, asfalt yolun sinəsinə yatıb su kimi axırdı. Sünbüllənmiş taxıllar, qızıl lalələr, gül-çiçəkli çöllər xəlbir kimi fırlanıb geridə qalırdı. Elə bil maşın yox, çöllər hərlənib, onların başına dolanırdı.

Şahnaz bəzən maşını saxlayıb yol kənarındakı çəmənlikdə oturardı. Külək vurduqca otların dalğalanmasından, çiçəklərin bir-birinə baş əyməsindən onun xoşu gələrdi. Qız sərin otluğa uzanıb gah əllərini, gah da yanaqlarını zərif, şehli çiçəklərə sürtərdi. Belə vaxtlarda Məmməd özünü təmkinli aparırdı. O, çiçəklərdən dəstə bağlayıb Şahnazın qucağına atar və oğrun-oğrun qızı süzərdi. Şahnaz artıq ondan çəkinmirdi. Hətta ürəyində Məmmədin cəsarətsizliyinə gülürdü.

Bir dəfə yenə onlar yol kənarında, təpə döşündəki çəmənlikdə dayanmışdılar. Şahnaz, adəti üzrə, göy otluqda sərilmişdi. Məmməd ondan bir az aralı dirsəklənib böyrü üstə uzanmışdı. Çölləri yarıb keçən asfalt yol bomboş idi. Ətrafdakı xırdaca təpələrdə, geniş çöllərdə heç kəs yox idi. Məmməd susurdu. Onun gözləri Şahnazın ipək corabda daha qəşəng görünən topuğuna və ətli baldırına dikilmişdi. Şahnaz bunu hiss edir və qürrələnirdi. Birdən Məmməd sürünüb ona yaxınlaşdı. Qızın qaynar gözlərinə, uzun və sıx kirpiklərinə, ehtirasdan alışıb-yanan dodaqlarına baxdı. Hər şeyi unutdu. Şahnazı qolları arasına alıb dəli bir ehtirasla öpməyə başladı. Şahnaz əvvəlcə heç nə demədi. Lakin bir az sonra Məmməd necə hərəkət etdisə, qız qəfildən çırpındı.

– Bura bax, fikrin nədir, dəli olmayıbsan ha?

– Dəlidən də pisəm.

– Özünü ələ al, ağıllı ol...

– Neyləyim, ağlımı başımdan çıxardırsan.

Şahnaz şoferin əl çəkməyəcəyini hiss edib üz-gözünü turşutdu.

– İndi fikrin nədir, xalqın qızını biabır eləyəcəksən? Özünü yığışdır, deyirəm, yoxsa dünyanı başına dar elərəm.

Məmməd udqunur, cavab vermirdi. Şahnaz onun alovlu gözlərinə baxıb yenə çırpındı.

– Bura bax, ay dəli, qolunu boşalt, belimi sındırdın. Qoy oturub ağıllı-başlı söhbət eləyək. Sənə sözüm var.

– Nə söz?

– Söz də...

– İnanmıram.

– Bəs mən sənə niyə inanıram?

– İnansan belə eləməzsən.

– Elə inandığım üçün sənə etibar edib buralara gəlirəm. Elə bilirsən mən səni istəmirəm?..

Şahnaz onunla şirin-şirin danışsa da qorxur, vəziyyətdən çıxmağa çalışırdı. O, əvvəlcə müqavimət göstərib çığır-bağır salmaq istədi. Ancaq bunun faydasız olacağını görüb dinmədi. Deyib-gülməyə başladı. Şahnaz vaxt qazanmaq və Məmmədi birtəhər yumşaltmaq istəyirdi.

– Ədə, yavaş – deyə birdən o ufuldadı. Sonra Məmmədin boynunu qucaqlayıb üzündən öpdü. – Görürsən ki, səni necə çox istəyirəm. Sən də məni istəyirsənsə, sözümə qulaq as.

Məmmədin qolları boşaldı. O, bir anlığa özünü itirdi. Qəfildən Şahnaz tükürpərdici bir səslə “İlan!” – deyə qışqırdı və bihuş halda onun qolları arasında uzandı.

Şofer dik atıldı. Özündən getmiş Şahnaza baxdı. Su gətirmək üçün maşına tərəf qaçdı. Şahnaza da elə bu lazım idi. O, cəld ayağa durdu. Yuxarı, təpə döşünə üz qoydu. Qızın qaqqıltısını eşidən şofer aldandığını başa düşdü. Yüyürüb qızı qovmağa başladı. Şahnaz, kəlağayısı əlində, xallı kəpənəkləri hürküdə-hürküdə otların, çiçəklərin arası ilə yuxarı qaçırdı. Ayaqqabılarını çıxartmışdı. Saçı üzünə dağılmışdı. Arabir geri dönür, ona çatmağa çalışan Məmmədə baxıb qaqqıldayırdı.

Təpənin başında Məmməd özünü yetirdi. Qızın qolundan tutub sinəsinə basdı. Hər ikisi tövşüyür, güclə nəfəs alırdı.

– Bura bax, məndən nə istəyirsən? Sən ki məni alan deyilsən?!

– Gələrsən?

Şahnaz gözlərini onun gözlərinin içinə zillədi.

– Aldatmırsan ki?

...O gündən Məmməd Şahnazın dalınca kölgə kimi sürünməyə başladı. Qız məktəbi qurtarıb kəndə qayıdanda Məmməd də “İyirmi altılar” kolxozuna gəldi. Şahnazın xətrinə Kosaoğlunun “Pobeda”sına şofer oldu. O, hələ də Şahnazdan qəti cavab ala bilmirdi. Qız yenə həmişəki kimi gülür, nazlanır, ancaq ciddi bir cavab vermirdi. İmran gələndən sonra Şahnaz birdən-birə Məmməddən üz döndərdi. Şofer susdu, işin sonunu gözlədi. Deyəsən, axır vaxtlar külək yenə onun tərəfinə əsirdi. Şahnaz “Pobeda”dan düşmürdü.

Yenə onlar səhər tezdən tarlaları gəzirdilər. Şahnaz itik axtaran kimi, maşını gah bu, gah da o biri briqadaya sürdürürdü. Məmməd dinməz-söyləməz qızın əmrinə əməl edirdi. Əyri-üyrü yollar toza-dumana bürünürdü.

Pambıq kolları qoza tökmüşdü. Bu gün-sabah çatlayıb ağarışacaqdı. Çöllərdən adam seyrəlmişdi. Taxıl çoxdan biçilmişdi. Kombaynla biçilən yerlərdə traktorların izi qalmışdı. Dərə-təpələrdə pencəyə vurulmuş taxılları xırmana araba ilə daşıyırdılar.

Maşın kolxozun tarlasının yanından keçib sola burulanda uzaqdan bir qaraltı göründü. Məmməd ona yaxınlaşanda "Pobeda"nı saxladı. Şahnaz atılıb yerə düşdü. Xarab olmuş motosikllə əlləşən İmranın başı üstündə dayanıb əllərini belinə qoydu. Cingiltili səslə qəhqəhə çəkdi.

– Yoldaş ağranom, bu nədir, səni nə kökdə görürəm?!

İmran cavab vermədi. Sökdüyü təkəri quraşdırıb yerinə keçirdikdən sonra üst-başını çırpıb ayağa durdu.

– Nə buyurdunuz, Şahnaz xanım?

Qız, İmranın baxışlarına dözə bilməyib, sözünü dəyişdi:

– Heç... dedim özünü niyə yorursan?

– Bəs nə edim?

– Gəl min "Pobeda"ya, bu nədir!..

– Çox sağ ol. Özgə atına minən tez düşər...

İmran motosikli işə saldı. Hələ də dayanıb onunla nə isə danışmaq istəyən Şahnazı süzdü:

– Özgə bir sözünüz yoxdur ki?

– Xeyir, nə sözüm olacaq.

– Onda salamat qalın.

Motosikl gurultu ilə onlardan uzaqlaşdı. Şahnaz toz-duman içərisində itən İmranın arxasınca baxıb, hirsindən alt dodağını çeynədi.

Şahnaz dabanı üstündə fırlanıb maşına mindi, qapını çırpdı.

– Sür!

– Hara?

– Hara istəyirsən.

Məmməd dodaqaltı güldü. Maşın baş alıb getdi.

Onlar susurdular. Şahnazın qaşqabağı yerlə gedirdi. Məmməd şad görünürdü.

– Bilmirəm qızlarda bu nə adətdir?

– Nə? – Şahnaz fikrindən ayıldı.

– Hansı oğlan ki onları saymır, dalınca düşüb dəli-divanə olurlar. Dərdlərindən ölənə isə məhəl qoymurlar.

– Elə sizin də xasiyyətiniz bizimki kimidir.

Məmməd bir az susduqdan sonra yenidən dilləndi:

– Şahnaz...

– Nə var?

– Bir söz desəm xətrinə dəyməz ki?

– De görüm.

– Axı bu İmranda nə tapmısan ki, əl çəkmək istəmirsən? Sən deyib-gülən bir qızsan, ərin də gərək çalıb oynayan bir adam olsun. İmranın qaşqabağından zəhər tökülür. O sənin qədrini nə biləcək? Canım üçün, düz sözümdür. Zər qədrini zərgər bilər. Onun fikri-zikri işdir. Sən də ömrünü-gününü belə adamla çürütmək istəyirsən? Ay qız, hayıf deyilsən? Cavanlıq bir də məgər əlinə düşəcək?

Məmmədin sözləri Şahnazın ürəyindəki qüssəni yavaş-yavaş dağıdırdı. O, yanında qədrini bilən bir adam olduğunu yəqin edib sevinir, "doğrudan da, mən İmranın nəyinə aşiq olmuşam? – deyə düşünürdü. – Ağrım ürəyinə! O da oğlandır? Mənim kimi bir qıza heç gözünün ucuyla da baxmır. Keyin birisidir, heç nə başa düşmür. Doğrudan da o mənim qədrimi nə biləcək? Elə əvvəldən də nahaq yerə Sayalı bibimin sözünə baxdım".

Məmməd asta-asta sözünə davam edir, Şahnazın qaş-gözünü, boy-buxununu tərifləyirdi. Şahnaz gah maşınının güzgüsündə özünə baxır, gah da Məmmədin ipək köynəyinin altından aydınca görünən qabarıq və geniş sinəsinə, qüvvətli qol əzələlərinə nəzər salırdı. "Bunun İmrandan nəyi pisdir? Top kimi oğlandır. Özü də neçə ildir dalımca sürünür".

Onlar çox dolandılar. Axşam üstü Dəlidağın ətəyindəki "Damcılı" bulağın yanında dayandılar.

Hava sərinləşirdi. Mamırlı daşların arasından dumduru su şırıltı ilə axıb gedirdi. Əvvəlcə Şahnaz, sonra da Məmməd sərin suda əl-üzünü yudu. Məmməd pendir-çörək çıxartdı. Hətta, bir qarpız da götürüb bulağın soyuq suyuna qoydu.

– Bunları haradan aldın? – deyə Şahnaz təəccüblə soruşdu.

– Bəs sən şoferləri nə bilirsən? İstəyirsən araq da gətirim.

– Yox, mən içən deyiləm.

– Nahaq.

Şahnaz doyunca çörək yedikdən sonra göylüyə uzandı. Onun başı hərlənirdi. Bugünkü gəzinti, deyəsən, qızı əldən salmışdı. Məmməd onun yanında oturdu. Qaranlıq qarışırdı. Aşağılarda kövşənlərə od vurmuşdular. Şahnaz gözlərini sonsuz boşluqlara zilləmişdi.

– Məmməd... Üşüyürəm.

Hava sərin olsa da, o qədər soyuq deyildi. Məmməd bu nazlı qızın oxşanmaq istədiyini duyub ona yaxınlaşdı.

– Sən düz deyirsən, Məmməd, zər qədrini zərgər bilər.

– İndi başa düşürsən?

Onlar yanaşı oturdular. Şahnazın kini coşub-daşırdı. O, bu axşam İmrana yanıq vermək, "sən qanmadın, indi yan-yaxıl" demək istəyirdi. Məmməd isə əlinə fürsət düşdüyünü hiss edir, nəhayət, neçə vaxtdan bəri dalınca süründüyü Şahnazı ələ keçirə biləcəyinə sevinirdi.

Məmməd səssizcə, Şahnazı qucaqlayıb otluğa yıxdı. Qız dillənmədi...

## 20

Klubda adam əlindən tərpənmək olmurdu. Yerlər tutulduğundan, gələnlərin çoxu ayaq üstündə qalmışdı. Pəncərə ağzında oturanlar, dal tərəfdə çənələrini əllərindəki yabaya söykəyib dayananlar da var idi.

Kazım Kosaoğlunun tapşırığı ilə qapının ağzını kəsmişdi. O, istədiyi adamı içəri buraxır, istəmədiyini döşündən itələyib xırıldayırdı:

– Yer yoxdur, hara soxulursan?

– Necə yəni hara soxulursan?

– Bunun necəsi yoxdur ki.

– Belə dur görüm, ayaq üstə dayanaram.

Mübahisə qızışır, bəziləri zorla içəri keçir, bəziləri də klubun qabağında dayanırdılar.

Kosaoğlu hamıdan qabaq gəlib, səhnəyə çıxmışdı. O, qırmızı örtüklü stolun arxasında oturub prokuror Əsədovla söhbət edir, arabir də gözucu zala baxırdı. Kazım işləri pis düzəltməmişdi: qabaq cərgələrdə oturanlar öz adamları idi. Bundan başqa hər tərəfdə-küncdə, ortada, lap arxada da onun ürəyinə yatan adamlar əyləşmişdi. "Qoy belə olsun, bir söz deyən kimi, səsimizə səs versinlər, – deyə Kosaoğlu düşünürdü, – görək kim kimin anasını ağladacaq".

Nəsib dayı ilə olan söhbətindən sonra iclassız keçinməyin mümkün olmayacağını gördükdə, Kosaoğlu başqa cür hərəkət etməyi qərara almış, bir həftə gecə-gündüz çalışmış, iclasda kimin nə barədə danışacağını müəyyənləşdirmişdi. Hətta prokuroru da yığıncağa dəvət etmişdi.

Zalda ağız deyəni qulaq eşitmirdi. İclasda nə məsələlər müzakirə olunacağını bilənlər də, bilməyənlər də həyəcanlı idi. Arvadlar pıçıldaşırdılar.

– Ay Xeyransa, görəsən nə məsələ olacaq?

– Bilmirsən? Tükəzbanın oğlu İmranın məsələsidir də.

– O nə qayırıb ki?

– Nə qayıracaq?! Camaatın taxılını, pulunu verib MTS-ə. İndi əməkgününə paylamağa heç nə qalmayıb.

– Elə şey olmaz.

– Niyə olmur? Kosaoğlu özü işin üstünü açıb.

Dal cərgədə də söhbət gedirdi.

– Deyirlər, Kərim kişini kənddən sürgün eləyəcəklər.

– Niyə?

– Nə bilim, kəndə çaxnaşma salır.

– Nə çaxnaşma? O ki sözün düzünü deyən kişidir.

– Bəs bilmirsən ki, Kosaoğlunun belə şeylərdən xoşu gəlmir? Odur ki, prokuroru da gətirib.

– Gətirəndə nə olar. Elə bilirsən camaat ondan qorxub danışmayacaq? Qoy iclas başlansın. Çox adamın paxırı açılacaq.

Kazım müəllimləri qapının ağzında saxlamışdı.

– Ay rəhmətlik uşağı, gedin işinizdə-gücünüzdə olun. Müəllimsiniz, müəllimliyinizi eləyin, kolxoz iclasınızda nə işiniz var? Görmürsünüz özümüzə yer çatmır?

Zeynəb də burada idi, Nərgiz müəllimənin yanında dayanmışdı. Bir azdan Nəsib dayı gəldi. O, klubun qabağında dayanıb, qapı ağzını kəsdirən Kazıma baxdı:

– Camaatı niyə buraxmırsan?

– Yer yoxdur.

Nəsib dayı üzünü məktəb direktoruna tutdu:

– Müəllim, mümkünsə bir gecəliyə skamyalarınızı kluba verin.

– Sonra yenə Kazıma baxdı. – Get özünə yer tap, otur, – dedi, – teatr zad deyil ki, yolu kəsibsən.

Beş dəqiqə keçməmiş yaxındakı məktəbdən skamya, stul gətirdilər.

Qapıda dayananlar içəri doluşdular.

İclas başlandı. Nəsib dayı camaatı sakitləşdirdi. Birinci Kosaoğlu danışdı. O, asta-asta xitabət kürsüsünə yaxınlaşdı. Zəhmli baxışlarla camaatı süzdü. Pıçıltılar kəsildi.

– Camaat! İndiyə qədər "İyirmi altılar" kolxozunu hamı tərifləyib. Rayonda planı hamıdan əvvəl biz doldurmuşuq. Adımız-sanımız olub. Amma indi adımızı batıranlar, kəndə çaxnaşma salanlar var. Kolxozumuzu geri çəkənlər var. Camaatı ac qoymaq istəyənlər var.

– O, bir az dayandı. Cərgələrə göz gəzdirib sözünün təsirini yoxladı.

– Özünüz gördünüz ki, səpində az qala biabır olmuşduq. Hamınız şahidsiniz ki, mən hər il əkini də, səpini də yerinə yetirmişəm. Amma bu il geridə qalmışıq, səbəbi nədir? – O, son sözləri daha da ucadan deyib susdu. Ani olaraq zalı süzdü, – səbəbi odur ki, bəzi adamlar iş görmək əvəzinə kəndə çaxnaşma salır. Partiyamızın tapşırığını yerinə yetirməyə qoymur. Qabağımıza kötük dığırlayır. Hökumətimiz hər işdə qabaqda olmağı bizdən tələb edir. Əgər biz yaxşı işləməsək, planı doldurmasaq, hökumət yanında üzümüz ağ olarmı?

– Əlbəttə yox, – deyə yerlərdən dilləndilər.

– Əkin zamanı işi pozmaq istəyənlər oldu, qoymadım. Səpində də çaxnaşma saldılar. Yenə dinc dayanmırlar. İçərimizdə texnikanın əleyhinə olanlar var. Belə getsə, işlərimiz tökülüb qalacaq.

– Kimdir onlar?

– Sədrlik eşqinə düşənlər. Əgər lazım bilsəniz, mən sədrlikdən gedə bilərəm. Ancaq yadınızdan çıxartmayın ki, mən neçə ildir əziyyət çəkib kolxoz düzəltmişəm. Dar gündə sizi saxlamışam.

– Biz səni buraxmırıq, Qurban qağa, – deyə Kazım xırıldadı.

– Kolxozu başsız qoymaq olarmı? – deyə kim isə ona səs verdi.

Bunlardan ürəklənən Kosaoğlu səsini daha da ucaltdı.

– Mən sizin pis günə düşməyinizi istəmirəm.

Rəyasət heyətində oturan prokuror gözucu Nəsib dayını, İmranı süzüb gülümsündü. Nəsib dayı isə adəti üzrə, sakitcə oturub: "Gör hardan yapışır, camaatı nə ilə öz tərəfinə çəkmək istəyir, – deyə düşünürdü, – dostum deyəsən bu iclasa möhkəmcə hazırlaşıb".

Kosaoğlu davam edirdi:

– ...Sizi bura çağırmaqda məqsədim odur ki, həmin adamları tapıb kəndimizdən qovaq. Bizə demaqoqlar, çaxnaşma salanlar lazım deyil.

– Kosaoğlunun səsi daha da ucaldı, – mən razı olmaram ki, belələri işimizə əngəl törətsin!

– Axı kimdir onlar, yoldaş sədr? – deyə yerdən soruşdular.

– Kimdir? Biri bax bu Kərim kişidir. İşi-gücü kolxoz rəhbərliyinin əleyhinə danışmaqdır. Ağzını açanda deyir "düzgünlük yoxdur". Əslinə baxsan, düzgün olmayan özüdür. İşləmir, həm də texnikanın əleyhinə gedir. O biri də İmrandır. Gedib üç-dörd il oxuyub, indi özündən yüz oyun çıxardır. Mən deyirəm, gərək bu il kolxozumuzda beş-altı geroy olsun, o deyir yox, biz geroyluq üçün çalışmırıq. Açıq-açığına gözü götürmür, yoldaşlar. Amma mənə də Kosaoğlu deyərlər. Kolxozumuzu dağıtmağa heç kimi qoymaram. Uşaq ola-ola bizə ağıl öyrətmək istəyir. Gəldiyi beş ay deyil, aləmi bir-birinə qatıb, hələ mən onun arvad-zad məsələsini demirəm...

Kosaoğlu çox danışdı. Axırda təklif etdi ki, İmranı aqronomluqdan çıxartmaq lazımdır.

O, sözünü qurtarıb yerində oturmaq istəyirdi ki, Nəsib dayı sual verdi:

– İmranı işdən götürsək, məsələlər düzələcəkmi?

Kim isə yerdən söz atdı:

– Niyə düzəlmir, sədrin əl-qolu açılar.

Kosaoğlu cavab vermədən, keçib yerində əyləşdi. Nəsib dayı camaata müraciət etdi:

– Danışmaq istəyən varmı?

Bir dəqiqə heç kəs dinmədi. Hamı bir-birinin üzünə baxdı. Görünür, qabağa düşməyə cəsarət edən yox idi. Nəsib dayı sualı bir daha təkrar edəndə Kərim kişi dilləndi:

– A dərdin alım, a sədr, mənə söz ver.

O, ayağa durdu. Çəliyinə dirənə-dirənə qabağa keçdi. Üzünü camaata çevirdi. Ancaq Nəsib dayı onu xitabət kürsüsünə dəvət etdi. "Bir də orayamı çıxım", – deyə Kərim kişi gülümsündüsə də, sədrin sözünü yerə salmadı.

– Kosaoğlu burda dedi ki, guya mən texnikanın əleyhinəyəm. Mən də boynuma alıram. Mən texnikanın yox, bircə maşın var, adı da kombayndır, bax onun əleyhinəyəm.

– Demək camaatın taxılını çöllərdə qoymaq istəyirsən? Kombayn olmasa, taxılı kim biçər? – deyə Kosaoğlu yerindən dilləndi.

– Bir sözümə axıra qədər qulaq as, sonra danış, – deyə Kərim kişi ona cavab verdi və üzünü camaata tutdu. – Dərdinizi alım, mən demişəm kombayn pis maşındır. İndi də deyirəm. Çox pis maşındır.

Yerdən səs-küy qopdu: "Sən başa düşmürsən!", "Keç otur yerində!", "Vaxtımızı alma!", "Kişinin sözünü yarımçıq kəsməyin".

Nəsib dayı əlindəki qələmi su qabına döydü. Hamının sakitləşdiyini görən Kərim kişi gülümsündü:

– Axı heç soruşmursunuz, niyə pis maşındır?

İmran maraqlandı:

– Kərim dayı, de görək, doğrudan da, kombayn niyə pis maşındır? Mən belə sözü birinci dəfə eşidirəm.

– Bu saat, dərdin alım, – o, əlini irəli uzadıb bir-bir barmaqlarını qatlamağa başladı. – Bax, kombayn taxılı göydə biçir, göydə döyür, göydə sovurur, göydə də kisələrə doldurub anbara göndərir. Belədirmi? Ay sağ ol. Amma bilmirəm nədənsə taxıl anbarda torpağa dönür, yarıdan çoxu torpaq olur. Mən başa düşən, taxılı torpağa döndərən kombayndır. Kombayndan başqa taxıla kim torpaq qata bilər? Amma mən bircə şeyi başa düşə bilmirəm, kombayn bu torpağı hardan alır? Taxılı göydə biçir, göydə döyüb sovurur, taxıl yer üzü görmür, ancaq torpağa dönür. Demək, kombayn pis maşındır.

O susdu. Camaat da dinmədi. Lakin birdən-birə klubu gülüş səsləri bürüdü. Kim isə yerindən dilləndi.

– Kərim dayı, kombaynda nə günah var, torpaq məsələsini anbardardan soruş, o, yaxşısını bilər.

– Mən bunu bilirəm, a bala, qoy görək Kosaoğlu da bilirmi?

– Bura bax, – deyə Kosaoğlu qışqırdı, – nə lağlağı danışırsan, camaatı niyə ələ salırsan?

– Camaatı mən yox, sən ələ salırsan, ay Kosaoğlu. Sən burda hədə-qorxu gəlincə, işimizdən danışsaydın yaxşı olardı.

– Nə iş?

– İşmi? İş çoxdur. Əgər istəyirsən mən deyim, sən qulaq as.

– Kərim kişi üzünü yenə camaata tutdu. – A başınıza dönüm, məni qınamayın, ürəyim doludur. Ona görə sizə başağrısı verirəm. Özünüz bilirsiniz ki, belə iclas xeyli vaxtdı olmurdu. İndi ki dərdim açılıb, hamısını deyəcəm. Bizim Kosaoğlu elə plan deyib durur, heç camaatın dərdinə qalmır. Nə vaxtında pul alırıq, nə də taxıl paylayır. Heç bilmirsən bizim dövlətimizi kim alıb, kim satır.

– Konkret danış!

– Danışacam, a bala, a Kazım, sən yerindəcə rahat otur, hə, mən əvvəlcə bizim anbardardan, hesabdardan danışacam. Onlar kolxozçunun haqq-hesabını özünə çatdırmır. Bir anbardarımız var, heç aylarla üzünü görmək olmur. Bir ayağı Tiflisdədir, bir ayağı Bakıda. Kefi istəyəndə anbarın ağzını açır, istəməyəndə yox. Söz soruşanda da adamın üstünə xoruzlanır. Kosaoğlu da ona dil verir. Sən gərək bunlardan danışaydın, ay sədr.

– Sənin peşən elə qarın davası eləməkdir, bu dünyaya ac gəlib, ac da gedəcəksən.

– Haqqımı sənin kimiləri yeyəndə, əlbəttə, mən ac qalaram. Amma yadında saxla, el malı ilan sümüyü kimi şeydir, boğazında qalacaq.

Kosaoğlu hirslə ayağa durdu. Üzünü Nəsib dayıya tutdu:

– Sən də adam tapdın söz verməyə?! Bu ki köhnənin demaqoqudur. Xalq işdən-gücdən danışır, bu da qarın davası döyür.

Yenə yerlərdən qışqırmağa başladılar: “Yalan danışır”. “Ona söz verməyin”. “Niyə bağırırsınız? Qoyun kişi sözünü qurtarsın”.

Nəsib dayı camaatı güclə sakitləşdirdi:

– Yoldaşlar, çox xahiş edirəm, iclasın qayda-qanununu pozmayasınız. Məni sədr seçibsiniz, sözümə də qulaq asın. Hamıya deyirəm, sözüm rəyasət heyətində oturanlara da aiddir. Kim bizə mane olsa, xahiş edəcəyəm çıxıb getsin. Buyur, Kərim dayı.

Kosaoğlu donquldandı:

– Sən də söz danışdın!

– Qurban, bura iclasdır!

Kərim kişi həyəcanlanmışdı. Fikrini toplayıb sözünü deməkdə çətinlik çəkirdi.

– Görürəm mənim danışığımı xoşlamayanlar var. Eybi yoxdur, qoy olsun. Ancaq mənim dediyim odur ki, kolxozda bir qayda-qanun yaradılsın. Təftiş komissiyası işə düşsün, hamıya bir gözlə baxsınlar. Birini doğma, o birini ögey hesab eləməsinlər. Heç kəs bizə ağalıq satmasın.

Nəsib dayı qocanın susduğunu görüb dilləndi:

– Bəs yeni üsulla becərmədən ağlın nə kəsir?

Kərim kişi bir az duruxdu. Sonra adəti üzrə boynunu yana əydi.

– Yeni üsulla becərmə yaxşı şeydir, qədrini bilən olsa.

– Bəs deyirlər pisdir, əməkgünü az olur, kolxozçu ac qalır.

– Qalmaz, haqqımızı düz bölsələr, elə olmaz. Nə pulumuzu düz verirlər, nə taxılımızı. Elə bizim aşıq Alı yaxşıca deyib:

“Anbardarın nənəsi,
Vurdum çıxdı çənəsi,
Altmış ton buğdadan
Qalmadı bir dənəsi...”

Kərim kişi asta-asta aşağı endi. Kazım ayağa durdu. Söz alıb xitabət kürsüsünə qalxdı.

– Yoldaşlar, bu Kərim kişi ki var, köhnənin araqarışdıranıdır. Onun dabbaqda gönünü tanıyıram. Gözümü açandan onu belə görmüşəm. Elə boş-boş danışır, ortada da heç nə yoxdur. Axı o nəçidir ki, bu iclasda belə çıxış edir? Onun arı-namusu olsa, camaatın gözünə görünməz. Kərim kişi bizim kolxozda ən tənbəl kolxozçudur. Onun heç minimum əməkgünü də yoxdur.

Kazımın xırıltılı səsi klubu ağzına götürdü. Kosaoğlunun yanında oturan prokuror yerində qurcalandı.

– Minimum əməkgünü olmayanları kolxozdan qovmaq qanunidir.

– Elə mən də bunu demək istəyirəm, yoldaş prokuror, Kərim kişi kimilərini kənddən qovmaq lazımdır. Mənim təklifim var: onu nəyinki kolxozdan, lap kənddən çıxartmaq lazımdır.

Yerlərdən səs-küy qalxdı:

– Düzdür, qoy çıxıb getsin.

– Niyə, sözün düzünü deyəni kənddən qovarlar?

– Bircə onu görməzsiniz, camaat qırılmayıb ha.

– Demaqoqdur, materialbazdır.

– Deyəsən, sənin də yağırına toxunur.

Kazımdan sonra hesabdar söz aldı. Kərim kişinin cəmi yetmiş beş əməkgünü olduğunu söylədi. Daha sonra anbardar danışdı. O da Kərim kişini böhtançı adlandırdı. Onu hətta məhkəməyə verməyi təklif etdi.

Zala yenə uğultu düşdü. Nəsib dayı bir neçə dəfə ayağa durmağa məcbur oldu. İndi hamı əl qaldırıb söz istəyirdi. Gözlənilmədən elə bir canlanma əmələ gəlmişdir ki, ağız deyəni qulaq eşitmirdi. “Yaralar təzələnib, qoy ürəklərini boşaltsınlar”, – deyə Nəsib dayı düşündü. O yenə camaatı sakitləşdirdi.

– Kim danışmaq istəyir?

– Daha nə danışmaq, hər şey aydındır. Təklifləri səsə qoy, – deyə Kosaoğlu yerindən dilləndi.

Nəsib dayı sakitcə ona cavab verdi:

– Yoldaş Kosaoğlu, bir az səbr elə, qoy camaat sözünü desin.

İclas davam edirdi. İndi də Zeynəb danışırdı:

– Heç kəsin Kərim kişini kolxozdan qovmağa ixtiyarı yoxdur. Onu deyən qulağının dibini görər. Hələ siz gərək ona mükafat verəsiniz ki, qoca ola-ola kolxoza kömək eləyir. Kərim dayının yaşı altmışı ötüb, hökumətimizin də qərarı var. O, işləməməlidir. Amma işləyir! Heç olmasa ildə yetmiş beş əməkgünü alır. Bəs sənin arvadın neçə əməkgünü alır, yoldaş Kosaoğlu, hə? Minimum əməkgünü varmı? Əgər kənddən adam sürgün olunmalıdırsa, birinci sənin arvadını sürmək lazımdır.

Yenə səs-küy qalxdı.

– Düz deyirsən, dilinə qurban olum.

– Ay gözünə dönüm, qız deyil ki, od parçasıdır.

– Od olsa da özünü yandıracaq.

– Yandırmaz!

– Görərsən!

Nərgiz müəllimə diqqətlə Zeynəbə qulaq asırdı. Onun qorxmazlığı, kişi kimi sinəsini gərib danışması müəlliməni valeh etmişdi. O hətta ürəyində Zeynəbə qibtə edirdi: "Kaş ondakı cəsarətin yarısı məndə olaydı. Gör necə də camaatın üzünə şax baxır. Doğrudan da oddur".

Nəsib dayının ürəyi dağa dönmüşdü. İmran isə sakit qıza baxırdı. Bayaqdan azacıq həyəcanlanan aqronom indi Zeynəbi görüb sakitləşmişdi. Camaat nəfəsini çəkib onun sözünə davam etməsini gözləyirdi.

– Mən heç kəsin əvəzinə işləmək istəmirəm. Qoy hər kəs gəlib normasını becərsin. Bizim kolxoz sədri dinəndə geroyluqdan danışır, elə fikri-zikri odur ki, bir təhər eləyib döşünə ulduz taxsın.

– Bəs sən istəmirsən?

– İstəyirəm, niyə istəmirəm! Ancaq fırıldaqla yox, namusla!

– Nə fırıldaq?

– Bu saat, heç darıxma, hamısını bir-bir ovcuna qoyacağam. Bizim kolxoz sədri hər briqadirə tapşırıb ki, əlavə pambıq əkin ki, planı artıq dolduraq.

– Yalandır! – deyə Kazım yerindən xırıldadı.

– Heç atılıb düşmə, bu saat sübut eləyəcəm. Elə İmranla Kosaoğlunun davası da bunun üstündədir. O deyir artıq yer əkəcəm, İmran deyir qoymaram, elədirmi?

İmrandan qabaq traktorçu Əli dilləndi:

– Düzdür, mən özüm bu işin şahidiyəm.

– Bax, mən bu cür qəhrəmanlığı istəmirəm, yoldaş Kosaoğlu.

– İstəmirsən, istəmə. Elə bir-ikisi səni geroyluğa təqdim edirdi.

– Sənin kimilərinin təqdimi də lazım deyil. Amma bir yolluq başa düş, daha bəsdir, əvvəlcə öz gözündəki tiri gör, sonra xalqın gözündə tük axtar.

Kosaoğlu özündən çıxmışdı. Hirsindən az qalırdı stolun üstündəki qrafini götürüb qızın başına çırpsın. "Çəpəlin dilinə bir bax! Təqsir məndədir, sənin dilini kökündən niyə qopartmıram ki, sən də belə edirsən. Yaxşı, borc olsun".

Nəhayət, İmrana söz verdilər. O, təmkinlə ayağa durdu. Xitabət kürsüsünə yaxınlaşdı:

– Mən sözümü Zeynəbin toxunduğu məsələdən başlamaq istəyirəm. Bizim kolxozda plandan əlavə artıq pambıq əkilmişdir. Bu işin müqəssirləri cəzalanmalıdır.

– Ortaya başqa söz salma, əvvəlcə cavab ver görək bizim bu pulları niyə MTS-in hesabına keçirdibsən? – deyə küncdə oturmuş bir kolxozçu İmranın sözünü kəsdi.

İmran sualı başa düşmədi:

– Hansı pulu?

– Hökumətin verdiyi avans pulunu.

– Avans pulunu heç kəs MTS-ə verməyib və belə bir qanun da yoxdur.

– Bəs onda nə üçün bizim hərəmizdən beş yüz manat pul tutublar?

– Kim?

– Bilmirəm. Deyirlər sən eləmisən.

– Elədir. Məndən də tutublar.

– Mən də o gündəyəm.

– Ə, nə olsun. Özümüz razılaşıb vermişik.

– Yalandı, zorla qol çəkdiriblər.

– Xahiş edirik bu məsələni aydınlaşdırasan.

– Mənim heç nədən xəbərim yoxdur.

– İndi biz kimə inanaq, sənə, yoxsa Kosaoğluna?

– Kim düz deyirsə, ona.

– O pulları MTS-ə yox, traktorçulara vermişik, – deyə anbardar yerindən dilləndi.

– Hansı traktorçulara?

– MTS-in traktorçularına verdik ki, yeri yaxşı əkib səpsinlər.

– Yalandır! – traktorçu Əli arxadan dilləndi. Camaatı yara-yara irəli keçdi. Anbardarla qabaq-qabağa dayandı. – Bu sənin üzün, bu da mənim, de görüm, bizə nə vaxt pul veribsən?

– Nə bilim, yadımda ha qalmayıb.

– Başını aşağı salma, gözümün içinə bax!

Kosaoğlu anbardarın xasiyyətinə bələd idi. Bir az bərkə düşən kimi hər şeyi aça bilərdi. Belə anlarda dərhal çıxış yolu tapmağı bacaran Kosaoğlu ayağa durub var səsi ilə qışqırdı:

– Ə, qoduq, sənin nə haqqın var, camaatın pulunu kəsib traktorçulara paylayırsan? Hesabdar sənə cədvəl tutub verib ya yox?

– Verib.

– Bəs niyə cədvəl üzrə paylamayıbsan? Yoxsa yemək istəyirsən? Bu saat, elə prokuror da burdadır, sənin başına bir oyun açaram ki, adın da yadından çıxar, heç nə bilmirəm, günü sabahdan pulları payla, yoxsa kənddən qovaram, utanmaz!

Anbardar ağzını açıb nə isə demək istədi. Belə dəqiqələrdə arif olub hər şeyi başa düşən Kazım onun ətəyindən çəkdi.

– Əyə, otur.

– Axı, Qurban qağa, özün...

– Kəs səsini, qanmaz!

– Əyə, aşağı otur.

Anbardar yerində əyləşdi. Zalda pıçapıç başladı. İmran gülümsündü. Kosaoğlu məsələnin başqa şəkil alacağını görüb yerindən qışqırdı:

– A bala, bizi başa sal görək sən nə istəyirsən? Kəndə gələn gündən camaatla düz gətirmirsən, davan nədir?

İmran halını pozmadan davam etdi:

– Mənim camaatla heç bir davam yoxdur. Mənə elə gəlir ki, camaatla düz gətirməyən sizsiniz, yoldaş Kosaoğlu. Gah məni uşaq hesab edirsiniz, gah hədə-qorxu gəlirsiniz, gah da evinizə çağırıb tumarlamaq istəyirsiniz. Sizin məqsədiniz odur ki, məni ələ alasınız, sonra da istədiyiniz havaya oynadasınız. Ancaq nahaq yerə əziyyət çəkməyin.

– Bura bax, uşaqlığınla bizə ağıl öyrətmə, de görüm nə istəyirsən?

– Mən nə istədiyimi bir dəfə sizə təklikdə demişəm. İndi də camaatın içində deyəcəm. Mən sizin iş üsulunuzun əleyhinəyəm. Siz

diktator kimi hərəkət edirsiniz, bu bir. İkinci, siz şöhrətpərəstsiniz, gözə soxulmaq üçün camaatı incidirsiniz, kolxoz nizamnaməsini pozub, partiya və hökuməti aldadırsınız.

– Mən partiya, hökumət uğrunda vuruşub qan axıdanda sən buralarda ayaqyalın gəzirdin, bala, ağzını açıb yava-yava danışma! – deyə Kosaoğlu əlini stola vurdu.

– Xahiş edirəm imkan verəsiniz. Siz arxın altındakı yerdə plandan artıq pambıq əkmək istəyirdiniz, mən razı olmadım, orda idarə heyətinin qərarı ilə bostan əkdik. Yenilikdən qorxursunuz. Əməkgününü bəhanə edib camaatı üstümüzə qaldırırsınız. Siz bir hektar əvəzinə iki hektar əkmək yolu ilə plan doldurmaq istəyirsiniz, mən isə aqrotexniki qaydalara əməl etməklə, məhsuldarlığı artırmaqla. Siz kolxozçuların əməkgününə düşən pulları paylamağa qoymursunuz ki, MTS-ə verəcəyik. Beləliklə, camaatı narazı salırsınız. Siz tənqidi boğursunuz. Kərim dayıya nə üçün hücum edirsiniz? Çünki sözü gözünüzün içinə deyir. Zeynəbi manqabaşçılıqdan niyə çıxartmaq istəyirsiniz? Çünki sizə "bəli, bəli" – demir, amma Kazımı əzizləyirsiniz, özü demişkən, şəxsən kişi ilə dostsunuz, çünki o, sizin əlibağlı qulunuzdur. İdarə rəhbəri ətrafına yaltaqları yox, iş bacaranları, necə deyərlər, dişli adamları toplamalıdır.

Zalda canlanma var idi. Kosaoğlu papirosu papirosun oduna yandırır, Zeynəb uşaq kimi sevinib tez-tez Nərgiz müəllimənin qolunu sıxırdı. Kərim kişinin gözləri yaşarmışdı. Nərgiz xəstə kimi titrəyir, bu mübahisələrin nə ilə qurtaracağını gözləyirdi. Kazım gözünü Kosaoğlundan çəkmir, onun işarəsini gözləyirdi. Yer olmadığından arxada dayanan Tükəzban xala həm sevinir, həm də qorxurdu. Kosaoğlunun qəzəbli baxışlarını görəndə titrəyir, ürəyi üstündə durmurdu. "Allah, sən bircə balamın pənahı ol" – deyə pıçıldayırdı. Şahnaz da burada idi, dinməz-söyləməz oturmuşdu. Şofer Məmməd onun yanını kəsdirmişdi. Həmişə deyib-gülən Şahnaz bu gün elə bil süst düşmüşdü.

– Mən nə istəyirəm? – deyə İmran sözünə davam etdi. – Mənim arzum budur ki, kəndimiz daha da varlansın, teatrımız, elektrik stansiyamız olsun. Kolxozçular firavan yaşasın. Bunları etmək üçün bizim imkanımız var, ancaq işə can yandırmaq, camaatın qeydinə qalmağı bacarmaq lazımdır. Partiyamız və hökumətimiz də bizdən bunu tələb edir. Biz də bunun üçün çalışmalıyıq. İndi qoy iclas desin, kim haqlıdır? Biz, yoxsa Kosaoğlu?

İmran stəkandakı suyu başına çəkib aşağı endi.

Heç kəs danışmırdı. Kosaoğlu çox əsəbiləşmişdi. O, vəziyyətdən çıxmağa çalışırdı. Nəsib dayı camaatın məsələləri düzgün başa düşdüyünə sevinirdi. İclasın axırında o:

– Mən çox danışmayacam, – deyə sözə başladı, – nöqsanlarımız çoxdur. Özü də hər sahədə. Ancaq mən bircə məsələdən – artıq əkilən pambıqdan danışacam. Mən iclasın adı ilə Kosaoğlundan soruşuram: meşədə pambıq əkilməsinə kim icazə verib?

– Artıq yer əkilmişdi, akt bağlanıb plana qatdıq, daha nə istəyirsən?

– Mənə müqəssir lazımdır.

– Lazımdır, axtar tap.

– Taparıq, – deyə Nəsib dayı cavab verdi, sonra qabaq cərgədə oturan briqadirə müraciət etdi: – Kazım, de görək sən nə ixtiyarla, nə məqsədlə gizlicə, plandan əlavə yer əkibsən?

Kazım yavaş-yavaş ayağa durdu. Əvvəlcə gözünü Kosaoğluna dikdi. Onun sərt baxışlarını görüb prokurorun üzünə baxdı. Nəsib dayı sualını bir də təkrar edəndə Kazım diksindi. Kim isə söz atdı:

– Məqsədi geroy olmaqdır.

– Qurban qağası arxasında durandan sonra niyə olmur?

Camaat güldü. Bu gurultudan Kazımın qulaqları cingildədi. O yenə dönüb Kosaoğluna baxdı və birdən, heç gözlənilmədən gur səslə:

– Özüm əkmişəm! – dedi. – Lazım bilmişəm, əkmişəm, heç kəs mənim işimə qarışa bilməz.

Kazım, Kosaoğlu olan yerdə ürəklə danışmağa adət etdiyindən, indi də iclası saymadı. Onun briqada üzvləri söz alıb danışmağa başladılar.

Kazım döyükür, az qalırdı gözü ilə Kosaoğlunu yesin. Kosaoğlu Kazımın baxışlarındakı təlaşı aydınca sezirdi. Lakin bu saat o, öz başının hayında idi.

– Artıq yer əkib, özü də cavab verər, – deyə o, məsələyə yekun vurmaq istədi.

– Yox, Qurban, – Nəsib dayı ona cavab verdi. – Bu işə səninlə mən də cavab verməliyik. Rayon təşkilatları hamıdan əvvəl bizdən haqq-hesab soruşacaq.

– Məni heç nə qorxutmur. Cavab taparıq.

– Elə o pisdir ki, həmişə işin altından çıxmağa çalışırsan, iş görmək istəmirsən.

– Ə, nə iş görəcəm? Mən Kazımın əvəzinə cavab verəcəm? Özbaşınalıq eyləyib, canı çıxsın, cəzasını çəksin.

Kazım eşitdiklərinə inanmaq istəmirdi. O, Kosaoğlundan kömək gözlədiyi halda, Qurban qağası onun arxasından qaçırdı. Nəsib dayı ayağa durub:

– Yoldaşlar, mənim təklifim budur ki, Kazımı briqadirlikdən çıxardaq, – dedi.

– Düzdür!

– Özünü də məhkəməyə!..

– Əvəzinə Zeynəb briqadir olsun.

– Ə, Zeynəb bacararmı?

– Zeynəb yüz Kazım kimi başı papaqlıdan qeyrətlidir!

– Təklifi səsə qoyun.

Kosaoğlu yerlərdən deyilən bu sözlərə qulaq asıb fikrindən daşındı. Kazımı müdafiə etsə gülünc vəziyyətə düşəcəyini duydu. Özünü itirən Kazıma gözünü ağartdı.

Nəsib dayı təklifləri səsə qoydu. İclas Kazımın vəzifədən azad edilməsini qərara aldı. Nəsib dayı iclası yekunlaşdırmaq istəyirdi ki, Kazım yerindən top kimi atıldı.

– Yoldaş partkom, demokratiyanı niyə pozursunuz? Bəs mənim təklifim necə oldu? Kərim kişini kolxozdan çıxartmaq lazımdır!

– Onun əlində qocalıq kağızı var.

– Yalandır. O kağızı verən həkim heç nə qanmır – deyə Kosaoğlu qəzəblə qışqırdı. – Səsə qoy!

Nəsib dayı bu məsələnin heç yeri olmadığını bilsə də, Kazımın təklifini səsə qoymağa razı oldu. O, Kosaoğlunu başa salmaq istəyirdi ki, kəllə-kəlləyə gəlmək olmaz.

Təklif səsə qoyulanda zalda elə sakitlik oldu ki, milçək uçsaydı səs eşidilərdi. Kosaoğlu ayağa durdu. Yuxarı qaldırılan əlləri saydı. Onun rəngi ağardı. Hirsindən dodağını çeynədi. Kərim kişinin əleyhinə yalnız on beş adam əl qaldırmışdı.

Nəsib dayı dedi:

– Keçirəm o biri təklifə.

– Hansı təklifə?

– İmran kolxozda qalsın, yoxsa getsin?

Kosaoğlu yenə ayağa durdu. Təklifinin yerə düşəcəyini hiss edib sözünü dəyişdi:

– Camaat, İmran məsələsini səsə qoymaq lazım deyil. Amma mən bu iclasda açığını deyirəm. Kəndimizdə mənim əleyhimə qruppa var. Ancaq onu bilin ki, mənə heç kəsin dişi batmayacaq. Qoy hamı bilsin ki, bu kəndin kolxoz sədri mənəm, mən də hər şeyə cavabdehəm. Sabah bir iş olanda nə Nəsib, nə də İmran qabağa duracaq. Madam ki, belədir, heç kəs mənim işimə qarışmasın. İndiyə qədər mən üzüyumşaqlıq eləmişəm, bundan sonra kolxozun işinə mane olanlara divan tutmaq mənim boynuma! – O, içini arıtlayıb, çiyninə saldığı kürkünün yaxasını düzəltdi və məğrur bir görkəm aldı. Nəsib dayının sifətində güclə seziləcək bir kinayə əmələ gəldi.

– Başqa bir təklif yoxdur ki?

– Yox.

– Onda icazə verin iclasımızı qapalı hesab edək.

Camaat evə dağılanda gecə yarıdan keçmişdi.

* * *

Şoferin yanında əyləşən prokuror qaşqabaqlı halda papiros çəkirdi. O, iclasdan narazı qalmışdı. Ürəyində öz-özünü danlayırdı: “Kosaoğlunun sözünə baxıb kəndə nahaq gəldim. Bundan sonra camaat arasında mənim nə nüfuzum ola bilər?..”

O, kəndə gələndə elə zənn etmişdi ki, rəyasət heyətində görünən kimi camaat qorxuya düşəcək, “prokurorun sözündən çıxmaq olmaz” – deyə onunla hesablaşacaq. O, isə arabir söz atacaq, iclasın gedişinə istiqamət verəcək, beləliklə hər şey qaydaya düşəcək, Kosaoğlu istədiyi adamları əzəcəkdir. Lakin prokurora məhəl qoymadılar.

Arxada, Kazımla yanaşı oturan Kosaoğlu da fikirli idi. O da özünü danlayır, işləri yaxşı qura bilmədiyinə heyfsilənirdi. “Mən bu dağı sinəmdə qoymaram. Onları bircə-bircə dənləmək mənim boynuma. Sən bir o Nəsibə bax, xəlvəti iş görür, ayağımın altını eşir, başına adam toplayır. Gör nə günə qalmışam ki, lüt Kərim də mənim üstümə ayaq alır! Yox, Kosaoğlu, bu işi belə qoymaq olmaz. – O, şoferin yanında dinməz-söyləməz oturan prokurora baxdı. – Bu niyə mısmırığını sallayıb? Özünü də elə çəkir, deyəsən qırx eşşəyi sağına gəlir. Evə də getmir. Eh, neyləyim, əlacım yoxdur. Yoxsa heç sənin üzünə də tüpürmərəm”.

Əsədov bu rayona təyin ediləndən sonra Kosaoğlunu ələ keçirmək üçün xeyli fikirləşmişdi. “Yağlı sədrə oxşayır. Onu bir təhər cəngimə

sala bilsəm, yeməyimiz-içməyimiz pis olmaz" – deyə düşünmüş və istədiyinə nail olmuşdu.

Bir dəfə onlar qonaqlıqda yanaşı oturmuşdular. Kosaoğlu kirvə olduğu bu evdə heç kəsi saymır, tez-tez sağlıq deyir, əlindəki badəni yuxarı qaldırıb məclisdəkilərə meydan oxuyurdu.

Əsədov gözaltı onu süzürdü.

Gecə yarıya yaxın Kosaoğlu lap qızışdı. Pencəyini soyunub köynəyinin qolunu çirmədi. Əsədovun gözü onun sol biləyinə sataşdı. Əvvəlcə bu güllə yarasına əhəmiyyət vermədi. Ancaq evə qayıdandan sonra onun beynində çox qəribə bir fikir doğdu. "Bəlkə baş tutdu" – deyə fikirləşdi.

Bir neçə gündən sonra o, Kosaoğlunu yanına çağırtdırdı. Kabinetin qapı və pəncərəsini örtüb qaşqabağını salladı. Kosaoğlu ilə üzbəüz oturub gözünü onun gözünə zillədi. Sükut xeyli çəkdi. Kosaoğlu bir qədər narahat olsa da, özünü sındırmadı.

– Ə, pişik kimi marıtdayıb üzümə niyə baxırsan? Məni yeməyəcəksən ha?

Əsədov halını pozmadan, yavaşca dilləndi:

– Köynəyinin qolunu aç.

Kosaoğlunun bədəninə üşütmə düşdü. Bu hal prokurorun gözündən yayınmadı. O, təmkinlə sualını təkrar edəndə Kosaoğlu özünü sakit göstərməyə çalışaraq ayağa durdu:

– Get özünə iş tap, bala, mənim sənnən oynamağa vaxtım yoxdur.

Onun bu cür soyuqqanlı cavab verməsi Əsədovu çaşdırdısa da, oyunu davam etdirməyi lazım bildi. Qapıya yaxınlaşan Kosaoğlunun üstünə qışqırdı:

– Dayan, sən dustaqsan!

Kosaoğlu geri döndü. Əsədov səsini alçaltdı:

– Əyləş.

Kosaoğlu itaət etdi. Prokuror papiros yandırdı.

– Qolunu aç.

– Axı niyə?

– Sonra bilərsən.

Kosaoğlu astaca köynəyinin düymələrini açdı. Əsədov onun barmaqlarını titrədiyini gördü.

– Tuapsedə yaralanmışam.

– Bilirəm. Özü də rayonumuzdakı qospitalda yatıbsan. Xəstəxanaya gəlməzdən əvvəl gecə evinizə də gedibsən.

– Bunları sən hardan bilirsən?

Əsədov Kosaoğlunun sifətinə baxıb acı-acı gülümsədi.

– Köynəyinin qolunu aşağı sala bilərsən.

Kosaoğlunun gözünə qaranlıq çökdü. Başı hərləndi. Amma özünü tez toxtatdı. Əsədov stolun siyirməsindən bir kağız çıxardıb oxudu və astadan:

– Fakt yoxlanılıb, bizə hər şey məlumdur, – dedi.

Kosaoğlunun rəngi ölü rəngi kimi saraldı. Əsədov gördü ki, o, stuldan qalxmaq istəyir, amma dizlərində taqət yoxdur.

Kosaoğlu ancaq bunu deyə bildi:

– İgid basdığını kəsməz, Əsədov.

Əsədov dərindən nəfəs alıb gülümsündü...

O gündən onlar dost oldular.

İndi Kosaoğlu maşında oturub hirsli-hirsli prokurora baxırdı.

İclasdan sonra o, Əsədovun qoluna girib "gedək evə, – demişdi, – bir əmliyim də var. Xeyli vaxtdır kabab yemirik". Prokuror razı olmamışdı. İş belə olanda Kosaoğlu maşını qapıdan sürdürmüşdü. Kazım bir dəqiqədə əmliyin ayaqlarını bağlayıb maşına qoymuşdu.

– Bizim evdə yemədik, sizdə yeyərik, – deyə Kosaoğlu izah etmişdi. O, Kazımı da özü ilə aparırdı ki, orda lazım olar.

Kazım büzüşüb maşının küncünə qısılmışdı. Bu saat onun gözünə heç nə görünmürdü. Dərd onu aparmışdı. Neçə il idi ki, kənddə əməlli-başlı dolanırdı. Altında at, hara istəsə gedir, kimi istəsə çağırıb işə göndərirdi. O hər səhər kənd arası ilə at çapıb idarəyə gedəndə, yaxud da çöldən evə qayıdanda elə bilirdi ki, dünya ayağının altındadır.

...Kazım fikirləşdikcə gözünün qabağında Zeynəb dayanırdı. "Bütün işlərin kökü ondadır. Suyu bulandıran odur. O olmasa, bəlkə heç İmranın da arası mənimlə dəyməzdi. Pambığın da üstü açılmazdı. Briqadirlikdən də çıxarılmazdım. Qız ola-ola gör mənim başıma nə oyun açır! Yaxşı, Zeynəb, borc olsun. Mən bu qisası yerdə qoysam, kişi deyiləm".

Şoferin yanında çəpəki oturan prokuror sükutdan darıxaraq geri döndü.

– Ay Kosaoğlu, bir az siyasətlə iş görmək lazımdır. Belə getsə, özünü də, məni də biabır elərsən! A kişi, niyə hər şeyi ümumi iclasa qoyursan ki, onlar da sənin əleyhinə qərar çıxardırlar?! İndi nə qayıracaqsan?

– Ə, işində ol, elə qərarları çox görmüşəm. Nə qərarbazlıqdır! Qərar mənəm. Onlara bir toy tutacam ki!..

– Bugünkü kimimi?

Kosaoğlu bir az tutuldu.

– Yox, bu gün səhv elədim.

– Əlbəttə, – deyə prokuror davam etdi: – Gərək hər şeyi maddəyə salasan. Bir akt, üç-dörd adamın da qolu. Sən bunları düzəlt mənə ver, sonrası ilə işin olmasın. Yoxsa məsələ səs-küyə düşüb raykomdakıların qulağına çatar. Onda nə sən bir iş görə bilərsən, nə də mən. Amma əl altdan üç-dörd adamı yola salsan, camaatın da gözü qorxar.

– Elədir, – deyə Kosaoğlu mızıldandı. – Onları bir-bir dənləmək lazımdır.

O yanında dinməz-söyləməz oturan Kazımı dürtmələdi.

– Ə, sənə nə olub?

– Nə olacaq, – Kazım incik halda dilləndi, – yeri əkdirdin, dara düşəndə də yıxdın mənim üstümə. İndi tutub basacaqlar dama.

– Ə, mən ölməmişəm ha! Dalında dağ kimi durmuşam. Lap qırx arşın quyunun dibinə də düşsən, çəkib çıxardaram. Vay o gündən ki, mənim işim dara düşə, onda sən məndən qabaq gedəcəksən. Başa düşdünmü, ay səfeh!

Kazım bir az ürəkləndi. Xeyli sükutdan sonra prokuror geri döndü:

– O qız kimdir?

– Hansı qız?

– Zeynəbdir, nədir, onun əri-zadı varmı?

– Yox, a kişi, nə ər? Yetim qızdır. Deyəsən ağranoma şırvanır.

– Onda işiniz düzələr ki.

Bu söhbət Kazımın yadına yenə Zeynəbi saldı. Birdən onun beynində qəribə bir fikir əmələ gəldi. Kazımın gözləri parıldadı.

– Onun öhdəsindən yaxşı gələrəm, amma Qurban qağamdan qorxuram.

– Ə, mən sənin əlini-ayağını tutmuşam? Nə bacarırsan elə, istəyirsən lap qolundan yapış, apar evinə. Bizim də qulağımız dincəlsin.

– Razı olmur.

– Razı sal.

– Nə təhər?

– Bunun təhəri yoxdur ki. Gecənin birində kəs qabağını, əliniayağını sarı, apar evə. Ondan sonra ha çığırsın, harayına kim çatacaq?

“Ağıllı sözdür, – deyə Kazım düşündü, – aparacam evə. Üç-dörd gün saxlayacam. Sonra da dalına bir təpik vurub qovacam. Qoy biabır

olsun. Ondan sonra onun üzünə heç tüpürən də olmayacaq. Heç İmran özü də ona yaxın durmayacaq".

– Axı, yoldaş prokuror məsuliyyətə çəkər.

– Qorxma, elə şeylər mənim boynuma. Təki səndə kişilik olsun.

– Çox sağ ol, prokuror qağa.

– Ağlabatan sözdür, – Kosaoğlu yenidən dilləndi. – Sonra da o birilərinə əncam çəkərik.

– Mütləq! – deyə prokuror qətiyyətlə bildirdi. – Elə barmaq keçirməyə balaca yer tapdım, o dəqiqə sanksiya verəcəm. Belə şeylər çətin deyil. Ancaq gərək siyasətin ola. Qoy işləsinlər, sən də üzdə özünü dost göstər. Kolxozun işi nə qədər irəli getsə, sənin adınadır. Dəymə, qoy işləsinlər. Amma yatma...

– Axı onların dediyi ilə getsək acından ölərik!

Maşın körpünü keçib şəhərə girdi. Onlar susurdular. Prokuror papiros çəkirdi. Kosaoğlu şəhərin küçələrinə baxıb düşünürdü: "Onları bir-bir dənləyib, kolxozu təmizləmək lazımdır..."

## 21

Qatar səhər tezdən Bakıya çatdı.

Onlar Nərgiz müəllimə gilin evini tapdılar. Üçüncü mərtəbədəki qapının zəngini basanda içəridən ayaq səsləri eşidildi.

Kim isə qapının arxasından:

– Kto tam? – deyə soruşdu.

Tükəzban xala heç nə başa düşmədi.

– Dərdin alım, Nərgiz burdamı olur?

– Çto? Koqo vı xotite?

– Bu nə deyir, ay Nəsib?

– Deyir ki, kim lazımdır.

– Necə kim lazımdır? Belə deynən Nərgiz müəlliməni axtarırıq.

– Bizə Muradova Nərgiz lazımdır, – nəhayət, Nəsib dayı rus dilində cavab verdi. Qapının dalından yenə həmin səs eşidildi:

– A...a...a... Mama, kimdirsə Nariçkanı axtarır.

Bir azdan qapı açıldı. Nəsib dayı ilə Tükəzban xalanın qabağına güllü ipək parçadan uzun xalat geyinmiş bir qadın çıxdı. Təəccüblə qonaqlara baxdı.

– Siz kimsiniz?

– "İyirmi altılar" kolxozundan gəlmişik, – deyə Nəsib dayı cavab verdi.

İçəridən söhbəti eşidən Nərgiz, tələsik qapıya yüyürdü. Tükəzban xalanın üstünə atılıb onu qucaqladı.

– Xoş gördük, ay xala, siz hara, bura hara, keçin içəri... Nəsib dayı, buyurun. Xoş gəlmisiniz! Nə əcəb sizdən?

– Xoş vaxtın olsun, qızım. Elə-belə, Bakıda bir balaca işimiz var. Tükəzban xalan da səndən ötrü darıxırdı.

Onlar içəri keçdilər.

Nərgiz əl-ayağa düşdü. Çay-çörək hazırladı. Qonaqlarına layiqincə hörmət etməyə çalışdı. Süfrə başında onları anası və bacıları ilə tanış etdi.

– Atam işə gedib. Axşam onunla da tanış olarsınız, – dedi. Kənddə nələr olduğunu soruşdu.

Nəsib dayı çay-çörəkdən sonra ayağa durdu:

– Məni bağışlayın, görüləsi işim çoxdur. İdarələr bağlanmamış qurtarmalıyam.

Axşam söhbət elərik.

O gedəndən sonra Nərgiz müəllimə Tükəzban xalanın etirazına baxmayaraq, hamamı qızdırdı:

– Yoldan gəlibsiniz, çimin, sonra da yatıb dincəlin.

Lakin Tükəzban xala yatmadı. O, qohum olmaq istədiyi adamların evini nəzərdən keçirdi. Otaqların divarları zərif naxışlı xalçalarla bəzənmişdi. Pəncərələrdən ipək pərdələr asılmışdı. Yemək otağının bir küncünə ayna kimi parıldayan qara piano qoyulmuşdu. Telefonları, hamamları, radioları, bir sözlə, hər şeyləri var idi. Təkcə dəhlizdəki bədənnüma güzgü bir evi satın alardı. "Pis dolanmırlar" – deyə Tükəzban xala öz-özünə pıçıldadı.

O eyni zamanda hiss edirdi ki, Nərgiz əl-ayağa düşsə də, başqaları ona bir cür baxırlar. Hətta əynində ipək xalat olan arıq qızın ona qəribə halda baxdığını, uzun, boyalı dırnaqları ilə oynayıb, qaş-göz süzdürdüyünü və işarə ilə evdəkilərə nə isə dediyini Tükəzban xala gördü. O, üst-başına baxdı. Əynindəki paltarlar pis deyildi. Göy rəngli yun parçadan don geymişdi. Başında qara kəlağayı vardı. Ayaqqabısı da təzə idi. "Bəs bu meymun yosunlu mənim nəyimə gülür?"

O, hiss etdi ki, Nərgizin anası da onunla candərdi danışır. Tükəzban xala qısıldı. Dönüb küncdəki böyük kəfgirli saata baxdı. Pəncərə-

dən boylanıb günün harada olduğunu yoxladı. “Görəsən bu Nəsib necə oldu?” – deyə düşündü. Tükəzban xala qonşu otaqda mübahisə getdiyini duydu. Hətta onun qulağına bəzi sözlər də gəlib çatdı. “Bu qız da bilmirəm, bu arvadın başına pərvanə kimi niyə dolanır?”

O gün Tükəzban xalaya bir il qədər uzun göründü. Axşam üstü Nərgizin atası gəldi. O, ucaboylu, ətli-canlı bir kişi idi. Başında həsir şlyapa, ayağında ağ parusin ayaqqabı vardı. Çesuça pencək-şalvarı nə qədər gen olsa da, iri qarnı süzüb irəli çıxmışdı.

Kişi heç kəsə bir söz demədən o biri otağa keçdi. Zolaq-zolaq pijamasını geyinib hamama getdi. Tükəzban xala su şırıltısı, öskürək və fınxırtı eşitdi.

Ortalığa süfrə saldılar, xörək gətirdilər. Hamı süfrə başına yığışdı. Yalnız bu zaman ağır-ağır otağa girən kişi, Tükəzban xalanı başdan-ayağa süzüb ağızucu salam verdi. Görünür, qonağın kim olduğunu bilirdi.

Tükəzban xala heç nəyə toxunmadı.

– Siz çörəyinizi yeyin, dərdin alım, – dedi, – mən toxam.

Tükəzban xala elə bil tikan üstə oturmuşdu. Əgər Nəsib dayı bir az da gec gəlsəydi, arvadın ürəyi az qala partlayacaqdı. Hamı süfrədən çəkildi. Evdə Nərgizin ata-anası, bir də qonaqlar qaldılar. Ortaya çay gətirdilər. Bir xeyli heç kəs danışmadı. Sonra kənddən, yeni qərarlardan söz düşdü. Kənd təsərrüfat mütəxəssislərinin kolxozlara getmələrindən danışdılar.

Muradov ehtirasla sözə başladı:

– Kənd təsərrüfatını ayağa qaldırmaq lazımdır. Bizim nazirlikdə də bu barədə müşavirə çağırılmışdı. Ən yaxşı mütəxəssisləri kolxozlara göndərəcəyik. Bizim gözəl ağranomlarımız var. Bəsdir, qoy kabinetdən çıxsınlar.

– Əlbəttə, əlbəttə. Yaxşı mütəxəssislərə kolxozlarımızın ehtiyacı var. Bəs siz özünüz necə? Kəndə getmək istəmirsinizmi? – deyə Nəsib dayı gülə-gülə soruşdu.

– Mənmi? Mən çox işləmişəm. Kolxoz qurulanda işim-peşəm at belində mürgüləmək olub. İndi də qoy başqaları getsin. Bu saat yol cavanlarındır. Bir də ki, bəs mərkəzdə heç kəs olmamalıdır?

Nəsib dayı Muradovun söhbətdən xoşlanmadığını hiss etdiyini bildirməməyə çalışdı:

– Düz deyirsiniz. Bir də, ağsaqqal vaxtınızda kəndə-kəsəyə düşmək sizə çətin olar.

Muradov Nəsib dayının eyhamını başa düşmədi.

– İndi bizim sakitcə dolanıb istirahət edən vaxtımızdır. Biz özümüzü çox göstərmişik. Təki cavanlar da bizim qədər işləsinlər.

Söhbət çox uzandı. Nəhayət, Nəsib dayı yavaş-yavaş mətləbə yaxınlaşdı. Muradovun uşaqlarından söz saldı, Nərgizi təriflədi:

– Halal olsun, çox ağıllı-kamallı qızdır. Kəndimizdə də hamı onun başına and içir. Mərifətli uşaqdır.

Muradov qızının tərifini eşidəndə susdu. Qabağındakı "Kazbeki" açıb bir papiros yandırdı, arxasını yumşaq stula söykədi:

– Amma bir az dəlidir.

– Niyə?

– Keçən il sözümüzə baxmayıb, özbaşına kəndə getdi.

– Lap yaxşı eləyib. Kənd pisdir?

– Yox, ancaq o, kənd uşağı deyil. Şəhərdə böyüyüb. Mən ondan yaman küsmüşdüm. Yenicə barışmışıq. Bir də sözümə baxmasa, ömürlük ondan inciyərəm.

– Xətrinizə dəyməsin, düz eləmirsiniz. Bayaqdan deyirdiniz cavanlar kəndə getsin, indi özünüz öz fikrinizə zidd çıxırsınız.

– Mən kənd təsərrüfat mütəxəssislərindən danışıram. Nərgiz müəllimdir. Onsuz da keçinmək olar.

– Mən yenə sizinlə razılaşa bilməyəcəm. Kəndə hər cür mütəxəssis lazımdır.

– Bir mənim qızım getməsə, keçinmək olmazmı?

– Düzü, çox qəribə mühakimə yürüdürsünüz. Əgər hamı "mənsiz də keçinmək olar" desə, işi kim görər? Bəs cəbhəyə övladlarını göndərənlərin yerinə olsanız neylərdiniz? Hər şeydən əvvəl adam gərək fədakar olsun.

– Bura bax, – deyə Muradov Nəsib dayını başdan-ayağa süzüb gülümsündü, – Bakıda agitatorlarımız çoxdur. Sənsiz də keçinə bilərik. Qızım bir il kənddə işləyib, bəsdir. Daha onu kənddə qoymayacam.

Muradovun zarafatı ilə ciddi sözünü seçmək çətin idi. Nəsib dayı papiros yandırdı, bir-iki nəfəs çəkib soruşdu:

– Niyə?

– Tək qız xeylağı kənddə dolana bilməz. Əziyyət çəkər. Özün bilirsən ki, hələ kənddə çox şey yoxdur.

– A dərdin alım, qoy özü desin, bu il onu ağzımda dilim kimi saxlamışam. İndi də onu elə saxlaram, heç ruhu da inciməz. Vallah, düz

sözümdür, onu yağ içində böyrək kimi bəsləyərəm, – deyə Tükəzban xala sözə qarışdı.

– Çox sağ ol, ay arvad, – Muradov Tükəzban xalaya çəpəki bir nəzər saldı. – Hörmətiniz artıq olsun. Ancaq elə şəhərdə, gözümüzün qabağında olsa yaxşıdır. Anası da onsuz dura bilmir.

– Düz deyir, bu il yediyim-içdiyim burnumdan gəlib.

– Axı niyə ey? – deyə Nəsib dayı gülə-gülə davam etdi: – Balaca ha deyil, ali təhsilli qızdır. Kənddə ona nə olacaq ki, siz qorxuya düşübsünüz? Keçən il pismi dolanıb?

– Orası elədir. Ancaq atayam da. Ürəyim yanında qalır.

– Ə kişi, heç nə olmaz, nahaq narahat olursunuz.

– Yox, elə demə. Bir də gördün birisi qolundan tutdu, gül kimi adını ləkələdi.

– Axı kim tuta bilər?

– Nə bilim, nə çoxdur adam. Zootexnikdən-mootexnikdən biri. Nəsib dayı qəhqəhə çəkdi. Muradovun bu sözlərinə gözü yaşarıncaya qədər güldü:

– Ali təhsilli, gözəl-göyçək bir aqronom olsa nə deyərsiniz?

Sözün yerinə düşdüyünə sevinən Tükəzban xala, ürək çırpıntısı ilə Muradovun cavabını gözlədi. O isə qaşqabağını töküb papirosunu sümürdü.

– Aqronom da zootexnikin tayıdır.

Onun səsindəki kinayəni duyan Tükəzban xala dözə bilmədi:

– Dərdin alım, ağranom olmaq pis ha deyil. O olmasa nə pambıq ərsəyə gələr, nə də taxıl. Dərdin alım, adam gərək kənddəkinin də qədrini bilə. Muradov təəccüblə arvadın üzünə baxdı:

– Mən nə dedim ki, xətrinizə dəydi?

– Axı onun oğlu ağranomdur, – deyə Nəsib dayı cavab verdi. Muradov qımışdı:

– İndi məndən nə istəyirsiniz?

– Müəlliməmizi.

– Nə müəllimə?

Nəsib dayı onun ciddiləşdiyini görüb səsinin ahəngini dəyişdi:

– Özünüz də hiss edirsiniz ki, sizin qapıya boş-boşuna gəlməmişik. Bizi buraya gətirən qızınız Nərgizdir. Məsələ belədir, – Nəsib dayı izaha başladı: – Bizim kəndin aqronomu İmran kəndimizin müəlliməsi və sizin qızınız Nərgizi istəyir. Gəlmişik sizin razılığınızı alaq.

Otağa sükut çökdü. Divardakı saat daha bərkdən çaqqıldadı. Tükəzban xala gözünü Muradovun ağzına zilləyib durdu. Muradov başı üzərində dayanan arvadının üzünə baxdı. Arvad ərinin "gördünmü, sənin qızın bizim başımıza nə oyun açdı" demək istədiyini dərhal anladı.

Muradovun əlləri yavaş-yavaş əsməyə, tükləri ağarmış gicgahlarındakı nazik damarlar şişməyə başladı. Arvadın rəngi ağardı. İllərdən bəri ərinin xasiyyətini bütün incəliklərinə qədər öyrənən Sona, bunun nə demək olduğunu dərhal anladı. O, bu saat Muradovun özündən çıxıb qonaqları bihörmət edəcəyindən, evdəki adamları bir-birinə qatacağından qorxdu. Həyəcan içərisində ərinə doğru əyildi. Qaş-gözlə onu başa salmağa çalışdı ki, "sakit ol, qız ağacı, qoz ağacı, hər ötən bir salba atar. Bizi biabır eləmə, ayıbdır. Kənddən gələndə nə olar?! Bir abırla danış, camaatı yola sal, əməlli-başlı söz de, söz eşit".

Lakin mümkün olmadı. Muradov fısıldayıb yerində qurcalandı. Nəsib dayını, Tükəzban xalanı diqqətlə nəzərdən keçirdi. Yenə arvadının üzünə baxdı.

Sükutun uzun çəkdiyini görən Nəsib dayı sakitcə papiros çıxardıb yandırdı.

– Nə yaman fikrə getdiniz?

Muradov diksindi. Özünü zorlayıb dodaqucu qımışdı və arvadının gözlədiyinin əksinə, sakitcə cavab verdi:

– Doğrusu, heç bilmirəm nə cavab verim? Zəhmət çəkib oradan buraya gəlibsiniz, amma yaman çiy iş görübsünüz.

– Nə təhər, dərdin alım? – Tükəzban xala dilləndi. Muradov arvada çəpəki nəzər saldıqdan sonra üzünü Nəsib dayıya tutdu.

– Özün məndən də yaxşı bilirsən ki, indiki zamanada əsas iş oğlanla qızdan asılıdır. Biz ata-analar ancaq kənardan baxanıq.

Nəsib dayı onun fikrini başa düşdü.

– Əlbəttə, elədir. Əgər onların arasında razılıq olmasaydı, biz sizə başağrısı verməzdik.

– Yəni deyirsən...

– Bəli.

– Heç ağlım kəsmir.

– Uzaqda deyil ki...

Muradov yenə arvadına baxdı.

– Get, o ölmüşü bura çağır.

– Bıy, iraq canından, niyə elə deyirsən?

O, Tükəzban xalanın sözünə fikir vermədi. Qonşu otağa qızı çağırmağa gedən arvadına nə isə işarə etdi.

Bir azdan Nərgiz pörtmüş halda içəri girdi. Utana-utana Nəsib dayıya, Tükəzban xalaya, sonra atasına baxdı.

Muradov gözlərini ağartdı.

– Heç utanırsan, bu nə oyundur başımıza açırsan?!

– Nə olub, ata?

– Heç nə, üzün ağ olsun.

– Axı, nə olub?

– Özünü bilməməzliyə qoyma! Kişilər sənin dalınca gəliblər. Nə deyirsən? Nərgiz udqunub gülümsündü.

– Nə deyəcəm, gəliblər, xoş gəliblər.

Hirsini güclə boğan Muradov, ilan çalmış kimi dik atıldı.

– Bu gündən mənim sən adlı qızım yoxdur. Hara istəyirsən rədd ol! Utanmaz!..

O, qonşu otağa keçib hirslə qapını çırpdı. İçəridəkilər donub qaldılar. Nərgiz üzünü əlləri ilə örtüb divanın üstündə oturdu. İçin-için ağlamağa başladı. Hamı ayağa durdu. Qonşu otaqdakı qızlar da gəldilər. Tükəzban xala Nərgizə yaxınlaşdı:

– Allah amanında qal, bala.

Nərgiz başını qaldırdı, qəhərdən titrəyə-titrəyə dedi:

– Tükəzban xala... Bu zaman hara belə?.. Qalın.

– Çox sağ ol, bala, qalmağa yerimiz var.

## 22

Nəsib dayı adəti üzrə bu gün yenə hamıdan əvvəl yuxudan durub kolxoz idarəsinə getdi. O, axşamdan verdiyi tapşırıqları yoxlamalı, maşınları yola salmalı, sonra briqadalara getməliydi.

Son partiya iclasından sonra Kosaoğlu çəkilib kənarda durur, əlini ağdan qaraya vurmurdu. Artıq yer əkdirdiyinə və kolxozçuların pulunu düzgün paylatdırmadığına görə partiya iclasında ona töhmət elan edildikdə Kosaoğlu qulaqlarına inanmamış, “Necə? Mənə, Kosaoğlu Qurbana töhmət verirsiniz? Ə, başınıza at təpib?” – deyə qışqırmış, sonra da, təklifi irəli sürən Nəsib dayının üstünə düşmüşdü. “Ə, heç nə danışdığını bilirsənmi? Ağlını başına yığ, isti yerini soyuq eləmə”.

Ancaq iclas öz qərarından dönməmiş, Kosaoğlunun hədəsinə baxmayaraq ona töhmət vermişdi.

Bir neçə gün yaralı qaban kimi gəzən Kosaoğlu qərarın rayon partiya komitəsində təsdiqindən sonra evə qapılmışdı. O, işin qızğın vaxtında hamının təntiyib əl-ayağa düşəcəyini və "Kosaoğlu, amanın bir günüdür, bizə kömək elə, sənsiz işimiz aşmır" – deyib yalvaracağını gözləyirdi.

O, əkin zamanı etdiyi kimi yenə də bir kələk qurmağı düşünürdü. Kosaoğlu əmindi ki, "İyirmi altılar" kolxozunda onsuz iş görmək mümkün deyil. O, əl qatmasa nə pambıq yığılar, nə də plan dolar.

Ərinin evdə olduğunu görən Sayalı əsəbiləşirdi.

– A kişi, get, işində-gücündə ol. Ağlını başına yığ.

– Qoy nə qayırırlar, qayırsınlar. Allahdan istəmişəm pambığı batıralar, hamısını dama basdıram.

Ancaq iş öz qaydası ilə gedirdi. Nəsib dayı hər işi öz əlinə almışdı.

O, idarənin qabağında İmranla rastlaşdı. Aqronom motosiklini minib getməyə hazırlaşırdı. Nəsib dayı onu saxladı.

– Zeynəbin briqadasında məni gözlə, – dedi, – sonra gülüb əlavə etdi: – Atım səninlə ayaqlaşmaz, yoxsa briqadaları birlikdə gəzərdik.

– İstəyirsiniz oturun, sizi aparım.

– Yox, a bala, qoca kişiyəm, sən get.

Onlar ayrılmaq istəyirdilər ki, Kosaoğlunun "Pobeda"sı qarajın yanında dayandı. Şofer düşüb maşına benzin istədi. Nəsib dayı ona yaxınlaşdı.

– A bala, xozeyinin hardadır?

– Evdə.

– Nə qayırır?

– Xəstədir.

– Bəs sən hara gedirsən?

– Nə bilim, hara desələr.

– Onda benzin götür, bizimlə gedəcəksən.

Şofer əl saxladı. Nə isə demək istədi.

– Tez ol, – deyə Nəsib dayı onu tələsdirdi.

– Mən gedə bilmərəm.

– Niyə?

– Xozeyin icazə vermir.

– Maşının xozeyini kolxozdur. Ayda neçə əməkgünü alırsan?

– Otuz beş.

– Onu sənə kolxoz verir. Zəhmət çək, kolxozla işlə. Tez ol, maşını sür.

– Dedim, sürməyəcəm.

– Onda açarı bura ver.

Məmməd əlində oynatdığı zəncirli açara baxdı:

– Mən maşını heç kəsə verməərəm.

– Sən nəçisən maşını vermirsən? – deyə yandan yaxınlaşan İmran dilləndi. – Gəmidə oturub gəmiçi ilə dava eləyəcəksən? Tez ol, xalqın işi-gücü var. Məmməd inadından dönmək istəmədi. Lakin qarşısında dayananların ciddiliyini görüb susdu. Əgər zora salsa, açarı ondan alacaqlarını yəqin etdi. Əvvəlcə rolun dalında özü oturmaq istədi, ancaq "Kosaoğlu bilsə atamı yandırar" – deyə düşündü və hirslə açarı yerə tulladı.

– Alın! Özünüz cavab verəcəksiniz.

– Şofer Məmməd uzaqlaşdıqdan sonra Nəsib dayı açarı götürüb İmrana baxdı.

Aqronom onun fikrini başa düşüb gülümsündü.

– Zərər yoxdur, özüm sürərəm.

İmran motosikli idarəyə qoyub, rulun dalına keçdi. Maşın pambıq tarlalarına doğru üz qoydu.

Onlar susurdular.

Nəsib dayı dalbadal papiros çəkirdi. Onu fikir götürmüşdü. Nə yoldan ötən yük maşınlarını, nə ağarışan çölləri, nə xaralları daşıyıb düşərgələrə yığan arabaçıları, nə də tərəcələrdə pambıqqurudanları görürdü. "Yox, belə olmaz . Məndə də günah çoxdur, – deyə düşünürdü. – Gərək hər şeyin çarəsini vaxtında qılasan. Qoymayasan iş-işdən keçsin. Vaxtında onunla ciddi danışsaydım, bəlkə də belə olmazdı".

Uşaq vaxtı eşitdiyi bir söhbət Nəsib dayının yadına düşdü. Qonşuları Alı kişi danışardı ki, bir gün bir qoca oturub alma yeyirmiş. Görür ki, balaca bir dozanqurdu onun üstünə dırmaşmaq istəyir. Kişi əlindəki bıçaqla qurdu kənara itələyir. Qurd dərhal kirpi boyda olub onun üstünə cumur. Kişi o qədər də əhəmiyyət verməyib bıçaqla yavaşca vurub onu öldürmək istəyir. Qurd daha da böyüyüb əjdahaya dönür və az qalır kişini yesin. Qoca bütün qüvvəsini toplayır və qurdu güclə öldürür. Sonra özünü danlayır ki, "taqsır məndədir. Gərək əvvəldən elə vuraydım, birdəfəlik öləydi". İndi Nəsib dayı Kosaoğlunu gözünün qabağına gətirdikcə, bu nağılı xatırlayırdı.

Toz-torpağa bulaşmış “Pobeda” tarlaların arası ilə gedirdi.

Pambıqlar saçaq -saçaq olub yerə tökülürdü.

İmran maşını sahələrdən birinin yanında saxladı.

Nəsib dayı yerə düşüb, iri söyüd ağaclarının dibi ilə şırıldayıb axan balaca arxdan tullandı. Kim isə kölgədə yatırdı. O, ayaq tappıltısı eşidib gözlərini açdı və bərkdən gərnəşdi. Birdən maşını görüb ayağa sıçradı. Üstünün tozunu çırpa-çırpa Nəsib dayıya yaxınlaşdı və tərs-tərs briqadirə baxdı.

Briqadir başını aşağı saldı.

– Sən qabırğanı yerə verib yatanda belə olar.

Elə bil briqadirin yaralı yerinə toxundular.

– A Nəsib dayı, adamı bitməz işə göndərirsiniz, adını da qoyursunuz yarıtmaz. Ə kişi, mən neyləyim, gücüm çatmır. Tərs kimi, mənim briqadama düşənlərin çoxu Kosaoğlunun qohum-əqrəbasıdır. Vallah, billah, öhdəsindən gələ bilmirəm. Ə kişi, mən heç Sayalıya söz deyə bilərəm?

Onlar söhbət edə-edə pambıq yığanlara tərəf gedirdilər. Nəsib dayı arabir əyilib, yerə düşən pambıqları götürür, tozunu çırpır və acıqlı-acıqlı briqadirə deyirdi:

– Bunun hamısı qızıldır. Sən bunun qədrini bilirsənmi?

– Bilirəm, niyə bilmirəm. Amma əlimdə əlac yoxdur.

Nəsib dayı briqadiri danlasa da, ürəyində ona haqq verirdi: “Məndə də günah çoxdur. Hamını işə cəlb edə bilməmişik”.

Maşının yanına qayıdanda Nəsib dayı elə pərt idi ki, çırtma vursaydın qanı çıxardı.

O, İmranın üzünə baxmadan:

– Kəndə qayıdırıq! – dedi.

Onlar yola düşdülər.

* * *

Kosaoğlu şoferin dediklərini eşidəndə qulaqlarına inanmadı. Tez bayıra çıxdı. Həyətdə maşını görməyəndə qan beyninə vurdu. “Necə, mənim maşınımı əlimdən alırlar? Mənim ha, Kosaoğlu Qurbanın qabağına keçirlər! Demək, onların gözü ayaqlarının altını seçmir! Hənək-hənək, axırı dəyənək? Bircə o qalmışdı ki, ayağımı yerdə qoyalar? Yox, daha buna dözmək olmaz. Bu saat aləmi bir-birinə qatmasam, anamdan əmdiyim süd mənə haram olsun”.

Kosaoğlu Məmmədi çağırdı:

– Bu saat get kəhər atı yəhərlə. Tez ol, daha durmaq vaxtı deyil.

Şofer bir anda gözdən itdi.

Ev-eşiyi yığışdıran Sayalı, ərinin vurnuxduğunu görüb, hirsindən dodağını çeynədi. "Sənə hələ bu da azdır. Lap yaxşı eləyirlər! – deyə ürəyində söyləndi. – Sən qırt toyuq kimi evdə oturanda, bilmirdinmi belə olacaq?!"

Kosaoğlu Sayalının ona məhəl qoymadığını görüb daha da hirsləndi:

– Gördün, arvad, bunların başımıza açdıqlarını?

– Gördüm, hələ harasıdır? Sən sonrasından qorx.

– Daha bundan artıq nə edəcəklər?

– Belə, sədrliyi də əlindən alacaqlar.

– Onlar kolxoza yiyəlik eləyəcək, mən də qıraqdan baxa-baxa qalacam?

– Qalacaqsan!

– O allahın birliyinə and olsun ki, dünyanı onların başına dar elərəm! Məni işdən çıxartmaq halvadır, nədir?

Sayalı özünü saxlaya bilmədi. Neçə gündən bəri ürəyinə yığdığı hirsi onun üstünə tökdü:

– Ay yazıq, heç xəbərin yoxdur, sən özün-özünü işdən çıxardıbsan. Neçə vaxtdır orda-burda gizlənirsən, evdə oturursan, kimə ziyan elədin? Yoxsa elə bilirsən sənin dalınca minnətçi gələcək? Yox, o baban öldü.

– İndi nə deyirsən?

– Nə deyəcəm! Heç nə! Qoy ağacın altına gəbə salım, başını yastığa qoy, ayaqlarını da uzat, yat.

Kosaoğlu özünü itirdi. "Deyəsən, axı, arvad məndən ağıllıdır. Doğrudan da mən geri çəkiləndə kimə neyləyirəm? Daha da onlara əl-qol açmağa imkan yaradıram".

– Yaxşı, arvad... De görüm məsləhətin nədir?

Sayalı ərinin vəziyyətini görüb yumşaldı, içəri qayıtdı.

– Məsləhətim odur ki, qolunu çirmə, işində-gücündə ol, camaat görsün ki, Kosaoğlu meydandadır. Raykomun, ispalkomun gözünə gir. Qoy onlar da desin ki, belə işçiyə töhmət vermək olmaz. Qandınmı? Sonra da əl altından bildiyini elə. Kişi sənə söz deyib, məsləhət verib.

– Kişi kimdir?

– Prokurorun dediklərini yadından çıxardıbsan?

Kosaoğlu fikrə getdi.

– Deyəsən, sən məndən ağıllısan, arvad.

Sayalı qaş-gözünü oynatdı.

– Mənim qədrimi sonra bilərsən.

Həyətdə at kişnəməsi eşidildi.

– Di get. Onların gözünün odunu almasan, kişi deyilsən! Ə, yatmaqdan nə çıxar?!

Kosaoğlu elə bil birdən-birə qüvvətləndi. Həyətə çıxıb atın belinə qalxdı. Yüyəni çeynəyən kəhər götürüldü. Sayalı ərinin dalınca baxa-baxa bir anlığa ötən günləri yadına saldı. "Qocalsa da, sümüyü yüngüldür. Atın belində qırğı kimi durur".

Kosaoğlu atını məktəbə sarı sürdü. Arvadın sözü ona bərk tutmuşdu. Kosaoğlu əsəbiləşir, nəyin hesabına olur-olsun, kolxozu əldən verməmək haqqında fikirləşirdi. "Kim qabağıma çıxsa, dəli inək buzovunu ayaqlayan kimi ayaqlayacam. Kosaoğlu ölməyib. Əlimi qatmamışam deyə pambıq tökülüb qalıb..."

Kosaoğlunun atı kəndin ortasındakı dikdirə çatanda bərkdən kişnədi. Sədr atın başını çəkib saxladı. Gözünü ağaran çöllərə zillədi. Üfüqlərə qədər uzanıb gedən pambıq tarlaları aydınca görünürdü. Düşərgələrin qabağına, yolların kənarına sərilmiş pambıq ağarırdı. Görünür, səhər-səhər üstünə şeh düşmüş pambığı qurudurdular.

Kosaoğlu dərindən nəfəs alıb göyün üzünə baxdı. Gün xeyli qalxmışdı. Hava tərtəmiz və şəffaf idi. Ağacların başına toplaşan qarğaların qarıltısından başqa kəndin sükutunu heç nə pozmurdu.

Bir dəstə quş havalanıb lap yuxarı qalxmışdı. Birdən güyültü qopdu. Quşlar qanadlarını büküb yerə şığıdılar. Bu, Kosaoğluna ləzzət verdi. "Bax, belə lazımdır! – deyə düşündü. – Yuxarı qalx, sonra da aşağı şığı, qabağına kim keçsə, üstünə cum. Onda səni sayarlar".

O, atı mahmızladı. Yolda Kazıma rast gəldi. Briqadirlikdən çıxarılandan sonra Kazım heç bir işə getmək istəmirdi. O, Qurban qağasının yeni vəzifə verəcəyini gözləyirdi.

Kazım Kosaoğlunu at belində görəndə:

– Uğur olsun, Qurban qağa, hara belə? – deyə soruşdu. – Bəs niyə at minibsən?

Kosaoğlu özünü sındırmadı:

– Ata minəndə adamın ürəyi tel-tel olur. Eşitməyibsən, at minən qocalmaz?!

– Elədir. Bir də, belə atı heç yüz maşına dəyişmərəm.
– Dalımca gəl! – deyə Kosaoğlu atı sürdü. Kazım onun dalınca yortdu.
Kosaoğlu atı məktəbin qabağında saxladı. Kəhər yüyəni çeynəyib kişnədi. Sədr əlindəki çubuqla müəllimlər otağının pəncərəsini döydü. Şüşələr az qaldı ovxalanıb tökülsün. Səs-küyə növbətçi müəllim bayıra çıxdı. Kosaoğlu salam vermədən, qəzəbli-qəzəbli soruşdu:
– Direktor hanı?
– Dərsdədir.
– Tez bura çağır.
– Beş dəqiqə gözləyin, tənəffüsə çaxacaq.
– Tez ol deyirəm sənə, nə tənəffüsbazlıqdır!
– Axı olmaz.
– Niyə?
– Dərsi poza bilmərəm.
– Mən dərs-zad qanmıram. Tez ol bəri çağır.
O, az qala atı məktəbin ortasına sürəcəkdi. Elə bu vaxt Kazım ləhləyə-ləhləyə özünü yetirdi.
– Nə olub, ay Qurban qağa?
– Get direktoru bura çağır!
Kazımın xırıltılı səsi məktəbi başına götürdü. O, sinif otaqlarının qapısını açıb-örtür və "direktor hanı?" – deyə bar-bar bağırırdı. Nəhayət, direktor bayıra çıxdı. Dırnaqları ilə yer eşən kəhər fınxırıb şahə qalxdı. Kosaoğlunun direktoru ayaqlatmaq istəyirmiş kimi, atı onun üstünə sürüb qışqırdı:
– Nə vaxtdan böyüyübsən?
– Nə olub?
– Adamın qabağına niyə çıxmırsan?!
Direktor gülümsündü.
– Yoldaş Kosaoğlu, ayda-ildə bir dəfə məktəbə gəlirsən, onda da dava ilə. Gəlibsən, atdan düş, gedək müəllimlər otağına.
– Heç yerə gedən deyiləm. Bu saat məktəbi bağla.
Direktor təəccüblə qaşlarını qaldırdı.
– Nə?..
– Uşaqları pambığa aparacam.
– Sizə bu ixtiyarı kim verib?
– Nə ixtiyarbazlıqdır! Kolxozun sədri mənəm. Məktəb də mənə tabedir. Tez ol uşaqları bəri tök!

– Bacarmaram. Sizin də buna haqqınız yoxdur.

– Mənim haqqım yoxdur, ə? Başına at təpib, nədir?

Ə, Kazım, tez ol uşaqları sinifdən çıxart, qat qabağına. Birbaş çölə! Bir buna bax, çöldə pambıq tökülüb qalacaq, bu da dərs keçəcək. Mənə sənin dərsin lazım deyil!

– Yoldaş Kosaoğlu, dərəbəylikdir-nədir, iki-üç gündür dərs başlayıb, sən nə ixtiyarla məktəbi dağıdırsan?

– Yaxşı eləyirəm, əlindən gələni beş qaba çək. Heç sənin böyüyünü də saymıram.

O, uşaqları bayıra çağıran Kazımın üstünə qışqırdı:

– Ə, belin qırılmayıb ha, tez olsana!

İçəridə hay-küy qalxdı...

* * *

İmran maşını Kosaoğlunun doqqazının qabağında, qoşa qoz ağacının altında saxladı. Ağacın başına toplaşıb qozları dimdikləyən qarğalar, maşının tırıltısından hürküb qırıldaşa-qırıldaşa ətrafa dağıldılar. Silkələnən budaqlardan tozlu yola dolu kimi qoz səpələndi.

Nəsib dayı yenicə tikan vurulmuş hündür çəpərli həyətə baxdı. Kosaoğlunun uşaqları eyvanda oynaşırdılar. Həyətdə toyuqlar eşələnirdi. Armud ağacının kölgəsində, ocağın üstündə yan-yana qazan asılmışdı. Bayaqdan bəri tövlənin qabağındakı çardağın kölgəsində yatan boz it, doqqazdan səs gəldiyini eşidib qulaqlarını şəklədi və birdən sıçrayıb ayağa qalxdı. Lakin o, axıra qədər qaça bilmədi. Ot tayalarının bərabərində zəncir dartıldı və boz it dal ayaqları üstünə qalxıb çırpındı. O yenidən geri qayıtdı və bir neçə dəfə eyvanın qabağında o tərəf bu tərəfə qaçdı.

Nəsib dayı ilə yanaşı dayanan İmran, itin zəncirinin həyət boyu çəkilmiş yoğun məftilə keçirildiyini gördü. İt qaçdıqca, zəncir məftilin üstü ilə sürüşüb cingildəyirdi. İmran acı-acı gülümsündü: "Zalım oğlu gör nə fikirləşib, qapı-bacasını necə də güdür!"

Şahnaz səs-küyə bayıra çıxdı. Onun başı açıq idi. Əlindəki daraqla yoğun hörüklərinin ucunu düzəldirdi. O, itə acıqlandı, evə qayıdıb əyninə başqa paltar geymək istədi, lakin fikrindən daşındı.

İmran Şahnazın qəsdən ağır-ağır yeridiyini, tez-tez dayanıb ayağındakı qırmızı qotazlı atlas başmağı düzəltdiyini gördü. Qız yeridikcə

qəsdən ləngərlənir, qırmızı butalı nazik ipək xalatının yaxasının açılmasına fikir vermirdi.

Şahnaz salam vermədən onlarla üz-üzə dayandı, başını azacıq sol çiyni üstə əyib gözlərini süzdürdü. Saçlarının ucunu qoşaladı və hörüyünü çiyni üstündən geri atdı. Xalatının yaxası daha da açıldı. Ağ sinəsindəki qızıl medalyonunun parıltısı İmranın gözünə düşdü. Bunu görən Şahnaz qaşını oynadıb yerində yırğalandı.

– Nə əcəb sizdən, yoldaş aqronom?

Nəsib dayı papirosunun kötüyünü yerə atdı.

– Dayın evdədirmi?

– Yoxdur, yoldaş partkom.

– Hara gedib?

– Bilmirəm.

– Bəs bibin hardadır?

– Nəyinə lazımdır?

– Ay qız, – İmran dilləndi, – atan yaşda kişi səndən söz soruşur, niyə əməlli cavab vermirsən?

– Səndən öyrənmişəm.

Həyətdəki armud ağacının dibində, əli belində hərlənib, qulplu qazanlarda bəhməz bişirən Gövhər qarıya göstəriş verən Sayalı Şahnazı çağırdı.

– Ay qız, kimdir, nə istəyir?

– Partkomla aqronom İmrandır, səni çağırırlar.

– Onların mənnən nə işi?

– Bilmirəm, gəl özün danış.

Sayalı doqqazda dayananları çoxdan görmüşdü, onların Şahnazla nə danışdıqlarını da eşitmişdi. Ancaq özünü elə aparırdı ki, guya heç nədən xəbəri yoxdur.

O tələsmədi, qazanların yanında hərləndi, pıqqıldayıb qaynayan bəhməzə baxdı, kəfgirlə qarışdırdı. Gövhər qarıya nə isə dedi. Doqqaza doğru addımladı. Sonra geri qayıtdı.

Nəsib dayı əsəbiləşsə də, özünü saxlayırdı. Şahnaz gözünü İmrandan çəkmirdi. Özünü laqeyd aparan İmran da hərdənbir gözaltı qıza baxır, onun dəyişdiyini, daha da gözəlləşdiyini görürdü.

Sayalı asta-asta onlara yaxınlaşdı:

– Nə istəyirsiniz? – deyə qəzəblə soruşdu.

Nəsib dayı müqəddiməsiz başlamağı lazım bildi:

– İşə niyə getməyibsən?

Arvadın qaşları çatıldı:

– Nə? İş? Hansı iş?

– Kolxozun işi.

– Mən birdən-ikiyə işə getmişəm?

– Getməyibsən, ancaq getməlisən.

– Bircə onu görməyəcəksiniz!

– İşə getməsən, kolxozdan çıxaracağıq.

– Məni?

– Bəli, səni!

Sayalının sinəsi qalxıb-endi. O, əlini belinə qoyub köksünü irəli verdi.

– Ə, Nəsib, hələ Kosaoğlu Qurban ölməyib ki, arvadı işə gedə. Gözünü sil, mənə düz bax. Ağlın uşaq-muşağa getməsin.

– Bəs sənin əvəzinə kim pambıq yığacaq? Kolxozun üzvüsən, payına düşən pambığı yığmalısan, – deyə İmran söhbətə qarışdı.

– Sən o ağlı get anana ver.

– Sayalı, – Nəsib səsini ucaltdı, – bura çənə-bazar açmağın yeri deyil. Bir saata kimi çöldə olmalısan, yoxsa axırı pis olacaq. Sənə də, güvəndiyin Kosaoğluna da.

Sayalı üzünü Şahnaza tutdu.

– Ay qız, get gör o it niyə zingildəyir, bəlkə zənciri dolaşıb.

Şahnaz bibisinin eyhamını başa düşüb bağa getdi. İmran yavaşca çəpərə yaxınlaşıb iri bir paya çıxartdı. Sayalı qışqırdı:

– Çəpəri niyə sökürsən?

Elə bu vaxt boz it Nəsib dayının üstünə atıldı. İmran ona imkan vermədi. Paya ilə itin biləyinə və ağzına döşədi. Boz it zingildəyib yerə çökdü. Bir-iki dəfə hücuma keçmək istədisə də bacarmadı, quyruğunu qısıb zingildəyə-zingildəyə geri qaçdı. Sayalı hay-küy saldı:

– Gör sənin başına nə oyun açacam! İtin biləyini niyə sındırırsan? Kosaoğlu ölüb ki, onun qapısına basqın eləyirsən?

Canı boğazına yığılmış İmran özünü saxlaya bilmədi:

– Səsini kəs! İti açdırdığın yetmir, hələ bir danışırsan da! Ərin hardadır? Sayalı İmranın pörtmüş sifətinə, titrəyən barmaqlarına baxdı. Cınqırını çıxartmadı.

– Sayalı! – deyə Nəsib dayı qətiyyətlə tapşırdı, – bu saat əl-ayağını yığışdır, işə get, Şahnazı da özünlə apar.

Onlar maşına oturdular. İmran hirslə pedalı basıb maşını işə saldı. “Pobeda” birdən irəli atıldı. Doqqazı toz bürüdü. Sayalı onların arxasınca baxıb donquldandı:

– Ciyəriyanmış gör necə havalanıb. Əliqurumuş itin biləyini sındırdı.

İmran maşını məktəbin həyətinə sürəndə, Kosaoğlu uşaqları yola çıxardırdı. Nəsib dayı maşını saxlatdı və təəccüblə Kosaoğluna baxdı.

– A Qurban, bu nə oyundur?

– Teatr çıxardıram!

Kosaoğlu atdan düşüb Nəsib dayı ilə üzbəüz dayandı.

– Nə istəyirsən?

– Bu uşaqları hara aparırsan?

– Pambığa.

– A kişi, sən dəli olubsan, nədir? Bu nə özbaşnalıqdır? Əvvəlcə kəndin arasında boş-boş gəzənləri, evdə oturan qohumlarını işə çıxart. Pambığı yığa bilməsək, məktəb uşaqları özləri bizə köməyə gələcəkdir. Yoxsa bu nə zorakılıqdır, təşkilat-zad yoxdurmu?

– Təşkilat mən özüməm, heç kimi tanımıram.

– Təqsir bizdədir ki, indiyə kimi təşkilatı sənə yaxşı tanıtmamışıq.

Nəsib dayı çaşbaş qalan uşaqlara dedi:

– A bala, gedin dərsinizi oxuyun!

Uşaqlar qaçıb məktəbə doluşdular.

Kosaoğlu Nəsib dayının üzünə qabardı:

– Bəs pambığı kim yığacaq?!

– Kim yığacaq? Sənin arvadın Sayalı, qapıda-bacada gizlənən, şəhərdə alver edən qohumların.

– Arvad-uşaqla işin olmasın.

Nəsib dayı hövsələdən çıxmışdı:

– Məni başa sal görüm, sən özünü nə hesab edirsən? De görüm bir axı sən kimsən? Xalq işləyəcək, sənin arvadın da evdə piylənəcək? İti açıb gələnə qısqırdacaq? Yox, Kosaoğlu, mən indiyəcən səninlə mülayim danışmışam, səni adam hesab etmişəm, başa salmağa çalışmışam. Amma sən qanmadın. İndi mən səninlə ayrı cür danışacam.

– Nəsib, mənnən buynuzlaşa bilməzsən.

– Sənin kimi buynuzluları çox görmüşük. Bu saat get arvadını, bütün qohumlarını çölə göndər. Göndərməsən, axırı pis olacaq.

– Ə, neyləyəcəksən? Göndərmirəm!

Nəsib dayı mübahisə etməyi yersiz bildi.

– Göndərməsən, partiya biletinlə cavab verəcəksən.

– Nə? Partbilet?

– Bəli, partbilet! – deyə Nəsib dayı qayıdıb maşında oturdu. Kosaoğlu yerində mıxlanıb qaldı...

## 23

İmran dan yeri ağaranda yuxudan durub geyindi və həyətə çıxdı. Əvvəlcə qolundakı saata, sonra qızaran üfüqlərə baxdı. Göy üzünə səpələnmiş ulduzlar solğunlaşıb bir-bir sönürdü. Yalnız şərq tərəfdə dan ulduzu iri almaz parçası kimi titrəyirdi.

"Yaman gecikmişəm" – deyə o, fikrindən keçirdi.

Xalxaldakı camışı sağıb, evə qayıdan Tükəzban xala oğlunun narahatlığını görüb dedi:

– Səhərin yuxusu şirin olur, özüm qıyıb səni durğuzmadım. Axşam da idarədən gec qayıtdın.

– Çalışıram, mümkün edə bilmirəm, ay ana. Pambıq saçaq-saçaq olub yerə tökülür, yığıb-yığışdırmaqla qurtarmır. Heç belə vaxtda adamın gözünə yuxu gedər?

İmran həyətdəki göy rəngli "Moskviç"ə yaxınlaşdı. Qapını açıb rulun dalına keçdi.

– Ana, gəl otur!

– Yox, dərdin alım, sən get. Mən qızlarla gələrəm.

– Gözlə ha, sonra qızlar səni yorub yolda qoyarlar.

– Bacarmazlar, bala.

Maşın yüngülcə tərpəndi, həyətdən çıxıb yola düşdü. İmran bu maşını təzə almışdı. Tükəzban xala Bakıdan qayıdandan sonra düyünçəsini açıb oğluna pul vermişdi.

"A bala, get özünə əməlli-başlı maşın al, moskletdən gözüm su içmir"

İmran anasını öpüb pulu götürmüşdü.

"Moskviç" kəndin içinə çıxanda kəsik-kəsik fit verdi. Səhər-səhər bu fiti eşidən kimi, demək olar hamı eyni şeyi düşünürdü: "Aqronom oyanıb, işə getmək vaxtıdır".

İmran maşını idarənin yanından sürdü. Qapı ağzında onu gözləyən Nəsib dayını götürdü. Birlikdə kəndin arasında dolandılar.

Göyün üzü tamam ağardı. Qəfil qalxan xəfif külək ağacların yarpaqlarını xışıldatdı. Xoruzlar səs-səsə verdi. Evlərin qapıları açılıb-örtüldü. Küçələr adamla doldu.

– Bir-iki dəfə də siqnal ver, gecikən olar.

– İnanmıram bu saat işə gecikən ola. Nəsib dayı. Axır vaxtlar yuxudan nə zaman durduqlarını da bilmək olmur. Yaman həvəsə gəliblər.

– Hələ harasıdır! Bu saat nə gəlir var, pambıqdandır.

Maşın, yolun kənarı ilə gülüşə-gülüşə işə gedən qızların yanından ötüb, balaca körpünü keçdi.

İmran gözünü yollara zilləyib fikrə getmişdi. Bir aydan çox idi ki, dərslər başlanmışdı, lakin Nərgiz hələ gəlib çıxmamışdı. Tükəzban xala Bakıdan qayıdandan sonra da İmran ümidini kəsməmişdi. O, əmin idi ki, Nərgiz dərs vaxtı gəlib çıxacaqdır. Axı onlar bir-birinə söz verib əhd-peyman bağlamışdılar. Nərgiz yay tətilinə gedəndə İmran özü onu yola salmışdı. Onlar rayon mərkəzinə qədər piyada getmişdilər. Nərgiz özü xahiş etmişdi ki, "gəzə-gəzə gedək". Onlar böyük torpaq yoldan çıxıb cığıra düşmüşdülər. Nərgiz uşaq kimi sevinirdi. Gah çiçək dalınca qaçır, gah da palıd ağacının dibində dayanıb quşların civiltisinə qulaq asırdı. Ağaclar sıxlaşdıqca hava bürküləşirdi. Nərgiz kəlağayısını əlinə almışdı, sinəsi açıq idi. Güllü şifon koftasının tünd-yaşıl yaxalığı ağ boynunu daha da gözəl göstərirdi. İmran diqqətlə baxdıqca, Nərgizdə yeni-yeni gözəlliklər tapırdı.

Qızın açıq qolları nə qədər də yumşaq və zərif idi! Güləndə sinəsi necə də titrəyirdi! Saçları ipək kimi axıb çiyninə tökülmüşdü. Nərgizin elə bil xasiyyəti də dəyişmişdi. Tez-tez İmranın qoluna girir, onun hər sözünə qaqqıltı ilə gülür, cüzi bir məsələ üstündə höcətləşirdi. İmran qızın sevindiyini aydınca görürdü. Ancaq o nəyə sevinirdi? Bəlkə Bakıya getdiyinə, özünün köhnə tanış-bilişləri ilə görüşmək üçün imkan tapdığına sevinirdi? Bəlkə indi Teymur da ordadır? Bəlkə Nərgizi qanadlandıran elə bu görüş arzusudur?

İmranın qaşları çatıldı. Nərgiz bunu hiss etmədi. Qaçıb palıdın kölgəsindəki göylükdə oturdu. İmran dinməz-söyləməz onun yanında əyləşdi. Meşə min bir dillə pıçıldaşırdı.

İmran yerdən bir ot qoparıb dişləriylə didişdirməyə başladı.

– Deyəsən, sevinirsən?

– Niyə də sevinməyim?

– Bakıya getdiyin üçün?

– Yox.
– Bəs nədən ötrü?
Nərgiz İmrana daha yaxın oturdu. Əllərini İmranın boynuna salıb çarpazladı. İmran gözlərini qızın üzünə zillədi. Birdən Nərgiz titrəyib onun sinəsinə qısıldı.
– Elə baxma...
Nərgiz onu öpüb qaçmaq istədi. Ancaq bacarmadı...
Onlar vaxtın necə gəlib keçdiyini bilmədilər. Gün əyiləndə göyün üzünə qara bulud gəldi, iri damlalı yağış çilədi. Onlar bunu da hiss etmədilər. Yağışdan sonrakı göy qurşağını belə görmədilər. Ancaq otluqda üst-başlarının şehə batdığını görüb təəccübləndilər.
Sahildə dayandılar. Suların qızaran, kölgələrin uzanan vaxtı idi.
– Mən bunu heç vaxt unutmayacam, İmran!
– Nəyi?
– Bizim bu görüşümüzü. Sahildə dayanıb üfüqdəki dağlara, axar sulara baxdığımızı...
– Səni bilmirəm, mən heç unuda bilməyəcəm, Nərgiz!
Onlar ulduzlar doğana qədər sahildə qaldılar. Birinci qatara gecikdiklərindən, İmran Nərgizi ikinci ilə yola saldı. Ayrılanda Nərgiz dönə-dönə tapşırdı:
– Bax, adam göndər ha, gözləyəcəm.
İndi İmran bunları necə başa düşsün? Yoxsa o, bir şəhər qızının şıltaqlığına uymuşdu? Atası razı deyil, bəs özü?.. Məgər Nərgiz uşaqdır? Doğrudanmı onun taleyi atasının iradəsindən asılıdır?
İmran, anası Bakıdan qayıdandan sonra Nərgizə üç məktub yazmışdı, cavab almamışdı. "Bu nə deməkdir? Yoxsa o, mənimlə əylənirdi? Bəlkə mənim məhəbbətimi də bir xatirə kimi öz gündəliyinə yazıb üçüncü bir oğlana oxuyacaq?"
İmran fikirləşdikcə həyəcanlanır, aldadıldığından qorxurdu. Dünyada onu ən çox qorxudan aldadılmaq idi. Çünki o, ömründə heç kəsi aldatmamışdı.
İmran zahirdə özünü gümrah tutsa da, xəcalətindən buz kimi əriyirdi. Otuz yaşına qədər heç kəsə bir söz deməyib, özünü ağır saxlayan bir oğlana belə bir hadisə təsir etməyə bilməzdi. Bu, İmranın ilk məhəbbəti idi. İndiyə qədər onu çox qızlar istəmişdi. Hətta bəziləri dözə bilməyib öz dilləri ilə sirr açmışdılar. İmran isə çox nəzakətlə başa salmışdı ki, onları sevə bilməyəcək, üstəlik onlara öyüd-nəsihət

vermişdi ki, "hər oğlana sirr verməyin, dünyada nanəciblər də çoxdur. Sonra pak məhəbbətinizdən sui-istifadə edərlər".

Qızların bəziləri incisə də, sonra ona haqq vermişdilər.

O, institutda oxuyarkən ailə və məhəbbət məsələlərinə yüngül nəzərlə baxan yoldaşlarına da acıqlanar, yaşlı bir adam kimi, onları danlardı.

İmran evlənmə məsələsinə çox böyük əhəmiyyət verirdi. Onun fikrincə, insan ömründə bir dəfə evlənməli və axıra qədər o qadınla yaşamalıdır. Qadını, yaxud kişini tez-tez dəyişmək insanı daxilən çürüdür, hətta bəzən məhv edir. Məhz buna görə də evlənərkən çox düşünməli, ilk təəssürata əsir olmamalısan.

Nəsib dayı da fikirli idi. O, gözaltı İmranı süzür və ürəyində Nərgizin atasını məzəmmət edirdi. O, özü ata olmasa da, atanın nə demək olduğunu Muradovdan yaxşı başa düşürdü.

Nəsib dayı atalıq borcunu yalnız övladı yaxşı geyindirib yedirməkdə görən adamlara gülərdi. Belə atalar adətən həmişə övladlarını sıxır, "mən səni saxlamışam, boğazımdan kəsib sənə vermişəm, mənə borclusan, ona görə də mən nə desəm, o olmalıdır" deyirlər. Övladlarının müstəqil yaşamasının əleyhinə çıxırlar. Çalışırlar ki, uşaqları da onlar kimi düşünsün, onlar kimi hərəkət etsin, onlar kimi yaşasınlar. Bu cür adamlar elə zənn edirdilər ki, həyatı, yaşayışı dünyada onlardan düzgün başa düşən yoxdur, heç kəs onların dediyinin əleyhinə çıxa bilməz. Övlad onun dediyini dinməz-söyləməz yerinə yetirib cavab qaytarmamalıdır. Bu qanun pozulduqda onlar müstəbidləşirlər.

Nəsib dayı bu cür adamları bədbəxt hesab edirdi. Çünki onlar öz aləmlərində övlada yaxşılıq edib qayğısına qalır, onun xoşbəxtliyinə çalışır, əslində isə qaş düzəltmək əvəzinə göz tökürlər. Unudurlar ki, hər quşun öz uçuşu var; ata körpəsini pərvazlandırıb uçurtduqdan sonra onun qanadını bağlaya bilməz.

Muradov belə atalardan idi. Nəsib dayı elə ilk söhbətdən bunu duymuşdu. Ancaq o, Nərgizin iradəsizliyinə inana bilmirdi.

O, aqronoma təskinlik vermək istəyirdisə də bacarmırdı. Nəsib dayı ilk sevginin nə demək olduğunu, nakam məhəbbətin dəhşətlərini çox yaxşı bilirdi...

Nəhayət o, papirosunu maşının pəncərəsindən kənara atıb dilləndi:

– Çox fikir eləmə, a bala.

İmran diksinib xəyaldan ayrıldı.

– Nə fikir, Nəsib dayı?

Nəsib dayı nə deyəcəyini bilmədi. Fikrini dəyişdi. İmranın yarasına toxunmamağı daha münasib bildi:

– İşi-gücü deyirəm, düzələcək. Bu il pambığımız yaxşıdır. Keçən il bu vaxt heç otuz faiz verməmişdik. İndi altmışı keçmişik. Yeni üsulla becərmə qolumuzdan tutdu.

İmran Nəsib dayının başqa söz demək istədiyini, lakin mövzunu qəsdən dəyişdiyini hiss etdisə də, üstünü vurmadı. Qüssəli-qüssəli qımışdı.

– Bəs maşınlar? Sözün düzü, təzə direktor bizim yaman dadımıza çatdı.

– Düz deyirsən, qoçaq oğlanmış.

Onlar birinci briqadanın tarla düşərgəsinə çatdılar.

Zeynəb bir saat əvvəl məntəqəyə yola saldığı maşını gözləyir, arabir də qurudulmuş pambığı xarallara dolduranlara kömək edirdi. Lakin qızın diqqəti başqa yerdə idi. Gözlərini sahənin aşağısında işləyən pambıqyığan maşına zilləmiş İmranın solğun çöhrəsinə fikir verdikcə, gizlicə köksünü ötürdü: "Qızı vermədilər, gədə fikir çəkir. Gör bir necə arıqlayıb". O yaxınlaşıb ehmalca İmranın qoluna toxundu:

– Üzünü niyə qırxdırmırsan? Lap keşişə dönübsən...

– Vaxt yoxdur, – deyə İmran köksünü ötürdü.

– Ə, buna nə vaxt? Çobanın könlü olsa, təkədən pendir tutar. Ayıbdır, get üzünü qırxdır, yoxsa qızlara göz eləyərəm, səni hoydu-hoyduya götürərlər.

İmran Zeynəbin qəsdən zarafat eləyib onun könlünü açmaq istədiyini hiss edir, daha da kədərlənirdi.

Xarallara doldurulan pambığı yoxlayan Nəsib dayı İmranı çağırıb, başqa briqadalara da baş çəkməyi təklif etdi.

Onlar getməyə hazırlaşanda Zeynəb:

– Günorta bizə qonaqsınız, – dedi.

– Nə münasibətlə? – İmran maraqla ona baxdı.

– Gələrsiniz, görərsiniz.

Onlar geri qayıdanda briqada çinar ağacının kölgəsinə toplaşmışdı. Tükəzban xala qolunu çirməyib qazanların yanında hərlənir, bişirdiyi xörəyin dadına baxırdı. Bir tərəfdə də samovarlar səs-səsə vermişdi. Kərim dayı artezian quyusundan bir çəllək su gətirmişdi.

Çinar ağacının kölgəsində böyük məclis qurulmuşdu. Briqada bayram edirdi.

Zeynəb, planı dolduran kimi elə tarlada öz üzvlərinə qonaqlıq verəcəyini yığıma başlayanda qərara almışdı. Bu gün onun briqadası planı doldururdu. Adamlar yavaş-yavaş çinarın kölgəsinə toplaşır, ortada hərlənib göstəriş verən briqadirə söz atırdılar.

– Bu nədir, ay Zeynəb, kimin toyudur?

– Briqadanın toyudur. Əhd eləmişəm, planı iki yüz faiz yerinə yetirəndə elə burada daha böyük məclis düzəldəcəm.

Bir dəstə kolxozçu İmranın başına toplaşmışdı. Onlar qızğın mübahisə edirdilər.

– Məsələ təkcə pambığı əkib-becərməkdə deyil. Gərək onu vaxtında yığmağı bacarasan. Hələlik havalar yaxşıdır. Qorxusu yoxdur. Amma birdən payız yağışları başlasa, keçən ilki kimi zəhmətimiz hədər gedəcək...

– Ona görə də pambıqyığan maşınlardan istifadə etmək lazımdır, – deyə İmran cavab verdi.

Kolxozçu başını buladı:

– Sözün açığı, mənim o maşınlardan ağlım bir şey kəsmir.

– Düz demirsən, Əhməd dayı, maşınlar çox gözəldir. Ancaq biz onları işlədə bilmirik.

– Bəs ona nə deyirsən? – Qoca qonşu kolxozun tarlaları üzərində uçan təyyarəni göstərdi, – dərmanla pambığın yarpağını töküb, kolları vaxtsız qurudur.

– O da lazımdır. Maşının işləməsi və əla növ pambıq yığılması üçün yarpaqlar tökülməlidir.

– Axı qozalar gömgöydür.

– Demək, suyu vaxtında verməmişik, günah yenə də özümüzdədir.

– Vallah, ağlım bir şey kəsmir, – qoca inadından dönmədi.

İmran qocanı inandırmaq üçün fakta müraciət etdi:

– Zeynəbin briqadası maşın işlətməsəydi, planı hamıdan tez doldurmazdı.

– O heç, a bala, qız deyil, od parçasıdır.

– Bir vaxt vardı, kəndə traktor gələndə də bəziləri belə deyirdi. Axırda nə oldu? – Kərim dayı da söhbətə qarışdı.

– O başqa məsələ, ay Kərim, – qoca qəlyanını sümürüb davam etdi. – Kolxoz yeni quralanda traktorun dilini bilən yox idi. Maşınlar tez-tez xarab olub, şumun içində qalırdı. Ona görə də çoxumuz inanmırdıq. Amma indi elə traktorçular var ki, maşını on il sürür, bir vinti də xarab olmur.

– Ay sağ ol. Elə mənə də bu lazım idi, – deyə Kərim dayı dikəldi. – Demək, günah maşında deyil, bizdədir. Biz hələ onun dilini öyrənə bilməmişik. MTS-lərdə yaxşı mütəxəssislərimiz azdır.

Bu vaxt Zeynəbin səsi eşidildi:

– Ay İmran, iclasınızı qurtarın.

Hamı süfrəyə yığışdı.

Qocaman çinarın yarpaqları xışıldayırdı. Deyib-gülənlərin səsi bir-birinə qarışmışdı...

## 24

Zeynəb yan arxı keçəndə diksinib dayandı. Ona elə gəldi ki, yarğanın dibindən qalxan kölgə sinə-sinə ötüb qaratikan kolları arasında gizləndi. Hətta oradan şıqqıltı eşidildi.

Zeynəb ayaq saxladı, ürəyi döyünə-döyünə qulaq asdı. Çöllər səssiz idi. Yalnız gecə böcəkləri qəmli-qəmli ötürdü. Elə bil onlar isti payız günündən sonra axşam sərinliyində dincələn çöllərə laylay çalırdılar. Cırcıramaların, çəyirtkələrin bu məhzun nəğmələri Zeynəbi darıxdırdı. Onun da qəlbini hüzn bürüdü. Ürəyində özünün də başa düşmədiyi hisslər oyandı. Tərəddüd içində dayanıb pıçıldadı: “Bu nə idi? Bu zaman yarğanda gizlənən kim ola? Düz adamdırsa, niyə yolla getmir?”

Zeynəb əvvəlcə şıqqıltı gələn tərəfə getmək istədi, bir-iki addım atıb dayandı: “Əgər bu doğrudan da adamdırsa, bu saat yenə tərpənəcək. Bəlkə də yola çıxacaq”. Bir az gözlədi. Nə bir səs, nə bir hənirti eşitdi. “Mən də lap məzəli olmuşam, deyə qız öz-özünü danladı, – adam nə gəzir, deyəsən məni qara basır. Elə bil heç bu çölləri ərşi-arğac eləyən Zeynəb deyiləm”.

O, şırıltı ilə axan suyun üstündəki daş körpüdən keçib yola çıxdı. Ancaq bu zaman hiss etdi ki, gecikmişdir. Həmişə bu vaxt evdə olar, yeyib-dincələr, ya da idarəyə gedərdi. İndi isə yolu yarı da eləməmişdi. Kəndin işıqları uzaqdan güclə seçilirdi, ətrafı qaranlıq bürüyürdü.

Zeynəbin bu dəfə qızlardan ayrılıb gecə vaxtı yola tək çıxmasına səbəb traktorçu Əli idi. Zeynəb, sözü adamın üzünə deyən, heç kəsdən qorxmayan, gecə-gündüz işləyən, necə deyərlər, qızdan-gəlindən həyalı olan bu oğlanı xoşlayır və “qiyamət traktorçudur” – deyə qızlara tərifləyirdi.

Əli “İyirmi altılar” kolxozundan deyildi. Bu kənddə onun nə bir qohumu, nə də tanışı vardı. O, gündüzlər tarlada işləyir, axşam da düşərgədə yatırdı. Ona ayrıca otaq, çarpayı, yorğan-döşək vermişdilər. Yemək-içməyi də pis deyildi. İmran onu bir-iki dəfə evə dəvət etmişdisə də, Əli razı olmamışdı.

Zeynəb əvvəllər ona o qədər fikir verməzdi. Ancaq dünən bir hadisənin şahidi oldu.

Günorta üstü hava çox isti idi. Zeynəb düşərgəyə gəlirdi. Onun dili-dodağı təpimişdi. Su içmək üçün arxa yaxınlaşdı, birdən yerindəcə donub qaldı. Əli arxın kənarında oturmuşdu. Soyuq suda yuduğu dəyişəyini göy otluğa sərmişdi. Özü də söyüdün kölgəsində nə isə yamayırdı. Zeynəb səssizcə dayanıb, onun iynəni necə sapladığına, paltara vurduğu tikişlərə baxdı. Birdən qızın ürəyi elə ağrıdı ki, hər şeyi unutdu, birbaş onun yanına yönəldi. Şıqqıltı eşidən Əli başını qaldırdı, Zeynəbi görcək sərdiyi paltarı tez yığışdırıb gizlətmək istədi. Ancaq gecikdi. Zeynəb onun üstünü almışdı. Qız, traktorçunun çaşdığından iynəni əlinə batırdığını gördü. Zeynəb heç nə soruşmadan, Əlinin yamadığı köynəyi götürdü. Onun tikişlərinə baxıb gülümsündü.

– Bu nədir, elə bil yer əkmisən?

– Neyləyim, bacardığım budur.

– Qızlardan birinə verə bilmirdin?

Əli daha da qızardı:

– Nə bilim, cürətim çatmadı.

– Oğlan cürətsiz olsa, qızlar onun başına oyun açar. Deyəsən, iynə əlinə bərk batıb?

Əli qanamış barmağını gizlətdi.

– Bekara şeydir.

– Belə tikiş tikməyi kimdən öyrənibsən?

– Heç kimdən. Elə öz-özümə öyrənmişəm. Yetim oğlanam, beş-altı yaşından cırıq-söküyümü özüm tikirəm...

– Niyə? Qohum-əqrəban yoxdur?

– Yox... Atamın üzünü heç görməmişəm. Mən bir yaşında olanda quldurlar vurublar. Anam da ki, ondan üç-dörd il sonra azarladı...

Əlinin səsi titrədi. Zeynəb verdiyi sualın traktorçuya təsir etdiyini görüb peşman oldu.

– Ürəyini sıxma, elə mən də sən gündəyəm.

– Ürəyimi niyə sıxıram? Mən boyda kişi, durub təzədən yetimlikdən şikayət eləyəcəyəm?

Zeynəb köynəyi yamayıb qurtardı. Göylüyə sərilmiş paltarı yığdı.

– Axşam aparıb özüm evdə yuyaram da, ütüləyərəm də.

– Yox, yox, dəymə.

– Bu nə sözdür! – deyə Zeynəb ona acıqlandı. – Mən də sənin bacın.

– Axı əziyyət olar...

Zeynəb dinməz-söyləməz, paltarı yığıb evə apardı. Gecə yarıya qədər yatmadı. Yuyub ütülədi, dəsmalları səliqə ilə qatlayıb ətir səpdi. "Qərib adamdır, qoy xətri xoş olsun, – dedi, – onsuz da ürəyi sınıqdır".

Səhər Zeynəb evdən gətirdiyi isti çörəklə camış qaymağını onun qabağına qoydu.

– Qonağa hörmət borcumuzdur, ye.

Əli Zeynəbə baxıb qımışdı:

– Mənə çox mehribanlıq eləmə, sonra şirnikib kəndinizdə həmişəlik qonaq qalaram.

– Canın sağ olsun, nə çoxdur qonaq sevən qızlarımız, heç kəsi qapıdan qovmazlar. Ancaq qorxuram gələn qonaq özü hürküb qaça.

– Qaçmaz.

Zeynəb şaqqıldayıb güldü və qızların dalınca qaçdı...

Bu axşam o, yenə düşərgədə ləngidi. Əli qaranlıq qarışdığını görüb, onu tək buraxmaq istəmədi. Zeynəb razı olmadı, pambıq kollarının arası ilə atıla-atıla qaçıb uzaqlaşdı.

İndi o tələsir, kəndə tez çatmaq üçün addımlarını yeyinlədirdi. Göyün üzünü bulud bürümüşdü. Deyəsən, yağacaqdı.

Zeynəb qorxunu unutmaq üçün zümzümə eləyir, fikrində dağı arana, aranı dağa köçürürdü. Hətta o, yol uzunu bir-iki dəfə fit də çaldı.

Zeynəb ən çox qorxduğu yerləri keçib kəndə yaxınlaşanda sakitləşdi. Arxayın-arxayın yeridi. Fikri İmranın üzərində dayandı. "Demək belə, Tükəzban xala Bakıdan əliboş qayıtdı. Nərgiz müəlliməni vermədilər. İmran yaman qaşqabaqlıdır. Ac-susuz gəzir.

– Zeynəb əsəbiləşdi. – Allah vurmuşdu onları, qabaqlarına İmran kimi oğul çıxıb, pirlərinə təpik atırlar. Qızlarını ondan artığına verəcəklər?.."

Zeynəb bu cür fikirlərlə kəndin kənarındakı qəbristanlığa qədər gəldi. Birdən at fınxırtısına bənzər bir səs eşitdi. Lap yaxında hənirti duydu. Fikirdən ayrılıb ətrafa göz gəzdirdi. Qaranlıq idi. Arabir yağış damcılayırdı. Təpədəki qəbir daşları güclə seçilirdi. Zeynəb uşaqlıqda goreşən haqqında eşitdiyi nağılı xatırladı. Vahiməlendi. Bir anlığa bil-

mədi nə etsin! Qəbristanlığın yanından keçsin, yoxsa dönüb geri qayıtsın, yuxarıdakı yola düşsün.

Zeynəb yoluna davam etdi.

Qəbristanlıqdan bir qaraltı aralanıb qabaq tərəfdən yola endi. Zeynəb dayanan kimi qaraltı ona yaxınlaşdı. Zeynəb mıxlanmış kimi yerində qaldı. Onun boğuq, quyu dibindən gəlirmiş kimi zəif səsi güclə eşidildi:

– Kimsən?

Qaraltı Zeynəblə üz-üzə dayandı. Qız onun sifətini görə bilmədi. O, başını sarımışdı.

– Bayaq fit çalan kim idi?

– Kazım, sənsən? Gecə vaxtı goreşən kimi qəbristanlıqda nə gəzirsən, baş-gözünü niyə sarıyıbsan?

– Hələ bir de görüm bayaq fit çalan kim idi?

– Harada?

– Körpüdən bir az bəridə.

Zeynəb duruxdu. Yan arxın yanında gözünə dəyən qaraltını yadına saldı. "Demək, məni qara basmırmış".

– Mən idim.

– Yanında heç kəs yox idi?

– Yox.

– Mən elə bildim tək deyilsən, yanında kişi var.

Zeynəb yoluna davam etmək istədi. Kazım onun qabağını kəsdi.

– Dayan, sənnən işim var.

Kazımın səsi daha da xırıldadı. Zeynəb ehtiyatlanmağa başladı.

– Sarsaq-sarsaq danışma. Rədd ol yoldan, allah batırmış!

Kazım qızın qolundan yapışdı. Zeynəbin ürəyi elə döyündü ki, az qaldı sinəsini partlatsın. O ancaq indi gecəyə qaldığına, vaxtında qızlarla çıxıb getmədiyinə heyifsiləndi. Döyükə-döyükə ətrafa boylandı. Qaranlıqda heykəl kimi dayanan lal qəbir daşlarından başqa heç nə görünmürdü. Yağış damlaları yavaş-yavaş artır, otları, ağacların yarpaqlarını şıqqıldadırdı. Bir az əvvəl səs-səsə verən gecə böcəkləri də susmuşdular. Zeynəb tək və köməksiz olduğunu duydusa da, özünü topladı:

– Qolumu burax, axmaq!

– Çığır-bağır salma.

– Çəkil deyirəm!

– Dilini yığ. Yoxsa bu saat bağırsağını ayaqlarına dolayaram.

Zeynəb Kazımın əlindəki iri bıçağı gördü.
– İndi qandınmı?
Zeynəb dinmədi. Kazım onun susduğunu görüb bıçağı gizlətdi. Elə bu zaman qulağının dibinə ağır bir yumruq dəydi. Zeynəb dartınıb qaçdı. Kazım özünü itirdisə də, fürsəti əldən vermədi. Qızın dalınca yüyürdü. Çox keçməmiş ona yetişdi, saçını biləyinə dolayıb özünə tərəf çəkdi. Zeynəb qışqıra-qışqıra Kazımı yumruqlayır, təpikləyir, əlini-ayağını dişləyir, üz-gözünü cırmaqlayır, yaxasını qurtarmaq istəyirdi. Kazım isə onu süpürləyib yıxmağa, əl-ayağını sarımağa çalışırdı. Onlar xeyli çarpışdılar. Kazım Zeynəbin qışqırdığını və tabe olmaq istəmədiyini görüb daha da hirsləndi.
– İtin küçüyü, səsini içinə sal!
Zeynəb heç nə eşitmir. Kazımı hey döyəcləyirdi. Birdən Zeynəbin qulağının dibinə ağır yumruq dəydi. O özünü tarazlamamış, ikinci zərbədən səndələdi. Kazım qızın zəiflədiyini görüb belindən qucaqladı, badalaq vurub arxası üstə yerə yıxdı, üstündə oturub qollarını dizi ilə basdı. Zeynəb çırpınıb qıy çəkdi.
– Xır-xır köpək oğlu, burax məni... Burax məni, deyirəm sənə!
Kazım dizləri altında balıq kimi çapalayan qızın səsini kəsmək üçün cibindən dəsmal çıxarıb ağzına tıxadı. Zeynəb xırıldayıb çırpındı. Ayaqları ilə Kazımı döyəcləməyə başladı. O isə ehtiyat üçün götürdüyü kəndiri çıxarıb böyük çətinliklə Zeynəbin əllərini, ayaqlarını sarıdı.
Nəfəsini dərib tərini sildi.
– Di öl!.. Daha əlimdən heç yana qaça bilməyəcəksən.
O, qızı yerdən qaldırıb çiyninə aldı. Qəbristanlığın o tərəfində kola bağladığı ata sarı apardı. Zeynəb gücsüzlüyünü sanki indi hiss edib acı-acı ağladı.
Kazım onu atın belinə qaldırdı. Ayağını üzəngiyə keçirdib yəhərə qalxmaq istəyəndə qaranlığı bir işıq yardı. Döngədəki təpəni burulan motosikl qəbristanlığa tərəf irəlilədi. Kazım nəfəsini dərmədən dayandı. Ürəyində İmranı söydü və sıçrayıb atın belinə qalxdı. Gözə görünməmək üçün atı qəbristanlığın o tərəfindən sürdü. O, qızı qucağında güclə saxlayırdı. Motosikl səsini eşidəndə Zeynəb var gücü ilə kəndiri laxlatmağa çalışdı.
Kazım motosiklin qəbristanlığın yanında dayandığını görüb atı mahmızladı. "Vaxtkən aradan çıxmaq lazımdır, – deyə düşündü. – Bircə gecə, tək bircə gecə qızı evdə saxlasam, hər şey düzələcək. Ondan sonra qovsam da getməyəcək".

Birdən Zeynəb daha möhkəm çırpındı. Kazım gözünü açıb yumunca, yuvarlanıb gumbultu ilə yerə düşdü.

– Köpək qızı, ölsən də səni əldən buraxmayacam.

Kazım atdan düşüb cilovu yəhərin qaşına keçirdi. Aşağı əyilərək qızı qaldırmaq istədi. Lakin bu vaxt yoldakı qaraltıdan hürkən at götürüldü. Kazım onun ardınca qaçdı, nə qədər çalışdısa tuta bilmədi. Əlacı kəsilib geri qayıtdı. Zeynəbi sürüyüb kolluğa saldı.

...İmran kişnəyə-kişnəyə qaçan atı görəndə təəccübləndi. Motosikli geri döndərdi, qəbristanlığın ətrafına dolandı. Fənərin işığı qaranlığı qılınc kimi yarıb sağı-solu aydınlaşdırdı.

İmran yola düşmüş kəlağayını görüb dayandı. Əyilib yerdən götürdü. “Bu nədir? Bu kəlağayı kimindir?”

O, ətrafı dinlədi. Qəbristanlıqdan aralıdakı kolluqdan şıqqıltı eşidildi. Otlar xışıldayırdı. Elə bil yerlə nə isə sürüyürdülər. İmran səs gələn tərəfə qaçdı.

Kazım ayaq tappıltılarını eşidib dayandı. Zeynəbi yerə atıb geri döndü. Bıçağı çıxarıb hazır dayandı. İmran birbaş onun üstünə gəlirdi. Deyəsən, qaranlıqda heç nə görmürdü.

Kazım onun üstünə atıldı. İmran azca yana burulub yumruğunu hərlədi. Çənəsi şaqqıldayan Kazımın başı gicəlləndi. Sol yanağına dəyən ikinci zərbədən səndələdi. Qolunu hərləyib bıçağı endirdi. Ancaq əli boşa çıxdı. Ayağı büdrədi və ağzı üstə yerə döşəndi. Bıçaq daşa dəyib cingildədi. İmran bu zaman düşməninin silahlı olduğunu başa düşüb onu yerindən tərpənməyə qoymadı. Onlar göy otluqda süpürüşdülər. İmran Kazımın biləyindən yapışıb qalxmağa qoymurdu. O çalışırdı ki, düşməninin qolunu qanırıb bıçağı alsın. Kazım isə müqavimət göstərib bıçağı əldən vermək istəmirdi. Onlar yumbalana-yumbalana qanova düşdülər. Kazım bıçağın əldən çıxacağını gördükdə özünü itirdi. Dəhşət onu bürüdü. Var gücünü toplayıb qolunu çəkdi. Bıçaq əlindən sıçrayıb qırağa düşdü.

İmran Kazımın yorulduğunu hiss edib onun sinəsinə əyildi. Fürsətdən istifadə edən Kazım onun çənəsinin altından ağır bir yumruq ilişdirdi. İmran arxası üstə yıxıldı. Sıçrayıb ayağa duran Kazım onun boğazından yapışmaq istədi. İmran düşmənin məqsədini başa düşdü və gücünü toplayıb təpiklə onun qarnına vurdu. Ufuldayan Kazım yanı üstə yıxıldı. İmran onu altına aldı.

Kazım çapalayıb müqavimət göstərirdi. Hər ikisi yorulmuşdu. Kazım səsini çıxartmırdı. İmran kiminlə vuruşduğunu hələ də bilmirdi.

Yaxındakı kolluqdan boğuq, iniltiyə bənzər bir səs gəldi. İmran nə edəcəyini bilmədi. Düşməni buraxsa, hər şeyi korlayırdı. O var gücünü toplayıb altındakı adamı yerə yıxdı. Tələsik kəmərini açıb onun qollarını sarıdı. Bu zaman xırıltılı səs eşitdi:

– İmran, məni öldürmə.

– Kazım?!

– Bir qələtdir elədim... Əvvəlcə səni tanımadım...

İmran heç nə başa düşmədi. Mat-məəttəl qaldı. Kolluqdan yenə inilti eşidildi. İmran sarsıldı.

– O kimdir? – deyə Kazımdan soruşdu. Lakin cavab almadı. İmran Kazımın belindəki kəməri açaraq onun ayaqlarını da sarıdı və səs gələn tərəfə qaçdı.

– Ay adam, kimsən, hardasan?

O, aşağı əyilib kolluqdakı sarınmış qızı tapdı. Ağzındakı dəsmalı çıxartdı, əl-qolunu açdı. Zeynəb dərindən nəfəs alıb qışqırdı:

– Hanı o əclaf!

– Zeynəb, sənsən? – deyə İmran təəccübləndi.

Onlar yola çıxdılar. İmran üst-başı cırılmış, saçları üzünə dağılmış Zeynəblə yanaşı gedirdi. Qolu bağlı Kazımı isə qabaqlarına salmışdılar.

Qəbristanlığın yanına çatanda dayandılar. İmran yolun kənarına atdığı motosikli qaldırdı. Fənəri yandırdı. İşığı Kazımın üstünə saldı. Onun üz-gözü şişmiş, ağzı-burnu qanamışdı. Alt dodağı göbələyə dönmüşdü. Boynundakı başlığı sürüşüb düşmüşdü. Onun bu saat çox yazıq görkəmi var idi. Zeynəb özünü saxlaya bilmədi. Kazıma yaxınlaşıb üzünə tüpürdü.

Kazım dinmədi. Gözünü döyüb dayandı.

– İndi məni haraya aparacaqsınız?

– Milis idarəsinə.

– İmran... İgid basdığını kəsməz... Keç günahımdan.

– Hələ bir dili də var danışır! Səni özüm aparacam! Utanmaz köpəkoğlu! – deyə Zeynəb qışqırdı.

– Görürsən, şikayətçi razı olmur.

– İmran, ə, sən də cavan deyilsənmi? Qızın sözünə niyə baxırsan? Bir qızdı, istəyirdim, nə bilim ki, günüqara başıma bu oyunu açacaq?

– Kazım, sən qanmaz adamsan. Sənin kimisi bir neçə il yatmasa ağıllanmaz.

– Axı mən neyləmişəm? Zeynəb özü desin. Əlim-ayağım dəyməyib. Çıxıb evinə getsin. Elə bilsin heç nə olmayıb... Zeynəb, mən heç, özünü biabır eləmə...

Zeynəb ildırım vurmuş kimi sarsıldı. Bayaqdan bu heç onun ağlına gəlmirdi. "Doğrudan, camaat bunu eşitsə nə deyəcək? Hər ağızdan bir söz çıxmayacaqmı? Elə bircə Şahnaz bilsə bəs deyilmi? Aləmə car çəkib məni biabır etməzmi? Mən ondan sonra kimi inandıra bilərəm? Axı bu mərdimazar köpəkoğlu haradan mənim qabağıma çıxdı?"

Zeynəb qəhərləndi. Bunu hiss edən Kazım yenidən sözə başladı:

– Keçin taqsırımdan. Atam-anamla bir qələtdir eləmişəm. İstəyirsiniz lap ayaqlarınıza döşənim. Qoyun bu sirr burda qalsın. Nə dil bilsin, nə dodaq. Mən ağzımı açıb bir adama söz desəm, kişi deyiləm... İmran... vallah, doğru sözümdür, itdən peşmanam. Axmaqlıq elədim, özünüzü də, məni də, dilə-ağıza salmayın. Camaat bilsə, Zeynəbdən ötrü daha pis olacaq.

İmran, qabağında tülkü kimi yaltaqlanan bu adama nifrətlə baxdı.

– Yaxşı, deyək ki, Zeynəbi qaçırmaq istəyirdin. Bəs mənə niyə hücuma keçdin?

– Sözün düzü, kişiliyimə sığışdıra bilmədim ki, qızı mənim əlimdən alasan.

– Qurumsağa bax, kişilikdən danışır!

– Zeynəb, nə desən haqlısan... Gəl ətəyindən daşı tök.

Zeynəb ona bir də yaxınlaşdı. Qolunu boşaldıb qulağının dibinə bir şillə çəkdi.

– Düş qabağıma, köpək oğlu! Sənin kimisinə işıqlı dünyada yaşamaq haramdır...

İmran, Kazımı kənd sovetinə təhvil verib qayıdanda Zeynəbi motosiklin yanında gördü, qız utandığından idarəyə getməmişdi. Onun saçları dağılmışdı. Yaxası açıq idi.

– Tez ol gedək, yağış yağır.

Zeynəb yerindən tərpənmədi. Birdən-birə İmranın boynuna sarıldı. Hönkürtü ilə ağladı:

– Yaxşı, ağıllı ol, uşaqlığı burax.

– Qurbanın olum...

– Di yaxşı, yenə dəliliyin tutmasın, gedək.

– Ayağının altında ölüm. Mənim səndən başqa kimim var? Yetim olmasaydım, o köpək oğlu qabağımı kəsə bilməzdi...

Kəsik-kəsik deyilən bu sözlər İmranın ürəyini dağladı. Zeynəbin alnından öpüb başını sinəsinə basdı, saçını sığalladı. İmranı da yaş boğdu.

– Di yaxşı... Sənə soyuq dəyər.

Zeynəb ancaq bu zaman üst-başının didilib töküldüyünə fikir verdi. Yaxasının açıq olduğunu görüb aşağı əyildi.

– İmran, qurban olum, bağışla.

– Yaxşı, yaxşı, gözünün yaşını sil.

O, qızı güclə sakitləşdirib motosikli işə saldı. Zeynəb dinməz-söyləməz oturub İmranın belini qucaqladı.

Onlar döngəni burulub həyətə girdilər. Zeynəb hərəkətsiz dayandı. Evlərinə getmək istəməsə də, Tükəzban xalagildə qalmağa da utandı. İmran maşını rahatladıqdan sonra onun qolundan tutdu.

– Gedək.

– Yox, evimizə gedəcəyəm.

– Ağıllı ol, bu saat səni heç yana buraxmaram. Sizin ev, ya bizim, nə təfavütü var? Gəl.

İmran onu çəkib eyvana çıxartdı. Pəncərədən süzülən işıqda üz-gözünə baxdı. Dəsmalını çıxardıb onun gözlərini sildi.

– Bax belə olmaz, al burnunu da sil.

Zeynəb qapını açıb içəri girdi.

Səhərdən oğlunu gözləyən Tükəzban xala, astanada dayananlara baxıb üzünü cırdı.

– A bala, bu nədir, üstünüz-başınız niyə cırılıb? Allah, mənə ölüm ver! Üz-gözünüz niyə bu kökə düşüb?

Zeynəb ağlamamaq üçün dodağını dişlədi. İmran qıza gözünü ağartdı.

– Heç nə olmayıb, ana, zəhrimar maşın sürüşdü. Xəndəyə yıxıldıq.

– Allah, sən saxla! Ay bala, neçə dəfə demişəm bu zəhrimarı minmə, hazır bir ətək pul verib maşın alıbsan, onu niyə sürmürsən? Üz-gözünüz də göyərib, əzilib.

– Bəs nə təhər olsun deyirsən, maşından yıxılanın üz-gözü də göyərər, dirsəyi də sıyrılar. Zərər yoxdur. Sən bizə yeməyə bir şey ver, yaman acmışıq.

Tükəzban xala əl-ayağa düşdü. Sandığı açıb oğluna təmiz paltar çıxartdı. Aftafa-ləyən gətirdi. “Gör bir özünü nə kökə salıb. Heç bilmirəm bu zəhrimar maşını hardan tapıb? Demir, qızcığazı da, özümü də şikəst elərəm. Bilmirəm bu günüqara da gədədən niyə əl çəkmir.

Qanmır ki, o ikitəkərli bir adamlıqdır. Yenə allahın mənə yazığı gəlib. Yoxsa evim yıxılırmış".

– Qızım, sən də get paltarını dəyiş, onacan mən də çay-çörək hazırlayım. Gör üstün-başın nə abırdadı!

Zeynəb bayıra çıxdı.

Çay-çörəkdən sonra Tükəzban xala üç yer saldı. Bir şey duyubmuş kimi Zeynəbi evə buraxmadı. Öz yanında yatızdırdı. Gecə yarıdan keçənə qədər oyaq qaldı.

O sakit ola bilmirdi. Uşaqların üzünə deməsə də, onların maşından yıxıldığına inanmırdı. "Yox, bunda nə isə bir iş var, məndən gizlədirlər. Maşından yıxılan adam da bu kökə düşər? Üz-gözlərindən elə bil dalaşıblar. İmran kiminlə dalaşar? Onun heç kəslə işi yoxdur. Bəs Zeynəb?"

Tükəzban xala yerin içində çevrilir, gah şirin-şirin yatan oğluna, gah da yorğanın altında büzüşən Zeynəbə baxır, heç nə başa düşə bilmirdi. O, ehmalca durub yerin içində oturdu. "Yox, maşın işi deyil, deyəsən, gədəciyi vurublar. Bax, bax...Sifətində barmaq izi var. Əli qurumuş buna necə qıyıb? Allah, sən özün saxla!"

Tükəzban xala vahimələndi. Əri Səmədin öldürüldüyü gecəni xatırladı, canına lərzə düşdü. Onda da belə qaranlıq gecə idi. Göz-gözü görmürdü. Səməd axşam çörəyindən sonra pencəyini götürüb ayağa durdu.

– Ay Tükəzban, – dedi, – məni gözləmə. Yıxıl yat. Bu axşam xırmanda qalacam.

– Əyə, soyuq-zad dəyər, axı xırmanın qaraulçusu var.

– Yox, gərək özüm gedəm. Köpək uşağı kolxozu dağıdır. Hər gecə taxılı daşıyıb aparırlar. Sabah camaat ac qalsa, kim cavab verəcək?

Tükəzban ərinin xasiyyətini bildiyindən dinmədi. Səməd oğlunun üzündən öpüb çıxdı. Tükəzban onu doqqaza qədər ötürdü.

Nədənsə ürəyi uçundu.

– Ə, özündən muğayat ol.

– Yeri get evə, uşaq təkdir.

Səməd gedəndən sonra Tükəzban xeyli dayanıb ərinin dalınca baxdı...

Onda "İyirmi altılar" kolxozu təzəcə təşkil olunmuşdu. Səmədi sədr seçmişdilər. İşlər yaman ağır idi.

Tükəzban evə qayıdıb yer saldı, ancaq yata bilmədi. Həmişə bütün gecəni kəsik-kəsik xırıldayan traktorun səsi və taxıldöyən maşının gu-

rultusu eşidilərdi. İndi isə sakitlik idi, yəqin yenə maşını xarab etmişdilər. Bayırda çisələmə yağış yağırdı. Həyətdəki tut ağaclarının yarpaqları xışıldayırdı. Evin üstündən süzülən yağış suyu navalçaları danqıldadıb şırıldayırdı. Kəndin yuxarı başında itlər hürüşürdülər. Bir azdan onlar da sakitləşdi.

Tükəzbanın yalnız səhərə yaxın gözünə yuxu getdi.

Birdən xırman tərəfdə boğuq tappıltı eşidildi. Tükəzban dik atıldı. Tüfəng bir də açıldı. "Kimi isə vurdular, güllə ətə dəydi" – deyə düşünən Tükəzban tələsik ayağa durdu. Paltarını əyninə keçirib bayıra çıxdı. İşıqlaşırdı. Toyuqlar yavaş-yavaş tardan tökülürdü.

"Görəsən bu nə idi, yenə kimin evini yıxdılar". Tükəzban içəri girib sönməkdə olan lampanın piltəsini qaldırdı. Ancaq çıraq bir-iki dəfə parıldayıb söndü. Evə qaranlıq çökdü. Arvad lap darıxdı.

Birdən onu çağırdılar. Tükəzban doqqaza yüyürdü.

Oradakı adamları görüb özünü itirdi.

– Nə olub, ay qızlar?

– Xırmanda adam vurublar.

O heç nə soruşmadı. Başı alovlu xırmana qaçdı. Kəlağayısı sürüşüb çiyninə düşmüşdü. Saçı dağılmışdı. Yanaqlarından qan axırdı.

Sovrulub ortaya tığlanmış sarı buğdanın yanında toplaşanlar Tükəzbanın gəldiyini görüb azca geri çəkildilər. Kim isə onun qolundan tutdu. Yıxılmağa qoymadı.

Səməd taxılın yanında arxası üstə yıxılmışdı. Güllə düz alnından dəymişdi...

İndi Tükəzban xala İmranın üzündəki ləkələri görəndə özünü itirdi: "Allah, sən özün bircə balamın pənahı ol!" Sonra yavaşca yorğanı açıb oğlunun yanına girdi, başını ehmalca qolunun üstünə qoydu. Uşaqlıqda olduğu kimi, onu sinəsinə basdı. Yalnız bundan sonra gözünə yuxu getdi.

## 25

Kosaoğlu dincələ bilmirdi. Gözünün yuxusu, ürəyinin rahatlığı yox olmuşdu. Axşamdan yer saldırıb yorğan-döşəyə girsə də, yata bilmir, o üz-bu üzə çevrilir, durub papiros çəkir, qaranlıqda gözlərini tavana zilləyirdi. Hər şıqqıltı onu diksindirir, hər səs yuxudan oyadırdı. Son

günlər heç yata bilmirdi. Arvadı Sayalı bir neçə dəfə "a kişi, sənə nə olub?" – deyə soruşmuşdusa da, toxtadıcı cavab ala bilməmişdi.

Kosaoğlu ürəyindəkiləri arvadına deməsə də, Sayalı kişinin gündən-günə əridiyini, daha da qaşqabaqlı olduğunu, evdə uşaqların üzünə baxmadığını görürdü. Sayalı da çox vaxt yatmır, ürəyində qarğış edirdi. "Allah bizə əyri baxanları dərdə salsın! Görüm o İmranın uğuru xeyrə çıxmasın! Mərdümazar oğlu kəndi çaxnaşdırıb, aləmi bir-birinə qatdı".

Sayalı əvvəllər elə zənn edirdi ki, Kosaoğlunu heç kim yerindən tərpədə bilməz. Ancaq indi hiss edirdi ki, onun əl-qolunu yavaş-yavaş doğrayırlar. Qorxurdu, bir gün baltanı lap kökündən vuralar...

Kosaoğlunu narahat edən də bu məsələlər idi. Bacısı oğlunun anbardan çıxarılması, Kazımın tutulması onun belini sındırmışdı. İş bununla qurtarsaydı, dərd yarı idi. Kazım tutulandan sonra Kosaoğlu prokurorun yanına ayaq döydüsə də, kömək edə bilmədi. Əsədov qaşqabağını töküb dedi:

– Çiy iş görürsünüz, işə raykom qarışıb, heç nə eləyə bilmərəm. Get yerində otur. Özünü də, məni də biabır eləmə...

Kosaoğlu dinmədi. Görüş alıb Kazımın yanına getdi. Qorxudan rəngi saralmış Kazım, onu görən kimi doluxsundu.

– Ay Qurban qağa, mənim evimi niyə yıxdın?

– Sarsaqlama, ə! Arvad kimi gözünün qorasını niyə sıxırsan? Sir-sifətinə bir bax, ə, sənə nə olub?

– Daha bundan artıq nə olacaq?

– Fikir eləmə, igidin başı qalda olar.

– Axı bu qalmağala məni sən saldın!

– Ə, mən sənə neylədim! İstədim ev-eşik sahibi olasan. Mən nə biləydim ki, fərsizin birisən? Elə nuh əyyamından hamı qız götürüb qaçır, dedim biri də olarsan sən.

– Olmadı, neyləyim, bacarmadım.

– Onda öz bəxtindən küs, daha mənim günahım nədir?

– Nə bilim, ay Qurban qağa, vallah, başımı itirmişəm.

Kosaoğlu onu uşaq kimi danladı, öyüd-nəsihət verdi. Sonra dedi ki, "qorxma, səni darda qoymaram. Amma bax ha, birdən məhkəmədə ağzından qaçırdarsan ki, Kosaoğlunun da bu işdən xəbəri var. Onda özün bil..."

Ancaq məsələnin üstü bir balaca açıldı. Kazımın mühakiməsindən sonra Kosaoğlunu raykoma çağırıb dedilər ki, "deyəsən axı sən də bu işdən xəbərdar imişsən".

Kosaoğlu iki gün yata bilmədi. "Özümü raykomun gözündən saldım. Bəs necə eləyim, təzədən onun gözünə girim?" – deyə fikirləşdi. Axırda yenə plan məsələsinin üzərində dayandı. "Bəli, plan! Pambıq planını hamıdan tez yerinə yetirsəm, hər şey düzələr. Plan ki doldu, raykom da, başıma and içəcək, ispalkom da. Ondan sonra hər şey yaddan çıxacaq".

Kosaoğlu birdən-birə dəyişdi. Gecə-gündüz çöllərdə oldu. Səhər tezdən məntəqələri gəzdi, arabaları, maşınları yoxladı, qurudulan pambıqları məntəqəyə aparanlara göstəriş verdi, axşamlar isə qapanların yanını kəsdirdi, yığılan pambığı hesaba aldı. Elə oradaca pambığı xarallara doldurtdurub birbaş qəbul məntəqəsinə göndərdi. İkicə gün keçməmiş İmranla idarənin qabağında sözə gəldi.

Aqronom, nəm olduğuna görə, məntəqədən geri qaytarılan pambıq xarallarını göstərib soruşdu:

– Bu nədir, nə hay-haray salıbsınız, qaçaqaçdırmı? Niyə qoymursunuz pambıq əməlli-başlı qurudula?

Kosaoğlu güclə hirsini boğdu:

– A bala, sənə nə var, kolxoz mənimdir, mən bilərəm!

– Pambığı geri qaytarırlar. Qəbul elədiklərini də üçüncü növ hesab edirlər. Camaatın zəhmətini niyə yerə vurursunuz?

– A bala, sən mənə darğalıq eləmə. Get öz işində ol. Məntəqəylə işin olmasın!

İmran getdikdən sonra Kosaoğlu xaralları yenidən maşına doldurtdu, birbaş məntəqəyə sürdürdü. Özü də onlardan qabaq yola düşdü.

Məntəqə müdiri onunla köhnə dost kim görüşüb, kabinetinə apardı. Kosaoğlu qapını örtdükdən sonra yarızarafat, yarıciddi dilləndi:

– Bu nədir, a kişi, yenə bizim pambığı geri qaytarırsan?

– A Qurban, öz aramızdır, yaman yaş pambıq göndərirsən.

– Yaşdır, qurutdur. Naşı deyilsən ki.

– Bilirəm, ancaq bunun altından kim çıxacaq?

– Necə kim, özümüz! Yoxsa mənə inanmırsan? Yəqin deyirsən ki, Fərhad ölüb, külüngünün səsi gəlmir? Yox, Kosaoğlu həmişəki Kosaoğludur. Heç nədən qorxma, nə göndərsəm qəbul elə. Şərtimiz həmişəki şərtdir.

Onlar bir anlığa susdular. Məntəqə müdiri gözünü döşəməyə zilləyib fikrə getdi. Kosaoğlu stulu yaxına çəkdi.

– Bura bax, planı dolduran kolxoz varmı?

– Hələ yoxdur.
– Onda çalış mənim kolxozum bir həftəyə planı doldursun.
– Çətin məsələdir.
– Ə, mən sənə bələdəm. İstəsən günü sabah mənim kolxozum planı doldurar. Nə təhər olsur-olsun gərək mən qabağa düşəm. Gərək özüm katibin yanına gedib dalajit eləyəm ki, Kosaoğlu rayonda planı birinci doldurdu. Gərək heç kəs qabağa düşməsin.
– Kim nə deyir ki? Çalışın qabağa düşün.
– Tək əldən səs çıxmaz.
– Çıxmaz, köməkləşin, bütün qüvvələri səfərbərliyə alın.
– Bura bax, – Kosaoğlu təəccübləndi, – sənə nə olub, ə? Lap bizim Nəsib kimi danışırsan. Ə, mən kimlə köməkləşim? Ağranom İmranlamı? Yoxsa elə bilirsən Nəsib mənə kömək eləyir? Onlar bu saat ayağımın altını qazıyırlar. Məni raykomun gözündən salmağa çalışırlar. Mən onlardan yox, səndən, köhnə dostumdan kömək istəyirəm, yoxsa aramızdakı haqq-hesabı unudubsan?
– Haqq-hesabımız öz yerində, amma...
– Alverimiz də öz yerində, hə? – deyə Kosaoğlu onun sözünü tamamladı.
– Necə ton lazımdır?
– Özün hesabla. Behini axşam evinizə göndərərəm.
O gün "İyirmi altılar" kolxozundan gələn bütün pambıq qəbul olundu.
Üç gün sonra Kosaloğlu "Pobedan"ı raykomun qabağında saxladı. Katibin yanına girib planı vaxtından əvvəl doldurduğunu söylədi.
Lakin bu şadlıq uzun sürmədi.
Ertəsi günü onu təcili rayon partiya komitəsinə sağırdılar. Katiblə MTS-in yeni direktoru yanaşı oturmuşdular. Nəsib dayı da burada idi. Katibin birinci sualı bu oldu:
– Niyə yalan məlumat verirsən?
– Nə məlumat?
– Plan haqqında.
– Onu kim deyir?
– MTS direktoru.
– Ola bilməz!
– Elədir, – direktor dilləndi, – bizdə olan məlumata görə, sizin kolxoz illik planı hələ 93,7 faiz yerinə yetirib. Sən isə raykoma dünən məlumat veribsən ki, yüz faiz ödəmişik.

– Düzdür. Məlumat vermişəm. Özü də heç kəsi aldatmamışam. Yəqin sənə məlumatı düz verməyiblər.

– İmran səhv eləməz.

– Ay yoldaş direktor, – deyə Kosaoğlu məzəmmətedici bir tərzdə davam etdi: – Mən boyda kişini qoyub, o uşağın sözünə niyə inanırsınız? Neçə ildir bu yolda can qoyub saqqal ağartmışam. Mən öz kolxozumun işini bilirəm. İmran uşaqdır, yəqin səhv eləyib. Biz planı dünəndən doldurmuşuq.

Katib üzünü Nəsib dayıya tutdu. Nəsib dayı onun nə dediyini anlayıb:

– Hələ planı doldurmamışıq, – dedi. – Bilmirəm Kosaoğlu nə əsasla sizə məlumat verib, hər halda yoxlamaq lazımdır.

"Yoxlamaq" sözünü eşidəndə Kosaoğlu narahat oldu. Ancaq özünü ələ aldı. Üzünü Nəsib dayıya tutub narazılıqla:

– A kişi, işin-gücün qızğın vaxtında nə yoxlamabazlıqdır! – dedi.

– Qoysana işimizi görək! Əlimdə əsasım olmasa, başıma at təpibdir, nədir ki, yalandan məlumat verirəm! Bir də, mən bunları dədəm ehsanına eləmirəm. Hökumət işidir, mən hökumətdən ötrü çalışıram. Elə yoldaş raykom da istər ki, rayonun planı tez dolsun.

Onu sakitcə dinləyən katib eyni sakitliklə əlini telefona uzatdı.

– Bəlkə k işi düz deyir, qoy məntəqə müdirini çağırıb soruşaq.

– Bir də nə zəhmət çəkirsiniz! – Kosaoğlu katibə mane oldu.

– Müdirin kağızı məndədir.

– Göstər görüm.

Kosaoğlu arxayınca, əlini məxmər köynəyinin döş cibinə salıb kağızı çıxartdı, katibə uzatdı. Elə bu an birdən-birə ürəyi döyünməyə, əli titrəməyə başladı. Yeni bir fikir beynində ildırım kimi çaxdı: "Bəlkə səhv elədim? Bəlkə bu kağızı ortaya atmasaydım yaxşıydı?.." Lakin keçdi. Katib kağızı oxuyurdu.

– Kosaoğlu düz deyir, məntəqə müdiri də onun sözünü təsdiqləyir. "İyirmi altılar" kolxozu planı doldurub.

Katibin bu sözləri Kosaoğlunu sakitləşdirdi. O, dərindən nəfəs aldı.

– Ancaq hər halda bu anlaşılmazlığı yoxlamaq pis olmaz. – Katib kağızı stolun siyirməsinə qoydu. – Get işində ol, Qurban.

Kosaoğlu kabinetdən çıxanda acı alma kimi bürüşmüşdü.

O, yenə özünü Əsədovun yanına saldı. Başına gələnləri danışdı. Kömək istədi. Prokurorun qaşqabağı töküldü. Oturub fikirli-fikirli papiros çəkdi.

– Bu nədir? Adam bir iş tutanda irəlisini-gerisini fikirləşməz? İndi mən nə edim, özünü də, o kişini də işə salıbsan.

Kosaoğlu özünü itirdi. Son ümidə əl atdı:

– Nə istəyirsən verim, kim lazımdırsa onu gör, amanın bir günüdür, qoyma məsələ böyüsün.

– Evin yıxılmasın, mən sənin hansı işini düzəldim?! Axı bu pambıq alveri sənin nəyinə lazımdı?

– Nə bilim, dedim raykomun gözünə girim, bəlkə ara düzələ.

– Görürsənmi, çox yemək adamı az yeməkdən də qoyur.

– Elə onu de, qaşını qayırdığım yerdə vurub gözünü tökdüm. Mənə deyən gərək dilini niyə farağat qoymursan?

– İndi səni kim müdafiə edəcək?

– Ə, bəs sən nəsən? O heykəl başına and olsun ki, sən olmasan mən bu qələtləri eləmərəm.

Prokuror otaqda çox gəzindi, sonra mənalı-mənalı başını tərpətdi:

– Çox çətindir. Kağızı raykom katibinə nahaq veribsən. O, əldə maddeyi-sübutdur. İndi əlac yenə özünüzə qalıb. Gör bir təhər o İmrandı, nədi, onu dilə tuta bilərsənmi. Nəsib kişini də yola gətir. Yoxlamada desinlər ki, səhv eləmişik.

– Deməzlər.

– Onda pambıq göndər, əksiyi düzəlt.

– Qoymazlar.

– Verməzlər, qoymazlar... Bəs nə olsun deyirsən? Bir halda ki, heç nə bacarmırsan, daha adını niyə sədr qoyubsan? – O, papiros yandırıb əlindəki kibriti hirslə stolun üstünə atdı. – Mənə nə var? Özün fələyin xərcinə gedəcəksən! Mənim məsləhətim budur ki, vaxtında başına çarə qıl.

Kosaoğlu kəndə gələnəcən çox düşündü. “Boş bir işdən ötrü dolaşacağam. Elə ki, yıxıldım, baltalı da, baltasız da döşəyəcək. Kimin nə heyfi var çıxacaq. Bütün olub-keçənləri açıb tökəcəklər. Ondan sonra nə qədər çapalasam da, altından çıxa bilməyəcəm. Yox, gərək çalışam, yaxam ələ keçməsin. Bəs nə təhər eləyim? Bu köpək oğlunun əlindən yaxamı necə qurtarım? Gecənin birində qabağını kəsdirib başını əzişdirimmi? Onun izini-tozunu itirsəm, hər şey düzələr. Bəs bunu nə cür eləyim? Sonra işin üstü açılmazmı? Təzədən başıma iş açmarammı? Yox, bircə yol qalıb. Kəsik baş danışmaz. Uşaqlara deyərəm, bir gecə xəlvətə salıb Alagöz çayına atarlar”.

Kosaoğlu maşını birbaş idarəyə sürdürdü. İçəridəkilərə salam vermədən stolun arxasına keçdi. Çırağın piltəsini qaldırıb otaqdakı adamları süzdü. İmran gözünə sataşanda qan beyninə vurdu. Əlini stola çırpıb bağırdı:

– Çıx mənim kabinetimdən!

İçəridəkilər, qapqara qaralmış Kosaoğluna təəccüblə baxdılar. İmran heç nə başa düşmədi.

– Sizə nə olub?

– Canına dərd olub, boğazına da boğma! Gərək hər yerə özünü soxasan? Ə, bir məni başa sal görüm sən kimsən?! Axı sən nəçisən ki, mənim işimə qarışıb aləmi bir-birinə qatırsan! Bu camaatı barmağına niyə dolayırsan? Xalqı avam yerinə qoyursan?! Camaatın zəhmətini niyə itirirsən?

Kosaoğlu xırıldadı. Susub nəfəsini dərdi. İmran qıpqırmızı olmuşdu. Onun yumruqları düyünlənmişdi. Gicgahındakı damarlar şişib tez-tez vururdu. Lakin o, səsini ucaltmadı.

– Otağı başına götürüb niyə qışqırırsan?! Nə olub, nə istəyirsən?

– Nə istəyirəm?.. – Kosaoğlu kəkələdi. Qarşısında dayanan İmranın geniş köksünə, otaqdakı kolxozçulara baxdı. "Mürəkkəbqabını götürüb bunun başına çırpsam nə olar? Görəsən camaat kimi müdafiə edər?" – deyə fikirləşdi və səsini yavaşıtmağı münasib bildi:

– Bala, niyə qoymursan camaat çörək yeyə, paxıllığın tutur? Xalqın çörəyinə niyə bais olursan? – O, üzünü içəridəkilərə çevirdi:

– A kişilər, siz öləsiniz, başa düşmürəm bu bizdən nə istəyir də? Gəlib-gəlməyib, elə hey dava-qalmağal salır.

– Sözünü açıq de görüm nə olub?

– Nə olacaq, aləmi qatıbsan bir-birinə! Sənə kim deyib ki, məndən xəbərsiz MTS-ə məlumat verirsən? De görüm bu viranxanada sədr mənəm, ya sən?

– Mən sədr olmaq fikrində deyiləm.

– Bəs onda niyə ortalığa dürtülürsən? Camaat zəhmət çəkib pambıq yığıb, vaxtından əvvəl plan doldurub, mən də raykoma raport yazmışam...

– Biz planı hələ doldurmamışıq...

– Sənə dedim ki, doldurmuşuq! Özüm raykoma məlumat vermişəm.

– Sən raykomu aldatmısan.

– A camaat, bu nə danışır, dəli olub nədir?! Ə, planın dolmağının sənə nə zərəri var? Daha yaxşı, mükafat alarıq, hökumətin yanında üzümüz ağ olar.

– Sonra da camaatın pulunu məntəqə müdirinə verərsən ki, satın pambıq almışam?

– Heç danışdığını bilirsən?!

– Lazım gəlsə sübut eylərəm.

Kosaoğlu nə cavab verəcəyini bilmədi. İmranı dindirdiyinə peşman oldusa da, özünü sındırmadı.

– Deyəsən sənin başın bədəninə ağırlıq eləyir, a bala! – O gözlənilmədən sakitcə dedi. – Yaxşı deyiblər ki, keçinin əcəli gələndə çobanın çomağına sürtünər. Get tay-tuşunla dartış, mənə gücün çatmaz, oğul!

İçəridəkilərin bəziləri Kosaoğlunun yanında yer qazanmaq istədilər: "A bala, ağsaqqal kişiylə dilləşmə" – dedilər. Bəziləri isə Kosaoğlunu danladı. "Yekə kişisən, sənə nə olub? Məlumatı düz verməyibsiniz, düzəldərsiniz. Adam belə şeydən ötrü dava-dalaş salmaz".

Camaat onları sakitləşdirməyə çalışsa da, Kosaoğlu dözə bilmirdi. İmran həmişə onun yaralı yerinə toxunurdu. Vəziyyət gərginləşmişdi. İmran Kosaoğlunun sözünü cavabsız qoymadı:

– Keçinin əcəli yetişəndə çobanın çomağına sürtünərsə, ilanın da başı ağrıyanda həmişə yol üstünə çıxar.

O, qapını hirslə çırpıb getdi...

Bir-iki gündən sonra kəndə komissiya gəldi. Kosaoğlu bərk təlaşa düşdü. Əl altından adam saldı. İşin üstünü basdırmağa çalışdısa da, müvəffəq olmadı. Nə dostluq, nə də pul kömək etdi. İmran dediyindən dönmədi. Nəsib dayı da ona səs verdi.

Məsələ getdikcə böyüyürdü. Elə buna görə də Kosaoğlunun yuxusu qaçmışdı. Sayalı son günlər ərinin gecələr yerdən qalxıb həyətə çıxdığını, ağacların altında gəzdiyini görmüşdü. O, bir-iki dəfə ərinin dalınca düşmüş, özünü göstərmədən onu izləmişdi.

Yoxsa kişi dəli olub, niyə gecələr gəzməyə çıxır? Sayalı eşitmişdi ki, elə xəstələr olur ki, gecə ay işığında gəzməyə çıxır. Səhərə kimi dolanır, sonra da yuxulu-yuxulu qayıdıb yatır. O nə etdiyini bilmir. Əgər onu gəzdiyi zaman oyatsan, dərhal ürəyi partlayar. Ona görə də Sayalı qorxur, gecələr kölgə kimi kişinin dalınca gəzib, onu dindirmirdi.

Kosaoğlu bu gecə də yatmadı. Evdəkiləri yuxuya verəndən sonra yavaşca durub geyindi. Kürkünü çiyninə salıb həyətə çıxdı. Hava tut-

qun idi. Asta-asta yağırdı. Yağış damlaları səpələndikcə ağacların yarpaqları xışıldayırdı. Kosaoğlu eyvanda dayanıb papiros bükdü. Bir-iki dəfə sümürüb, həyətə düşdü. Əvvəlcə tövləyə getdi, əl fənərini yandırıb heyvanlara baxdı. İnəklər bir tərəfdə gövşəyirdi. Qara camış axuru yoxlayırdı. Qurbanı görəndə heyvanlar mələşdi. Kosaoğlu doluxsundu. Ona elə gəldi ki, bu heyvanlar ondan ayrılmaq istəmir, o isə səfərə hazırlaşır, bir daha qayıtmayacaq. Sədr olandan sonra aldığı bu heyvanlarla halallaşmağa gəlib. Onun əli titrədi, təpəl kəlçəni, qızıl inəyi sığalladı...

Tövlədən çıxan Kosaoğlu bağa getdi. Bir-bir ağaclara baş çəkdi. Öz əli ilə basdırdığı armudlara, almalara, alça və tut ağaclarına baxdı. Əvvəllər burada bağ-bağça yox idi. Kosaoğlunun atadan qalma uçuq bir daxması var idi. İndi üstü kirəmitdən, qoşa eyvanlı ev tikdirib, özünə cah-cəlal düzəltmişdi. O, evin ətrafına dolandı. Sonra ot tayasına, talvarın altındakı odunlara, bir az bəridəki sarı "Pobeda"ya baxdı. Papirosunu çəkə-çəkə doqqaza getdi. Darvazanın kilidini yoxladı, çəpərin dibi ilə gəzib həyəti dolaşdı. Elə bil bağın nə qədər yer tutduğunu bilmək istəyirdi. O niyə belə edirdi? Heç özü də bilmirdi.

Geri qayıdıb, ot tayasının böyründə büzüşüb yatan itə baxdı. Həyətin ortasında dayanıb dərindən nəfəs aldı. Dodaqları astadan tərpəndi: "Bunların hamısı mənimdir. Mal da, ev-eşik də, maşın da, kənd də mənimdir. Mən bu kənddə sədrəm. Heç kəs bunları mənim əlimdən ala bilməz. Heç kəs!.." – deyə pıçıldadı.

Yağış yenə yağırdı. Bağda görünən papiros işıltısı gah çəpərin dibində, gah bağın aşağısındakı arxın kənarında, gah da tayanın yanında parıldayırdı. Çiyninə qalın şal salmış Sayalı kölgə kimi hərlənib ərini gözdən qoymurdu. Birdən ərinin: "Yox, mən ona göstərəcəyəm, onu atasının yanına göndərəcəyəm!" qışqırığını eşitdi.

Kosaoğlu evə qayıdıb yerinə girdi. Xoruzlar banlayırdı. Sayalı ərinin yuxuda sayıqladığını, tez-tez "Partiya bileti...mən...İmran..." dediyini eşitdi.

Nəhayət, Kosaoğlu müəyyən qərara gəldi. O, xəstə olduğunu söylədi. Kolxozun idarə heyətinə ərizə verib yerini müvəqqəti olaraq İmrana tapşırmağı xahiş etdi. Özü isə müalicə üçün Kirovabada getməyə hazırlaşdı.

O bir qədər gözdən uzaq olmağa, vaxt qazanmağa çalışırdı. "Bəlkə canımı qurtardım" – deyə düşünürdü.

Kosaoğlu yola hazırlaşdığı zaman bacısı oğlu Musa gəldi. O, ayaq üstündə güclə dururdu. Anbardan çıxarıldıqdan sonra xeyli nazilmişdi.

Kosaoğlu onun sərxoş gözlərinə baxıb qaşqabağını turşutdu.

– Yenə nə olub, qılçaların dolaşır!.. Az içsənə!..

– İçməsəm olmur, ay dayı; neyləyim, dərd yandırır, mən də içirəm. Hər uşaq-muşaq sənin üzünə ağ olur. Dağ boyda kişinin başına oyun açır.

– Sənin kimi bacısı oğlu olanın başına nə desən açarlar. Mən gedirəm, sizi bir-bir yeyəcəklər.

– Bəc neyləyim?

– Kömək elə, mənim düşmənim sizin düşməninizdir.

– Bilirəm, ay dayı... Bəs bizi qoyub hara gedirsən?

– Xəstəyəm.

– Sənsiz bir günümüz olmasın, ay dayı. Tez qayıt!

Onlar gecə qatarına çatmaq üçün saat onda kənddən yola düşdülər.

## 26

Tez-tez göyün üzü tutulur, buludlar ətəyini sallayıb kəndin üstünə çökürdü. Çənli-çiskinli yağış başlamışdı. Yolların palçığı saqqız kimi olmuşdu. Yavaş-yavaş hava soyuyur, mal-qara örüşə çıxmırdı. Toyuqlar quru yer axtarır, itlər büzüşüb ocaq yerində yatırdı.

Hava açılana oxşamırdı.

Çöldə pambıq çox idi. Məhsulu yığıb qurtarmaq, vaxtında təhvil vermək lazım idi.

İmran bir az özünü itirdi. Əvvəlcə nə edəcəyini bilmədi, ancaq Nəsib dayı onun köməyinə gəldi. Dərhal pambıq qurudulan məntəqələri işə saldılar. Odun gətirdilər. Kənddə boş olan otaqlardan da istifadə etdilər.

İşin bütün ağırlığı İmranın üzərinə düşdüyündən, o, evə çox gec gəlirdi. Bəzən Tükəzban xala onun dalınca yemək aparır, ya da Zeynəblə göndərirdi. İmran gecə yarıya qədər idarədə otururdu.

...Qaranlıq qarışanda çöldən qayıdan İmran, tövlənin qabağında atdan düşdü. Əvvəlcə pambıq qurudulan məntəqəyə baş çəkdi. Sonra üstünə brezent çəkilmiş maşınlara baxdı. Asta-asta idarəyə doğru getdi. Eyvandakılarla salamlaşıb içəri keçdi.

Briqadirlər bir-bir gəlib gedir, hesabdarın yanına dəyib haqq-hesab verirdilər. Arabir də göyün üzünə baxıb narazılıqla başlarını bulayırdılar.

Getdikcə adam çoxalırdı.

Axşamdan xeyli keçmiş, Kosaoğlunun bacısı oğlu Musa da idarənin qabağında göründü. O, gödəkçəsinin yaxasını qaldırmış, uzun günlüklü şapkasını gözünün üstünə endirmişdi. Əllərini pencəyinin yan ciblərinə salmışdı. Uzunboğaz çəkmələri palçığa bulaşdığından, ayaqları daha da ağırlaşmışdı. Yeridikcələngərlənir, elə bil, ayağını qaldırmağa çətinlik çəkirdi. Musa anbardan çıxarılandan sonra kəndin arasında az-az görünürdü.

Onun içəri girdiyini heç kəs hiss etmədi. İmran qabağındakı kağızlara baxır, Zeynəb əyilib kağızda nə isə göstərir, başqaları da onun ətrafına toplaşıb qulaq asırdılar.

Musa küncdəki stulda oturdu. Dərindən nəfəs alıb gözünü yumdu. Əvvəl adamları seçə bilmirdi. Gözünün qabağında kölgələr dolaşır, qulağına qarışıq səslər dəyirdi. Ancaq yavaş-yavaş otaq aydınlaşmağa, adamların sifəti görünməyə başladı.

Musanın gözünə birinci dəyən İmran oldu. İmran Kosaoğlunun yerində oturmuşdu. Tez-tez zəng edir, yanına gələnlərə göstəriş verirdi.

Musa yavaş-yavaş ayıldı. "Deməк, belə! – deyə hiddətlə düşündü: – Dayımın düşməni onun yerində oturub, kabinetinə yiyələnib! Gör indi mən kimin buyruğuyla oturub-durmalıyam! Dağ boyda kişini yerindən, yurdundan gör kim oynadır? Dayımdan sonra bəs mənim axırım nə olacaq?" Anbarda işlədiyi müddətdə tikdirdiyi evlər, qat-qat alıb yığdığı gəbələr Musanın gözü qabağında durdu. O, xərclədiyi pulları, arvadına, uşağına aldığı paltarları yadına saldı. Musanın ailəsi heç nədən korluq çəkmirdi. O, nəinki özünü, hətta bəzi uzaq qohumlarını da saxlayırdı. Toy-nişanda pul xərcləməkdə Musanın qabağına çıxan olmazdı?

Bəs indi? Birdən dayısını yola salanda Kosaoğlunun dediyi sözlər yadına düşdü. "Sənin kimi bacısı oğlu olan bu günə düşər də". "Doğrudan, mən biqeyrətəm. Gözüm baxa-baxa kişinin yerini tutublar, mən də burada boylanıram. Bəs nə gündə lazımam?!"

Onun yumruqları düyünləndi, dişini qıcayıb aqronoma baxdı. İmran onun gözlərində kiçilib fındıq boyda oldu. Musaya elə gəldi ki, yaxınlaşıb ona bircə yumruq ilişdirsə, yerindəcə qalacaq. Özünü toplayıb ayağa durdu. Stola yaxınlaşmaq istəyəndə, İmran yenidən böyüdü. Musa onun geniş köksünü, enli çiyinlərini, qüvvətli əllərini gördü.

O səndələyib geri çəkildi, qapını açıb bayıra çıxdı. İçəridəkilər onun sərxoş olduğunu bilib əhəmiyyət vermədilər.

Musa eyvanda dayandı. Yağış aram-aram yağırdı. Adamlar seyrəlmişdi. O, fikrini toplayıb ətrafa boylandı. Pambıq qurudulan məntəqəyə doğru getdi.

Məntəqənin ocağı yanırdı. Kərim kişi kənardakı kötüyün üstündə oturub qəlyan çəkirdi. Alov üzünü işıqlandırırdı. Musa dişini qıcayıb qaranlıqda gözdən itdi...

Birdən pambıq qurudulan məntəqə tərəfdən alov qalxdı. Göyün üzü işıqlandı. Eyvanda söhbət edən Zeynəb tələsik aşağı enib məntəqəyə tərəf qaçdı. Qaranlıqda kiməsə toxundu. Zeynəb təngnəfəs olan Kərim kişinin səsini eşitdi:

– Qoymayın, kömək eləyin!

– Kərim dayı, nə olub?

– Tez ol, qızım, rayona zəng elə. Məntəqə yanır, pambıq od tutub... Ay camaat, kömək eləyin! Ay haray, qoymayın!..

Kərim kişinin səsini eşidənlər idarədən çıxıb məntəqəyə sarı qaçdılar. Kəndi səs-küy bürüdü. Kimsə yüyürüb zəngi çaldı. Kolxoz yanğın dəstəsinin üzvləri, kolxozçular özlərini yetirdilər.

Məntəqə tüstü-duman içində idi. Bacadan alov qalxır, qapıdan duman kimi tüstü çıxırdı. Qarışıq səslər eşidilirdi:

– Ocağı söndürün!

– Su gətirin!

– Torpaq atın!

– Nasosu işə salın!

– Qapını açın, içəridəki pambığı bayıra tökün!

Adamlar bir-birinə qarışmışdı. Kimi su gətirir, kimi bellə torpaq atır, kimi də içəridəki pambığı qucaqlayıb bayıra çıxardırdı.

Zeynəb rayon yanğın dəstəsinə zəng etdikdən sonra qaça-qaça məntəqəyə gəldi. Özünü içəriyə saldı. Öskürək onu boğdusa da, geri çəkilmədi. Hələ alışmamış pambığı qucaqladı. O tək deyildi. İçəridə tüstü içində əlləşən adamlar çox idi, hamı yanan pambığı söndürməyə çalışırdı. Zeynəb hər şeyi unutmuşdu, heç kəsi görmürdü.

Adamların çalışmasına baxmayaraq, alov getdikcə güclənirdi.

Zeynəb yenə içəri girdi. Küncdə tüstülənə-tüstülənə yanan pambıq birdən alışdı. İçərini alov bürüdü. Məntəqə təndir kimi guruldadı. Kimsə qışqırdı, alovlana-alovlana bayıra qaçdı. Lakin qapının ağzın-

da taqətdən düşüb yerə sərildi. Zeynəb onun köməyinə çatdı. Od almış paltarı əlləri ilə döyəcləyib söndürmək istədi. Lakin tüstü onu boğurdu. Zeynəb yanan arvadı bayıra çıxartdı. Paltarını cırıb tökdü. Arvad inildədi. Birdən Zeynəb dəhşət içində donub qaldı.

– Tükəzban xala, ay Tükəzban xala!

Arvad dinmədi. Zeynəb onun iniltisini eşitdi.

– Tükəzban xala!

Kim isə qışqırdı:

– Qoyma, görmürsən qız da yanır?

Onların üstünə kilim saldılar. Alov sönən kimi, Zeynəb yerə uzanmış arvadın başını dizi üstünə aldı. Onun saçları yanmışdı. Sifəti tuluq-tuluq idi. Bədənində sağ yer qalmamışdı.

– Tez olun, həkim çağırın!

– Arvadı xəstəxanaya çatdırmaq lazımdır.

Tüstünün, odun içində əlləşən İmran, özünü anasının üstünə saldı. Maşın gətirdilər. İmran özü anasını qucağına alıb maşına qoydu. Ondan ayrılmaq istəmədi. Zeynəb “sən işində ol, – deyə onu maşından düşürtdü, – mən özüm gedərəm”.

Səhər tezdən rayon işçiləri tökülüb gəldilər. Kirovabaddan yenicə qayıtmış Kosaoğlu pencəyini çiyninə salıb gəzinirdi. Nəsib dayı fikirli dayanmışdı. Kərim kişi boynunu büküb durmuşdu. İmran dinmirdi. Hamı fikirli idi.

Nəsib dayı heç nə anlaya bilmirdi. “Bu necə ola bilər?.. Elə bil hər şey əvvəlcədən ölçülüb-biçilmişdi? Bu yanğın təsadüfimi baş vermişdi? Bəlkə Kərim kişi ehtiyatsızlıq edib yatmışdı? Bəlkə içəridə papiros çəkiblər?”

Rayon milis idarəsinin işçiləri yanğın olan yeri yoxlayırdı. Camaat işin sonunu gözləyirdi.

Kosaoğlu müştüyünü üfürüb papiros kötüyünü tulladı.

– Gərək heç getməyəydim. Başqa vaxt ağızlarına çullu dovşan sığmır, amma ikicə gün kənddə olmadım, dünyanı bir-birinə qatdılar. El içində biabır olduq. İmranı adam bilib iş tapşırdım, o da ki...

Kənarda dayanan prokuror sözə qarışdı!

– Kənddən çoxdanmı getmişdin?

– İki həftə olar, yerimi İmrana tapşırmışdım.

– Burda yox idin, səni heç bir şeydə təqsirləndirmək olmaz.

– Onu bilirəm. Amma kolxoz ki, mənimdir.

İmran yava-yavaş irəli gəlib Kosaoğlunu süzdü.

– Əl-ayağa düşmə. Bu işlərin hamısı mənim vaxtımda olub.

– Mən olmayım, sən ol, nə təfavütü var? Kolxoz ki, birdir. Dediyim odur ki, ikicə gün kəndə başçılıq eləyə bilməyəcəkdin, niyə boynuna götürürdün? Vaxtında desəydin, ya getməzdim, ya da yerimi başqasına tapşırardım.

– Bu barədə sonra danışarıq. Deyin görüm bu məntəqə kimin briqadasınındır? – deyə prokuror soruşdu.

– Zeynəbin.

– Hanı o?

– Xəstəxanadadır.

– Bəs onun briqadasından burda kimlər işləyirdi?

– Tükəzban arvadla Kərim kişi.

– Bəs onlar hanı?

– Arvad xəstəxanadadır. Kişi burdadır.

Prokuror yaxşı tanıdığı Kərim kişini camaatın içində gözləri ilə xeyli axtardı:

– Bəs hanı? Gözümə dəymir, yoxsa qaçıb?

– Burdayam, heç yerə qaçmamışam.

Əsədov qocanı hirsli-hirsli süzüb dişini qıcadı.

– Kişi, pambığı niyə yandırıbsan?

– Mən pambıq yandırmamışam.

– Bəs kim yandırıb?

– Bilmirəm.

– Əyə, ağlını başına yığ, – Kosaoğlu dilləndi, – necə yəni bilmirəm? Ocağı qalayan sən deyildinmi?

– Məndim, ay Kosaoğlu. Ancaq onu bil ki, mən öz malımı öz əlimlə yandırmaram.

– Bəs nə təhər oldu, sən vurmadın, mən yıxılmadım? De görüm hadisə necə oldu?

Kərim kişi üzünü prokurora tutub sözə başladı:

– Qaranlıq qarışandan sonra ocağın qırağında təkcə oturmuşdum. Tükəzban da içəridə pambığı çevirirdi. Birdən qulağıma səs dəydi. Elə bil bir şey partladı. Tez məntəqənin içinə getdim. Gördüm, pambıq alışıb yanır, nə qədər ayaqlayıb söndürmək istədimsə olmadı. Qaçıb köməyə adam çağırdım.

– İçəridə kim var idi?

– Təkcə Tükəzban idi.
– Deyirsən pambıq içəridən od almışdı, hə?
– Bəli.
– Ağlınca bunu kim etmiş olar? Tükəzban arvad etməz ki?
– Nə?! – Kərim kişi heyrətlə qaşını çəkdi. – A kişi, sən nə danışırsan?!
Prokuror yanındakı milis nəfərinə işarə etdi.
– Hələlik bu kişini saxlayın, görünür, tək deyil, yoldaşları da var. Sonrasına baxarıq.
Nəsib dayı dözə bilmədi:
– Yoldaş Əsədov, bir az səbr eləsəniz yaxşıdır. Məncə, qərar çıxarmaqda çox tələsirsiniz.
– Bu mənim işimdir.
– Ə, Nəsib, – deyə Kosaoğlu acıqlı-acıqlı dilləndi, – sən prokurora qanun öyrətməyəcəksən ha... Qoysana işini görə! Sən ki dünən gecə rayonda olubsan. Qoy kim müqəssirdir, cavab versin.
– Əlbəttə, vəzifədə səhlənkarlıq edənlər də məsuliyyət daşıyırlar.
Prokuror üzünü İmrana tutub nə isə demək istədi. Elə bu vaxt rayon milis şöbəsinin rəisi dəstəyə yaxınlaşdı. Onun əlində partlamış bir neft qabı var idi.
– Çox qəribədir, – deyə o, sözə başladı, – yanmış məntəqədə neft qabı nə gəzir?
O, əlindəki neft qabını prokurora uzatdı. Əsədov könülsüzcəsinə qaba baxıb geri qaytardı. Neft qabı əldən-ələ gəzdi.
– Zənnimcə, yanğın bundan törəyib. Görünür, kim isə nefti içəri qoyubmuş. İsti dəyəndə partlayıb, sonra da pambıq od alıb.
– Sən də söz danışdın! – prokuror rəisin sözünü kəsdi. – Heç neft də partlayarmı?
– Bəlkə qabda neft yox, benzin varmış.
– Yaxşı fərz edək ki, sən deyəndir. Bəs hansı axmaq qabı pambığın içinə qoyub?
– Elə məni də düşündürən odur...
Həmin axşam, İmranın həbs edildiyinə sevinən Kosaoğlu mütəkkəyə dirsəklənib təzəcə uzanmışdı ki, Musa içəri girdi. Dayısının yanında oturub ayaqlarını uzatdı. Onlara çay verdilər. Birdən Musa dayısının üzünə baxıb sinəsini qabartdı.
– Gördün hayfını necə aldım?

Kosaoğlu stəkanı nəlbəkiyə qoyub diqqətlə onun üzünə baxdı:
– Nə hayıf?
– Bəs məntəqə öz-özünə yandı?
– Ə, Musa, kefli deyilsən ki?
– Kefli niyə oluram? Düz sözümdür.
Kosaoğlunu fikir götürdü. O, çayını qurtum-qurtum içib bacısı oğlunu gözaltı süzdü. Birdən stəkanı nəlbəkiyə qoyub geri itələdi.
– Ə, sənə kim demişdi, bizi niyə işə saldın?!
– Əcəb elədim!
– Yaxşı, sinənə döymə, bu saat kənddən çıx get. Bir neçə gün gözə görünmə, görək sonrası nə olur.
Həmin gecə Musa Tiflisə qaçdı.

## 27

Tükəzban gözünü açanda ətrafa boylandı. Harada olduğunu müəyyənləşdirə bilmədi. Sonra başının üstündə dayanmış Zeynəbi gördü:
– Bura haradır, qızım?
– Xəstəxanadır, xala.
Arvad xeyli susdu. Başına gələnləri yadına saldı. Qızın sarıqlı əlləri gözünə sataşdı.
– Sənə nə olub, qızım?
– Heç nə, Tükəzban xala.
Arvad otağa göz gəzdirdi, səsi titrədi:
– Bəs İmran gəlmədi?
– Bu saat gələcək. Bir az əvvəl buradaydı. Kəndə getdi. İndicə qayıdar.
Zeynəb hiss etdi ki, Tükəzban xala ona inanmır.
– Məndən gizlətmə, qızım. İmranın başı əlində deyil.
– Heç nə yoxdur, Tükəzban xala.
Arvadın gözü qapıya zilləndi. O ağır-ağır nəfəs alır, intizarla oğlunu gözləyirdi. Həkimlər iki-üç dəfə xəstənin yanına gəlib onu müayinə etmişdilər. Hər dəfə məyusluqla geri qayıtmışdılar. Tükəzban xala ağır yanmışdı. Onun sağalacağına ümid çox azdı. Bunu, deyəsən, özü də hiss edirdi...
Zeynəb can verən arvadın üzünə baxıb göz yaşlarını güclə saxlayırdı. Tibb bacıları, çarpayıda sakitcə uzanıb gözünü qapıdan çəkmə-

yən arvada baxıb kövrəldilər. Elə bil arvad oğlunu görməmiş can vermək istəmirdi.

Həkimlər Zeynəbə dedilər ki, kəndə xəbər göndərsin, arvadın oğlunu çağırsınlar. Yazıqdır, arvad əli uzalı getməsin. Zeynəb zəng elədi. Nəsib dayı cavab verdi. Yarım saatdan sonra İmranı da zaminə götürüb gələcəyini söylədi.

Tükəzban xala gözünü qapıdan çəkib yenə Zeynəbin üzünə baxdı.

– Qızım, deyəsən, axı mən öləcəyəm.

– Elə söz danışma, Tükəzban xala, səndə nə var ki...

– Yox, qızım, daha gözlərim tor görür...Bəs İmran gəlmədi?

– Bu saat gələcək.

Zeynəb hönkürtüsünü boğmaq üçün dəsmalı ağzına aparır, dişinə salıb didişdirirdi.

– Bala, dərdin alım... bəlkə o gələnəcən canımı tapşırdım... vəsiyyətimi sənə eləyirəm.

Zeynəb hıçqırdı.

– Ağlama, qızım...yaranan öləcək...Ancaq...oğul toyunu görmədim...

– Görəcəksən, Tükəzban xala.

– Yox, bala gecdir...diləyim ürəyimdə qaldı.

– Heç nə olmaz. Nərgiz müəllimə harda olsa gəlib çıxacaq. O, İmranı çox istəyir.

– Eh, qızım, – arvad köksünü ötürdü. – İstəyən olsaydı, indiyəcən gəlib çıxartdı. Yox...deyəsən o, İmranın qədrini bilmədi. – Tükəzban xala sönməkdə olan gözlərini Zeynəbin üzündən çəkmədi. – Qızım... məndən...gizlətmə...düzünü de...barı son nəfəsimdə hər şeyi bilim, sən...İmranı...çoxmu istəyirsən?

Zeynəb Tükəzban xalanın nə demək istədiyini başa düşdü. Amma ölüm ayağında olan bu arvada nə desin? Nə cavab versin?

– Niyə dinmirsən, qızım?

– Tükəzban xala...

– Can bala!..

– İmranı kim istəmir ki, Tükəzban xala?

– İstəməyənlər var... qızım. Olmasaydı... mən bu kökə düşməzdim.

O, inildəyib yenə gözlərini qapıya zillədi.

– Zeynəb... bala... özün bilirsən ki, İmranın heç kəsi yoxdur... O lap tək qalır. Onu sənə tapşırıram... İmran əmanəti, dərdin alım!.. Onu tək buraxma... Özün qulluğunu elə, onun anası, bacısı ol... Bəs niyə gəlmədi?

Tükəzban xala susdu, onun gözləri yenə qapıda idi.

Aradan xeyli keçdi. Qapı açıldı. Nəsib dayı ilə İmran içəri girdi. Səs-küy eşidən arvad zarıdı. Zeynəb göz yaşını saxlaya bilmədi.

– Tükəzban xala, İmran gəldi.

Ananın sifətində ani bir canlanma sezildi.

– Hanı?.. Gözüm görmür... Pəncərəni niyə örtübsünüz? Açın!

Zeynəb dəsmalı ağzına tutub çarpayıdan aralandı. Açıq pəncərənin qabağında dayandı. Onun çiyni qalxıb-enirdi.

İmran çarpayının qabağında diz çökdü.

– Ana!

– Can... səsinə qurban... hardasan?

– Burdayam, ana, yanındayam.

– Bircə gözümün qabağına gəl, boyuna tamaşa eləyim. Üzünü görüm, yastığımı bir az qaldır.

İmran anasının saçını sığalladı.

– Hardaydın, bala?

– Özgə yerə göndərmişdilər, ana.

– Adam da... anasını... intizarda qoyarmı? Bu işığı niyə yandırmırlar?.. Otağa niyə qaranlıq çökdü? Bala, hardasan, üzünü görmürəm.

Heç kəs dinmədi.

Tükəzban xala oğlunun qolları arasında sustaldı, dodaqları titrədi.

– Şükür... Səni... gördüm... Bala!

O son dəfə çırpındı, sinəsi dolusu nəfəs aldı. Köksünü ötürüb dincəldi. Onun hərəkətsiz gözləri oğluna zillənmişdi. İmran bircə dəfə:

– Ana! – deyə hıçqırdı və ağzı üstə çarpayıya döşəndi.

Ertəsi günü Tükəzban xalanı kəndin kənarındakı qəbristanlıqda əri Səmədlə yanaşı basdırdılar. Göyün üzü açılmışdı. Elə bil buludlar gözlərini sıxıb yaşlarını axıtdıqdan sonra çəkilib uzaqlara getmişdi. Günəş də gözü yaşlı-yaşlı gülən uşaqlar kimi üfüqdən boylanırdı. Çöllərdə ot cücərmişdi. Baş-başa verən qəbir daşlarının arası belə yaşıl rəngə boyanmışdı. Otlar parıldayırdı. Göy qurşağının ucu kəndin qurtaracağında yerə enirdi.

Camaat çəkildikdən sonra da İmran qəbristanlıqdan ayrılmadı. Yalnız qaranlıq düşüb, işıqlar yananda Zeynəb onun qoluna toxundu. İmran dinməz-söyləməz onunla yanaşı evə qayıtdı.

## 28

Gecədən xeyli keçmiş itlər hürüşdü. Doqqazdan səs gəldi. Axır günlər səksəkəli olan Kosaoğlu yerindən dik qalxdı, döyükmüş halda pəncərədən boylandı, səsə qulaq asdı. Bir azdan Sayalı içəri girdi.

– Kimdir?

– Pambıq məntəqəsinin müdiridir, səni görmək istəyir.

– Deynən evdə yoxdur.

– Əl çəkmir. Qapını kəsdirib durur.

– Qoy cəhənnəm olub getsin! Xeyirliyə gəlməyib.

Lap qapının ağzında ayaq səsləri gəldi. Kosaoğlu tələsik paltarını geydi.

– Donuz oğlu əl çəkməz ki! – deyə donquldayıb həyətə çıxdı. Heç nə bilmirmiş kimi səsləndi:

– Aya, kimsən?

– Mənəm, ə.

Qonaq təklif gözləmədən içəri girdi. Stul çəkib oturdu, papiros yandırdı. Kosaoğlu qonağının həyəcanlı olduğunu duydu.

– Nə var, ə, xeyir ola, gecənin bu vaxtı niyə gəlibsən?

Qonaq başı ilə qapının ağzında dayanan Sayalıya işarə etdi.

– Eybi yoxdur, sözünü de, mənim ondan gizli sirrim yoxdur.

– İşimiz şuluqdur.

– Hay-küy salma görək.

– Nə vecinədir, çəkilib qıraqda durubsan, kəndir də mənim boğazıma keçib. Pambıq əskik gəlir.

Kosaoğlu çiynini çəkib gülümsündü.

– Mənə nə?

– Necə sənə nə? Yadından çıxıb?

– Əyə, nə sayıqlayırsan?

– Mən sayıqlamıram, yoxsa gəlib dil tökdüyün, yalvardığın yadından çıxıb?

– Mən sənə heç nə deməmişəm.

– Ay Kosaoğlu, məni uşaq yerinə qoyma. Ağlını başına yığ, söz danış. Mən səndən ötrü kəndçi-kündçü deyiləm ki, başımı aldadasan.

– A bala, məndən nə istəyirsən?

– Satın aldığın pambığın pulunu.

– Nə pambıq?

– Kişisən, ə, özünü qanmaz yerinə qoyma. Planı qabaqca doldurmaq üçün məndən otuz ton pambıq almadınmı? İndi işin üstü açılıb. Ya pambığı qaytar, ya da pulunu ver ki, yaxamızı qurtaraq. Yoxsa gurultu ilə gedirik fələyin xərcinə. Başa düşdünmü?

– İndi neyləyək deyirsən?

– Nə qədər yığılmış pambığın var, gətir ver, otuz tonun yerini dolduraq.

– Ə, elə şey olarmı? Bu saat hər tərəfdən mənə min göz baxır. Heç qorxumdan başımı qaşıya bilmirəm.

– Onda pulları ver.

– Pul hardadır? Bu saat qəpiyə güllə atıram.

– Ay Kosaoğlu, gəl məni dolama.

– Ə, nə dolamaq? Birdən-ikidən səninlə zarafat eləmişəm? İşə düşübsən, get başına çarə qıl.

– Demək belə oldu?!

– Məni nə hədələyirsən? Əlində qəbzim-zadım var? Pambığı satıb yeyibsən, özün də cavabını ver.

Qonaq papirosu sümürüb kötüyü hirslə yerə çırpdı.

– Yaxşı, Kosaoğlu!.. Mən dedim köməkləşək, bu xatadan qurtaraq. İndi ki, belə oldu, məndən incimə.

– Neyləyəcəksən?

– Onu özüm bilərəm. Özümdən qabaq səni dama basdırmasam, atamın oğlu deyiləm.

Kosaoğlu qorxuya düşdü.

– Yaxşı, artıq-əskik danışma, kömək istəyirsən de, eləyim. Daha dünyanı başına niyə götürübsən? Sən get, mən özüm prokuroru görərəm.

Qonaq yola düşəndən sonra Kosaoğlu evdə xeyli gəzindi. İndi o, haraya, kimin yanına getməli idi? Dərdini kimə deməli idi? Onun indi pənah gətirəcəyi yeganə adam var idisə, o da Əsədov idi. Deyəsən, axır vaxtlar o da yaxasını kənara çəkirdi. Hətta Kosaoğlunun özü ilə də ehtiyatla danışırdı.

Kosaoğlu papirosu papirosun oduna yandırırdı. "İndi mən neyləyim? Adamın bir gəlhagəli olur, bir də gethagedi. Görünür, mənim gethagedimdir. Mənə deyən gərək, ay axmaq məntəqədən pambıq alanmı olubsan? Keçən il işlər ayrı cür idi, anbar da, kassa da əlimdəydi. İndi kimdi məni özbaşına buraxan? Səhv elədim, gərək pambıq məsələsinə başımı qatmayaydım. Bir yandan da ki, bu Şahnaz günüqara adımızı batırdı.

Kosaoğlu qapını aralayıb Sayalını çağırdı.

– Arvad, gəl görüm.

Sayalı otağa girdi. Ərinin üz-gözündən zəhər töküldüyünü görüb özünü itirdi, ona yazığı gəldi. Kişi axır vaxtlar çox fağırlamışdı.

– Nə oldu, gədəni yola gətirə bildinizmi?

– Bir az yumşalan kimi olub, Şahnaz bütün günü dilə tutdu. Özüm qapının dalından pusurdum. Gədə əvvəlcə nəm-nüm elədi, qız əl çəkmədi. Dedi: "Gəl davasız-şavasız bu işi qurtaraq, yoxsa özümü öldürüb qanımı üstünə tökərəm".

Kosaoğlunun səbri tükəndi:

– Yaxşı, axırı nə oldu?

– Nə olacaq, yalvar-yaxardan sonra gədə yumşaldı. Zaqsa gedəcəklər.

Qurban dərindən nəfəs aldı.

– Onda üstlərinə düş. Mənim başım qarışıqdır. Elə isti-isti işi qurtarın. Sən qızın cehizlərini ona göstər. Tamahkar gədədir, geri durmaz.

– Yaxşı, ay kişi. Bəs özün heç onunla danışmayacaqsan?

– Sonra, sonra...Siz işi qurtarın. Guya mənim xəbərim yoxdur. Bəs indi gədə hardadır?

– O biri otaqda.

– Çağır gəlsin...Deyinən "Qurban qağan rayona gedəcək, maşını sazla".

Yarım saatdan sonra onlar yola düşdülər.

Kosaoğlu maşını prokurorun evinin qabağında saxladı. Asta-asta pilləkəni qalxdı. Ehtiyatla qapını döydü. Qapını açdılar. Kosaoğlu Əsədovun arvadı ilə üz-üzə dayandı. Heç biri dinmədi. Arvadın gözləri qızarmışdı, deyəsən, ağlamışdı.

– Nə istəyirsən?

– Gülzar bacı, niyə bikefsiniz? Yoldaş Əsədov evdədirmi?

– Əsədovun evini yıxdın, indi nə istəyirsən? Vaxtında sözümə baxmadı, sənə uydu.

– Nə olub ki?

– Nə olacaq, Bakıya çağırıblar, yəqin başında bir iş var.

Kosaoğlu dinməz-söyləməz qayıtdı. Tez bir papiros yandırdı. Şoferin yanında oturdu.

– Kəndə sür.

...Maşın qapıda görünəndə Sayalı özünü ərinin üstünə saldı.

– A kişi, sənsən?

– Mənəm. Nə olub, rəngin niyə qaçıb?

– Nə olacaq? Musanı tutub apardılar. Tiflisdən təzəcə qayıtmışdı. İndicə sənin dalınca gəlmişdilər, soruşdular ki, hardadır?

– Kim?

– Naçalnik.

– Bəs necə oldu?

– Dedim evdə yoxdur, çıxıb getdi.

Lakin milis rəisi getməyibmiş. Kosaoğlu doqqazın o tərəfindən ağır-ağır yaxınlaşan rəislə milis nəfərini gördü. O, daim çiynində gəzdirdiyi kürkünü payız girəli ilk dəfə əyninə geydi, şaxtaya düşmüş kimi əllərini ciblərinə dürtüb, boynunu içinə qısdı. Canını titrəmə götürdü...

## 29

İmran evə qədəm basan kimi anasının yoxluğunu bütün dəhşəti ilə hiss etdi. Toyuq-cücə həyətə səpələnmişdi. Eyvan süpürülməmişdi. Ocaq yerindəki daşlara, divara söykədilmiş saca əl dəyməmişdi. Səhəng boş idi. Taxtın üstü səliqəyə salınmamışdı. Ev buz kimi idi.

İmran sakitcə taxtda oturdu. Hara baxdısa, anası gəlib gözünün qabağında dayandı. Ona elə gəldi ki, anası bu saat qaynamış samovarı içəri gətirəcək, süfrə salacaq, qonşu otaqdan Nərgiz çıxıb gələcək, yenə oturub birlikdə, deyə-gülə çörək yeyəcəklər...

Qapının ağzında boyunlarını büküb dən gözləyən toyuqlar qaqqıldaşırdılar. Xoruz qanadlarını çırpıb vaxtsız banladı. İmran xəyaldan ayrıldı. Başını qaldırıb qaranlıq otağa baxdı. Evə ürəksıxıcı, ağır sükut çökmüşdü. Bu sükutu yalnız su daşından süzülüb küpə düşən damlaların yeknəsəq səsi pozurdu. İmranın bədəni üşürgələndi. O bir daha dərk etdi ki, anası yoxdur. O həmişəlik getmiş, özü ilə bərabər evin istiliyini də aparmışdır. Qaranlıq düşdükcə, İmran daha çox kədərlənirdi. Nəhayət, özünü saxlaya bilmədi, taxtın üstünə uzanıb hönkürdü.

Aradan nə qədər keçdiyini İmran hiss etmədi. Kim isə onun çiyninə toxundu. Gözlərini açdı. Ev işıq idi. Samovar yenə də həmişəki kimi stolun üstündə zümzümə edirdi. Süfrəyə yemək düzülmüş, stəkan-nəlbəki yuyulub silinmişdi. Hər şey öz qaydasında idi. Elə bil otağın havası da dəyişmişdi. Bayaqkı soyuqluqdan əsər qalmamışdı. İmran

yalnız indi, başının altına yastıq qoyulub, üstünə yorğan salındığını hiss etdi. Yavaşca ayağa durdu. Samovarın yanında dayanıb kədərli-kədərli gülümsünən Nərgizi görəndə yerindən tərpənmədi. Ona elə gəldi ki, yuxu görür.

Lakin qız cəsarətsiz addımlarla İmrana yaxınlaşdı. Onun gözləri yaşarmışdı. Damlalar iri kirpiklərinin ucunda titrəyirdi.

İmran onu birinci dəfə görürmüş kimi, diqqətlə gözdən keçirdi, səbəbini özü də bilmədən köksünü ötürüb başını tərpətdi. Nərgiz lampa işığında onun yaşarmış gözlərinin parıltısını gördü.

Onlar dinməzcə həm ağlayır, həm də gülümsünürdülər. Nə etmək olar? Kədərlə sevinc elə əvvəldən əkiz doğulmamışdırmı?

*1954-1955*

# ÖLƏN DÜNYAM

## *I fəsil*

### 1

Həsən ağa eyvanı Kürə baxan evlərinin həyətində odun yarırdı. Havanın sazaq, ətrafın qırov olmasına baxmayaraq enli kürəyinin ortası tərləmişdi. Ələddinin səsini eşidəndə baltanı kötüyə sancıb dikəldi. Gödəkcəsini çiyninə saldı, ağır-ağır doqqaza doğru addımladı.

– Niyə orda durubsan?

– Bəri gəl, sözüm var.

Həsən ağa ona yaxınlaşdı. Salamlaşdılar. Ələddinin gözləri gülürdü.

– Bir şey görmürsən?

Həsən ağa diqqətlə Ələddini başdan-ayağa süzdü. Gördü ki, nişanlanandan bəri üstü-başı səliqəyə düşüb. Gülümsündü.

– Deyəsən qızın eşqi səni sığallaşdırıb?

– Elə bu?

– Bə, nə istəyirsən?

– Üst-başımı demirəm, bir çiynimdəkinə bax.

Həsən ağa yalnız indi qoşalüləni gördü və gözləri maraqdan işıldadı. Bir ovçu hərisliyi ilə əlini uzadıb tüfəngi aldı. Parıldayan qundağına, nə qədər təmizlənsə də, yağı tamam silinməyən lüləsinə baxdı, çaxmağını çəkib bərk-boşluğunu yoxladı. Tətiyi basdı, sonra lüləni işıldayan günə doğru qaldırıb baxdı. Nişan alırmış kimi gözünü qıyıb üzünü qundağa yapışdırdı.

– Hə, necədir?

Həsən ağa tüfəngin ağırlığını bilmək istəyirmiş təkin qoşalüləni əlində sanballadı.

– Çox mübarək, havaxt alıbsan?

– Dünən.

– Atmağı necədir, yoxlamısanmı, düzmü nişan alır?

– Elə sənin yanına gəlmişəm ki, gedək yoxlayaq.

Həsən ağanın birdən-birə alışan ovçuluq ehtirası birdən-birə də söndü. Qoşalüləni geri qaytardı.

– Yox, bu gün gedə bilməyəcəm.

– Niyə?

– Qonağım gələcək.

Ələddin dostundan belə cavab gözləmədiyindən bir an duruxdu. O elə zənn edirdi ki, Həsən ağa həmişəki kimi əlüstü razılaşacaq, dərhal patrondaşını, tüfəngini götürüb ona yoldaşlıq edəcəkdi.

– Qonağın nə vaxt gələcək?

– Günortaüstü, ya da axşam tərəfi.

– Eh, ay rəhmətliyin oğlu, onacan on dəfə gedib gələrik. Tez ol, tüfəngini götür.

– Yox, Ələddin, bu dəfə mənsiz get.

– Elə şey yoxdu. Sənsiz ovun nə ləzzəti. – Ələddin dönüb suyu soğulmuş Kürə, călədəki çılpaq ağaclara, çiləkənlərə, o taydakı meşənin boz qovaqlarına baxdı. – Əsl ov vaxtıdı, hava da havalanıb. Sənin canın üçün ürəyimə damıb, gedən kimi maral vuracayıq, özüm ocaq çatıb kabab çəkəcəm.

Həsən ağanın ovçuluğuna, sərrast güllə atmağına söz ola bilməzdi. Onlar həmişə bir yerdə ova gedər, ocaq çatıb ov əti bişirərdilər. Ələddin də pis ovçu deyildi. Amma özünün əlinə yatan tüfəngi yox idi. Yeznəsindən, tanışlarından aldığı tüfənglər isə, hərdən onun gülləsini boşa çıxarırdı. İndi özünə təzə tüfəng almışdı. Həsən ağa bu cavan oğlanın ürəyindən keçənləri duydu. O başa düşürdü ki, Ələddin özünü göstərmək istəyir. İstəyir ki, Kürü keçib meşədə axşama qədər dolaşsın, geri dönəndə əli dolu qayıtsın, təzə tüfəngin ilk ovundan – vurduğu qırqovullardan nişanlısına pay göndərsin, qürrələnsin. Onun özü də cavan olmuşdu. Meşədən qayıdanda kəndin ortasındakı cığırlara sığışmırdı. İstədiyi qızın doqqazlarından keçəndə bilirdi ki, hardasa gizlənib arxasınca baxan var, az qalırdı ayaqları dolaşsın. Axşamüstü bacısı, ya da anası üstünü vurmasalar da, onun ürəyindən keçənləri başa düşür, ovlanan qırqovullardan qonşuya pay göndərirdilər. Bu pay Həsən ağanın deyiklisinin gizlicə ürək döyüntüsünə, yanaqlarının qızarmasına səbəb olurdu. Ertəsi gün isə ona naxışlı yun corab, ya da yanları işləməli dəsmal gəlirdi... Həsən ağa başa düşürdü ki, Ələddin bu saat tüfəngdən çox özünü sınamaq, nişanlısının gözündə ucalmaq istəyir.

– Elə gərək bu gün gedək? Qoy qalsın sabaha. Axşamdan hazırlaşıb obaşdan gedərik. Görmürsən gün hara qalxıb? Biz Kürü keçənəcən gün günortadan əyiləcək.

– Hələ axşama çox var, sözümü yerə salma, özün bilirsən ki, əliboş geriyə qayıda bilmərəm.

Həsən ağa onun eyhamını başa düşdü. Gülümsündü.

– Vallah heç həvəsim yoxdu.

– Başın haqqı, səndən əl çəkən deyiləm, gedək!

Həsən ağa yarı xoş, yarı zor razılıq verdi.

* * *

Onlar torpaq yoldan aralanıb, yarğanın qaşındakı cığıra çıxdılar.

Alan hamıdan qabaqda gedir, tez-tez cığırdan çıxıb sirkənlərin arasını dolaşır, ayağını asta-asta basıb yeri imsiləyir, torağayları hürküdür, sonra geri qayıdır, Ələddinin əl-ayağına sürtünürdü. Ələddin itin sevincinə şərik olurmuş kimi onun başını sığallayırdı.

Dikdirə çıxdılar. Həsən ağa ayaq saxlayıb girməyə enən yola baxdı. Birdən bədəni üşürgələndi. Bərkdən asqırdı. Ələddin səsə dönüb baxdı və gördü ki, Həsən ağa dikdirdə dayanıb aşağı enmək istəmir. Ələddin geri qayıtdı.

– Niyə durdun?

– Eşitmədin tək səbir gəldi? – Həsən ağa gözünü Ələddinin üzünə zillədi. Onun baxışlarında bir yalvarış vardı. – Heç ayağım getmir, gəl qayıdaq.

– Ay Həsən qağa, sən də lap məzəli olmusan, tək səbir gələndə nə olar? Belə şeydən ötəri də, adam gerimi qayıdar?

– Bilirəm, sən belə şeylərə inanmırsan, amma mən inanıram. Tək səbir mənə düşmür, mən qayıdıram.

O, doğrudan da geri döndü. Ələddin nə qədər yalvardısa, eşitmək istəmədi. Hətta onun yolunu kəsib qabağında atılıb-düşən Alanı da acıqlanıb qovdu.

– Ay Həsən qağa, bir ayaq saxla, gör nə deyirəm?

Həsən ağa dayandı. Həyəcandan sinəsi qalxıb-enən Ələddinə baxdı.

– Nə deyirsən?

– Bir şərtim var.

– Nə şərt?

– Bax, bu ispiçkanı nişan qoyacam. Əgər birinci gülləyə vura bilsəm, gedirik. Əgər vura bilməsəm, sən deyən olsun, qayıdırıq.

Həsən ağa tərəddüd içində dayandı. Ondan intizarla cavab gözləyən Ələddinə xeyli baxdı. Nə fikirləşdisə, "yaxşı" dedi və köksünü

ötürdü. Ələddin quş kimi sıçrayıb aralandı. Yoldan kənarda, sirkənliklərin içindən ucalan qanqalın ucuna kibrit qutusunu taxdı və eyni sürətlə geri qayıtdı.

– Burdan nişan alım, yoxsa bir az geri çəkilim?

– Burdan nənəm də vurar, bax, get o dikdirə.

Ələddin deyilən yerə getdi və tüfəngi üzünə qaldırmağı ilə nişanı vurmağı bir oldu.

– İndi nə deyirsən?

– Yaxşı, sən deyən olsun, – deyə Həsən ağa könülsüz cavab verdi və ayağını sürüyə-sürüyə enişə doğru addımladı.

Kürün suyu göz yaşı kimi dumduru idi. Yarğanların dibi, çiləkənlərin ətrafı sırsıra bağlamışdı. Su elə dayazlaşıb, elə şəffaflaşmışdı ki, çayın dibindəki daşlar aydınca görünürdü. Soyuq olmasaydı, adam çərməşib asanlıqla o üzə keçə bilərdi.

Ələddin yulğun kollarının arasındakı qayığı itələyib suya saldı. Hamıdan qabaq Alan atılıb qayığa mindi. Həsən ağa kürəyi götürüb burun tərəfə keçdi. Ələddin çəpi əlinə aldı. İki-üç təkandan sonra Kürü yarı elədilər.

Xəzəl dizə çıxırdı. Qovaqlar, palıdlar, cır meyvə ağacları, saqqız kolları yarpaqlarını töksələr də, bir-birlərinə söykənib sıxlaşmışdılar. Elə bil soyuqdan qorunmaq üçün bir-birlərinə qısılmışdılar. Bircə qızılcıq kolları yarpağını tökməmiş, yaz-yay aylarında olduğu kimi qalınlaşıb fızıllığa dönmüşdülər.

Alan qabaqda gedir, ayaqlarını asta basır, arabir dayanıb qulaqlarını şəkləyir, ətrafı dinşəyirdi. Meşənin dərinliyindən, Qarasu tərəfdən qaz səsi gəlir, qanad səsi eşidilirdi. Birdən Alan dayandı. Yeri imsiləyib geri boylandı və qamışlığa doğru qaçıb marığa yatdı. Həsən ağa qoltuqaltısından güllə çıxardıb tüfəngi doldurdu. Ələddin qabağa, itin yanına getdi. Diqqətlə xəzələ, qamışlığın kənarındakı nəm torpağa baxdı. Əli ilə izi göstərdi.

– Qabandır, indicə keçiblər.

İt izi alıb bir xeyli qamışlığın yaxası boyu getdi. Sonra yana burulub, meşənin dərinliyinə qaçdı.

– Deyəsən, iyi alıb, ehtiyatlı ol, – deyə Həsən ağa pıçıltı ilə göstəriş verdi.

Onlar dizə qədər xəzələ bata-bata, nəfəslərini dərmədən Alanın dalınca getdilər.

Meşə qalınlaşırdı. Qızılcıq kolları, sarmaşıqlar, ağacların gövdəsinə ilan kimi dolanıb qol-budaq atan tənəklər tez-tez yollarını kəsirdi. Arabir quşlar kollardan pırıltı ilə uçur, qamışlığın o tayında gözdən itirdilər.

Birdən Alanın səsi gəldi; əvvəl kəsik-kəsik, sonra boğuq-boğuq. Ələddin sıçrayıb qabağa atıldı. Alanın xasiyyətini bilirdi: ov görəndə həmişə belə edərdi.

Onlar qamışlığın yanından talaya çıxanda gördülər ki, Alan iri bir qabanı qabağına salıb qovur. Ələddin tüfəngi üzünə qaldırdı, tətiyi çəkdi. İt zingildədi və qızılcıq koluna doğru qaçdı. Onlar özlərini yetirəndə gördülər ki, Alan hürə-hürə qızılcıq kolunun ətrafında fırlanır. İt onları görəndə daha da ürəkləndi və kolluğa cumuldu.

– Murdar kola girib, tez ol, arakəsməyə alaq.

Həsən ağa yerində dayandı. Ələddin qənşər tərəfə keçdi. Qızılcıq kolunu araya aldılar. Çaxmağı çəkib tüfəngləri kolluğa tuşladılar. Barmaqlar tətikdə hazır dayandılar.

Qızılcıq kolu elə qalın idi ki, bu üzündən baxanda o üzünü görmək mümkün deyildi. İtin qovub kola saldığı qaban da, elə Alanın özü də şiniyib hardasa dayanmışdılar. Ovçular da nəfəslərini içəri salmışdılar. Bir balaca şıqqıltı eşidən kimi tətiyi çəkib həmin səmtə güllə atasıydılar.

Həsən ağa kolun dərinliyində it zingiltisi, sonra şıqqıltı eşitdi. Yəqin etdi ki, Alan qabanın qabağını kəsmişdir. Donuz isə nəfəsini dərib fürsət gözləyir, azacıq keçsə, iti parçalayacaq. Tüfəngini o səmtə hərləyib tətiyi çəkdi. Alan sıçrayıb kolluqdan kənara atıldı. Güllə səsinə diksinən quşlar, ağacın budağındakı qarğalar havaya qalxdılar və uzun zaman civilti səsi qarğa qarıltısına qarışdı. Barıt tüstüsü çəkilməmiş Həsən ağa gördü ki, qaban kolluqdan çıxıb xortlaya-xortlaya qamışlığa qaçdı. Qolları yanına düşdü. O yəqin bilirdi ki, gülləsi boşa çıxmayıb. Bəs necə olmuşdu ki, qaban qaçırdı. Alan da görünmürdü. Tüfəngi yerə atdı. Ürəyi səksəkəli halda qızılcıq kolunun başına dolandı və gördü ki, Alanın bədəni titrəyir. İt çaşqın halda gah quyruğunu bulayıb irəli əyilir, gah da geri çəkilib kəsik-kəsik zingildəyirdi.

Ələddin saralmış kolların arasında arxası üstə uzanmışdı. Sinəsindən qan axırdı. Papağı kənara düşmüşdü. Həsən ağanın dizləri qatlandı. Elə bil gözlərinə qaranlıq çökdü. Başı hərləndi. Səldirləyə-səldirləyə Ələddinə yaxınlaşdı. Diz çöküb bir xeyli donmuş kimi, lal-dinməz qarşısında uzanan Ələddinin önündə dayandı. Elə bil onun nitqi tutulmuş,

damarlarında qan donmuş, gözlərinə tor gəlmişdi. Nə dillənə bilirdi, nə də tərpənə. Xeyli gözlədi. Sonra titrək əlləri ilə xəzəli, otları kənara atdı. Ələddinin hələ də tüfəngin tətiyində olan barmağını araladı. Onu qucağına alıb kolluqdan kənara çəkdi. Bir xeyli nə edəcəyini bilmədən beləcə dayandı. Sonra Ələddini yenidən xəzəlin üstünə uzatdı. Nəfəsi daraldı. Hövllə dartıb yaxasını açdı. Pencəyinin, köynəyinin düymələri vızıltı ilə ətrafa səpələndi. Boğazına yığılmış göz yaşlarını uddu. Ələddinin başını qaldırıb dizinin üstünə qoydu. Onun da pencəyinin, köynəyinin yaxasını açdı. Əli isti qana bulandı. Boğula-boğula: "Mənim evimi niyə yıxdın, – dedi, – indi mən nə edim, camaata nə cavab verim, sizinkilərin üzünə necə baxım, a zalım balası? Ay bədbəxt oğlu, bədbəxt, özünü də, məni də niyə bədbəxt elədin? Sənə demədimmi tək səbir gəldi, gəl qayıdaq. İndi mən başıma haranın daşını töküm?!".

Ələddin elə bil bu sözləri eşitdi. Gözlərində işartı sezildi. Dodaqları tərpəndi. Səsi güclə eşidildi.

– Səndə nə günah var, ay Həsən qağa, görünür əcəl məni çəkirmiş.

Ələddinin bədənindən gizilti keçdi. Bu giziltidən qolları, qılçaları gərildi və birdən süstləşib boşaldı. Həsən ağa onu qucaqlayıb hönkürdü. Başa düşdü ki, Ələddin canını tapşırdı. Diqqətlə gözlərinə baxdı. Telini sığalladı, əlini üzündə gəzdirdi.

Beləcə, meyit qucağında nə qədər dayandığını bilmədi. Havanın qaralıb günün yaxdığından, axşamın düşdüyündən xəbəri olmadı. Bir də o vaxt ayıldı ki, meşəyə qaranlıq çökür. Özünə toxtaqlıq verdi. Meyiti ehmalca yerə, qırovlanmış xəzəlin üstünə qoydu. Meyitin ayaqlarını, qollarını düzəltdi, gözlərini sığadı, papağını gətirib başının altına qoydu. Bundan sonra qamətini düzəldib dikəldi. Sazaq başlamışdı. Meşə sükuta qərq olmuşdu.

## 2

Həsən ağa ətrafa səpələnmiş quru budaqlardan bir qucaq yığdı, gətirib meyitin yanında yerə tökdü. Əlləri əsə-əsə ciblərini axtardı. Kibrit çıxardıb ocaq qaladı. Meşəyə qızıl dilli alovun işığı yayıldı. Sonra iri bir kötüyü sürüyüb ocağa qoydu. Bir xeyli çatırtıyla yanan odunlara baxdı.

Alan yerə yatdı. Qabaq ayaqlarının üstündə, xəzəli xışıldada-xışıldada, zingildəyə-zingildəyə meyitin bərabərinə qədər süründü. Onu imsilədi və birdən dik atılıb geri sıçradı. Həsən ağa dolmuşdu. Başını əlləri arasına alıb, için-için, korun-korun ağladı. Elə bil Alan bunu başa düşdü. Ulamasına ara verib təzədən yerə yatdı. Bu dəfə sürünə-sürünə Həsən ağaya yaxınlaşdı. İtin zingiltisini eşidən kişi əlini onun başına çəkdi. İt özünə həyan tapmış kimi sivişib ona lap yaxınlaşdı. Quyruğunu buladı, Həsən ağanın bədəninə qısıldı. Hər ikisi titrəyirdi. Həsən ağa itin bu hərəkətindən ürəkləndi, özünə həmdərd tapmış kimi oldu. Bədəninin titrəməsi azaldı. Əlini əsim-əsim əsən Alanın başına çəkdi. “İndi nə eləyək, Alan, bu dərdi kimə söyləyək? Özün gördün ki, məndə günah olmadı, bədbəxt oğlunu əcəl çəkib bura gətirdi! Özünün də evini yıxdı, mənim də. İndi mənə kim inanacaq?”. Kişinin yanaqlarından yaş yuvarlandı. Elə bil Alan da ağlayırdı, ocağın işığında gözləri parıldayırdı.

Xeyli beləcə oturdular. Sonra Həsən ağa astaca ayağa durdu. Tüfəngləri götürüb qamətini düzəltdi. Bir xeyli çatırtı ilə yanan ocağa, alovun işığında uzanmış Ələddinin sifətinə baxdı. Köksünü ötürüb asta addımlarla uzaqlaşmağa başladı. İt də durdu. Quyruğunu qısıb yazıq-yazıq boylandı. Həsən ağa geri döndü. Gözləri Alanın gözlərinə sataşdı və gördü ki, itin üzündə, gözlərinin altı bərabərində iki sulu zolaq işıldayır. Onu yenidən qəhər boğdu: “Sən burda qalarsan, yaxşımı, Alan, Ələddini meşədə tək qoymaq olmaz. Onun yanında, ocağın qırağında oturarsan. Qoymazsan qurd-quş yaxın gələ, yaxşımı? Mən də gedim kəndə görüm neyləyirəm, başıma haranın daşını salıram”. Alan elə bil deyilənləri başa düşdü. Bir ocağın işığında aydın görünən meyitə, bir də Həsən ağaya baxdı. Çömbəldi. Həsən ağa qaranlıqda gözdən itəndən sonra ağzını göyə tutub, acı-acı uladı.

Meşə sakitləşmişdi. Nə quş səsi eşidilirdi, nə də qanad şaqqıltısı. Hərdən bir adamın ətini ürpəşdirən bayquş ulaması olmasaydı və Kürün qıjıltısı aydınlaşmasaydı, insan mürgüləyən meşədə vahimələnib ölərdi.

Həsən ağa şaxtadan donmuş xəzəl və quru ağac budaqlarını ayaqlaya-ayaqlaya sahilə doğru addımlayırdı. Hələ özünə gəlməmişdi. Hara gedəcəyini, nə edəcəyini bilmirdi. Bilmirdi ki, əvvəl öz evinə getsin, yoxsa qardaşıgilə. Dərdini əvvəl anasına açsın, yoxsa arvadlar üz-gözlərini cırıb saçlarını yolduqdan sonra onu aralığa alıb didim-didim edəcəkdilər? Heç nə anlamır, heç nə başa düşə bilmirdi...

Birdən qabaqdan şıqqıltı və at fınxırtısı eşidildi. Həsən ağa diksindi, amma yoldan çıxmadı. Özgə vaxt olsaydı, sıçrayıb ağacın dalına keçər, tüfəngi hərləyib əlinə alar, çaxmağı çəkib gülləni lüləyə verər və barmağı tətikdə gözləyərdi. Amma indi elə bil heç nə görmədi. Başını aşağı salıb xəzəli xışıldada-xışıldada yoluna davam etdi. At bir də fınxırdı. Çaxmaq şaqqıldadı və boğuq səs eşidildi:

– Ayə, kimsən?

– Mənəm.

Şəmiddin ağa qardaşının səsini tanıyıb atdan düşdü.

– Nə olub?

Həsən ağa dinmədi. Şəmiddin ağa gördü ki, qardaşı büzüşüb. Elə bil onun enli kürəyi, geniş sinəsi qatlanmış, beli də əyilmişdi. Şəmiddin ağa ətrafa boylandı.

– Bə, Ələddin hanı?

Həsən ağa dinmədi. Bilmədi sözə nədən və necə başlasın, əhvalatı qardaşına nə təhər başa salsın.

– Heç Alan da gözümə dəymir. Bə, ova gəlməmişdiniz?

– Kaş qılçalarım qırılaydı, heç gəlməyəydik.

– Ə, bir düz-əməlli danış görüm nə olub?

– Əlimdən xata çıxdı, bədbəxt oğlunu öldürdüm.

– Ə, nə danışdığındı?

Şəmiddin ağanın boğazı qurudu, udquna-udquna qaldı. Nə qədər çalışdısa, sözünün dalını gətirə bilmədi.

– Vallah heç özüm də bilmədim necə oldu?

– Bə meyit hanı?

– Orda, ocağın qırağındadır.

Şəmiddin ağa meşənin dərinliyində qızaran qızılcıq koluna baxdı. Başa düşdü ki, qardaşı meyitə qurd-quş yaxın gəlməsin deyə ocaq qalayıb. İndi canavarın kürsək vaxtı idi. Sürü ilə gəzir və əllərinə keçəni dağıdırdılar.

– İndi nə eləmək istəyirsən?

– Bilmirəm.

– Yaxşı, arvad kimi hönkürmə! Kişinin başına iş gələr, əlindən xata da çıxar, adam öldürüb zindana da düşər.

Qardaşının acıqlı səsi elə bil Həsən ağanı özünə gətirdi. Əlinin arxası ilə gözünü silib dirçəldi. Şəmiddin ağa atını yedəkləyib qabağa düşdü. İri addımlarla işıq gələn tərəfə yeridi.

Alan çənəsini biləklərinin üstünə qoyub meyitin yanında uzanmışdı. Xəzəl xışıltısı və at fınxırtısı eşidən kimi dik atıldı. At onu görən təkin oxrandı. Alan iki-üç sıçrayışla özünü onların üstünə saldı. İt atı, at da iti imsilədi. Alan sahibinin ayaqlarına dolaşdı, quyruğunu bulayıb şırvandı. Birdən nəyisə xatırlamış kimi dayandı. Ağzını göyə tutub acı-acı uladı. At da onun səsinə səs verdi. Ayaqlarını yerə döyüb kişnədi.

Şəmiddin ağa meyitə yaxınlaşdı. Diz çöküb ocaq işığında ala-bula görünən sifətinə baxdı. Əlini meyitin üzünə çəkdi. Onun təzə pencəyinə, təzə şalvarına, təzə çəkmələrinə təfərrinc etdi. "Zalım balası elə bil toya yox, ölümə hazırlaşırmış", – deyə ürəyindən keçirdi. Düz bir ay qabaq Ələddini özü şəhərə aparmışdı. Gəlinə də, Ələddinə də paltarları özü almışdı. Elçiliyə də özü getmişdi. Ələddin onun gözü qabağında böyümüşdü, onu doğma balası kimi istəyirdi. Düz bir həftədən sonra toyunu edəcəkdilər. Çıraq uşağı da, Alqazaxlılar da məsləhətləşmişdilər ki, mahalın ən mahir zurnaçısı Hümməti gətirsinlər, hətta beh də vermişdilər. Aşıq Qarnet də bığını eşə-eşə sazını kökləyib gözləyirdi. Qohum-əqrəba, kəndin bütün qız-gəlini əllərinə xına yaxıb oynamağa hazırlaşırdılar. Şəmiddin ağa kövrəldi. Ayağa durdu. Atın cilovundan yapışdı. Büzüşən qardaşına baxdı.

– Sən burda qal.

Sıçrayıb atın belinə qalxdı. Yüyəni dartıb Kürə doğru çapdı. Alan da onun dalınca getdi. Amma beş-on addım atmamış zingildəyib dayandı. Gah qaranlıqda gözdən itməkdə olan atlıya baxdı, gah da öləziməkdə olan ocağın qırağında dayanan qaraltıya. Xeyli tərəddüddən sonra quyruğunu qısıb zingildəyə-zingildəyə geri qayıtdı. Meyitin yanına uzanıb başını biləklərinə söykədi.

## 3

Şəmiddin ağa atı birbaş qardaşıgilə sürdü. Zəncirdən açılmış itlər onu az qala yəhərdən salacaqdılar. Amma kişinin tanış səsini eşidib dayandılar. O, atı həyətə çəkdi. Talvarın altında yüyəni dirəyə bağladı. Pillələri qalxıb, birbaş anasının otağına keçdi. Güllü xanım içərisi başdan-başa gəbə ilə döşənmiş evin yuxarı başında döşəkçənin üstündə oturub yastığa dirsəklənmişdi. Qabağında çay vardı. Dəmir soba

gurhagurla yanırdı. Şəmiddin ağa içəri girən kimi kəkotu çayının ətrini duydu. Qapının ağzında bir az ayaq saxladı, sonra ürkək addımlarla anasına yaxınlaşdı. Otuzluq çırağın işığında sifəti aydın görünən anasının gözlərindəki qəzəb qarışıq suala fikir vermədən, qarşısında diz çöküb əlindən öpdü; arvad da oğlunun alnından. Şəmiddin ağa xeyli beləcə, anasının önündə dizi üstə qaldı və yalnız o, işarə edəndən sonra böyründə bardaş qurub oturdu. Arvadın adəti idi: özü çağırmamış heç kəs cəsarət edib icazəsiz onun otağına girə bilməzdi; o handa da yanında oturmaq ola.

Otağa sükut çökdü. Gurhagurla yanan dəmir sobadakı odunların çatırtısı daha aydın eşidilməyə başladı. Qapağın deşiklərindən süzülüb düşən işıq zolaqları gəbələrin üstündə çarpazlaşıb titrəşdi. Güllü xanım başını qaldırıb oğlunun üzünə baxmadan asta-asta çayını içdi və yəqin etdi ki, oğlu onun yanına boş-boşuna gəlməyib.

Qapı azacıq aralandı. Güllü xanım tərs-tərs, zəhmlə necə baxdısa gəlin gəlməyinə peşman oldu və kölgə kimi yox oldu. Şəmiddin ağa başa düşdü ki, anası hirslidi, nəyəsə acıqlanıb, bəlkə də onun çağırılmamış gəlməyinə qəzəblənib? Bəlkə ürəyinə nəsə damıb? Arvadın qaşqabağı bulud kimi tutulmuşdu. Özü yağıb boşalmasa, ona toxunmaq olmazdı. Nəhayət, Güllü xanım gözünü hərləyib oğlunun üzünə baxdı.

– Nə olub, bu gecə vaxtı gəlməyin xeyirdimi?

Arvadın zəhmli səsi fikir götürmüş Şəmiddin ağanı diksindirdi.

– Yox, ay ana, xeyir deyil, başımıza iş gəlib, yanına məsləhətə gəlmişəm.

– Nə iş?

Arvadın təəccüb və təşviş dolu bu sualı verməyi ilə dirçəlməsi və yanındakı əsanı əlinə almağı bir oldu. Şəmiddin ağa vahimələndi. Ona elə gəldi ki, anası uşaq vaxtlarında olduğu kimi onu döyəcək.

– Həsən ağanın əlindən xata çıxıb.

– Nə xata?

– Adam öldürüb.

– Kimi?

– Ələddini.

– Harda?

– O tayda, meşədə.

Güllü xanım elə bil sakitləşdi. Yerini döşəkçənin üstündə rahatlayıb yenidən yastığa dirsəkləndi. Boş stəkanı geri itələdi. Nəlbəki cin-

gildədi. Gəlin elə bil qonşu otaqda bunu eşitdi və qayınanasının ürəyindən keçəni duydu. Qapını aralayıb səssiz addımlarla arvada yaxınlaşdı. Boş stəkanı götürdü. Bir göz qırpımında təzə çayla geri qayıtdı. Güllü xanım yenidən asta-asta çayını içdi.

– Qönçə bilirmi?

– Yox, səndən başqa heç kəsə deməmişəm.

– Yaxşı eləyibsən.

İl qədər uzun görünən bir neçə an da gəlib keçdi.

– Dur, arabanı qoş, uşaqlardan da götür, get meyiti gətir.

– Hara?

– Sözümü kəsmə! – Arvad dönüb tərs-tərs oğlunun üzünə baxdı.

– Birbaş bizim həyətə. Xatanı biz etmişik, altından da biz çıxmalıyıq.

Şəmiddin ağa ayağa durdu. Əlini qapının dəstəyinə uzatmazdan əvvəl dönüb anasına baxdı.

– Bə, Həsən ağa neyləsin?

– Meyitlə bərabər evə gəlsin!

Oğlu gedəndən sonra Güllü xanım ayağa durdu. Başı tavandan asılmış otuzluq çırağa toxundu. Ləngərlənən çırağın kölgəsi divarda, pəncərə taxtalarında, döşəmə və tavanda vahiməli hoyullalar kimi dolaşdı. Arvad on dörd taxtalı uzun donunun qırçınlarını, belinin büzməsini sığalladı, qara atlas koftasının yaxasını yoxladı, iki qatar butalı qızıl düzülmüş qara məxmər baş çəkisini düzəltdi, bənövşəyi yelənli qara kəlağayısını gözünün üstə dartdı. Koftasının altından bağladığı qurşağa əl gəzdirdi, naqanın yerində olub-olmadığını yoxladı və əsanı əlinə alıb orta divarı bir-iki dəfə taqqıldatdı. Gəlin qapıda göründü.

– Qönçəni bura çağır.

Arvadın zəhmli səsi ərinin ovdan gec qayıtmasından və qaynı Şəmiddin ağanın anası ilə pıçıldaşmasından sonra arabanı qoşub tələsik getməsindən ürəyi uçunan gəlini daha da vahimələndirdi. Ağzını açıb nəsə soruşmaq istədi. Amma qayınanasının zəhmli nəzərlərini üzündə duyub, dinməzcə geri çəkildi. Güllü xanım bir az aralı qalmış pəncərə taxtalarını kip bağladı, əsası ilə dəmir sobanın qapağını örtdü, otuzluq çırağın fitilini aşağı çəkdi. Otağın işığı azaldı və içəri alaqaranlıq oldu. Bundan sonra keçib yerində, döşəkçənin üstündə oturdu.

## 4

Güllü xanım Çıraqlılar nəslini çox yaxşı tanıyırdı. Hələ bu evə gəlin gəlməzdən əvvəl, döşü-başı yenicə çıxıb qız həddinə düşən vaxt gördüyü bir əhvalatı yadına salanda indi də başının tükü qarsıyıb yumağa dönür.

Naltökən yaylağına getmişdilər. Noylu bulağın üst tərəfində, yaşıl döşdə, məhəllə-məhəllə dəyə tikmişdilər. Gün çıtdayan kimi sığırçılar mal-qaranı haylayıb örüşə aparırdılar. Qız-gəlin isə Noylu bulağın üstünə tökülür, əl-üzlərini yuyub sığallanır, sonra da sənəklərini diş göynədən bumbuz su ilə doldurub dəyələrə qayıdırdılar. Mal-qara örüşdən qayıdana qədər samovar qaynayır, çay dəmlənir, stəkan-nəlbəki dəyənin içində açılmış süfrəyə düzülürdü. Səhər tezdən qoyun-quzuya baş çəkməyə gedən atlı kişilər binələrə qayıdanda hər şey hazır olurdu.

Güllügilin dəyəsi Ömər koxagilin dəyəsinə yaxın idi. Ömər koxa enli kürəkli, uzun, qalın saqqallı bir kişi idi. Başına saçaqlı papaq qoyardı. Uzun arxalığının altından belinə enli qurşaq bağlardı. İri gümüş xəncəri vardı. Güllü göz qoymuşdu: kişi hər səhər örüşdən sağına qayıdan mal-qara ilə birlikdə gəlir, dəyənin qabağında atdan düşür, xal-xalda fırlanan qoç Ömər koxanı görən kimi sahibinin yanına qaçır, başını aşağı salıb kişiyə hücuma keçirdi. Ömər koxa onun buruq-buruq iri buynuzundan yapışıb boynunu qanırırdı. Beləcə xeyli oynadıqdan sonra qoç xalxala qayıdır, Ömər koxa isə alaçığa girirdi. Güllü bir neçə dəfə gəlinlərə qoşulub ona qulluq da etmişdi. Görmüşdü ki, kişi pörtdəmə bişirilmiş bir quzunun yarım şaqqasını sarımsaqlı qatıqla yedikdən sonra üstündən bir cəm ərinmiş yağla bal içmiş, sonra da yastığa dirsəklənərək çay istəmişdi. Güllü bir-iki dəfə gəlinlərdən qabağa düşüb ona çay vermişdi. Deyəsən kişinin də qızdan xoşu gəlirdi. Onu "A Güllü-pullu qızım, günün ağ olsun, bir stəkan çay ver", – deyə buyurmuşdu da.

Ömər koxanın Şamil adlı bir oğlu da vardı. Bığ yeri yenicə tərləyirdi. Güllü hiss etmişdi ki, nədənsə özü də bilmədən Şamili görəndə ayaqları dolaşır, ürəyi guppuldayırdı. Tez qaçıb dəyələrin arasında gizlənirdi. Hətta bir-iki dəfə özünə gülməyi də tutmuşdu. Ürəyindən keçirmişdi ki, adamın Ömər koxa kimi bir qayınatası ola.

Bir gün el dağdan arana köçməzdən xeyli əvvəl arvadlar xısınlaşmağa başladılar ki, Ömər koxa kiçik gəlinini öldürəcək. Gəlin alt tu-

manını itirib. Bu, biabırçılıq idi. Qızın ya gəlinin alt tumanını itirməsi namusunu itirməsi demək idi. Namusunu itirənin eybini isə yalnız qara torpaq örtməli idi.

Yazıq gəlinin gəzmədiyi yer qalmamışdı. Dəyənin içini ələk-vələk eləmişdi: yorğan-döşəyin arasını, keçələrin-kilimlərin altını, çətənlərin dalını, nəmilərin, tejənlərin içini belə axtarmışdı. Tuman bir parça yağlı əppəyə dönüb cinbata çəkilmişdi. “Kaş qollarım sınaydı, o gün paltar yumayaydım, tuman-köynəyə əl vurmayaydım. Axı, mən gecə heç kəs görməsin deyə, paltarı dəyənin böyrünə, ipin üstünə sərmişdim. Hamıdan qabaq durub, gecə sazağından təpimiş paltarı yığanda gördüm ki, tuman yoxdu. Bu nə təhər şeydi? Oğru gəlsəydi, paltarın hamısını aparardı. Bir də paltar oğrunun nəyinə lazımdı? Onlar gələndə at çapıb ilxı qovur, sürü aparırdılar. Yox, bu, namusa sataşmaqdı. Görünür, kiminsə bizimkilərlə düşmənçiliyi var, haqq-hesab çəkirlər. Başım batsın, boynum sınsın, öləsiyəm”. Kişi də gözə görünmürdü, gəlin də. Gəlin dəyənin bir küncünə qısılıb için-için ağlayırdı, kişi isə alaçıqda, döşəkçənin üstünə uzanıb hoylundan gəhildəyirdi.

Bir axşamüstü Güllü qorxa-qorxa dəyəyə yaxınlaşdı. Çətənin arasından içəri boylandı. Astadan gəlini çağırdı.

– Bir bəri dur, sözüm var. Bibim deyir ki, dünən səhərin ala toranında gördüm ki, camış nəsə yeyir. Bəlkə üzülmüşün yediyi elə həmin şeydi.

Güllü kölgə kimi çəkilib getdi. Gəlin donub qaldı. Gözünün yaşı qurudu. Amma bilmədi bu sözü kimə və necə desin.

Ömər koxa Güllünün sinə-sinə gəldiyini və getdiyini görmüşdü. Amma gəlinə nə dediyini eşitməmişdi. Ancaq ürəyinə dammışdı ki, nəsə qızda bir xəbər var.

Dalınca uşaq yolladı. Güllü gəldi. Qorxusundan alaçığa girmədi. Ömər koxa səsinə mülayimlik verdi.

– Gəl görüm, Güllü-pullu qızım, səndən söz soruşacam.

Qız içəri girdi. Titim-titim titrəyirdi. Ömər koxanı heç belə heybətli görməmişdi.

– Bayaq dəyənin böyründə gəlinə dediyin nəydi?

Güllü dili-dodağı təpimiş halda bildiklərini söylədi və gördü ki, kişinin qan sağılmış gözləri elə bil işıqlandı, deyəsən sifəti də açıldı, dodaqlarında gülüşə bənzər bir şey sezildi.

– Çox sağ ol, qızım.

Güllü bu sözləri icazə kimi başa düşüb alaçıqdan çıxdı.

Ömər koxa dərhal ayağa durdu. Alaçıqdan çıxıb xalxala yaxınlaşdı. Onun beş sağmal camışı vardı, bir də ərəmiyi. Onların yan-yörəsinə dolandı, yatıb gövşəyənlərini ayağa qaldırdı. Təfərrinclə yanlarına, qarınlarına baxdı, əlini iri xəncərin dəstəyinə uzatdı, amma nə fikirləşdisə, əl saxladı. Asta addımlarla alaçığa qayıtdı. Elə pallı-paltarlı döşəkçənin üstünə uzandı. Düz iki gün idi, qoymurdu ki, çırağı yandırsınlar. İki gün idi ki, dilinə çörək də dəymirdi. Qorxudan yanına gələn də yox idi. Amma indi içini arıtlayıb, bir-iki dəfə öskürdü. Qonşu dəyədə hərəkət başladı, kişiyə çay-çörək gətirdilər.

Səhər tezdən, gün yenicə çıtdayıb mal-qara örüşə haylananda Ömər koxa camışları qoymadı xalxaldan çıxartsınlar. Onun işarəsi ilə camışlardan birini gətirib, dərənin dikdirində boğazladılar. Dərisini soymadan qarnını yardılar, mədəsini, bağırsaqlarını bayıra tökdülər. Hər şeyi doğram-doğram elədilər. Heç nə başa düşməsələr də, nökərlər kişinin göstərişi ilə ikinci camışı gətirdilər. Onu da birinci kimi boğazlayıb doğradılar. Ömər koxanın üzü tunc kimi bozardı. Qalın qaşları pırpızlandı və gözləri qan çanağına döndü. Əlini xəncərin dəstəyinə uzadıb tiyəni yarıyacan qından siyirdi.

– O birini gətirin!

Nökərlər xalxaldan ərəmiyi gətirdilər. Camış öləcəyini başa düşmüş kimi başını dik tutub mələdi. Amma onu qomarğalayıb dərənin qaşına gətirdilər. Ərəmik kəsilmiş başları və laxtalanmış qanı görən kimi iri buynuzu ilə ətrafındakıları dağıdıb aradan çıxmaq istədi. Amma gözünü açmamış kəməndə salıb boynunu qanırdılar. Dizini yerə gətirib ayaqlarını çatdılar, xəncəri boğazına çəkdilər, qarnını yardılar, içini bayıra töküb doğradılar və birdən xəncər bir əski parçasına dəydi. Ömər koxa dərindən nəfəs alıb, bayaqdan qınından yarıyacan siyirdiyi xəncəri şaqqıltı ilə qınına qoydu.

– Bəsdi!

Nökərlər əl saxladılar.

– O əskini mənə verin!

Heç nə başa düşməsələr də, dinməz-söyləməz deyilənə itaət etdilər. Ömər koxa alaçığa yaxınlaşanda geri döndü.

– O leşləri doğrayıb, itlərin qabağına tökün!

Alaçığa gələn kimi gəlini çağırtdırdı. Əlindəki əskini əsim-əsim əsən gəlinin başına çırpdı və qulağının dibinə dalbadal iki sillə çəkdi.

– Köpək qızı, tumanını belində saxlaya bilməyən gəlin mənə lazım deyil, rədd ol mənim evimdən!

Elə o gecə gəlini atası evinə yola saldılar. El yaylaqdan arana dönəndən bir az sonra isə onun meyitini Gəmi qayanın alt tərəfindən çiləkənin yanından tapdılar.

Aylar dolandı, illər keçdi, Güllü Alqazaxlıların gəlini oldu, oğul-uşaq böyütdü. Balacalıqdan ürəyində nisgil kimi qalmış bir arzu sonradan Çıraq oğlu Şamilin qızı Qönçəni görəndə cücərdi. “Özüm ona gedə bilmədim, Ömər koxanın zəhmindən zəhrim yarıldı, indi onun nəvəsini oğluma alıb qohum olacam”, – deyə ürəyindən keçirdi və əri ilə məsləhətləşdi. Bir aydan sonra cah-cəlalla toy edib Qönçəni oğlu Şəmistan ağaya gəlin gətirdi.

## 5

Qönçə xanımın birdən-birə ürəyi sıxıldı. İçəridə otura bilməyib yönü Kürə baxan evin eyvanına çıxdı. Əlini gözünün üstə qoyub yarğanın qaşıboyu uzanaraq sahilə, girmənin bərabərinə enən araba yoluna baxdı. Heç kəs görünmürdü. Hava qaralmışdı. Qaranlıq qarışdığından Kürün qıjıltısı daha aydın eşidilirdi. O taydakı meşə vahiməli görünürdü. Arvad eyvandan aşağı endi, həyətin o başındakı samanlığın belinə qalxdı, əlini gözünün üstünə qoyub cığırlara baxdı. “Görəsən harda qaldılar? Heç belə ləngiməzdilər. Günün qulağı yaxmamış gəmini sallayıb girmədən bəri çıxardılar. Amma indi qaranlıq qarışmış, əl-ayaq yığşırılmışdı. Onlardansa səs-səmir yox idi”. Qönçə xanımın bədəni titrədi, ürəyi az qaldı sinəsindən çıxsın. “Mənə nə oldu? – deyə özünü danladı – ağlıma gələn dağlara-daşlara”. Geri qayıtdı. Başını qatmaq üçün içəri girdi. Sonra mis samovarı doldurub bayıra gətirdi, odluğuna köz saldı, üstündən kıxmıq tökdü və alışana qədər gözlədi.

Səhər tezdən qardaşı Ələddin qara damların arasındakı cığırla çiynində qoşalülə iki yanını basa-basa gəlib onların həyətindəki rus ağacının dibində dayanmışdı. Hənirtiyə həyətə çıxan Qönçə xanım bir xeyli heyranlıqla qardaşının yanakı qoyduğu papağına, əyninə kip yapışan gödəkçəsinə, qara məxmər şalvarına, günün işıltısında burnu parıldayan çəkməsinə və zər baftalı dolağına xeyli baxmışdı. Ələddinin boyu uca, çiyinləri enli idi. Beli elə bil üzükdən keçəcəkdi.

– Dərdin alım, orda niyə durubsan, bəri gəlsənə?

– Yox, ay bacı, tələsirəm, gedəcəm.

Qönçə xanım sürüşüb çiyninə düşmüş kəlağayısını düzəltdi, beli büzməli qırçınlı donunun qırışığını sığalladı və eyvandan endi, asta addımlarla gəlib qardaşı ilə üzbəüz dayandı.

– Xeyirdimi, hara belə?

– O taya, meşəyə.

Ələddin qoşalüləsini çiynindən götürüb əlinə aldı. Zağlı tüfəngin qundağı, lüləsi parıldadı. Bacısı başa düşdü ki, qardaşı təzə aldığı ov tüfəngini ona göstərmək istəyir.

– Kimnən gedirsən?

– Həsən ağayla.

Qönçə xanımın qaşları çatıldı. Təfərrinclə qardaşını təpədən dırnağa süzdü, sonra qaynı Həsən ağanı gözünün qabağına gətirdi. Son vaxtlar onlar meşəyə – ova qoşa gedər, qoşa da gələrdilər. Heç vaxt da əliboş qayıtmazdılar. Maral, qaban rastlarına gəlməsə də, qırqovul tapardılar. Ələddin həmişə bacısından yeznəsinin tüfəngini alardı. Arvad bir də qardaşının boyuna baxdı və birdən ürəyi elə çırpındı ki, az qaldı nəfəsi təngisin, hiss etdi ki, qan üzünə vurdu. Altdan yuxarı qardaşının üzünə baxdı və ürəyindən keçirdi ki, onu getməyə qoymasın, desin ki, a bala, hava da deyəsən bulaşacaq, geri qayıt, yıxıl otur evdə, qurddaquşda nə işin var, qan-qarğışdır. O, istəmirdi ki, yenicə nişan taxdıqları qardaşı əlini qana bulasın.

– Bəlkə bu gün getməyəsən.

– Yox, ay bacı, boynuma düşüb, gərək gedəm. Bir də, – o, tüfəngini əlində oynatdı. – Heç atmamışam, yoxlamaq istəyirəm.

Qönçə xanım qardaşının sifətindəki qətiyyətdən yumşaldı.

– Nə deyirəm, özün bilən yaxşıdı. Bə bizə...

Ələddin bacısının sözünü kəsdi.

– Alanı da özümlə aparmaq istəyirəm.

Bayaqdan kənarda, çənəsini biləklərinin üstünə qoyub uzanan it adını eşidən kimi dirçəldi, qulaqlarını şəklədi, haraya isə gedəcəyini hiss edib zingildədi.

– Apar, ağrın alım, amma tez qayıdın, axşama qalmayın.

Ələddin Alanı çağırdı. İt sıçrayıb, onun yanına gəldi. Atılıb əlini imsilədi, burnunu tüfəngin qundağına sürtdü, quyruğunu bulayıb şırvandı və yola çıxdı. Orada bir-iki dəfə hürdü. Ələddin başa düşdü ki,

Alan onu çağırır. Gülümsündü. Tüfəngin qayışını çiyninə aşırıb getmək istədi. Elə bu vaxt Qönçə xanım qardaşının boynuna sarıldı.

– Sənə nə oldu, ay bacı?

– Heç özüm də bilmirəm, ağrın alım. – Kəlağayının ucu ilə gözünün nəmini sildi. – Yolundan qalma, get.

Ələddin iki yanını basa-basa, cığırla yarğanın başındakı evə doğru addımladı...

Qönçə xanım çaynik gətirdi, içinə quru çay tökdü, üstünə qaynar su aldı və dəmkeşin üstünə qoydu ki, dəmlənsin. Əlləri əsirdi. Nə qədər çalışsa da, sakitləşə bilmirdi. Bir istədi doqqaza çıxsın, qaynı arvadını səsləyib Həsən ağanı soruşsun. Amma nədənsə yerindən tərpənmədi. Donunun ətəyi ilə samovarın qulpundan tutub eyvana qalxmaq istədi. Elə bu vaxt suların qıjıltısı arasından acı bir ulartı eşitdi. Ona elə gəldi ki, ulayan hardasa tək qalmış yalquzaq canavardı. “Murdar yenə ziyanlıq edəcək”, – deyə düşündü və pillələri qalxmağa başladı.

– Çırağı niyə yandırmayıbsan?

Arvad diksindi. Dönüb həyətə yenicə girmiş, hələ də atdan enməyən ərinin üzünə baxdı. Elə bu vaxt ulartı yenidən eşidildi. Qönçə xanım samovar əlində pilləkəndə donub qaldı. Dinlədi və başa düşdü ki, bu ulama canavar uluması deyil. Ulayan it idi. Özü də elə acı-acı, elə vahiməli ulayırdı ki, elə bil darda qalmış adamdı, haray salıb bütün dünyanı köməyə çağırırdı. Birdən arvadın üzünə qan vurdu. Saçlarının dibinə elə bil qor doldu. Əlindəki samovarı gurultu ilə yerə saldı. Ayağının pöşülənməsini hiss etmədi. Səldirəyə-səldirəyə, dili-dodağı təpimiş halda özünü hələ də atdan düşməmiş ərinin üstünə saldı.

– Deyəsən atamın evi yıxılıb, a kişi, bir qulaq as, gör ulayan bizim itdimi?

Şəmistan ağa hələ yolda ikən itin ulamasını eşitmiş və Alanın səsini tanımışdı, sümüyü eymənmişdi. Amma özünə toxtaqlıq verib arvadına acıqlandı.

– Qaraçı harayı salma görək, it ulayanda nə olar?

– İtin ulaması pis şeydi, a kişi, it ulayanda ziyanlıq olur.

– Ağzını xeyirliyə aç!

Şəmistan ağa yəhərdən enmədi. Atın başını qanırıb doqqaza çıxdı və bir baş Kürə doğru çapdı. Qönçə xanım əli ürəyinin üstündə atın ayaq tappıltısı eşidilməz olana qədər həyətin ortasında qaldı.

Aradan nə qədər keçdiyini bilmədi. Gah eyvana çıxdı, gah samanlığın üstünə. Hər şıqqıltını, hər səsi dinlədi. Əli qoynunda yollara boylandı, gözü zülmət qaranlığa zillənmiş qaldı.

Doqqazda qaraltı göründü.

– Qönçə xala, nənəm səni çağırır.

Arvad diksindi. Samanlığın üstündən enib, eyvana qalxdı. İsti yun şalı çiyninə saldı. Ayaqları dolaşa-dolaşa doqqaza getdi. Bütün yolboyu xəyalında dağı arana köçürdü, aranı da dağa. "Ürəyimə damıb, gədənin başında qaranlıq var. Yoxsa arvad məni çağırmazdı. İndi mən nə edim? Ay Allah, ey yeri-göyü yaradan tanrı, sən özün kömək ol, qardaşım muraz üstündədi, ona qıyma, qoyma nişanlısı ağlar qalsın!". Həyətə çatanda özünə toxtaqlıq verdi. Qayınanasının xasiyyətini bilirdi; çığır-bağır salsa, qapıdan qovardı. Bir də axı nə olub, niyə axı ürək-göbəyimi yeyirəm?

Evdəkilər onu sükutla qarşıladılar. Dinməz-söyləməz Güllü xanımın otağına apardılar.

Qönçə xanım alaqaranlıqda güclə görünən qayınanasına yaxınlaşdı. Qabağında diz çöküb əlindən öpdü. Arvad gəlinin ürək döyüntülərini sinəsinin titrəyişindən hiss etdi. Qönçə xanım yaşla dolub-boşalan qızarmış gözlərini qayınanasının üzünə zillədi. Güllü xanım gördü ki, gəlinin nəbzi boyun damarlarında vurur. Qulaqlarındakı yumru, iri qızıl sırğalar titrəyir.

– Yoxsa Çıraqlıların çırağı sönüb, ay ana, mənə düzünü de.

Arvad onun başını sinəsinə sıxdı. Qönçə xanım hıçqırdı, uşaq kimi içini çəkdi. Qayınanasının iri əli xeyli onun başını sığalladı, saçını tumarladı. Qönçə xanım hiss etdi ki, qayınanası da titrəyir. Qəhər boğduğundan dinə bilmir.

– Adam başına iş gələr, qızım, özünə toxtaqlıq ver. Ölən də bizimdi, öldürən də. Olacağa çarə yoxdu, hamısı fələyin işidi.

Qönçə xanımın bulaq kimi qaynamağa hazır olan göz yaşı elə bil birdən qurudu. Saçını yolub üzünü cırmaq, dizlərinə döymək və beləliklə dərdini yüngülləşdirmək istəyi yoxa çıxdı. Hönkürtüsünü boğmaq üçün başını arvadın sinəsinə daha möhkəm sıxdı, onu qucaqladı. Güllü xanım gəlinin saçından öpdü.

– Sən kişi qızısan, gərək özünü kişi qızı kimi aparasan!

## 6

Bütün gecəni yatmadılar. Səssiz-səmirsiz işlədilər. Ocaq qaladılar, su qaynatdılar, meyiti yuyub kəfənlədilər. İşıqlaşanda üstünə qırmızı kəlağayı örtülmüş cənazəni eyvana qoydular. Güllü xanım hər şeyi yerbəyer edəndən sonra qara paltar geyinib qabağa düşdü. Gün xeyli qalxandan sonra cənazəni yerdən qaldırdılar. Alqazaxlıların başıpapaqlıları, elə Şəmistan ağa ilə Həsən ağa da, tüfəng götürmək istədilər. Güllü xanım qoymadı; "Əli yalın gedəcəyik, – dedi, – düşmən üstünə ha yerimirik, qıranda da qıracaqlar". Güllü xanım əlində əsa qabağa düşdü. İki qardaş – Həsən ağa ilə Şəmistan ağa öndə, qalanları arxada cənazəni çiyinlərinə aldılar. Alqazaxlıların say-seçmə başıpapaqlıları, qız-gəlinləri dinməz-söyləməz cənazənin ardınca irəlilədilər. Matəm karvanı doqqazdan çıxıb, kəndarası yolla Çıraqlılar tərəfə üz tutdu. Doqqazdan, eyvanlardan boylananların üz-gözündə təəccüb vardı. Heç kəs heç nə başa düşmürdü. Cənazəni aparanlar kəndin ortasındakı təpənin yanından keçib dikdirə çıxanda axşamdan səksəkəli yatan Şamil vahimələndi. Tez ayağa durub tüfəngi götürdü. Yaşı yüzü haqlasa da, hələ at minəndə üzəngisini basdırmayan, gözünün nurunu itirməyən Ömər koxa oğlunun təlaşını görəndə həyəcanlandı. Əsasını götürdü və ondan qabaq eyvana çıxdı. Əslinə baxsan, o bütün gecəni yatmamış, səhər tezdən bəd xəbər eşidəcəyinə özünü hazırlamışdı.

Cənazəni gətirən dəstə doqqazda, darvazanın arxasında dayandı. Şamil eyvandan aşağı endi.

– A bala, ayaq saxla!

Atasının səsi onu toxtatdı.

Darvazanı açdılar. Ömər koxa aşağı düşüb, bir xeyli həyətin ortasında dayandı. Güllü xanım qabağa yeridi. Ömər koxanın bərabərinə çatanda əyilib kişinin əlindən öpdü. Hamı susdu. Çiynində cənazə darvazanın ağzında dayananlar da, həyətə toplaşan arvad-uşaq da cınqırını çəkmədilər. Güllü xanım dikəldi. Yaşarmış gözlərini kişinin zəhmli sifətinə zillədi. Onlar uzaq uşaqlıq illərindən sonra ilk dəfə idi ki, belə yaxından qarşılaşırdılar. Ömər koxanın dodağı səyridi. Dümağ pilə kimi saqqalı titrədi. İndi hər şey onun bircə işarəsindən asılı idi. Ömər koxa geri qanrılıb boğuq səslə dilləndi.

– A bala, yer hazırlayın!

Bayaqdan lal-dinməz dayanan Şamil tərpəndi. Darvazaya yaxınlaşıb cənazənin bir tərəfini çiyninə aldı. Şəmistan ağa ilə yanaşı addımladılar.

Çıraqlıların qaydası idi. Evə yas düşəndə vay-şüvən salmazdılar. “Dost var, düşmən var, adam özünü sındırmaz” deyərdilər. İndi də elə oldu.

Ömər koxa evin yuxarı başında, döşəkçə üstündə əyləşdi. Güllü xanımı da yanında oturtdu. Şəmistan ağa ilə Şamil yasa gələnləri qarşıladılar. Elə həmin gün günortadan gün əyiləndə bütün kənd camaatı yığıldı, Ələddini qədim dədə-baba qəbristanlığında dəfn etdilər. Düz bir həftə, mərhumun yeddisi çıxana qədər Çıraqlılarla Alqazaxlılar bir yerdə oldular...

Ömər koxa üzə salmasa da, içəridən qovrulurdu. Bu yaşa gəlmişdi hələ heç bir diləyi ürəyində qalmamışdı. Onun son arzusu Ələddini evləndirmək idi. Bir balaca başı ağrıyanda, ya da soyuq dəyib özünü küpədəndə, hor-hoyuş suyunda çimib isti yorğan-döşəkdə tərləyə-tərləyə yatanda özünə ürək-dirək verirdi: “Yox, elə bir şey yoxdu, Ömər koxa, bərk dur, Ələddinə toy eləməmiş can vermə, Allahdan möhlət istə, qoy ömrünü bir az uzatsın. Bə indi? Fələyin nə yaman oyunları varmış, belə də zülm olarmı? Şıvırtı kimi bir oğlanı nə tez torpağın altına apardı bu rəhminə qurban olduğum tanrı? Ölüm mənim idi, balam getdi. Görünür düz deyirlərmiş; kötük üstündə neçə çırpılar doğranarmış”.

Kişi yorğan-döşəkdə uzansa da, gözünə yuxu getmirdi. Tavana baxa-baxa səhəri açırdı. “Görəsən, Həsən ağa namərdlik etməyib ki? Bilirəm Alqazax uşağı qan çanağıdır, nahaq yerə onlara “Dəli Alqazaxlılar” demirlər. Amma bu yaşa gəlmişəm, onlardan namərdlik görməmişəm. Düşmənlə düşməndirlər, dostla dost. Əllərindən xata çıxıb, amma namərd olmayıblar”.

Çıraqlılarla Alqazaxlılar həm qohum idilər, həm düşmən. Ömər koxanın yaxşı yadında idi: uşaq vaxtı Kürün sahilində at otarırdılar. Alqazaxlıların da uşaqları öz ilxılarını Kürdə çimizdirirdilər. İpə-sapa yatmayan erkək atı isə çəmənliyə örükləmişdilər. Birdən ilxıya çaxnaşma düşdü. Uşaqlar gözlərini yumub-açınca gördülər ki, at örüyünü qopardıb ilxıya tərəf gəlir, ilxıdakı erkək at da şahə qalxıb kişnəyir. Bir göz qırpımında kəhərlər qarşılaşdılar. Erkəklik və ilxıya sahib olmaq ehtirası onları əjdahaya döndərmişdi. Döş-döşə gəldilər, çəçik-çəçiyə qalxdılar, bir-birilərinin yalından yapışıb gəmirişdilər. Təpik,

nal şaqqıltısı, kişnərti bir-birinə qarışdı. Gah o bunun dizini yerə gətirdi, gah bu onun. Torpaq eşim-eşim oldu, ot xıncım-xıncım. Uşaqlar nə qədər çalışdılarsa, onları ayıra bilmədilər. Belə getsəydi, atlar bir-birini gəmirib şikəst edəcək, ya da qızıl qana bulayıb öldürəcəkdilər. Birdən hardansa peyda olan nökərlərdən biri atın irəşməsindən yapışıb onları aralamaq istədi. Ömər koxagilin kəhəri kömək gəldiyini və irəşmənin cilovlandığını görüb daha böyük qəzəblə irəli cumuldu, rəqibinin yalından yapışıb boynunu qanırmağa çalışdı. Alqazaxlıların kəhəri çırpındı və birdən necə güc gəldisə irəşməni dartıb nökərin əlindən çıxartdı və dal ayaqları ilə atın döşünə necə vurdusa, at təngildədi. Alqazaxlıların kəhəri ona göz açmağa imkan vermədi, boynunu qanırıb yerə yıxdı. Nökər gördü ki, at xırıldayır, iri xəncərini sıyırdı...

Kəndə haray düşdü. Hər iki tərəfdən tökülüşüb gəldilər. Atışma başlandı. Hərə özünə bir mətəris tapdı, tayfa-tayfaya bölünüb üz-üzə dayandılar. Düz üç gün kənddən atışma səsi kəsilmədi. Üç gündən sonra camaat bir səhər yuxudan durub gördü ki, hər iki nəslin əli tüfəng tutan başıpapaqlıları gecə ikən kəndin üst tərəfindəki təpəlikdə səngər qazıb, üz-üzə marığa yatıblar. İki gün də keçdi, atışma kəsmədi. Evlərdə arvad-uşaq üzünü cırıb saçını yolur, əlləri ürəklərinin üstündə göz yaşı axıdırdılar. Hər güllə açılanda diksinir, gecəli-gündüzlü səksəkə içində çırpınır, səhəri ayaq üstündə açırdılar. Hamıdan çox ağlayan və özünü öldürənlərdən biri də Həmayıl idi.

Həmayıl üç ayın gəlini idi. Hələ əlinin xınası getməmişdi. Hələ əri evinə, Çıraqlıların qayda-qanununa isinişməmişdi. İndi də araya dava düşmüşdü. Səngərin bir tərəfində qardaşları, əmisi uşaqları marığa yatmışdılar, o biri tərəfində isə əri və qayınları. Bilmirdi neyləsin. Bir gün də keçdi. Səngərlərdən səs-səmir gəlmədi. Həmayılın ürəyinə damdı ki, atışanların gülləsi qurtarıb. Həm də neçə gündü acdılar, onlara yemək-içmək aparan yoxdu. Əslində heç kəs irəli çıxa bilmirdi. Çıraqlılardan biri təpənin döşündə görünən kimi Alqazaxlılar gülləyə basırdı, Alqazaxlılardan görünəndə Çıraqlılar.

Həmayıl tezdən durdu. Ərinin patron dolu qoltuqaltısını kəlağayısının altından çalın-çarpaz belinə bağladı. Ala xurcunun bir gözünü xamralı çörəyi, o biri gözünü isə pendir, yağ, balla doldurdu. Su dolu cürdəyi əlinə aldı. Cığırla təpənin döşündəki səngərlərə doğru addımladı. Hamı gəlinin bu işinə mat qaldı. Əllərini gözlərinin üstünə qoyub Həmayılın arxasınca baxdılar.

Yalın döşünə iri bir cığır qalxırdı. Bu cığır yolun ortasında haçalanırdı. Həmayıl heç nəyə fikir vermədən, heç nə eşitmədən cığırla yuxarı qalxırdı. Onun kəlağayısının altından çıxan və az qala topuğuna dəyən qoşa hörüyü gərdənində yırğalanırdı. Səngərdəkilərin gözü onu almışdı. Nəfəslərini çəkmədən barmaqları tətikdə gözləyirdilər. Gözləyirdilər ki, görək cığır haçalananda Həmayıl hansı tərəfə dönəcək? Tüfəngin qundağı ərinin sinəsində olsa da, arxayın idi ki, arvadı ona tərəf gələcək. Qardaşı da əli ürəyinin üstündə bacısının hansı tərəfə dönəcəyini gözləyirdi.

Həmayıl cığırların haçalaşdığı yerdə heç yana dönmədi, düz getdi. Çala-çuxura düşməyinə, tez-tez büdrəməsinə fikir vermədi. Baldırlarını sirkən, qanqal dalasa da, dayanmadı, elə bil quşa döndü. Nə çiynindəki xurcunun ağırlığını hiss etdi, nə də yoxuşa dırmananda sızıldayan dizinin ağrılarını. Səngərlərin bərabərinə çatanda sıçrayıb sağa döndü. Bir göz qırpımında özünü qardaşıgilin səngərinə saldı. Elə bu an ərinin gülləsi açıldı. Həmayılın az qala topuğuna dəyən qoşa hörüyünü elə bil qayçı ilə kəsib yerə atdılar.

Kənd camaatı yığışdı. Ağsaqqallar məsləhətləşdilər ki, Alqazaxlıların da, Çıraqlıların da başbilənlərinin yanına getsinlər. Onları başa salsınlar ki, cavanların beyinləri qandı. Belə getsə, bir-birlərini qıracaqlar, araya qan düşəcək. Bir atdan ötrü iki nəslin düşmən olmasına dəyərmi? Getdilər. Nə qədər hirsli olsalar da, hər iki tərəfin ağsaqqalları söz eşitdilər və birlikdə səngərə qalxdılar. Cavanlara öyüd-nəsihət verdilər, tüfənglərini əllərindən alıb evə qaytardılar. Hər iki tərəf əllərini Qurana basıb and içdi ki, dinc oturacaqlar.

Həmayıl bir həftə atası evində qaldıqdan sonra "Ərim evinə qayıdıram", – dedi. Onu buraxmaq istəmədilər. Qorxdular ki, qızın başına iş gətirərlər. Həmayıl inadından dönmədi. Ertəsi günü mal-qara örüşə haylanıb, əl-ayaq yığşırılandan sonra cığırı əlinə alıb əri evinə tərəf addımladı. Onun üzünə baxan olmadı. Amma üstünə əl qaldıran da olmadı. Əri isə arvadını görəndə, hirsindən bığını çeynəyib üzünü o yana çevirdi. Həmayıl axşama qədər gözlədi. Qaranlıq qarışıb çıraqlar yananda qayınanasının yanına getdi. Qabağında diz çökdü, səsi titrəyə-titrəyə sözə başladı.

– Ana, hamı məni qınasa da, sən qınamazsan, oğlun-qızın var. Adı Alosmana gedib çıxan qardaşların var. İndi özün de, mən nə etməliydim? Yəqin eşitməmiş olmazsan, deyiblər ki, ər eldən gələr, oğul beldən. Bə, mən atam oğlu qardaşı hardan alaram?

Qayınanası dinmədi. Gəlininin üzünə dikilmiş nəmli gözlərinə baxdı. Həmayılın bu ağıllı sözləri onu xeyli fikrə apardı. Xəyalında haralarasa gedib gəldi, nəyisə ölçüb-biçdi və birdən dodağı qaçdı.

– Yaxşı, ay şeytan, get otağına. Əriyin də, özüyün də yerini yanaşı sal.

– Bə...

– Qələt eləyir!

Həmayıl quş kimi uçdu.

Bu əhvalat çoxdan olmuşdu, lap çoxdan, indi onların heç sümüyü də qalmamışdı...

Ömər koxa eyvanda hərlənən oğlunu içəri çağırdı. Şamil çoxdan bunu gözləyirdi. Atasının səsini eşidən kimi başının qapıya dəyəcəyindən ehtiyat edərək, aşağı əyildi. Ayaqqabılarını soyundu. Gəbənin üstü ilə atasına tərəf irəlilədi.

Kişi işarə etdi. Şamil atasının yanında bardaş qurub oturdu. Əvvəl gəbəni, sonra ayağındakı naxışlı yun corabını didişdirdi. Kişi arxalığının yan cibindən tənbəki kisəsini çıxartdı. Üstü naxışlı gümüş qəlyanını doldurdu. Sobadan od götürüb yandırdı. Bir-iki qullab vurdu. Tüstü laylanıb tavandan asılmış otuzluq çırağın ətrafında qalaqlandı.

– Fikrin nədi?

Atasının yanında uşağa dönən Şamil xəyaldan ayrıldı.

– Uşağın qanı yerdəmi qalsın?

Ömər koxa oğluna cavab vermədi. Xeyli fikirli-fikirli qəlyanını sümürdü və birdən öz-özünə danışırmış kimi soruşdu.

– Ağlın nə kəsir, bu işdə bir namərdlik olmaz ki?

– Nə bilim, olanda da olar, onlardan nə desən çıxar.

– Axı, nədən ötəri, Ələddin onlara nə pislik eləmişdi?

Şamil çiynini çəkdi. İstədi papağını çıxardıb fikirdən ağrıyan başını ovxalasın. Atasının yanında oturduğunu başa düşəndə əlini çəkdi. Ömər koxa zərif gümüş zəncirdən sallanan gümüş millə qəlyanının közünü deşib hərisliklə sümürdü. Otaqda yenidən tüstü laylandı. Kişi gözünün altından bu laylar arxasından sifəti güclə görünən oğluna baxdı. Onun dodaqları kip bağlanmışdı. Həmişə sığallı olan, dən düşmüş bığı codlaşmışdı. Dişini-dişinə sıxdığından çənəsi kilidlənmiş kimi idi. Alın qırışları sıxlaşmışdı. Çuxura düşən gözlərinə qan sağılmışdı. Əli xəncərin dəstəyində idi. Özünün də xəbəri olmadan tiyəni tez-tez qınından çıxardırdı. Ömər koxa başa düşdü ki, oğlu bir himə

bənddir, əgər ona bir balaca işarə etsə, bütün Çıraqlıları ayağa qaldırar və qan su yerinə axar.

– Qanı qanla yumazlar, oğul, bir də sənin qızın onların ocağının başındadı, qan-qana, süd-südə qarışıb.

– Məsləhətin nədi, ata, uşağın qanı batsın?

– Səbr elə, bala, nahaq qan yerdə qalmaz. Əgər Ələddin bir xatanın qurbanıdısa, Allah Həsən ağanın günahından keçər. Əgər namərdlik eləyibsə, Allah özü bəlasını verəcək, sən ayrı fikrə düşmə. O, əlini qana bulayıb, sən bulama. Gec-tez haqq öz yerini tapacaq.

Bu sözlərdən sonra kişi elə bil yüngülləşdi. Amma Şamil qurğuşun yükü daşıyırmış kimi əyildi. Dodağı səyridi, əlləri əsdi. Bu, Ömər koxanın gözündən yayınmadı.

– Birdən divan-dərə gəlib çıxsa?

Kişi sərtləşdi.

– Divan-dərənin nə işi var?!

Qəlyanını tez-tez sümürüb közərtdi. Səsi yumşaldı.

– Dur get. Uşaqları da başa sal, farağat otursunlar.

Şamil beli qırılmış kimi əllərini dizinə söykəyib güclə ayağa qalxdı. Ağır-ağır qapıya yaxınlaşdı. O gedəndən xeyli sonra Ömər koxanın hönkürtüsü eşidildi.

## *II fəsil*

### 1

O, yuxudan ayılan kimi əlini yastığın altına uzatdı və naqanın dəstəyini ovcunda hiss edib sakitləşdi. Yorğanı üstündən atıb çarpayıda oturdu və ayaqlarını salladı. Paçasının arasına və dizlərinə qara dəri tikilmiş qalife şalvarını soyunmamışdı, corablarını da çıxartmamışdı. Tələsik uzunboğaz xrom çəkmələrini geyindi, naqanı şalvarının cibinə qoyub gərnəşdi. Otağın küncündəki əl-üz yuyulana yaxınlaşdı, lüləyi açıb möhkəm yuyundu. Dəsmalla qurulandıqdan sonra gəlib frenç pencəyini geyindi. Yaxasının düymələrini, iri döş və yan ciblərinin ağzını bağladı, kəmərini qurşadı, çalın-çarpaz qoltuqaltılarını çiynindən aşırdı, patron daraqlarının yerində olub-olmadığını yoxladıqdan sonra naqanı qoburuna qoydu, onaçılanı isə yanından salladı. Adəti üz-

rə mauzerin taxta qoburuna bərkidilmiş qızıl lövhənin üstündəki yazıları oxudu. Bu onaçılanı ona Zaqataladakı qaçaqlarla döyüşlərdə göstərdiyi şücaətə görə vermişdilər. Onun göy gümüşü və şabalıdı rəngli buxara papaqları olmasına baxmayaraq iri, dəyirmi, boz saçaqlı papaq geyinərdi. İndi də elə elədi. Bu papağı geyinəndə elə bil çiyni bir az da enlənir, qan sağılmış gözləri adamı qılınc kimi kəsir, qarşısındakıları vahimələndirirdi. Çox vaxt saçaqlı papağın altından baxan baxışların nə ifadə etdiyini ayırd etmək olmurdu.

Qapı astaca aralandı. Növbətçi milisioner əlində səhər yeməyi içəri daxil oldu. Küncdəki stolun üstünə yeməkləri səliqə ilə düzdü. Növbətçi getdikdən sonra o, süfrəyə yaxınlaşdı: soyutma yumurtanı, bal ilə qaymağı bir göz qırpımında yeyib üstündən bir stəkan südlü çay içdi. Üst-başını səliqəyə salıb iş otağına keçdi.

Onun iş otağında hansı bəyinsə evindən gətirilmiş ayaqları və yan taxtaları, siyirmələri naxışlarla bəzədilmiş iri bir yazı masası var idi. Masanın üstü göy mahuddan idi. İri yazı ləvazimatında iki iri mürəkkəbqabı, qələmdan və kağız kəsmək üçün fil sümüyündən xüsusi bıçaq var idi. Mürəkkəbqabının biri bənövşəyi, o birisi isə qırmızı mürəkkəblə dolu idi.

O, masanın arxasında yerini rahatlayan kimi qapı azacıq aralandı, içəri qara pencəyinin boynu və biləkləri didilmiş bir adam girdi. Ayağında uzunboğaz çəkmə, başında isə əynindəki pencək kimi nimdaş, ulduzlu şapka var idi. O da çiyinlərindən çalın-çarpaz qayış aşırmışdı. Bir yanından naqan, bir yanından isə dəri çanta sallanırdı. O, içəri girən kimi stol çəkib oturdu, qoltuğundakı qovluğu açıb masanın üstünə bir kağız qoydu.

– Bu nədir?

– "Troyka"nın qərarıdır, yoldaş Kəsəmənli.

– Nə qərar?

– Müzür ünsürlərin haqqında cəza qərarıdı.

Kəsəmənlinin çatılmış qaşları bir az da çatıldı, diqqətlə yazını oxumağa başladı. Sonra başını qaldırıb zəhmli gözlərini müsahibinin üzünə zillədi.

– Bunlar hamısı müzür ünsürlərdi?

– Bəli, yoldaş Kəsəmənli.

– Çoban da?

– O çox böyük cinayət işləyib.

– Nə edib, adam öldürüb?

– Yox. Qaçaqlara çörək aparıb.

– Bəs bu aşığın günahı nədi?

– Qaçaqlara saz çalıb. Yoldaş Kəsəmənli, qərarı təsdiq edin. Gedək hökmü yerinə yetirək. Onsuz da qalada yer yoxdu. Çox darısqallıqdı. Adamları bir az seyrəltsək, yaxşıdır.

Kəsəmənli dönüb ona necə baxdısa, o özünü itirib ayağa durdu və qovluğunu bağlayıb qoltuğuna aldı.

– Get, özüm çağıracam.

– Keçən dəfə də elə elədiniz, yoldaş Kəsəmənli, "Troyka"nın qərarını təsdiqləmədiniz.

– İnqilabi şuranın sədri mənəm, mən nə elədiyimi bilirəm, çıx get!

Durub otaqda gəzindi. O, aşıq Qarneti çox yaxşı tanıyırdı. Orta boylu, dolu bədənli bir kişi idi. Kəndin kənarında taxtapuşlu qara damı vardı. İki uşağı və arvadı ilə orada yaşayırdı. Bir toya, məclisə çağırılanda sazı səliqə ilə köynəyinə salar, qayışı çiyninə aşırardı. Sağ əlində isə toppuza bənzər yumru başlı ağac gəzdirərdi. Ağacın əl tutan yerində qayış var idi. Qayışı qoluna keçirər, toppuza bənzər əl ağacından həm çəlik kimi istifadə edər, həm də özünü kənd itlərindən qoruyardı. Onun qalın göyçək bığı var idi. Həmişə gözündən gülərdi. Çox yaraşıqlı bir kişi idi. Kəsəmənli dəfələrlə onun məclisində olmuşdu. Onun çox məlahətli zil səsi, həm də gözəl dili var idi. Axşamdan başladığı dastanı səhərə yaxın qurtarardı. Oxuduqca cuşa gələr, otuzluq çırağın altında dayanıb zəngulə vurardı. Fitilin işığı titrəyər, bəzən də öləziyib sönərdi. Bütün mahalda onu sevərdilər. Heç kəsdə işi olmaz, heç kəsin sözünü yerə salmaz, toyda-mağarda çalıb oxuyardı. İndi ona güllələnmək kəsmişdilər. Nə var-nə var, yaylaqda qaçaqların məclisində saz çalıb, mahnı oxumuşdu.

O qayıdıb yerində əyləşdi, qələmi qırmızı mürəkkəbə batırıb aşığın adının üstündən iri bir xətt çəkdi. Özünü yüngülləşmiş hiss etdi və dərindən nəfəs aldı. Sonra masanın küncündəki balaca zəngi götürüb cingildətdi. Növbətçi milisioner qapıda göründü.

– Uşaqlardan iki nəfər yolla qalaya. Çoban Kərəməlini tez yanıma gətirsinlər. O yan-bu yan eləyən olsa, desinlər ki, yoldaş Kəsəmənli onunla danışacaq.

Aradan yarım saat keçməmiş qapı aralandı. Milisionerlər çobanı itələyib içəri saldılar və barmaqları tətikdə arxada dayandılar.

Kəsəmənli başını qaldırıb onları süzdü və işarə ilə milisionerləri başa saldı ki, çıxıb bayırda dayansınlar.

Qapı örtüldükdən sonra diqqətlə Çoban Kərəməlini başdan ayağa süzdü. Onun yumru sifətini tük basmışdı. Gözünün altında və alnında qara ləkələr var idi. Yumruq və şapalaq yerinə oxşayırdı. Görünür, yazığı əməllicə döymüşdülər. Rəng-rufu da qaçmışdı. Əynində yamaqlı boz çuxa var idi. Amma qəddi-qamətini əyməmişdi.

Kəsəmənlinin mizin üstündə yumruqları düyünləndi və az qaldı dırnaqları ovcunu doğrasın.

– Yaxın gəl, bala, stul çək otur.

Kərəməli bir şey anlamadı və elə zənn etdi ki, qulağı səsə düşüb. O buraya gətiriləndə gözləyirdi ki, qamçının altına salınıb döyüləcək, ağız-burnunun qanı bir-birinə qatılacaqdı.

Onun çaşdığını görən Kəsəmənlinin səsi bir az da yumşaldı.

– Niyə dayanmısan, stul çək otur.

Kərəməli bir azca cəsarətləndi, hürkək addımlarla yazı masasına yaxınlaşıb stulda əyləşdi.

Kəsəmənli ayağa durub otaqda xeyli gəzindi və birdən Kərəməlinin arxasında dayandı:

– De görüm, nə qələt qarışdırıbsan?

Kərəməli geri çevrildi və altdan yuxarı Kəsəmənlinin qan sağılmış zəhmli gözlərinə baxdı.

– Kabı dayı, siz məni bir "Gepo" kimi danışdırırsınız, yoxsa Kabı dayı kimi? Mən sizə necə cavab verim?

Kəsəmənlinin dodaqları astaca qaçdı və o keçib yerində əyləşdi.

– Mən səni Kabı dayı kimi danışdırıram, qorxma, ürəyini aç.

Kərəməli dərindən nəfəs alıb rahatlandı.

– Yaylaqda qaçaqlara çörək aparmışam.

– Kimə?

– Halay bəyə.

– Kimə? Halay bəylə sənin nə işin, a bala?

– Kabı dayı, o elə yaxşı adamdı ki, onun yolunda adam ölümə də gedər. O mənə elə yaxşılıq eləyib ki, özüm də, balalarım da ona ömrümüz boyu borcluyuq.

Kabı kişi Kərəməlinin həyəcandan titrəyən əllərinə, səyriyən dodaqlarına baxdı:

– Mən yenə soruşuram: sənin Halay bəylə nə işin?

Kərəməli yerini rahatladı, bir az bundan əvvəl canına hopmuş qorxunu unutdu:

– Kabı dayı, Şura hökuməti yeni qurulanda olan aclıq ili yadınıza gəlirmi? Yadınızdadımı kəndimizdə neçə adam acından şişib tuluğa döndü. Damların altında para əppəkdən ötrü uşaqlar sabah açılana qədər mələşirdilər. Bax onda mən də balalarımnan birlikdə damın altında ac qalmışdım. Uşaqlar yerlərinə qor dolmuş kimi yorğanın altında çapalayır, gözlərinə yuxu getmirdi. Eşitməyibsənmi ilan vuran yatar, ac yatmaz. Səndən də üzüm qara, uşaqların anası da yorğana bürünüb hıçqırırdı. Elə mən özüm də. Gözümü damın his basmış pərdilərinə zilləyib elə hey fikirləşirdim. Evdə satılası bir şeyim yox idi ki, bazara çıxardım. Nə qonumda bir şey var idi, nə də qonşuda. Hamı mənim günümdə idi. Səhəri diri gözlü açdım. Dan qızaranda evdən çıxdım, gün xeyli qalxana qədər fikrimdə aranı dağa köçürdüm, dağı arana. Gümanım gələn yerləri, adamları bir-bir yadıma saldım. Hətta yaxın adamlardan bir-ikisinin qapısını döydüm də. Amma əliboş geri qayıtdım. Uşaqların içəridən səsi gəlirdi. Anaları onları ovundurmağa çalışırdısa da, qarnı ac tifillərin hıçqırığı kəsmirdi. Bir istədim xəncəri çıxarıb özümü doğram-doğram eləyim. Hər gün diri gözlü ölməkdənsə, bir dəfəlik ölmək yaxşı idi. Bax, Kabı dayı, bilmirəm, Allahın işi idi, yoxsa nə idi, birdən-birə Halay bəy yadıma düşdü. Tez ayağa durdum, balaca heybəni çiynimə aşırdım, Allaha pənah deyib, bəyin qapısına yollandım. Dedim, Allah onun ürəyinə insaf salar, hes olmasa, bir-iki xamralı çörəyi verər. Lap qarğıdalı olsun, arpa çörəyi olsun, gətirim, uşaqlar göyşüyüb səslərini kəssinlər. Yadınızda olar, Halay bəyin evi: dörd tərəfi hasarlı, darvazalı, ikimərtəbəli imarət idi. Mən qorxa-qorxa darvazaya yaxınlaşıb tərəddüd içində dayandım. Xeyli nə edəcəyimi bilmədim. Arada bir qəsdəndim geri qayıdım, amma uşaqların sifəti gözümün qabağına gələndə ürəklənib qapını döydüm. Nökər darvazanı aralayıb üzümə baxdı:

– Nə istəyirsən?

– Bəyə sözüm var.

Nökər səsini bəyin eşidəcəyindən qorxurmuş kimi az qala pıçıldadı:

– Görmürsənmi, bəyin qonağı var.

Doğrudan da ikinci mərtəbənin eyvanında stol açmışdılar. Sarı mis samovar da bir tərəfdə poqquldayırdı.

Halay bəyin yanında oxuyan maşın var idi. Nəsə oxuyurdular. Mənim gözümə nə oxuyan maşın görünürdü, nə də mahnı eşidirdim. Ürə-

yimdə deyirdim ki, nə olaydı Allahın altında o süfrədəki yeməklər bizim evdə olaydı, samovar da böyründə. Uşaqları doyunca yedizdirib, üstündən də hərəsinə bir stəkan çay verəydim. Elə özüm də çaydan doyunca içərdim.

Üzümə salıb içəri girmək istədim, amma nökər döşümdən geri itələdi. Deyəsən, Halay bəyin gözü bunu aldı. Elə eyvandan nökəri səslədi:

– Aya, bala, nə olub orda?

Nökər hünər edibmiş kimi gur səslə dilləndi:

– Bir adamdı, sizi görmək istəyir, amma buraxmıram.

– Niyə?

– Axı qonağınız var.

– Nə olar, burax gəlsin.

Nökər geri çəkildi, mən qorxa-qorxa içəri girdim, həyətin ortasına çatanda gördüm ki, Halay bəy pilləkəni enib qabağıma gəldi.

– Mənə nə sözün var, bala?

Boğazım qurudu. Xeyli dillənə bilmədim. Elə bil lal idim. Halay bəy üzümə baxıb gülümsündü və mənə ürək-dirək verdi:

– Utanma, bala, nəyə gəlibsən, de.

Mən udquna-udquna sözə başladım:

– Halay bəy, məni çevir balalarıyın başına. Əyər mümkünsə, mənə bir-iki çörək ver. Uşaqlar üç gündü damın altında acdılar. Kəndimizdə gümanım bircə sizə gəldi. Ona görə, qapınızı döydüm. Siz olasınız o bir Allahınız, məni balalarımın yanına əliboş, üzüqara qaytarmayın.

Mənə elə gəldi ki, bəyin gözü yaşardı, səsi də titrədi.

– Yaxşı, bala, elə şeydən ötrü köyrəlmə. – Diqqətlə çiynimdəki balaca heybəyə baxdı. – Bə çörəyi nədə aparacaqsan? Bir iri qab gətirəmmirdinmi? – Dönüb kimisə səslədi. – A bala, ordan bir xurcun gətirin.

Aradan bir az keçmiş hər iki gözü dolu naxışlı xurcunu gətirib çiynimə aşırdılar. Bəy üzümə baxıb gülümsünürdü.

– Apara biləcəksənmi?

Key kimi idim. Çaşıb qalmışdım. Nə edəcəyimi bilmirdim. Birdən əyilib bəyin əlindən öpmək istədim. Qoymadı.

– A bala, kömək eləyin, yola salın.

Mən ayaqlarım dolaşa-dolaşa darvazadan uzaqlaşanda hiss etdim ki, Halay bəy ikinci mərtəbənin eyvanında dayanıb arxamca baxır...

Evdə xurcunu açanda gördüm ki, bir gözündə təndir və xamralı çörəyi, o biri gözündə isə yağ, pendir, hətta qənd, çay da var. Arvad tez ortaya süfrə saldı, isti çörəklərdən kəsib uşaqlara verdi, uşaqlar çörəyin arasına pendir doldurub dürmək elədilər. Biz özümüzün də ac olduğumuzu yaddan çıxartdıq. Uşaqların acgözlüklə çörək yediyini, rənglərinin özünə gəldiyini görəndə ürəyimiz rahatlandı. Arvad başındakı şalın ucu ilə gözünün yaşını silib ayağa durdu, hətta çay da qoydu. O gün uşaqların da, özümüzün də qarnı doydu. Axşamüstü qara damımızın qapısında bir araba dayandı. Arabada üç çuval var idi. Arabadakılarnan köməkləşib çuvalları çardağın altına düşürdük. Gələnlərdən biri bayaq məni darvazadan içəri buraxmayan idi. O, gülümsündü və astadan dilləndi:

– Çatdımı?

– Allah onun ömrünü uzun eləsin, çatdı da, artıqdı da.

Həmin taxılla dul bacımın özünü də, yetim uşağını da yaza çıxardım. İndi özünüz deyin, Kabı dayı, adam belə yaxşılığı unuda bilərmi?

Kəsəmənli bir xeyli fikirli-fikirli, gözləri yol çəkirmiş kimi laldinməz oturdu. Sonra ayağa durub pəncərəyə yaxınlaşdı. Frençinin cibindən gümüş papiros qutusunu çıxartdı. Papiros yandırıb iki dəfə ciyəri dolusu nəfəs aldı. Ağ tüstü layları otağı bürüdü. Duman çəkildikdən sonra, gözünü şəhərin kənarı ilə axan çaya, kəndlərə doğru uzanan yollara zillədi. Onu fikir götürmüşdü. Çekanın mərkəzdən göndərdiyi Fətullayev hər yerdə, hər adamın simasında müzür ünsür görürdü. Kim əlinə keçirdisə, ən ağır cəza verməyə çalışırdı. Qəzada qaçaqların sayı getdikcə çoxalırdı. Gözəgəlimli kişilər tüfənglərini götürüb meşələrə, yaylaqlara üz tuturdular. Elə biri – Halay bəy. Vaxtilə Qori müəllimlər seminariyasında oxumuş bu adam bütün ömrü boyu müəllimlik etmişdi. Riyaziyyatı gözəl bilirdi. Kəsəmənlinin uşaqlıq dostu, məktəb yoldaşı idi. Qoridə bir yerdə oxumuşdular. O zaman Kəsəmənli tələbə yığıncaqlarında iştirak edirdi. Halay bəyi də öz cərgələrinə qoşmağa çalışırdı. Amma Halay bəy heç nəyə qarışmır, "Mənim yolum maarifçilik yoludur" deyirdi. Doğrudan da, Halay bəy sonradan müəllimlik etmiş və qəza mərkəzində açılan məktəbdə dərs demişdi. Amma Kəsəmənli eşidirdi ki, yığıncaqlarda cavan müəllimlər, tələbələr onu tez-tez sıxışdırırlar, bəyliyin nümayəndəsi kimi tənqid atəşinə tuturlar. Kəsəmənli onu yanına çağırmağa hazırlaşırdı ki, Halay bəy bir gecə yoxa çıxdı. Onun sorağını dağlardan – qaçaqların dəstəsindən aldılar. İndi də bu yazıq Kərəməli ələ keçmişdi.

Kəsəmənli pəncərənin önündən çəkilib Kərəməliyə baxdı.

– Qalada paltar-palazın varmı?

– Dərziyə köç dedilər, iynəsini yaxasına taxdı. Nəyim vardı əynimdədi.

Kəsəmənli yazı masasına yaxınlaşıb zınqırovu cingildətdi.

Milisioner dərhal içəri girdi.

– Dustağı apar qalaya, kağız-kuğazlarını al gətir bura.

Kərəməli gözlərini təşviş içində Kəsəmənlinin üzünə zillədi. Sifəti kətan kimi avazıdı. Bunlar Kəsəmənlinin qan sağılmış gözlərindən yayınmadı. O hiss etdi ki, bayaqdan özünü şax aparan Kərəməlinin bədənindən gizilti keçdi, titrədi. Kəsəmənli ayılan kimi oldu və ani olaraq düşündü ki, dustağı hara göndərir? Milisioner Kərəməlini qapıdan çıxarthaçıxartda onu saxladı və dustağı geri qaytardı.

Elə bu vaxt masanın üstündəki dəstəkli telefon cingildədi. Kəsəmənli dəstəyi götürdü.

– Allo, eşidirəm. Mənəm, Abdal qağa.

– Başın çox qarışıqdı?

– Nə olub ki?

– Yenə orda işləri nə qarışdırıbsan? Təcili qəza firqə komitəsinə gəl.

– Baş üstə. Deyəsən, yenə araya girən var?

– Sorğu-suala başlama, bura gəl, bilərsən.

O, astaca dəstəyi yerinə qoydu və hiss etdi ki, barmaqları titrəyir. Qan sağılmış gözləri bir az da qızardı və heç nə görmədi. Çiyni bir-iki dəfə qalxıb endi. Başı azacıq titrədi. Kişinin halının birdən-birə dəyişdiyini görən Kərəməli dərhal su qabını doldurub Kabı kişiyə verdi. Kişi suyu bir nəfəsə başına çəkəndən sonra azacıq sakitləşdi və özünü ələ almaq üçün yazı masasına dirsəklənərək başını qollarına söykədi.

Küncdəki iri kəfgirli saat əsəbləri yumşaldan məlahətli səslə astadan danqıldadı. Elə bil bu səs Kəsəmənlinin əsəblərini sakitləşdirdi. O, ayağa durub üst-başını səliqəyə saldı, bir xeyli otaqda gəzindi və əvvəlki təmkini özünə qayıtdı.

Qapıdakı milisionerləri içəriyə çağırdı.

– Bax, mən gedirəm. Bu dustağı sizə tapşırıram. Kim gəlir-gəlsin, kim nə əmr verir-versin, heç nəyə, heç kəsin sözünə baxmazsınız. Onun başından bir tük əskik olsa, özünüzü ölmüş bilin.

Kərəməlini içəri saldılar...

## 2

Qəza firqə özəyinin qapısında dayanan keşikçilər Kəsəmənlini görən kimi gülümsünüb ona yol verdilər. Kabı kişi üst-başını düzəltdi, saçaqlı papağını gözünün üstündən azca geri itələdi və şax addımlarla dəhliz boyu getdi. Üstünə qəza firqə özək katibinin adı yazılmış qapını aralayıb içəridəkilərə salam verdi. Firqə özək katibi Abdal kişi qaş-qabaqlı idi. Telefonda kiminləsə acı-acı danışırdı. O, dilucu salamı aldı və Kəsəmənliyə oturmaq üçün yer göstərdi. Kəsəmənli neçə aydan bəri qəzaya təhkim olunmuş Çekanın nümayəndəsilə qabaq-qənşər oturası oldu. O, adəti üzrə ayağını ayağının üstünə aşırmışdı. Biləkləri didilmiş qara tumac gödəkçəsinin ortasını enli qalın kəmərlə boğmalamışdı. Bir yandan naqanı, bir yandan da çantası sallanırdı. Başındakı papaq da nimdaş idi. Bircə ulduzdan başqa. Elə bil ulduzu qəsdən seçmişdi; hər gün tozunu alıb papağının alnına yapışdırırdı.

Onların baxışları ani olaraq toqquşdu. Kəsəmənliyə elə gəldi ki, Fətullayevin gözlərində qıvrılıb yatan ilan fısıldayıb ayıldı və qarşısındakı adamın üstünə atılmağa hazırlaşdı. Fətullayev də Kəsəmənlinin gözlərində ildırım kimi şaxıyan amansız baxışları gördü. Lakin özlərini çox sakit apardılar. Kəsəmənli başa düşdü ki, onu buraya boş-boşuna çağırmayıblar.

Abdal kişi dəstəyi yerinə qoydu, bir müddət nə edəcəyini bilmirmiş kimi yazı masasının üstündəki kağızları vərəqlədi və sonra Kabının üzünə baxdı.

– De görüm, yenə nə iş qarışdırıbsan? Bununla səndən üçüncü dəfədir ki, şikayət gəlir. “Troyka”nın qərarını nə üçün təsdiq eləmirsən?

– Haqsız olduğuna görə.

Fətullayev ilan vurmuş kimi qıvrıldı və Kabı kişinin üstünə qışqırdı:

– Haqqı-ədaləti səndən başqa başa düşən yoxdur?

– Səsiyin yoğun yerinə salma. Yoxsa elə qışqıraram, qulaqların tutular. Abdal qağa, bununla mən dil tapa bilmirəm. Bəlkə özünüz bunu başa salasınız ki, hamı müzür ünsür deyil. Kimi görürsə, onu düşmən hesab edir. Haqqında sorğu-sual aparır. Kimini dama saldırır, kimini döydürür. Belə getsə, kənddə-kəsəkdə bir başıpapaqlı qalmayacaq. Hərə canını götürüb bir yana qaçacaq. Onsuz da qaçaq-quçağın sayı çoxalıb.

– Onları sən çoxaltmısan. Sənsən onların başına sığal çəkən. Biri qohumundur, biri tanışındır, o biri də dostun. Mən isə sinfi düşmənlərnən vuruşuram.

– Ağına-bozuna baxmadan da hamısına güllələnmə kəsirsən, eləmi? Firudin bəy Köçərlini neylədin?

– Lazımi cəzasına çatdırdım.

– Axı, o, neynəmişdi? Qəzamızda seminariya açmış, görkəmli müəllimləri başına yığmış, uşaqları kəndlərdən yığıb oxumağa gətirmişdi. Nə idi onun günahı?

– Bəs onun Musavat partiyasının üzvü olmasını niyə demirsən? Pristav Xan-Xoyskinin faytonunda gəzməyini niyə yadına salmırsan? Belə bir adam bizim cəmiyyətdə yaşaya bilməzdi. "Troyka"nın qərarını çıxartdım, göndərdim Gəncəyə. Orada cəzasını verdilər.

Söhbətin qızışdığını görən Abdal kişi əsəbiləşdi və əlini masaya çırpıb onların üstünə acıqlandı.

– Nə qələt eləmisiniz, eləmisiniz. Köhnə sandıq içi tökməyin.

– Üzünü Fətullayevə tutub kin dolu bir qəzəblə sözünə davam etdi.

– Firudin bəy kimi bir kişini günahsız qurban verdiyin yetmir, iftixarla danışırsan da. Bir gün bunun haqq-hesabını səndən də, məndən də alacaqlar. Anladın, yoxsa izah edim.

– Mən heç nədən qorxmuram və gördüyüm işə cavab verməyə hazıram.

Abdal kişinin boyun damarları şişdi. Hirsini boğmaq üçün bir stəkan su içdi. Sonra cibindən səliqə ilə bükülmüş dəsmal çıxardıb dodaqlarının, bığının yaşını sildi. Firudin bəy yadına düşəndə o da odsuz-ocaqsız yanırdı. Belə bir kişini qoruya bilmədiyi üçün özünü danlamaqdan yorulmurdu.

Aralıqdakı sükutdan sonra Abdal kişi üzünü Kəsəmənliyə tutdu.

– De görüm, indi nəyin üstündə mübahisə edirsiniz?

Kəsəmənli qovluğu açdı və "Troyka"nın ona göndərdiyi qərarı qəza firqə özək katibinin qarşısına qoydu. Abdal kişi astaca kağızı oxudu və sonra üzünü Kəsəmənliyə çevirdi:

– Bu nədi?

– "Troyka"nın təsdiqə verdiyi qərar.

Abdal kişi bu dəfə üzünü Fətullayevə tutdu:

– Nə cəza təklif edirsiniz?

– Güllələmək.

– Burda on beş nəfərin adı var, hamısına?

– Bəli, hamısına. Onlar müzür ünsürlərdir. Cəmiyyətimizi belələrindən təmizləməsək, irəli gedə bilmərik.

Abdal kişinin elə bil nəfəsi boğuldu. Köynəyinin boyun düymələrini boşaltdı. Qələmi əlinə götürüb qərarı sakitcə oxumağa başladı.

– İndi de görüm, bu müzür ünsürlər nə iş görüblər?

Fətullayev stulunu bir az da yaxına çəkdi. Onun gözündə yatmış ilanlar oyanıb qaynaşdılar. Kişinin sifətini elə bil sevinc alovları bürüdü. Əlini siyahıdakı birinci familin üstünə qoydu.

– Bax bu, çobandı. Qaçaqlara çörək aparıb, bu da aşıqdı, qaçaqlara saz çalıb.

Kabı kişi kağızı kənara itələyib ayağa durdu.

– Bilirsən nə var, Fətullayev, elə şey var ki, onun üstündə adamı danlayarlar, elə şey də var ki, onun üstündə adamı damlayarlar. Sən isə güllələməkdən başqa bir şey bilmirsən. Heç adamı da çörək üstündə güllələyərlər. Heç saz çalmaq üstdə də adamı güllələyərlər? Sən və sənin "Troyka" yoldaşların heç bu haqda fikirləşibsiz?

– Burda fikirləşməli bir şey yoxdur. Sinfi düşmənə kömək edən müzür ünsürlər qırılmalıdı, vəssalam.

Artıq Abdal kişi dözə bilmədi. Hirslə ayağa durdu.

– Mənimlə çənə-boğaz döymə. Səni bura göndəriblər ki, bizim işlərimizə kömək edəsən, göndərməyiblər ki, harda başıpapaqlı gördün güllələyəsən. Elə buna görədi ki, qaçaq-quldurun əlindən tərpənmək olmur. Camaatı hürküdüb yerindən-yurdundan oynatmısınız. Çıxın gedin. Yoxsa sizi müzür element kimi "geponun" podvalına saldırram.

## 3

Qapının ağzında domuşuqlu oturan uşaq Kəsəmənlini görən kimi ayağa durdu və hörmətlə ona salam verdi. Kabı kişi bu üstü-başı cırıq uşağın mərifətinə heyran qaldı. Ayaq saxlayıb onun tükü tökülmüş papağına, çiyinləri yamaqlı köynəyinə və didik-didik olmuş şalvarına baxdı. Uşağın ayağındakı çarığın burnu deşilmişdi. Çirkli corabı görünürdü. Amma özünü əkə-bükə kişi kimi aparırdı.

– Kimi istəyirsən, bala?

– Səni, Kabı dayı.

– Məni hardan tanıyırsan, oğul?

– Mən də Kəsəməndənəm, eloğluyuq. Sənə deyiləsi sözüm var.

– Sözünü burdakılara deyə bilməzdinmi?

Qapının yanında dayanmış milisioner söhbətə qarışdı:

– Çox inad uşaqdır. Səhərdən deyirik ki, Kabı dayın gec gələcək, nə sözün varsa, bizə de. Demir ki, demir.

Kəsəmənli gülümsündü və qapını açıb uşağı içəri buraxdı. Uşaq gözü qamaşmış kimi bir xeyli ətrafa boylandı, hara düşdüyünü anlaya bilmədi. Kabı kişi stul çəkib uşağı oturtdu və özü də onunla üzbəüz əyləşdi.

– Bir papiros çəksəm, inciməzsən ki?

– Mən nə karəyəm ki, Kabı dayı.

Kişi bu uşağın ədəb-ərkanına yenidən gülümsündü və papiros qabından papiros çıxardıb yandırdı. O bununla hirsini bir az da soyutmaq, qəza firqə özəyindəki söhbətdən uzaqlaşmaq istəyirdi. Fətullayevin səsi hələ də qulaqlarında idi: "Müzür ünsürləri qırmaq lazımdır". Kabı kişi papirosu sümürüb ciyərlərini tüstü ilə doldurdu, sonra da əlindəki kötüyü hirslə külqabına basıb söndürdü. Sifətinə ılıq və mülayim bir ifadə verdi.

– De görüm, bala, mənə nə sözün var?

Uşaq stulunu azca irəli çəkdi və yazı masasına doğru əyildi.

– Bizim kəndin şura sədrini, Qəzənfər kişini tanıyırdınızmı?

Kəsəmənli dik atıldı, qaşları çatıldı, kirpiklərini bir-iki dəfə çaxıb qan sağılmış gözlərini uşağın üzünə zillədi.

– Nə olub ki?

– Onu mən öldürmüşəm.

– Kim?!

– Mən!

– Sən nə danışırsan, bala, onu iki aydır öldürüblər. Öldürənlər də qalada yatır.

– Yox, Kabı dayı, o tutulanların heç bir günahı yoxdur. Onu mən öldürmüşəm.

Uşaq ayağa durdu. Şalvarının belini qurdaladı və oradan bir naqan çıxardıb masanın üstünə qoydu.

– Bax bunnan. Düz qaşının ortasından vurdum. Bu da Qəzənfərin qanlı papağı, tapançası da üstündə.

– Axı, nə üstə?

Uşağın qaşqabağı töküldü. Birdən-birə sifətini elə bil qara bulud bürüdü. Deyəcəyi sözə çətinlik çəkirmiş kimi bir-iki dəfə udqundu, sonra təmkinini pozmadan qətiyyətlə dilləndi:

– Bacıma sataşmışdı. – Uşaq elə bil birdən-birə büzüşdü. Az qaldı iri yazı masasının altına girsin. Elə bil neçə aydan bəri ürəyində sirr kimi saxladığı məsələni açdığına görə, tarıma çəkilmiş əsəbləri boşaldı. İndi o yüngülləşmişdi və tutduğu işə görə cəzasını çəkməyə hazır idi.

Kabı kişi ayağa durub otaqda gəzindi, papirosu papirosun oduna yandırıb içərini tüstü-dumanla doldurdu. O, öldürülmüş şura sədrini yaxşı tanıyırdı; anasının əmcəyini kəsənin biri idi. Halal-haram qanmaz, abır-həya bilməzdi. Əli də əyri idi. Kənd camaatını zinhara gətirmişdi. Onun oturub-durduğu adamlar da çekanın nümayəndəsi demişkən, müzür ünsürlər idilər. Əslinə baxsan, Kəsəmənli onlardan can qurtarmaq üçün bir yol axtarırdı. Onun ölüm xəbərini eşidəndə bir az yüngülləşən kimi oldu və şahidlərin dediyinə inanaraq dostlarından iki nəfərini də tutub cəza verdilər. Amma indi işin gözlənilmədən bu cür açılması onu həm sevindirmiş, həm də sarsıtmışdı. Kabı kişi qəti addımlarla uşağa yaxınlaşdı, onun qoltuğundan hop götürüb masanın üstünə qoydu.

– Bu sirri bir kəsə deməmisən ki?

– Heç bacım da bilmir, anam da. Kişinin sirri özündə olar. Amma, Kabı dayı, bu məsələni sizə açmaya bilməzdim.

Kabı kişi uşağı qucaqlayıb sinəsinə sıxdı.

– Vallah kişi qırığısan, kişi. Ananın südü sənə halal olsun. Amma, ay oğul, indidən qan tökməyə vərdiş eləmə. Axırda bir gün su çanağı suda sınacaq. – Kabı kişi birdən ciddiləşdi. – Oxumaq bilirsənmi?

– Yox.

– İstəyirsənmi?

– İstəyirəm.

Kabı kişi onu yüngülcə götürüb yerə qoydu, yazı masasının arxasına keçib telefonun quyruğunu fırladı.

– Ay qız, yetimxananı ver. Allo, Məmmədov, sənsən? Sənin məktəbinə bir uşaq göndərirəm. Onu qəbul edərsən, təzə pal-paltar verərsən, yataqxanada yer düzəldərsən. Gözün həmişə üstündə olsun. Özüm də tez-tez baş çəkəcəm.

Kabı kişi ayağa durdu. Uşaq da qalxdı. Onun çiynindəki heybəni Kəsəmənli yenicə görürmüş kimi qımışdı.

– Bu nədir?

– Çörəkdi, Kabı dayı, götürmüşdüm ki, qalada yeyərəm.

– Özgə nəyin var?

– Pendirim, bir də soğan doğranmış şorum var.
– Çıxart qoy ortalığa.
Uşaq təəccüblə Kabı kişinin üzünə baxdı. Kabı kişi gülümsündü.
– Yəqin acıbsan, mən də acmışam. Bir yerdə iştahnan çörək yeyərik.
Uşaq dərhal heybədə nə varsa, çıxarıb yazı masasının üstünə düzdü. Kəsəmənli zınqırovu cingildətdi. Qapı azacıq aralandı. Keşikçi milisioner göründü.
– Bizə iki stəkan salma çay gətir.

## *III fəsil*

### 1

Son vaxtlar Ömər koxanın yuxusu ərşə çəkilmişdi. Mal-qara tövləyə, xalxala salındıqdan, əl-ayaq yığışdırılıb kənd camaatı qapı-bacasına çəkildikdən sonra eyvanda xeyli oturardı. Qapı-bacalarda ləngiyən mal-qaranın mələşməsinə qulaq asar, Kürün bəri üzündəki tülkülərin, çaqqalların vaqqıltısını dinləyərdi. Çaqqal-tülkü yaman çoxalmışdı. Günün qulağı yaxıb qaranlıq düşməmiş cələyə yığışır və kəndə doluşmağa hazırlaşırdılar. Ömər koxa onlara sakitcə qulaq asır və görürdü ki, kənd itləri nəyisə qabaqlarına qatıb cələyə qədər qovurdular. "Bu qırılmışlar yaman çoxalıb. Az qalırlar evlərə doluşsunlar. Eh, zamana yaman dəyişib. Əvvəllər bizim kəndin həndəvərində ağzı qanlı canavarlar dolaşardı. İndi də çaqqal-maqqal dolaşır. Belə getsə, camaat özü də çaqqala dönəcək".
Ömər koxa qaratikan kolundan düzəldilmiş gümüş örtüklü qəlyanını közərdir, fikrində dağı arana, aranı da dağa köçürürdü.
Ələddinin ölümü onu yaman sarsıtmışdı. Özünə nə qədər təskinlik versə də, ürəyində dərd çəkirdi. Onun dünyada ən çox qorxduğu şey aldanmaq idi. Nəvəsinin qəfil öldürülməsində xəyanətin olub-olmadığını bilməyə çalışırdı. Həm də qorxurdu ki, məsələnin qəsdən olunduğu bilinsə, araya qan düşər və iki nəsil bir-birini qırıb qurtarardı.
Böyük gəlin ağzında yaşmaq qayınatasına yaxınlaşdı və qalaylanmış mis sinini ortalığa qoydu. Kişi buğlanan çaya, bal qatılmış qaymağa, motal pendirinə və sacın üstündən yenicə götürülmüş isti ağ fətirə gözucu nəzər saldı. Bir oturuma quzunun şaqqasını sarımsaqlı qatıqla

yeyib üstündən bir cam bal içən Ömər koxanın iştahı yox idi. O, candərdi çörəkdən bir parça kəsib dürmək elədi, çayı bir-iki hortuma içib geri itələdi. Gəlin dərhal yaxınlaşıb sinini götürdü.

Kəndin səs-səmiri azaldı. Görünür, adamlar yatmağa hazırlaşırdı. Elə Ömər koxanın da həyətinə sükut çökdü. Mal-qaranı sağıb qurtardılar, inəkləri, camışları xalxala doldurdular, uşaqların da səs-səmiri kəsildi. Bircə gəlinlər kölgə kimi ortada hərlənir, qapıları astaca örtüb açırdılar.

Ömər koxa yavaşca ayağa durdu. Asta addımlarla öz otağına getdi. Onun yerini salmışdılar. Tavandan asılmış otuzluq çırağın piltəsini aşağı çəkmişdilər. Otaq yarıqaranlıq idi. Ömər koxa çuxasını, arxalığını soyundu. Belindəki gümüş dəstəkli xəncərini yastığın altına qoydu. Yatmazdan əvvəl üzünü qibləyə çevirib dua elədi. Sonra səksəkəli halda, qorxa-qorxa yorğanı qaldırıb arasına girdi.

Düz on gün idi ki, bir səs onu yatmağa qoymurdu. Ömər koxa kənd tam sükuta qərq olandan sonra, Kürün qıjıltısına qulaq asmağı elə uşaqlıqdan sevirdi. Onun gah ucalıb, gah da alçalan səsində bir mehribanlıq duyardı. Elə çox vaxtı suyun qıjıltısı altında yuxuya gedərdi. Amma son günlər Kürün qıjıltısı ona layla çalıb yuxuya aparan vaxt, kişi gözünü yumar-yummaz qulağına gələn bir səs onu diksindirib yerindən qaldırardı. Ömər koxa bu səsin haradan gəldiyini və kimin olduğunu bilmək istəyirdi. Uşaqlarından gecələr qulağına gələn bu səsin nə səs olduğunu öyrənmək istəsə də, fikrindən daşınmışdı. Qorxmuşdu ki, "Kişi deyəsən havalanıb" – deyə ondan şübhələnsinlər. Amma hər gecə səs gəlirdi. Özü də apaydın. Ömər koxa təxmin etmişdi ki, bu səs qəbristanlıq tərəfdən gəlir. Kişini həm vahimə basmış, həm də məsələni öyrənmək marağı daha da artmışdı. O qərara almışdı ki, əgər bu gecə də səs gəlsə, mütləq o tərəfə gedəcək və bu qəbristanlıqdakı səsin sahibinin nə canlı-cinli olacağını biləcəkdi. Elə ona görə də atın yəhərini almamış, tövlədəcə hazır saxlamışdı.

Ömər koxa yerin içində bir xeyli qurcalandı, gözünü tavana zilləyib Kürün qıjıltısına qulaq asdı. Sakitlik idi. Meşənin ağacları da susmuşdu, meşədəki çaqqal-çuqqal da. Kənd sükuta qərq olmuşdu. Birdən kəndin yuxarı tərəfindən vaxtsız banlayan xoruz səsi gəldi. Onun ardınca fəryada oxşar həmin səs eşidildi. Ömər koxa dik atıldı. Tələsik paltarını geyindi, xəncərini bağladı, tövləyə keçib atı çıxartdı. Heç kəsə sezdirmədən darvazadan keçib qəbristanlığa doğru yollandı.

Qəbir daşları baş-başa vermişdi. Lap yuxarı tərəfdə Ələddinin qəbrindən bir az arxada üç uca qəbir daşı görünürdü. Hündürlüyü az qala üç metrə çatan bu qəbir daşlarına gözəl naxışlar vurulmuşdu. Camaat arasında nədənsə bu qəbirlərə oğuz qəbirləri deyirdilər. Amma Ömər koxanın yadındadır ki, onun babası hərdən-bir uşaqları başına yığıb bu qəbirlərin tarixindən danışardı.

Birdən kişinin gözlərinə ağ paltarda hərlənən kölgə göründü. Bu kölgə qəbrin başına fırlandı. Əli ilə torpağı sığalladı. Sonra da sinə daşını qucaqlayıb xeyli tərpənməz oldu. Ömər koxa yerindən tərpənə bilmədi. İstədi atın cilovunu çəksin. Sonra başa düşdü ki, at yerindədi, onu heç minməmişdi. Kişinin gözünə bir qaraltı da göründü. Bu qaraltı insana bənzəmirdi. Ömər koxa doğrudan da vahimələndi, "Allah sən saxla, bu nə işdir mənim başıma gəlir" dedi və dilinə kəlmeyi-şəhadət gətirdi, "Bəlkə bu Əzrayıldır, məni qəbristanlığa çəkib gətirib".

Birdən qəbrin üstündəki qaraltı Ömər koxaya doğru yüyürdü. Kişi gələn qaraltının şeytanmı, itmi olduğunu ayırd edə bilmədi. Amma it onun qarşısında gəlib dayananda, quyruğunu tərpədib şırvananda ani olaraq astadan "Alan" deyə pıçıldadı. İt öz adını eşidib çömbəltmə oturdu. Ömər koxa özünə gəlib qəbrə yaxınlaşdı. Bu dəfə qız vahiməyə düşüb kənara sıçradı və qəbristanlıq uzunu qaçmağa başladı. Ömər koxa nə qədər çağırdısa, dayanmadı.

## 2

Qaratel nişanlısı Ələddini bircə dəfə görmüşdü. Bircə dəfə əlləri əlinə toxunmuş, barmaqları bədəninə dəymişdi. İlin-ayın axır çərşənbəsi idi. Qızlar Qaratelgilə toplaşmışdılar. Əvvəlcə həyətdəki ota, samana od vurub tonqal qalamış, üstündən atılmışdılar. Oğlanlar görmədən düzəltdikləri lopaya od vurmuşdular. Həyət bir anlığa işığa qərq olmuşdu. Qızlar lopanın işığında hərlənən oğlanlara, onların göyə atdığı fişənglərə doyunca tamaşa etmişdilər. Elə bil kəndin üstünə yarpız böcəkləri səpələnmişdi. İşığın biri yanıb biri sönürdü. Sonra qızlar içəri keçdilər, plov yedilər, şirni paylarını götürüb qağıldaşa-qağıldaşa ortaya sulu bir qab qoyub iynəlik saldılar. Düz dan yeri qızarana qədər deyib güldülər. Bu kəndin qaydası idi: ilin – ayın axır çərşənbəsində köhnə ili yola salanda, baharın gəldiyini xəbər verən Novruzun ilk günündə dan yeri qızarar-qızarmaz axar suya

– Kürə tökülüşərdilər. Su bumbuz olub adamı qılınc kimi kəssə də, çimişər, ağırlıqlarını-uğurluqlarını yuyar, təzə ilə tərtəmiz gələrdilər. Bu dəfə də elə oldu. Qızlar Kürün sahilinə gələndə artıq dan yerinə səda düşmüşdü. Kənd xoruzları banlayırdı. Göyün üzü yavaş-yavaş çəhrayı rəngə boyanırdı. Sakit havalı, tərtəmiz bir səhər gəlirdi. Kürün üstünə tül kimi nazik duman çökmüşdü. Bu duman gah sürünüb sahilə yaxınlaşır, gah da o taydakı meşəyə tərəf qanad açırdı. Elə bil Kürün üstünü qəsdən örtmək, mələk kimi uçub çimməyə gələn qızların bədənlərini yad gözlərdən qorumağa çalışırdı.

Qaratelgilin dəstəsi sahildəki saçaqlı söyüd ağacının yanında dayandı. Əvvəlcə ehtiyatla ətrafa boylandılar, yaxında heç kəsin olmadığını yəqin etdikdən sonra paltarlarını soyunub Kürə atıldılar. Su bumbuz idi. Amma səslərini çıxartmadılar. Xısın-xısın danışıb güldülər, bir-birlərini çimdiklədilər, döş-başlarını əlləşdirdilər.

Suda çox qalmaq olmazdı. Dişləri dişlərinə dəyirdi. Tezcə sahilə çıxıb paltarlarını geyinməyi qərara aldılar. Hərə öz geyimini götürdü. Tələm-tələsik donlarını başlarından keçirdilər. Bədənləri azacıq isiləndi. Amma Qaratel paltarını qoyduğu yerdə tapmadı. Qızlardan soruşdu, gördüm deyən olmadı. Qaratel ağacların dibini, yarğanların qaşını nə qədər axtardısa, bir şey tapmadı. Qızlar paltarlarını geyinib gülə-gülə sahildən uzaqlaşdılar:

– Ay qız, Qaratel, daha sən bizimlə gedə bilməzsən. Sənin paltarına bəni-insan əli dəyib. Sən uçub gələn göyərçin bacılardan biri kimi burda qalmalısan.

Qızlar gülə-gülə sahildən uzaqlaşdılar. Qaratel həm soyuqdan, həm də vahimədən titrəməyə başladı. “Mənim paltarım necə oldu? Onu kim götürdü? İndi mən el içinə necə çıxacam?”. Heç yerdən səs gəlmədiyini görüncə oturub hönkür-hönkür ağladı. Elə bu vaxt yarğanın qaş tərəfindən səs gəldi.

– Ağlama, paltarın məndədi.

Bu sözləri deyən adam səsinə nə qədər mehribanlıq versə də, Qarateli elə bil ildırım vurdu. Büzüşüb yumağa döndü, bilmədi hara girsin, harda gizlənsin. Oğlanın qabağında diz çöküb yalvardı: “Sən qağayın canı, kimi çox istəyirsən onun canı, mənə əl vurma. Əyər bir şey eləsən, özümü Kürə atıb boğaram”.

– Özünü niyə boğursan, ay dəli. Nağıllardan eşitməmisənmi, üç göyərçin bacının birinin paltarına əl dəyəndə heç yana gedə bilmir,

qalır ordaca. İndi sənin paltarına mənim əlim dəyib, heç yana gedə bilməzsən. Qalacaqsan mənim yanımda.

Qaratel bu dəfə doğrudan qorxuya düşdü. Dönüb Kürə doğru baxdı. Onun fikrindən keçənləri elə bil oğlan başa düşdü:

– Əlini mənə ver, – Bu sözü deməyi ilə qızı dartıb yarğandan çıxarmağı bir oldu. – Mən sənin sorağını çoxdan almışdım. İndi də rastlaşdıq. Qorxma, bizim nəsildə namərd adam tapılmaz. Mən Ömər koxanın nəvəsiyəm. Adım da Ələddindi. Al paltarını gey. Gömgöy olubsan.

Qaratel paltarı götürüb bir göz qırpımında donunu başına keçirdi. Amma qorxusu hələ getməmişdi.

Həm soyuqdan, həm də həyadan tir-tir əsirdi. Ələddin onun qaşlarına sığal çəkib uzaqlaşdı.

– Elçilərimi gözlə.

Qaratel donub qalmışdı. Bilmirdi yuxu görür, yoxsa doğrudan da oğlana rast gəlib. O, xeyli Ələddinin arxasınca baxdı.

Artıq dan yeri ağarmışdı. Üfüqlər çəhrayı rəngə boyanmışdı. Səhər tezdən Kürün üstünə çöküb, gah yarğanlara, gah da meşəyə doğru sürünən duman da yox olmuşdu. Daşqını hələ ötüb keçməyən Kürün suları ilə çiləkənlərdən atlarını Kürə tökən kənd cavanları aydınca görünürdü. Yaqut rəngli bir səhər başlayırdı.

## 3

Ələddin sözünə düz çıxdı. On gündən bəri gecəsi-gündüzü bir-birinə qarışan, qorxusundan gözünə yuxu getməyən Qaratelin həyəcanlı günləri qurtardı. Qızlar ona axır vaxtlar bir cür baxırdılar. Onu görən kimi qaş-gözlərini oynadır, fürsət düşəndə bir-birlərinə him-cim edirdilər. Əvvəlki kimi onunla açıq danışmırdılar. Elə bil nəyi isə gizlədir, hansı sirrinsə açılacağından qorxurdular. Qaratel başa düşürdü ki, qızlar ona daha əvvəlki kimi inanmır, o Novruz günü sahildə nəyinsə baş verdiyini düşünürdülər. “Allah, mənə ölüm ver, ağlıma gələn dağlara-daşlara getsin. Əyər qızlardan biri ağzından söz qaçırtsa, kənd arvadları, kənd camaatının hansını inandıracaqsan ki, heç nə olmayıb, mən gül kim tər-təmizəm”. Qaratel bəzən özü də özündən şübhələnirdi. Gecələr yerinə qor dolmuş kimi yata bilmir, səhərə kimi qıvrılırdı. Amma bir gün gördü ki, başda Ömər koxa bir dəstə kişi ilə onlara

gəldi. Qız özünü itirdiyindən hər şeyi unudaraq eyvana çıxdı; özü də bilmədən qapıları açıb-örtdü, samovara od saldı. Sarı lüləli aftafa-ləyəni su ilə doldurub hazır qoydu. Donunun yaxasındakı muncuqlar, qızıl pullar cingildədi. Əslinə baxsan, Qaratelin ürəyi də, qəlbi də, bütün bədəni də cingildəyirdi. O, hiss etmişdi ki, qonaqlar xeyirliyə gəliblər.

Elçilər getdilər. Bir həftədən sonra qıza nişan gəldi. Bunu eşidən kənd qızları Qaratelin başına toplaşdılar, ondan şirinlik istədilər.

Qaratel yerə-göyə sığmırdı, hər yerdə: doqqazda, çəpərlərin töngəsində, Kürün sahilində, yarğanların qaşında Ələddini görürdü. Evlərinin yanından bir başıpapaqlı keçəndə elə bilirdi ki, Ələddindi, ürəyi çırpınırdı. Boş vaxtlarda evdə oturub yanı işləməli dəsmal tikir, naxışlı corablar toxuyurdu. Xəyalında bunları Ələddinə bağışlayır, corabların bəzəyinə özü də heyran qalırdı. Getdikcə qız Ələddinə daha çox bağlanır, onun mərdliyinə heyran qalırdı. Bircə kəlmə söz demiş və sözünün üstündə də kişi kimi dayanmışdı.

Qaratel bu cür şirin xülyaların içində xumarlandığı vaxt, bu gün-sabah toy olacağını gözlədiyi anda qəfil acı xəbər eşitdi: Ələddin yox idi, onu vurmuşdular, onu öldürmüşdülər. Elə bil göy şaqqıldadı, dünyanın altı üstünə qarışdı, hər yana zülmət qaranlıq çökdü. Qaratel evdə iki gün bilmədi yerin altındadı, ya üstündə. İçəridən göynədi, xısın-xısın ağladı. Dəfnə gedə bilmədi. Bu yerlərdə adət deyildi. Nişanlı qızın camaatla birlikdə qəbristanlığa getməyi görünməmiş iş idi. O, uzaqdan Çıraqlılar tərəfdən meyitin götürülməsinə, dəstənin qəbristanlığa yaxınlaşmasına tamaşa etdi. Ağlayan arvadların üz-başlarını cırıb, sinələrini döyməsinə, dil deyib səs-səsə vermələrinə qulaq asdı. Xısın-xısın, hıçqıra-hıçqıra divara qısılıb ağladı.

Bir gecə, Ələddinin qırxı çıxandan sonra, hamını yuxuya verib qəbristanlığa yollandı; qorxu içində, vahimələnə-vahimələnə. O, nəinki gecə vaxtı, hətta günün-günorta çağı qəbristanlıq tərəfə hərlənməkdən qorxardı, amma indi onu bir qüvvə çəkib aparırdı. Qaratel çala-çuxur qəbirlərin yanından ehtiyatla keçdi, dilinə kəlmeyi-şəhadət gətirdi. Hər şıqqıltıdan diksinə-diksinə ucqardakı qəbirə yaxınlaşdı. Bir neçə kərə “Bissimillah” dedi. Sonra baş daşına söykənib hıçqırdı. Əyilib qəbirin torpağını sığalladı. Düz iki gün beləcə, gizlincə qəbristanlığa gəldi. Üçüncü gün baş daşına söykənib hıçqıranda gözlənilmədən yanında bir hənirti duydu. Diksindi. Qorxusundan yerindən tərpənə bilmədi. Mat-məəttəl yanında çömbəltmə oturmuş itə bənzər məxlu-

qa baxdı. Yəqin etdi ki, bu gələn şeytandı. Titrəyə-titrəyə bir-iki dəfə "Bissimillah" dedi. Sonra dili tutuldu. Kəlmələri bir-birinə qarışdırdı. İt bunları duymuş kimi qıza yaxınlaşdı. Astadan zingildəyib, sanki nəsə demək istədi. İtin zingiltisi qızı özünə gətirən kimi oldu. Dili əsə-əsə "Alan, Alan" dedi. İt adını eşidən kimi qulaqlarını şəklədi və qızın əlini yalamağa başladı. Qaratel ehtiyatla əlini itin başına çəkdi. "Mənim Alanım, mənim Ələddinimin Alanı", – deyə hıçqırdı.

O gündən Alan ilə dost oldular. Qaratel qəbristanlığa gələndə Alanı orda görürdü. İt qızı gözləyirdi. Bu sirri dünənə kimi heç kəs bilmirdi. Dünən isə Ömər koxa qəbristanlıqda peyda olmuşdu.

Düz bir həftə Ömər koxa qəbristanlıq tərəfi dinşədi. Hər dəfə acı-acı ulayan Alanın səsini eşidir və qovşurulurdu. Aradan bir həftə də keçdi. Bir səhər oğlunu yanına çağırdı. Şamil içəri girdi. Qapının ağzında ayaqqabılarını çıxardıb cütlədi. Atası ona yanında yer göstərdi. Şamil bardaş qurub gəbənin üstündə oturdu.

Ömər koxa gümüş dəstəkli qəlyanını tənbəki ilə doldurdu. Kibrit çəkib yandırdı, otağa ağ tüstü qatları laylandı.

– Gecələr qəbristanlıq tərəfə fikir vermisənmi?

– Yox, necə bəyəm?

Kişi oğlunun təşfiq dolu baxışlarını üzündə hiss etdi.

– Qız uşağın qəbrinin üstündən əl çəkmir.

Aralığa sükut çökdü. Tüstü layları tavana qalxıb bürülüb-büküldü və birdən aşağı enib açıq pəncərədən sürünüb bayıra çıxdı.

– Fikrin nədir?

– Məsləhət səninkidir, ata.

Ömər koxa yenidən susdu. Harayasa uzaqlara getmiş fikirlərini cilovlayıb cəmləşdirdi. Kişinin səsi titrədi.

– Bilmirəm, qocalıqdandı, nədəndi, ay bala, sümüyüm yaman köyrəlib, heç uzun saçlının ahına dözə bilmirəm.

– Neyləmək olar, ay ata, Allahın işidir, bizdə nə taqsır var.

– Elə olmasına elədi, amma ahu-naləyə ürəyim dözmür.

Şamil dinmədi. Atası da susdu. Yenə tüstü layları tavana qalxdı.

– Gəlsənə son beşimiyizi evləndirək!

Şamil söhbətin bura gəlib çıxmasını gözləmirdi. Diksinən kimi oldu.

– Çox fikirləşmişəm, oğul, o qız tanrının bizə göndərdiyi qismətdir. Bizim ocağın gəlini olmalıdır. Ələddindən sonra onun başqa qapıda gəlin olmasını ürəyim götürməz.

Şamil başını aşağı saldı. Əli ilə gəbənin ilgələrini didişdirdi. Ələddinin nişanlısını kiçik oğluna almağı heç ağlına belə gətirməmişdi. Qonum-qonşunun buna nə deyəcəyini, elə evdə arvad-uşağın bu işə necə baxacağını belə fikirləşməmişdi. Hələ qız evinin adamlarının da fikirlərini bilmək lazım idi. Qız heç, onu dilə tutmaq olardı, böyüklərin sözündən çıxmazdı. Elə gədənin özünü də bu işə razı salmaq lazım idi. Şamil əslində belə işlərə bir cür baxırdı. Nə çox idi kənddə gözəl-göyçək durna boğaz qızlar. Amma atasının da xasiyyətini bilirdi. Bir şeyi ölçüb-biçməmiş ortalığa söz atmazdı. Sözü də dedimi, geri durmazdı.

Ömər koxa elə bil oğlunun fikrindən keçənləri duydu.

– Sən əvvəlcə evdəkilərin ağzını ara. Sonra əl altından arvadlar gedib, qızı su yolunda, Kürdə tapıb fikrini öyrənsinlər. Özün də kişilərlə söhbət elə. İşi dağ eləyəndən sonra mənə deyərsən. Əgər xəm-xom eləsələr, onlarnan özüm danışaram. Sənin işin olmasın.

Şamil yerindən ağır durdu. Qapıya da ağır-ağır yaxınlaşdı. Bunlar kişinin gözündən yayınmadı və başa düşdü ki, oğlu ona bir şey deməsə də, bu iş ürəyindən deyil...

Neçə gündən sonra arvadlar Qarateli qəbrin üstündə tapdılar.

Həmişəki kimi axşamın ala-qaranlığında Alan da yanında, baş daşına söykənib hıçqırırdı. Onları görəndə hürkdü. Tez aralanmaq istədi. Amma Şamilin arvadı qolundan tutub saxladı.

– Özünü üzmə, qızım, olacağa çarə yoxdur. Görünür qismət bu imiş.

Qız hönkürdü.

– Mən fələyə nə etmişdim ki, murazımı gözümdə qoydu.

– Təkcə sənin ha murazını gözündə qoymadı. Elə hamımızın murazı gözündə qaldı. Sənə nə olub, cavan qızsan. Qoy biz dərd çəkək ki, oğul itirdik.

– Mənim də tanrı nişanlımı əlimdən aldı.

– Sən mənim gəlinimsən. Elə Ömər baban da belə deyir. Səni yad qapısına qoymarıq. Əvvəl-axır öz qapımıza gələcəksən. Şükür Allaha, nə olub, oğlumuzmu yoxdur!!!

Qızın göz yaşı qurudu. Başını qaldırıb ala-qaranlıqda arvadın üzünə baxdı. Kəlağayısını irəli çəkdi. Onun fikrindən keçənləri başa düşdü və bir göz qırpımında qəbristanlıqdan uzaqlaşdı. İşə Ömər koxa özü qarışmalı oldu. Onun sözünü yerə salmadılar.

Ömər koxa hamının gözündən yayınaraq tövləyə getdi. At onu görən kimi oxrandı. Sahibini imsilədi, ayağını yavaşca yerə döydü. Kişi

əlini atın sağrısına çəkdi, yalını sığalladı. Sonra gözündən öpdü. At bu mehribanlıqdan sakitləşib lap quzuya döndü. O, həmişə atın yanında, axurda saxladığı yəhəri götürdü. Qolu ilə tozunu silib atın belinə qoydu. Gümüş sinəbəndini taxdı, qarınaltı qayışlarını bağladı, yüyəni başına keçirdi. Bir də atın ətrafına dolandı. Kəhər elə bil harayasa gedəcəyini başa düşdü. Kişinin əli yalına, sağrısına dəyəndə bədəni səyridi.

Ömər kişi atı sakitcə tövlədən çıxartdı. Tayaların arxasına keçdi. Oradan da çığırla Kürə doğru endi. Heç kəs onu görmədi. Camaatın başı toya qarışmışdı. Qara zurna zilə çəkirdi. Cavanlar dirə-döymə oynayırdılar.

Bu kənd cavanlarının qəribə xasiyyəti vardı. Axşamdan ala çatıları istağa qoyurdular. Səhər, gün xeyli qalxandan və zurnaçılar damın üstünə çıxıb səhər havasını çalandan sonra dəstə-dəstə gəlib xırman yerinə toplaşırdılar. Böyük dairə çəkirdilər. Sonra da haley gəlib beş-beş iki yerə bölünürdülər. Yalaq düzəldib ala çatıları ora qoyurdular. Oynayanlardan beş nəfəri həmin çatıların – dairənin üstündə dayanırdı, beş nəfəri isə dairəvi cızıqdan kənarda dayanırdı. Oyunun şərti belə idi: kənarda dayanan beş nəfər çalışırdı ki, dairənin içində dirələrin üstündə dayananlardan birinin ayağının altından çatını götürsün. Əgər götürə bilsələr, çatıları alır, dirələrin üstündə dayananları dairənin içinə salır və əllərindəki çatı ilə onları döyürdülər. O vaxta qədər ki, döyülənlərdən biri döyənlərdən birini dairənin içində təpiklə vura bilsin. Belə olanda oyun təzədən başlayırdı. Döyənlər dairənin içində dirələrin üstündə dayanır, döyülənlər isə onlara hücuma keçirdilər. Bu, adicə oyun deyildi, tamaşa idi. Doğrudan da kənd camaatı: qocalar, cavanlar, gəlinlər, qızlar dövrə vurub tamaşa edirdilər. Qara zurna zilə çəkirdi. Oyunçuları həm qara zurnanın səsi, həm də qız-gəlin baxışları pələngə döndərirdi. Bir də görürdün papaqlarını astar üzünə çevirib toza bulayır və iki nəfər dirə üstündə dayananlardan birinin üstünə düşürdü. Papaqla ağzının üstünə vurur, təpik atır, arxa tərəfə keçir və onu təntidib çatını əlindən almaq istəyirdilər. Üstü kəsilən adam həm özünü qorumalı, həm də arxadan gələn varsa, onu hiss etməli idi. O biri yoldaşlar da ağzı kəsiləni gözdən qoymurdular. Təpik, qışqırıq, ağzıüstə dəyən və gözdən od çıxardan toza bulanmış astar papaqların şappıltısı bir-birinə qarışırdı. Bir də görürdün hücum edənlərdən biri pişik cəldliyi ilə meydanın ortasına girir və quş kim sıçrayıb ağzı kəsilən oyunçunun kürəyinə təpik vururdu. Onu ya yolda qabaqlayıb təpiklə vurur, ya da

o, əldən çıxıb "düşmənindən" qurtulurdu. Kürəyinə təpik dəyən təngildəsə də, yıxılmır, vuransa onun çiyninin üstə qalxıb kənara sıçrayırdı. Bu oyuna hər adam girişə bilməzdi...

Ömər koxanın həyətində düz iki gün idi toy vurulurdu. Axşamlar ismar olurdu, gündüzlər cıdır – dirə-döymə. Ömər koxa düz iki gün idi ki, bunlara tamaşa edirdi. Hər yerdə də gözləri ilə nəvəsi Ələddini axtarırdı. Onu cıdıra çıxanlar, dirə-döymə oynayanlar arasında görməyəndə korun-korun qovşurulurdu. Nə qədər çalışsa da, nakam balasını unuda bilmirdi.

Dərəyə enəndə atı saxladı. Ayağını üzəngiyə qoyub yəhərə qalxmaq istədi və ömründə ilk dəfə bədəni ağırlıq elədi. Ata minə bilmədi. Kişini elə bil ildırım vurdu. Başını atın böyrünə söykədi. At oxrandı, sonra qanrılıb dodaqlarını kişinin boynunda, sifətində gəzdirdi. Elə bil atın bu hərəkətindən kişi ürəkləndi. Başını qaldırıb ayağını üzəngiyə qoydu və cavanlıq illərində olduğu kimi sıçrayıb yəhərə qalxdı. Sahibini belində hiss edən kəhər kişnədi və cığırla birbaş sahilə endi.

Kür coşmuşdu. Bu tərəfdə yarğanla siləlenmişdi, o biri tərəfdə isə meşəni ağzına almışdı. Ömər koxa sahilə çatanda özünü suya atmaq istəyən atın cilovunu dartdı və boynunu qanırıb yarğanın qaşı boyu ağaran cığıra saldı.

"Eh, gidi dünya, – deyə düşünməyə başladı. – Deyəsən köçümü sürürəm. Sümüklərim ağırlaşıb. Gör işin nə yeridi ki, atın belinə qalxa bilmirəm. Atın yalından yapışıb Kürü bir nəfəsə o üzə keçən Ömər koxa indi ayağını üzəngiyə güclə qoyur. Hanı at oynatdığım qarda, boranda?"

Gəmi qayanın dikdirinə çıxanda atın cilovunu dartdı. Gözünü o taya – Qarayazıya zillədi. Meşə qalınlaşmışdı. İri qovaqlar baş-başa verib elə bil sahil boyu çəpər çəkmişdilər. Kür qol-budağa ayrılmışdı. Bu qolların bəziləri adaya çevrilmiş kiçik cələlərin başına dolanır, bəziləri burula-burula cələlərin üstündən aşır, bəziləri şütüyüb meşəyə axır, bəziləri də yarğanlara çırpılırdı. Ömər koxa xeyli uzaqlara, Qarayazının o tayında bozaran Ceyran çölün boz dağlarına, üfüqdə göyün üzünə səpələnmiş topa-topa ağ buludlara baxdı. Sonra nəzərlərini hərləyib Kürün üstünə yeriyən və sahildə sularla əlbəyaxa olan meşəyə baxdı. Kür yatağını xeyli dəyişmişdi. İndi Kürün vadisinə çevrilmiş yerlərdə çəmənlik vardı. Həmin yerlərdə mal-qara otlayar, at kişnəyər, buğa heykirərdi. Səhər tezdən, ya da axşamüstü marallar meşədən

çıxıb sürü ilə Kürə, su içməyə gələrdilər. Nədənsə onların ayağı kəsilmişdi. Ömər koxa çoxdandı onları görmürdü. Gecələr də oturub ətrafı dinşəmişdi. Nə maral buğası heykirirdi, nə də düyələr mələşirdi. Amma çaqqal-tülkü vaqqıltısından qulaq tutulurdu. Meşədəki cələdən azıb-tazıb gələn bu murdarlar az qalırdı kəndin içinə dolsunlar. Kişinin xəyalından çox şeylər gəlib keçdi. Qarayazıdakı binələr, yaylağa qalxan üstü düyəli kənd arabaları, mal-qoyun sürüsü, ilxılar, at çapan, tüfəng atan neçə igidi yadına saldı. Qarayazıda binədə olan kənd camaatı yaylağa qalxmazdan əvvəl Gəmi qaya ilə üzbəüz meşədə dayanardılar. Burada gəmi işləyərdi. Ömər koxa yadına saldı ki, həmin gəmi iri, nəhəng qovaq ağacından düzəldilmişdi. Düzəldilmişdi deyəndə, ağacı havaxtsa, kimsə kəsmiş, onun içini təknə kimi ovmuş, burun tərəfini naziltmiş, arxa tərəfini isə enli eləmişdi. Bu gəmi böyük və tutumlu idi. Onun içinə iki-üç araba sürür, qoyun-quzu doldururdular. Gəmini on-on beş adam dartıb çay yuxarı aparır, orada girmədə gəmiçi uzun çəplə gəmini arxadan itələyirdi. Gəmi nə qədər ağır olsa da, şütüyüb suyun ortasına gəlirdi. Ömər koxa o günləri yada saldı. Özü gəmiyə oturub atın yalından yapışdığını və atını gəminin böyrü ilə qarşı sahilə çıxardığını xatırladı. Köksünü ötürdü. İllər Kürün suları kimi çoxdan axıb getmişdi, lap çoxdan.

O tayda Kürün qolu torpağı yarıb özünə yol açmışdı. İri, qollu-budaqlı, uca bir qovaq ağacı təklənmişdi. Sular onun ətrafında burulur, ayaq tərəfdən qovağı yalayırdı. Ömər koxanın gözü bunu aldı. Sular ilan kimi qıvrılır, ağacın ətrafında burulur və ağacın kökü işləmiş torpağı yuyurdu. Qovaq bu həmlələrdən vahimələnmiş kimi titrəsə də, əyilmirdi. Elə bil boz-bulanıq sular bundan qəzəblənib ağacın kökünü qurd kimi eşirdi. Ağac titrədi, silkələndi və birdən yerindən oynamış dağ kimi nərilti ilə suya sərildi. Ömər koxa diksindi, at da ayağı ilə yeri eşib kişnədi. Sular qovağı bürüb-büküb qabağına aldı, fırlada-fırlada ortaya, Kürün dərin yerinə gətirdi. Ömər koxa atın başını qanırdı və gəldiyi yolla geri qayıtdı. Heç yerə dönmədi, heç yerə qanrılmadı. Birbaş evlərinə gəldi. Atı tövləyə bağladı, yəhərini aldı.

Axşam sərini düşmüşdü. Cavanlar xırmanı dövrələmişdilər. Zurnaçılar indi də oyun havası çalırdılar. Oynayanlar qoşalaşmışdılar. Ömər koxa ayaq saxladı. Bir xeyli qol qaldırıb süzən kəlağayılı qızlara, çərkəzi paltarlı oğlanlara baxdı. Tez-tez şabaş verirdilər. Dəfçinin alnına pul yapışdırıb qulağına nəsə deyirdilər. Dəfçi isə cuşa gəlib çomağı

dəfə daha bərk vurub ucadan qışqırırdı: “Yaşasın oynayan qardaşıynan”, “Oynayanın nişanlısı sağ olsun”.

Ömər koxa gülümsündü və nəzərə çarpmadan eyvana qalxıb otağına keçdi. Gəlini çağırdı.

– A bala, tez elə, taxtın üstündə mənim yerimi sal.

Gəlin sürüşmüş yaşmağını yuxarı qaldırdı və təəccüblə qayınatasına baxdı. Gözləri kişinin gözlərinə sataşanda yenə səssizcə bayıra çıxdı. Yenicə yuyulmuş dümağ tuman-köynəklə geri qayıtdı. Ömər koxa gözaltı paltara baxdı.

– Aftafa-ləyən, isti su, bir də qayçı gətir.

Gəlin bu dəfə də heç nə demədi. Bayıra çıxmağı ilə geri qayıtmağı bir oldu. Elə bil hər şey əvvəlcədən hazır imiş.

Ləyəni ılıq su ilə doldurdu. Kişinin ayaqlarını soyundurdu. Suya salıb sabunladı. Barmaqlarını, topuğunu ovxaladı. Dizinə qədər tər-təmiz yudu. Sonra qayçını götürüb qayınatasının dırnaqlarını tutdu. Quruladı. Kişinin fikrindən keçənləri başa düşüb, sarı, iri lüləli aftafanı götürdü. Ömər koxa aşağı əyildi. Dəstəmaz alırmış kimi qollarını dirsəyə qədər yudu. Gəlin su tökdü. Boynunu, üzünü, qırxıq başını da tər-təmiz yudu. Dəsmalla quruladı.

– Günün ağ olsun, qızım. İndi get paltarımı dəyişim.

Gəlin aftafa-ləyəni götürüb otaqdan çıxdı. Geri qayıdanda gördü ki, qayınatası yorğan-döşəkdə uzanıb.

– İndi get, Şamili yanıma çağır. Amma elə elə ki, heç kəs duyuq düşməsin.

Gəlin yenə aşağı sürüşmüş yaşmağını yuxarı çəkdi. Amma bu dəfə otaqdan çıxmazdan əvvəl qayınatasının üzünə baxdı. Gördü ki, kişi pəncərədən bayıra, çalıb-oynayanlara baxır.

Şamil içəri girəndə mat qaldı. Kişi dümağ köynəkdə, təmiz yorğan-döşəkdə uzanmışdı. Sinəsinə yayılmış uzun, ağ, pilə kimi saqqalı köynəyindən seçilmirdi. Şamil atasının ömründə günün bu vaxtı yorğan-döşəyə girməsini görməmişdi. Dinmədi. Gözlədi ki, atası gözlərini pəncərədən çəksin.

Ömər koxa yavaş-yavaş yönünü oğluna tərəf çevirdi.

– Gəldinmi, bala, yaxın otur.

Şamil yorğanın ucunu qaldırıb kişinin böyründə oturmaq istədi.

– Yox, bala, elə otur ki, gözüm səni görsün.

Şamil yerini dəyişdi və atası ilə üzbəüz oturdu.

Ömər koxa xeyli dinmədi. Gözünü tavanda, divarlarda gəzdirdi. Sonra oğlunun üzünə baxdı. Şamil ömründə ilk dəfə onun gözündə yaş gördü. Təntidi. Kişi oğlunun kövrəldiyini başa düşdü.

– Toxtaq ol, bala, mən dövranımı çoxdan sürmüşəm. Tay-tuşlar da çoxdan haqq dünyadadılar. Tək qalmışam. Əslinə baxsan, mən bu dünyada ləngimişəm.

– Tək niyə olursan, ata!

– Mən nə dediyimi bilirəm, oğul, köçümü sürmək vaxtı yetişib.

– Bu nə sözdü, maşallah sənə nə olub?

– Sözümü kəsmə. Bilirəm. Yuxumu da görmüşəm. Mən bir azdan, şər qarışanda haqq dünyasına qarışacam. Sənə iki vəsiyyətim var. Biri odur ki, mən öləndən sonra çalış, araya qan düşməsin. Onsuz da dünya qana çalxalanır. Belə getsə, deyəsən, adamları bir-birinin üstünə qaldırıb üz-göz edəcəklər. Araya qırğın salacaqlar. Divan-dərəyə lotu-potular yığılıb, bala, ehtiyatlı olun. Bir-birinizdən göz-qulaq olun.

– Kişi nəfəsini dərdi. – İkinci vəsiyyətim də, odur ki, toyu yarımçıq qoymayın. Ta gəlin evə gələnədək heç kəs bunu bilməməlidi. Dost var, düşmən var. Elə elə ki, mənim ölümümə nə sevinən olsun, nə ağlayan.

– Ata!

Ömər koxa əlini yavaşca yuxarı qaldırıb oğlunun sözünü kəsdi.

– Di get, uşaqları bir-bir çağır halallaşım. Vaxtıma az qalıb. Amma elə elə ki, heç kəs heç nə başa düşməsin.

Bir azdan kişinin yatdığı otağın qapısı açılıb-örtüldü. Ömər koxanın övladları, gəlinləri, nəvə-nəticələri babalarının yanına gəldilər ki, onun əlini öpsünlər. Qoca isə körpələrin başını tumarladı. Hamı gedəndən sonra Şamilə qapını bağlatdı:

– Qaranlıq qarışmamışdan gedin, gəlini gətirin. Oğul, indi də zəhmət olmasa, yönümü qibləyə çevir.

Doğrudan da qaranlıq qarışanda Ömər koxa oğlu Şamilin gözü qabağında elə bil yuxuya getdi. Şamil yorğan-döşəkdə yatan bu pilə saqqallı, bəyaz sifətli kişinin atasımı, yoxsa müqəddəs bir məxluqmu olduğunu xeyli müddət ayırd edə bilmədi.

Bayırda, xırmanda isə lopaları yandırmışdılar. Bu lopaların işıqları pəncərə şüşələrindən süzülərək rahat yuxuya gedən nurani qocanın sifətində, saqqalında oynayırdı.

Zurna zilə çəkmişdi. Kənd gözəlləri, kənd cavanları qoşa-qoşa oynayırdılar. Dəfçinin səsi gəldi: “Sağ olsun oynayanlar nişanlılarıynan!”.

## 4

Qarateli sakitcə, səs-səmir salmadan, qaş-qabaqları turşumuş halda, burunlarını astaca çəkə-çəkə, kəlağayılarının ucu ilə gözlərini silə-silə gəlin otağına gətirdilər. Gərdəyin yanında oturtdular. Qız xeyli başını qaldırmadan, heç nə düşünmədən eləcə oturdu. İçəri alaqaranlıq idi. Otuzluq lampanın piltəsini aşağı çəkmişdilər. Bayırda da səs-səmir kəsilmişdi. Bircə otaqların qapısı astadan örtülüb-açılır, ev adamları ora-bura qaçışırdılar.

Bunların heç biri Qarateli maraqlandırmırdı. Onun fikri uzaqlarda, Kür sahilində, Ələddinlə ilk görüşündə idi. Qız hər şeyi: hara gətirildiyini, qapını açıb kimin içəri girəcəyini belə unutmuşdu. Elə bil yuxuda idi. Heç nə onu maraqlandırmırdı. Birdən əli gərdəyə toxundu. İpək və atlasdan düzəldilmiş gərdəyin örtükləri xışıldadı... Qız diksindi, əvvəlcə ayağa durub qapıya doğru qaçmaq istədi. Sonra gərdəyin dalında heç kəsin olmadığını yəqin edib, qorxa-qorxa astaca addımlarla geri qayıtdı. Təfərrinclə ipək qumaş pərdələrin əhatə etdiyi təmiz yorğan-döşəyə, qızların üz ağlığını bilmək və qapıda pusquda dayanan yengəyə, səhəri isə qonum-qonşulara göstərmək üçün döşək üstdə salınan ağ mələfəyə baxdı. Ona elə gəldi ki, gərdək çoxdan hazırlanmışdı, lap çoxdan. Bu gərdək Ələddinin gərdəyi idi. Ələddin Qarateli bu gərdəyin arxasında görməli idi. Qız havalanan kimi oldu. Gərdəyə yaxınlaşıb ipək, qumaş pərdələri, təmiz yorğan-döşəyi, qu tükündən düzəldilmiş iri yastığı qucaqlayıb öpməyə başladı. Elə bil Ələddinin qoxusunu bunlardan almaq istədi. O özünü unutmuşdu. Gah hıçqırıb ağlayır, gah da məst olmuş kimi gülümsünürdü. “Məni niyə tək qoyub getdin, dərdin alım. Sənə kim qıydı, sənə kim əl qaldırdı, a gözlərinə qurban olum. Sən ki heç kəsə bir pislik eləməmişdin, bir adamın itinə, toyuğuna daş atmamışdın. Yenicə muraz üstündə idin. Dilim də gəlmir ki, səni vurana qarğış eləyim. Tanrı özü bilən yaxşıdı. Ey yeri-göyü yaradan, qurtar mənim bu nakam qəlbimi bəladan”.

Qız yenidən hıçqırdı və ona elə gəldi ki, onun dərdinə şərik olanlar səsinə səs verib ağlaşma qurublar. Astadan dil deyib hönkürüşürdülər. Qız şəkləndi. Gərdəyin dalından çıxıb qonşu otağı dinşədi. Doğrudan da ağlaşırdılar. “Bu nə idi? Toyla yas bir-birinəmi qarışmışdı?”. Qız qulaq kəsildi. Arada uşaqların “Baba, Ömər baba” deyib hönkürtülərini eşitdi. Başa düşdü ki, açıb ağartmasalar da, evdə yas var. Ölən – evin kötüyü, elin-günün ağsaqqalı o nurani kişi idi.

Qaratel xəyallardan, şirin arzulardan ayılan kimi oldu. Elə bil onu bürümüş tüstü-dumanı qovurmuş kimi başını silkələdi. Duvağı üzündən götürüb atdı. Bilmədi neyləsin. Bir xeyli beləcə ildırım vurmuş kimi oturdu. "El-oba buna nə deyəcək? Kənd arasında arvadlar, qız-gəlinlər onu görəndə vahimə içində geri çəkilməyəcəklərmi? Sabah-sabah bu uğursuz qara daban hardan qabağımıza çıxdı, deməyəcəklərmi? Həmişə onu Kür qırağına suya çağıran, toy-düyünə aparan qızlar onu görəndə gözdən yayınmağa çalışmayacaqlarmı? Balaca da, böyük də qaçın, qara daban gəlir, deməyəcəklərmi? Bəlkə elə doğrudan da qara dabanam? Toy olmamış nişanlım öldürüldü. Yasın birindən çıxmamış o biri başladı. Mən evə ayaq basan kimi bu kişi rəhmətə getdi. Bu, qara dabanlıq deyil, bəs nədir? Haraya ayaq basıram, bədbəxtlik gətirirəm. Görünür, tanrı özü mənə qarğış eləyib. Yüz min təbib neyləyər bir tanrı qarğımışa?".

Qaratel yavaşca ayağa durdu. Evdəkilərin başının qarışdığını görüb dal qapıdan eyvana çıxdı. Nəzərə çarpmadan hasarın dibinə endi, sinə-sinə darvazaya yaxınlaşdı, açıq qapıdan bayıra çıxdı. Alanın çəpərin yanında şöngüyüb oturduğunu görmədi. Nəfəsi tıxana-tıxana birbaş Kürün sahilinə, hündür yarğana doğru getdi. Ancaq burda ayaq saxlayıb nəfəsini dərdi.

Kür yenə əvvəlki kimi qıjıldayıb axırdı. O taydakı meşə aylı gecədə mürgüləyirdi. Suyun ortasındakı adacıqlar, cələlər elə bil yuxuya getmişdi. Gündüzlər qaynayıb-qarışan haylı-haraylı Kür vadisi elə bil dincəlib nəfəs alırdı. Arabir yarğanların harasındasa özünə məskən salmış bayquşların səsi eşidilirdi.

Qaratel ciyərləri dolusu nəfəs aldı və elə bu vaxt Alanı gördü. İt Qarateldən bir-iki addım aralıda biləklərinin üstünə uzanıb zingildəyirdi. Qaratel aşağı əyilib itin başını sinəsinə sıxdı. Onun gözlərinə baxdı. Heyvanın qonur gözlərindəki məhzunluğu ay işığında aydınca gördü. "Deyəsən təkcə sən məndən qaçmayacaqsan, Alan? Məni son mənzilə də sən yola salacaqsan". İt bu mehriban səsdən riqqətə gəldi. Bir az da irəli sürünüb zingiltisini artırdı.

Qaratel itin gözlərindən öpüb qamətini düzəltdi. Ətrafı dinşədi. Hər şey zümzümə edirdi. Təbiətin bu gözəlliyini Qaratel yalnız bircə anlığına duydu. "Mənə bunları çoxmu gördün, ey yeri-göyü yaradan Tanrı?" – deyib gözlərini yumdu. Alan özünə gələnə qədər qız yoxa çıxdı. İt yarğanın dibində şappıltı eşitdi və özünü Kürə atdı. Bir azdan

yarğanın aşağı tərəfindən Qarateli sürüyüb sahilə çıxartdı. Çınqıl daşların üstünə uzatdı. Dan yeri qızarana qədər qızın başına fırlandı. Başdan-ayağa, ayaqdan-başa dönə-dönə imsilədi, üz-gözünü, saçını, əllərini yaladı. Nəfəsini sinəsinə verdi. Elə bildi ki, bu nəvazişləri ilə qızı ayağa qaldıracaq. Ancaq dan yeri qızaranda ehtiyatla burnunu Qaratelin üzünə yaxınlaşdırdı və diksinib geri atıldı. Qızın bədəni bumbuz idi. Alan ağzını göyə tutub oyanmaqda olan təbiəti elə bil köməyə çağırdı. Meşələrə, cələlərə, yarğanlara, dərələrə, dağlara, axar sulara, çox nakamları qurban aparan Kürə haray saldı. Acı-acı uladı.

## *IV fəsil*

### 1

Qəza mərkəzindəki müəllimlər seminariyasını yenicə bitirən Mürsəli Qaymaqlı kəndinə işləməyə göndərdilər. O, iki gün yol gözlədikdən sonra Tiflisə doğru gedən bir faytonla Şıxlı kəndinə yola düşdü, ordan da bir at tapıb Qaymaqlıya gəldi. Kəndin ortasındakı ikimərtəbəli məktəb binasında ona balaca bir otaq verdilər. Mürsəl yorğan-döşəyini pilləkənin üst tərəfindəki otağın küncünə yığdı, gecələr üstü naxışlı taxta çamadanını başının altına qoyub yatdı. Məktəbin ikicə müəllimi var idi. Biri Qori müəllimlər seminariyasını bitirmişdi. O da ailəsi ilə birlikdə alt mərtəbədə olurdu. Məktəb 20-ci illərin əvvəlində tutulub harayasa aparılmış bəylərdən birinin evində yerləşdirilmişdi. İri otaqları süzüb irəli çıxan geniş, başabaş eyvanı var idi. Kənd ətəyi kiçik təpələrlə örtülü olan iki dağın ortasında yerləşmişdi. Evləri, həyətləri ortadan bölən yeganə yolun bir ucu dərəyə enib aşağıdakı kəndə, o biri ucu isə yuxarıdakı şenliyə gedirdi. Çəpərlərin, həyətlərin, təpəlikdəki məhəllələrin yanından ötən cığırlar kəndin ortasındakı iri yolla birləşirdi. Deyəsən, kəndin torpağı dəmyə idi. Qapılarda bağ-bağça yox idi. Məktəbin eyvanından baxanda evlərin həyətbacası, qapı-pəncərəsi, evə girib çıxan arvad-uşaq aydınca görünürdü.

Mürsəl bir həftə qəribsədi; yaman qəribsədi. Nə uşaqlara alışa bildi, nə də məktəbə. Ancaq sonradan hər şeyə isinişdi. Eyvanın küncündə dayanıb səhər-axşam kəndə tamaşa etdi. Gördü ki, səhər tezdən də, axşam üstü də obanın yuxarı başından zurna səsi gəlir. Zurnaçılar

şövq ilə havadan havaya keçir, gah bəmdə çalır, gah da zilə çəkirdilər. Dəfin sümüyə düşən ahəngdar tappıltısı getdikcə güclənir, evlərin üstünə yayılır, hələ bəlkə qonşu kəndlərə də gedib çıxırdı. Mürsəl elə bildi ki, kənddə toy var, kimisə evləndirirlər. Onun ürəyi atlandı, az qaldı eyvandan düşüb məclisə getsin. Axı o, ömründə kənd toyu görməmişdi. Ancaq sonradan öyrəndi ki, bu dəstə zurnaçı Hümmətin dəstəsidir. Onlar havacat öyrənirdilər. Ertəsi günü kəndin aşağı tərəfindən də toy səsi gəldi. Bu da Dursunun dəstəsi idi. Onlar da yeni oyun havaları öyrənirdilər. Mürsəl başa düşdü ki, kənddə iki dəstə zurnaçı var. Onlar bir-birinin bəhsinə yeni havalar çalır, səhər-axşam kənd cavanlarının, qız-gəlinin ürəyini atlandırırdılar.

Bir gün səhər "uçitel" onu aşağı çağırdı.

– Gəl bir tikə çörək yeyək, – dedi. Mürsəl getmək istəmədi, "toxam" dedi. Uçitel bilirdi ki, Mürsəl ac qalmır. Danışmışdılar, hər səhər ona isti çörək, süd, qaymaq gətirirdilər.

Uçitel onun qolundan yapışıb evə apardı. Süfrə hazır idi. Ağ samovar astadan zümzümə edir, tər-təmiz silinmiş stəkan-nəlbəki parıldayırdı.

Uçitel Mürsəlin ciblərinin düyməsi parıldayan köynəyinə, çiyin qayışına və enli kəmərinə baxdı. Onun üzünə yenicə ülgüc dəymişdi. Telini yana daramışdı. Gözləri həm utancaqlıq, həm də mehribanlıqla dolu idi.

Stəkanlara qənd saldılar. Salma çayla pendir-çörək yeməyə başladılar. Mürsəl neçə gündən bəri ürəyində dolandırdığı və öyrənmək istədiyi məsələlərdən söz açdı.

– Müəllim, heç bilmirəm sizə necə müraciət edim?

– Hamı uçitel deyir, sən də de.

– Bu kəndin nə qəribə adətləri var.

Uçitel çayına ara verib gülümsündü.

– Sən bu kəndin qız-gəlininin suya getməyini görmüsənmi?

– Yox. Onda səhər tezdən xoruzun ilk banı yuxudan dur, eyvana çıx və tamaşa elə. Onda görəcəksən ki, kəndin qarıları, gəlinləri və sənəyi yerdən güclə qaldıra bilən qızları qatarlaşıb yola səpələnir və kəndin kənarındakı dərəyə – İncə çayının sahilinə enirlər. Dərənin dərinliyi yarım verstdən çoxdur. Arvadlar gün doğana qədər 2-3 dəfə bu dərəyə enib evlərinə su gətirirlər. Kənd dəmyədədir. Özündə su yoxdur. Amma məsələ onda deyil. Kəndin arvadları suya getməzdən əvvəl yaxtanlarını, çemodanlarını açıb təzə ipək qumaş paltarlarını ge-

yirlər. Bilərziklərini, sırğalarını taxırlar. Əziz bir şey kimi saxladıqları saç yağı ilə tellərini sığallayıb bururlar. Sonradan ətirlənib kəlağayılarını örtürlər. Sənəyi götürüb bayıra çıxmazdan əvvəl divardan asdıqları balaca güzgünün qabağında bir də fırlanır, bellərindəki gümüş kəmərə bir də baxırlar. Bax, qəribəlik burasındadı. Axı niyə suya gedəndə onlar bu cür bəzənib-düzənirlər? – Kişi sözünə ara verdi. Çayları təzələdi və gözündən gülərək söhbətinə davam elədi. – Hə, Mürsəl müəllim, kəndin bir adəti də var. O da zümzümədir.

– Nə?

– Zümzümə, qımqımı. Bu kəndə zümzüməli, qımqımılı kənd deyirlər. Kəndə təzə bir adam gələn kimi ona şer qoşurlar. Ertəsi günü bütün gəlinlər-qızlar bu şeri dodaqaltı qımqımı kimi oxuyur və kəndə bir zümzümə yayılır. Elə bil yaz fəsli meşədə böcəklər vızıldaşır, arabir də bülbül şaqqanaq çəkir. Qəribə-qəribə sözlər tapırlar. Məsələn, "Boy-boy, arvadın ölsün, səni dul qalasan, ay gədə, ay gədə".

Hələ sənə şer qoşmayıblar?! Qoşmamış olmazlar. Amma özünü gözlə. Allah göstərməsin, dilə-dişə düşsən, axırı yaxşı olmaz. – Söhbəti zarafatla başlayan Uçitel ciddiyyətlə qurtardı. – Bu kəndin qızgəlinləri deyib-gülən, adama sataşandılar. Kişiləri isə yaman əzazildi.

Ertəsi gün Mürsəl xoruzun ilk banı pencəyini çiyninə salıb eyvana çıxdı və gördü ki, cığırlardan, əyri-üyrü dar yollardan qatarlaşıb gələn qız-gəlin mərkəzi yolda birləşib Uçitelin dediyi dərə ilə çaya enirlər. Onların pıçıltısı və qəhqəhəsi kəndə yayılır. Mürsəl elə bil sehrli bir aləmə düşmüşdü.

## 2

Bir gün Mürsəl məktəbin xəritə, qlobus və köhnə kitablar yığılmış basırıq otağından bir qrammofon tapdı. Görünür, ev sahibi Ömər koxanın imiş. Onu götürüb tozunu sildi, trubasını təmizlədi. İki də köhnə, lap köhnə, çalınmaqdan üzləri cızıq-cızıq olmuş val tapdı. Tələsik qrammofonun dəstəyini hərlədi, iynəni keçirib oxutmağa başladı. Cabbar Qaryağdı oğlunun, Keçəçi oğlu İslamın səsi otağı bürüdü. Mürsəl sevincindən bilmirdi neyləsin. O balaca bir qabaq stolu tapıb eyvanın küncünə qoydu. Qrammofonu stolun üstündə rahatladı. Səs borusunun ağzını yola tərəf çevirdi. Suya gedən və zümzümə edən

qız-gəlinlərin gurlaşdığı vaxt dəstəyi fırlayıb qrammofonu oxutdu. Yoldakılar bir anlığına dayanıb, məktəbin eyvanına tərəf boylandılar, qrammofona qulaq asdılar və dirəyə söykənib onlara tamaşa edən Mürsələ baxdılar. Sonra şaqqanaq çəkib, gülə-gülə yollarına davam etdilər. Ertəsi günü bütün kənd zümzüməyə qərq oldu. Mürsəlin adı qızların qımqımısına düşdü. O gündən kəndin bir nəğməsi də artdı. Səhər-axşam zurnaçılar qoşalaşdılar, gündüzlər qız-gəlin zümzümə etdi, qrammofon da məktəbin eyvanında oxudu. Mürsəl qız-gəlinləri qrammofonla suya yola salıb qarşılayır, dərsə gələn uşaqları isə elə bil bu mahnılarla salamlayırdı. O artıq hər şeyə öyrənmiş, kəndin adətlərinə qaynayıb qarışmış və özü də zümzümə edən kənd böcəklərinin birinə çevrilmişdi.

Uçitel bunlara göz qoyurdu. Mürsəlin uşaqlarla mehribanlığından, gözəl dərs deməyindən xoşu gəlirdi. İnanırdı ki, ondan yaxşı müəllim olacaq. Bir gün Mürsəl onun yanına gəldi:

– Gəlsənə xeyirxah bir iş görək?! Deyəsən, bu kəndin camaatı heç ömürlərində teatr görməyiblər, onlara bir tamaşa hazırlayaq.

Uçitel azacıq fikrə getdi. Sonra gözlərini ondan cavab gözləyən Mürsəlin üzünə zillədi.

– Fikrin çox gözəldi, amma iki adamla nə tamaşa göstərmək olar?

– Onu da fikirləşmişəm. Qonşu kəndlərin müəllimlərini də yığarıq. Cümə günləri bir yerdə məşq edərik.

Uçitelin ürəyi atlandı. Qori müəllimlər seminariyasını qurtardıqdan sonra ucqar bir dağ kəndinə göndərildiyini xatırladı. Onda cavan idi, lap cavan. Hələ evlənməmişdi. O da Mürsəl kimi bir yerdə otura bilmir, kənddə indiyə qədər heç kəsin ağlına gəlməyən yeni işlər görmək istəyirdi. Gah uşaqlara şərqi öyrədir, divarlarını his basmış ikiotaqlı məktəb binasının küncündə tələbələrinə nağıllar danışırdı. Uçitel o zaman kənd camaatına tamaşa göstərməyi çox arzulamışdı. Amma tək əldən səs çıxmamışdı. Bir də kəndin ağsaqqalları ona göz ağartısı vermişdilər ki, "Camaatla işin yoxdur. Müəllim babasan, get öz işinlə məşğul ol. Allahına da şükür elə ki, uşaqlarını məktəbə göndərən var". Əslində məktəbin bir elə məktəbliyi də yox idi. Mart ayı gələn kimi kənd binəyə köçür, ordan da yaylağa qalxırdı. Uşaqlar da ata-anaları ilə gedirdi. Aprel ayından məktəb bağlanır, bir də soyuqlar düşəndə beş-on uşaq dərsə gəlirdi. İndi Uçitel Mürsəlin timsalında öz gəncliyini gördü, cavanlığını xatırladı və ötən illərə qayıtdı. Qəlbində

yatmış olan duyğular birdən-birə oyandı, Mürsəli sinəsinə basıb bərk-bərk qucaqladı.

– Günü sabahdan işə başlayaq. Qonşu kəndin müəllimlərini çağırıb razı salmaq mənim boynuma. Onlardan narahat olma. Sözümü yerə salmazlar. Çoxuna dərs demişəm, mənim tələbələrimdir. Hansı əsəri hazırlayaq?

– "Hacı Qənbəri".

Razılaşdılar. Düz iki ay məşq etdilər. Nəhayət, tamaşanı göstərməyin vaxtı çatdı. Məktəbin böyründəki Ömər koxadan qalma samanlığı tər-təmiz süpürdülər. Mürsəlin göstərişi ilə uşaqlar evlərindən kilim gətirdilər. Dirəklərə ip bağlayıb pərdə kimi asdılar. Qoyun yunundan özlərinə saqqal düzəltdilər. Teatrda iştirak edəcək cavanlara hisdən bığ çəkdilər. Paltarlarını dəyişdirdilər. Elə etdilər ki, heç kəs onları tanımadı. Mürsəl Hacı Qənbəri oynayırdı. Qoyun yunundan düzəldilmiş uzun ağ saqqalı var idi. Çuxa arxalıq geyinmişdi. Hər şey hazır olduqdan və samanlıq kənd camaatı ilə dolduqdan sonra Mürsəl "səhnə arxasına" keçdi və gözlərinə inanmadı. Gördü ki, kəndin hörmətli adamları: şura sədri, firqə özək katibi və bir-iki ağsaqqal pərdənin arxasında "səhnə"də stul qoyub əyləşiblər. Mürsəl təəccüb və maraqla soruşdu:

– Burda niyə oturmusunuz?

– Biz həmişə yuxarı başda otururuq, müəllim.

Mürsəl cavab verməmişdən əvvəl azacıq fikirləşdi və çıxış yolu tapmış kimi sevindi.

– Burda sizə rahatlıq verməyəcəyik. O yana-bu yana qaçdıqca toz-torpaq havaya qalxacaq. Bu saat uşaqlara deyərəm stullarınızı kilimin o üzünə keçirər, yenə yuxarı başda qabaqda əyləşərsiniz.

Azacıq tərəddüddən sonra razılaşdılar. Tamaşa başladı. Hadisələrin o yeri gəldi ki, Hacı Qənbərin evində qonaqlıqdı, dəryada baraması batmış və başına hava gəlmiş Hacını sakitləşdirmək üçün Əşrəf məclis düzəltmişdi. Bu məclisdə aşıq da çalıb oxumalı idi. Tələbələrdən birinə güc-bəla ilə sazda bir-iki hava çalmağı öyrətmişdilər.

Həmin tələbə səhnədə sazını köynəkdən çıxardıb simləri cingildətdi və nəsə yalan-yanlış bir hava çaldı. Elə bu vaxt camaatın içindən bir səs gəldi: "Anasının balası, elə çalıb oxumazlar". Bu sözləri deyən uca boylu, buxara papaqlı, bənövşəyi şivyotdan köynək və qəlifə şalvar geymiş uzunboğaz çəkməli cavan bir oğlan idi. Onun belində sallamalı gümüş kəmər və çiynində saz var idi. Mürsəl gördü ki, o birbaş

səhnəyə gəlir. Doğrudan da o, səhnəyə gəldi, dərhal da sazı sinəsinə basdı. Yanıqlı-yanıqlı "Yanıq Kərəm" havasını çaldı. Sonra da zil səslə oxumağa başladı. İçəridəkilər cınqırlarını çəkmədən lal sükutla kişiyə qulaq asdılar. Bunu hiss edən aşıq havanı-havaya calayaraq, ara vermədən sazı da, səsini də zilə çəkdi. Hava isti idi. Səhnədəkiləri tər yuyub aparırdı. Mürsəl suyun içində idi. O bir az səbr elədi və gördü ki, aşıq oxuyub qurtarana oxşamır. Camaat da heyranlıqla ona qulaq asırdı; elə bilirdilər ki, tamaşa elə budur. Vaxt isə keçirdi. Birdən Mürsəlin ağlına bir fikir gəldi: nökəri Cəbini yanına çağırdı. Onun qulağına nə isə pıçıldayıb ayağa durdu. Əlindəki çəliklə Cəbini budarladı.

– Mənim gəmim dəryada qərq olub, baramalarım batıb, siz isə burda kef məclisi düzəldibsiniz, köpək uşağı!

Cəbi isə qışqırmağa başladı:

– Ay camaat, Hacının yenə dəliliyi tutdu, qaçın! – Özünü aşığın üstünə salıb səhnədən camaatın içinə itələdi. Hacının çəliyinin biri-kisi də ona dəydi. Camaat gülüb özünə gələnədək tamaşanı davam etdirdilər.

Ertəsi gün kənd zümzümə içində axşamkı tamaşadan danışır, məktəbin yanından keçənlər ayaq saxlayıb gözaltı Mürsəl müəllimə baxır və bəziləri də yaxınlaşıb soruşurdular:

– A müəllim, bizə yenə teatr göstərəcəksizmi?

– Göstərəcəyik. İndi də sizə "Arşın mal alanı" hazırlayırıq.

– Məni yenə çəliklə döyəcəksənmi?

Bunu deyən aşıq idi. Mürsəl geri dönüb onu qucaqladı.

– Biz istidən ölürdük, sənsə havanı havaya calayıb oxuyurdun. Bə səni səhnədən necə uzaqlaşdırmalı idim.

### 3

Kənddə savadsızlığın ləğvinə başlamışdılar. Qəza maarif şöbəsindən təliqə gəlmişdi: gecə kursları açmaq və savadsız kənd camaatını oraya toplayıb, yazı-pozu öyrətmək. Təliqəni aldıqdan sonra Uçitellə Mürsəl xeyli məsləhətləşdilər.

– Kişiləri kurslara gətirmək və onlara yazı-pozu öyrətmək asandır. Ancaq qadınların məktəbə gəlməsi müşkül işdir, – deyə Uçitel dilləndi. – Hökumətin bu qərarı lap vaxtında verilib: "Ölkədə bir nəfər də

olsun, savadsız qalmamalıdır". Yaxşıdır, amma görək bunu necə həyata keçirəcəyik. Gərək kənd ağsaqqalları ilə, hökumət nümayəndələri ilə məsləhətləşib bir yol tapaq.

Mürsəl zehnində nə isə axtarırmış kimi fikrə getdi və onun yanına oxumağa məktub gətirənləri xatırladı. Dustağı, qəriblikdə qohumları, əsgərliyə gedənləri olanlar aldıqları məktubları əziz bir şey kimi qoyunlarında gizlədir və utana-utana Mürsəlin yanına gəlirdilər.

– A, müəllim, üzüm də səndən qara, bizim uşaq dustaqlıqdan kağız yollayıb. Bir oxuyun görək nə yazıb?

Mürsəl ata hənirtisi ilə isinmiş məktubu alıb o üz-bu üzünə baxır, sonra zərfi açır və hiss edirdi ki, dustaq qalada bu məktubu kiməsə yazdırmışdı. Gələn məktubların hamısı eyni sözlərlə başlayırdı: "Əvvəla qəlbimin ən dərin guşəsində bəslədiyim salamları səba nəsiminə qataraq sizlərə göndərirəm". Lap axırda isə məktub yazan öz təşəkkürünü bu sözlərlə bitirirdi: "Sağ olsun bu kağızı oxuyan və qulaq asanlar". Mürsəl başa düşürdü ki, kənddə savadlı adam yoxdu, kimisə axtarıb tapmalı və ona oxutdurmalı idilər. Arvad-uşağın maraqdan bağrı çatlayır, orada yazılanları bilmək istəyirdilər. Amma abır-həyalarına qısılaraq kişiləri məktubla bərabər məktəbə, müəllimlərin yanına göndərirdilər. Evdə oxuyan uşaqları olsa da, onlara inanmırdılar.

Məktub yazan da, məktub alan da bunları yaxşı bilirdi. Ona görə də mütləq yazının sonunda "Sağ olsun bu məktubu oxuyan" sözlərini qeyd edirdilər. Mürsəl xeyli fikirdən sonra, – "Uçitel, – dedi – olmazmı, uşaqlara tapşıraq analarının, bacılarının, bibi və xalalarının əlindən tutub məktəbə gətirsinlər".

– Ağıllı fikirdi.

Bu cür təliqədən kənd şura sədrinə və firqə özək katibinə də göndərmişdilər.

Məktəbdə gecə kursları açıldı. Kişilərə Mürsəl, arvadlara isə Uçitel dərs deməyə başladı. Onlara dəftər, qələm payladılar, düz bir həftə qələmi necə tutmağı öyrətdilər, sonra isə hərflərə keçdilər.

Uçitelin sinfində Zöhrə adlı bir gəlin də var idi. O hər axşam, məktəbə gəlməzdən əvvəl, ipək paltar geyinər, təzə ayaqqabısını çıxardar, qoşa hörüklərini kürəyinə atar, yanaqlarında qıvrılan saçını burub, yaşıl yelənli ağ kəlağayısını örtərdi. Sonra qara məxmərin üstünə tikilmiş üç qatar qızıl butalarını başına bağlardı. Kəlağayını gözünün üstünə endirər və elə edərdi ki, qızıllar görünməsin. Gəlin elə bil təzə eşqə düşmüşdü.

Sığallanmaqdan doymurdu. Onun özü sinfə girməzdən əvvəl ətrinin qoxusu otağa dolardı.

Mürsəl qonşu otaqda hisli çırağın solğun işığında kişilərə dərs keçirdi. O, tez-tez dayanır, aşağıya əyilir, kobudlaşmış barmaqların güclə tutduğu qələmi düzəldir və göstəriş verirdi. Zöhrə o, aşağı əyildikdə göz altından oğrunca ona baxırdı. Sonra pul kimi qızarıb başını dəftərin üstünə əyirdi. Gəlinin bu hərəkətləri Uçitelin gözündən qaçmamışdı.

Məşğələ qurtardıqdan sonra hamı ayağa durur, qaranlıq gecələrdə əllərinə götürdükləri şaxtaçı çırağına bənzər lampaları işıldada-işıldada kənd yollarına səpələnirdilər. Elə bil iri, titrəşən yarpız böcəkləri doqqazlara, həyətlərə doluşurdu. Qəribə idi..., başqa vaxtlar zəncirdən açılmış kənd itləri doqqazda bir qaraltı görən kimi atılıb hücuma keçir, az qalırdı qabaqdakını süpürləyib basmarlasınlar. Amma yanan çıraqları görən kimi qaçıb çəpərin böyrünə qısılır və qorxudan zingildəyirdilər. Mürsəl isə adəti üzrə gediş-gəliş kəsilib kənd tamam sakitləşənə qədər eyvanda qrammofon oxutdurardı.

Beş-on gündən sonra kəndi yeni bir zümzümə bürüdü. Həyətbacalarda, çay qırağında, doqqazlarda qımqımı üstündə yeni mahnı oxumağa başladılar. Bu zümzümə və qımqımılarda tez-tez Zöhrənin, Mürsəlin adı çəkilirdi. Zöhrə bu işlərin nə ilə qurtaracağını bəlkə də əvvəlcədən hiss edirdi, amma qəlbində cücərən və yaz bənövşəsi kimi boynu bükük olan hissin qarşısını ala bilmirdi. Sümüyü çaxnaşsa da, özünü bilməməzliyə qoyurdu. Mürsəlin isə heç nədən xəbəri yox idi.

Uçitel də yaman təşvişdə idi. Aylar, günlər dolaşdı. Gecə kursları qurtardı, arvadlar, kişilər hıqqana-hıqqana yazıb oxumağa başladılar.

## 4

Məktəbin həyətində bir dəstə atlı dayandı. Qabaqdakı kəhərin belində əyləşən kişi cilovu çəkdi, sonra qamçısını çərkəzi yəhərin üstündən aşırıb yanpörtü oturdu. Onun uzunboğaz çəkməsi azca palçığa bulaşmışdı. Əynində qalife şalvar və yarımkürk var idi. Geyimindən hərbi adama oxşayırdı. O, əlini cibinə salıb qızıl papiros qutusunu çıxartdı, qapağını açıb iri cığala kağızı götürdü. Saçaqlı sarı tütündən arasına doldurub papiros bükdü. Zoğal müştüyünə taxıb yandırdı. Tüstü-duman içində gözlərini qıyıb məktəbin ikinci mərtəbəsinə baxdı.

Mürsəl eyvanda dayanmışdı. O elə bil həyətdəkiləri görmürdü. Kəndin üstündəki təpəliklərə, göy üzündə laylanmış ağ buludlara və üfüqlərin sonsuz ənginliklərinə baxırdı. Yəhərdə qılçasını qılçasının üstünə aşırıb papiros çəkən kişi xeyli onun boy-buxununa tamaşa etdi. Oğlan şıvırtı kimi nazik, ucaboylu idi. Yenicə qoyduğu və qalınlaşan bığı sifətinə yaraşırdı.

O, papirosunu son dəfə sümürüb kötüyü müştükdən çıxardı və üzünü Mürsələ tutdu.

– A bala, a müəllim, zəhmət olmasa bir aşağı düş, – dedi.

Mürsəl təəccüblənsə də, pilləkənləri endi. Atlı sıçrayıb yəhərdən düşdü. Dəstədən aralandılar.

– Oğul, səndən xoşum gəldi, yaxşı adama oxşayırsan. Ona görə də sənə qıymıram. Sən bizim kəndin xasiyyətini yaxşı bilmirsən. Çox sözlü-gaplı kənddi. Əllərindən nə xəta desən, çıxa bilər. Özünü bir az ağıllı apar.

– Mən nə eləyirəm ki?

– Sözümü kəsmə!

Elə bil kişini birdən-birə dəyişdilər. Quyruğunun üstünə qalxıb fısıldayan ilana döndü.

– Qanacağın olsun, böyük danışanda kiçik qulaq asar. Hələ bu kənddə mənə cavab qaytaran olmayıb. Yadında saxla. Mənə Çapıq Əmrah deyərlər.

– Buyurun, sözünüzü deyin, qulaq asıram.

– Əvvəla, bu gündən o qrammofonu oxutma. Hardan almısan, qoy yerinə!

– Burda nə var ki, musiqidi, qulaq asırıq.

– Dedim ki, sözümü kəsmə! – Kişinin əli belindəki xəncərin dəstəyinə uzandı. – Sən bizi nə hesab edirsən? Hər səhər eyvanda qrammofon oxutdurub suya gedən qız-gəlinə sataşırsan, biz də durub baxacayıq? Yoxsa uşağın biri bizi xoşqeyrət hesab edir? Ağır otur, batman gəl. Yoxsa iri tikəni qulağın boyda eləyərlər. Kənddəki zümzümələri eşitməmisən?

– Mən nə eləyim, mənim nə günahım var? Sizin kəndin adamları sazlı-sözlü camaatdı.

– Çalış adın o saza-sözə düşməsin, bildinmi? Bir də teatr-zad çıxartmaqdan əl çək. Bax, bu mənim axırıncı sözlərimdi. Eşitməsən, öz bəxtindən küs.

Uçitel atlıları görüb həyətə çıxdı. Salam verdi. Və ehtiyatla soruşdu:

– Xeyirdimi, a Əmrah? Nə əcəb sizdən?

Əmrah dabanı üstdə fırlanıb Uçitelə köntöy cavab verdi:

– Bu müəllim uşaqdır, ağlı bir şey kəsmir. Bəs sənə nə olub? Mən sözümü dedim. İndi ona de ki, ağlını başına yığsın.

O, quş kimi sıçrayıb atın belinə qalxdı. Dəstə bir göz qırpımında məktəbdən uzaqlaşdı.

Uçitel gecə kurslarından və kəndə yayılan zümzümələrdən sonra səksəkəli idi. O, belə bir hadisənin olacağından qorxurdu. Mürsəlin xəbəri olmadan onu gözdən qoymur, duruşuna, oturuşuna fikir verirdi. Hətta bir-iki dəfə qəsdlənmişdi ki, onunla söhbət etsin, bəzi məsələləri ona başa salsın. Ancaq onun bir gənclik ehtirası ilə məktəbə vurulduğunu görəndə qəlbinə dəyməmişdi. İndi Əmrahın məktəbə gəlməsi onun sümüyünü çaxnaşdırmış və ürəyinə qorxu salmışdı. Mürsəl də çaşıb qalmışdı. Uçitel bu cavan oğlanın sir-sifətindəki qəzəb qarışıq kədəri, şaşqınlığı görüb onu acı düşüncələrdən ayırmaq istədi. Əvvəlcə özünə toxtaxlıq verib gülümsündü, sonra Mürsəlin qolundan yapışdı.

– Gəl içəri gedək, bala, yaman üşüdüm. Deyəsən, hava soyudu. Mina xalanın təzəcə dəmlədiyi samovar çayından bir-iki stəkan içib qızışaq. Ağzımıza bir-iki tikə çörək alaq. Fikir eləmə. Belə sözləri çox eşitmişik və çox da eşidəcəyik.

Mürsəl özünə gəlməmiş Uçitel bir ata kimi onun qolundan yapışıb içəri apardı. Mürsəl sakitcə çayını içdi, iştahası olmasa da, bir-iki tikə çörək kəsdi. Uçitel gördü ki, onun fikri uzaqlardadır, çox uzaqlarda. O nə isə düşünür, nəyi isə ölçüb-biçir və vəziyyəti aydınlaşdırmağa çalışırdı. O, isti məxməri çaydan bir stəkan da içib üzünü Uçitelə tutdu.

– Bəs nə olsun, onların qabağından qaçaq? Onlar meydanda at oynatsınlar, biz də durub baxaq? Bəlkə boynumuzu büküb qabaqlarında diz çökək?

Uçitel gülümsünüb əlini onun çiyninə qoydu.

– Tələsmə, oğlum, hər şeyin vaxtı var. Zorakılıqnan heç nə olmaz. Atalar deyib ki, saxla samanı, gələr zamanı.

– Zamanı çox gözləmək olmaz. Ona təkan vermək lazımdı. İnqilab yaratmaq lazımdır. Eşitməmiş olmazsınız, dahilər deyib ki, inqilab zamanın əvəçisidir. Zorakılıq olmasa, uşaq dünyaya gəlməz.

– Yarımçıq doğulan uşaq da çox yaşamaz: ya anadan olan kimi ölər, ya da ağıldan naqis olar. Təbiətin də, cəmiyyətin də öz əbədi və

əzəli dəyişməz qanunları var. Yaz qışı, yay yazı, payız da yayı əvəz etdiyi kimi cəmiyyət də embrioloji mərhələlər keçməlidir. Əvvəlcə insanların zehnində kamillik yaranmalı, təkamül yolunu keçib inqilaba gəlməlidir. Yoxsa uşağı 6-7 aylığında ala-yarımçıq halda dünyaya gətirmək olmaz.

– Olar, Uçitel, olar. Bəs tarixi dahilər yaratmırmı?

Uçitel özünə bir stəkan da çay süzdü. Gülümsəyərək Mürsələ baxdı.

– Dahi kimə deyirsən?

– Cəmiyyətin istiqamətini dəyişən adamlara.

– Onlar cəmiyyətin istiqamətini dəyişdirə bilməzlər. Cəmiyyət özü öz istiqamətini dəyişdirir.

– Bəs elə isə dahilər nə edir?

– Bax, məsələ də elə bundadı. Xəstə cəmiyyətin yaraları göynəyir, əzab-əziyyət verir və nəhayət, yetişir, bədəndə olan çiban kimi. O çibanların deşilmə mərhələsi gəlib çatır. Kim cəmiyyətin bu vəziyyətə düşməsini əvvəlcədən görürsə və neştəri götürüb hamıdan əvvəl yaranı kəsirsə, dahiyə çevrilir. Yenə deyirəm, əslində, cəmiyyət özü dəyişir, təzələnmək istəyir. Dahilər isə qabağa düşüb bu işi sürətləndirirlər. İndi, Mürsəl bala, tələsmək olmaz. Hər şeyin vaxtı-vədəsi var. Bundan başqa, yaşadığın cəmiyyətin qanunlarını gərək öyrənib özünü qorumağı da bacarasan.

Süfrəyə xörək gətirdilər. Uçitel Mürsəlin boşqabını yağlı plovla doldurdu və söhbətinə davam etdi.

– Yadındadırmı, iki ay bundan əvvəl bizi kəndin yuxarı hissəsinə iclasa çağırmışdılar. Axşamüstü gedəsi olduq. Mənim qoşalülə tüfəngimi sən götürdün. Arxayınca çağırılan yerə getdik. Biz mühazirə oxumalı idik. Amma heç kəs gəlməmişdi. Qaranlıq isə qarışmışdı. Sən sakit idin. Mənim isə ürəyimə damdı ki, burda bir qurğu var. Bizi buraya pis niyyətlə çağırıblar. Azacıq sonra kəndin işıqları yandı, itlər zəncirdən açıldılar. Birdən-birə kəndi iki yerə ayıran dərəyə zil qaranlıq çökdü. Elə qaranlıq ki, göz-gözü görmədi. Biz qayıdası olduq. Tüfəngi mən götürdüm. Qabağa düşdüm. Bilirsənmi niyə? Fikirləşdim ki, əgər yolumuzu kəsən olsa, çaş-baş qalsınlar. Gedəndə tüfəng səndə idi, indi onlar ehtiyat edəcək, bilməyəcəkdilər ki, tüfəng qabaqda gedəndədir, ya arxada qalanda. Geri qayıdanda da gəldiyimiz yolla yox, ayrı bir cığırla qayıtdıq. Məndən sənə əmanət, heç vaxt getdiyin yolla geri qayıtma, çalış izini itir, düşmən sənin haradan gəlib, hara getdiyini bil-

məsin. Sən fikir verdinmi, mən çığırla yox, cığırın kənarındakı kələ-kötür yerlə gedirdim. Özü də elə bil nəyinsə üstünə cumurdum. Nəyisə ayaqlamaq istəyirdim. Bunu da qəsdən edirdim ki, yolumuzu kəsən olsa, çaşıb qalsın. İndi gərək hər şeyi öyrənəsən, ehtiyatlı olasan. Bir yatdığın yerdə bir də yatmayasan, yerini tez-tez dəyişdirəsən. Pis niyyətlə evinə gələn olsa, axşamı harda yatacağını bilməsin. Xörəyini ye, soyutma. İndi gəl, belə məsləhətləşək: onsuz da bu gün-sabah qış gəlir, havalar soyuyur, sən mənim sözümə qulaq as, qrammofonu yığışdır, saxla, yaz gələnə qədər. Ona qədər söz-söhbət kəsilər, kəndin qız-gəlini ayrı şeylərə zümzümə qoşarlar. Sonrasına baxarıq.

Uçitelin sözləri Mürsəlin ağlına batdı və qrammofonu götürüb saxladı.

Ancaq Novruz bayramından sonra Mürsəl yenidən qrammofonu oxutmağa başladı. Yenə mahnılar zümzüməyə qarışdı.

## 5

Bu il havalar tez istiləşmişdi. Təpələrdəki qar örtükləri götürülmüş, yer-göy birdən-birə yaşıllaşmışdı. Çəpərlərin diblərində balaca mavi çiçəklər pıtrax kimi qalxmışdı. Vaxtından tez oyanan qara xallı qırmızı böcəklər onların arasında gəzişirdi. Təbiətin belə tez ayılmasından Mürsəl sevinirdi. O bu il məktəbdə əməlli-başlı may bayramı keçirməyi qərara almışdı. Qırmızı, yaşıl, sarı və göy rəngli kağızlar tapmışdı. Uşaqları başına yığıb həmin kağızları bərabər ölçüdə kəsərək yapışqanla birləşdirir və sonra zəncirvarı həlqələri bir-birinə calayırdı. Bu bəzəkli, naxışlı və müxtəlif rəngli kağız zəncirlər sinif otaqlarından birinin küncünə yığılırdı. Mürsəl müəllim bayrama bir neçə gün qalmış dükandan cürbəcür şəkillər aldı və məktəbin divarlarına yapışdırdı. Həyətdə iki uzun dirək basdırıb keçid düzəltdilər. Keçidin yuxarısına qırmızı parça örtdülər və cürbəcür şüarlar yazdılar. Lap ortada isə Leninin ipək parçadan toxunmuş şəklini vurdular. Şəklin ətrafı dairəvi idi. Bu dairənin içində inqilab edən, yeni traktor sürən, zindanların üstündə dəmir döyən adamların əksi var idi. Fabrik-zavodların bacalarından tüstü qalxırdı. Bir sözlə, dünya əməkçiləri rəhbəri əhatəyə almışdılar. Lap yuxarı başda isə "Cümlə-cahan füqareyi-kasibəsi, birləşiniz" sözləri yazılmışdı. Bayrama iki gün qalmış uşaqlar sərçə kimi cividəşə-civildəşə həyət-bacanı, sinif otaqla-

rını, eyvanları süpürüb təmizlədilər, pəncərə şüşələrini yuyub parıldatdılar. Oğlanlar kəndin kənarındakı dərəyə, İncə çayının sahilinə gedərək, saçaqlı söyüdlərin budaqlarından qırıb məktəbə gətirdilər. Eyvanların, otaqların dirəklərini yaşıllığa bürüdülər. Sonra rəngli kağızlardan düzəltdikləri zəncirləri saçaq-saçaq burub divarlardan, həyətdən keçidə qədər düzdülər. Məktəb hisi silinmiş çıraq kimi par-par parıldayırdı. Mürsəl sevincdən hər şeyi unutmuşdu. Başı bəzək-düzəyə o qədər qarışmışdı ki, kənd camaatından maraqlanıb onlara tamaşa etməyə gələnlərə fikir vermirdi. Fikir vermirdi ki, onların bəziləri pilləkənin qurtaracağında dayanıb Mürsəl müəllimin otağına baxır, onun yatdığı yeri gözdən keçirir və divara nə isə işarə qoyurdular.

Mayın 1-i gəldi. Göyün üzü tər-təmiz, hava ılıq idi. Bu gün kənd lap tezdən oyanmışdı. Zümzümələr baharın ılıq havasına qovuşmuşdu. Mürsəl də tezdən oyanıb, qrammofonunu işə salmışdı. Gün xeyli qalxdı. Alabəzək parçalardan paltar geymiş qızlar-oğlanlar axışıb gəldilər. Mürsəl müəllim zurna səsi eşidəndə qulaqlarına inanmadı. Tez həyətə düşdü. Gördü ki, Hümmət də, Dursun da burdadır. Onlar zurnalarını kökləyir, dəfi günə tutub qurudurdular.

– A müəllim, bizsiz bu bayramın nə ləzzəti, – deyə Hümmət dilləndi. – İstəyirəm bir “Səhər havası” çalım, camaat bilsin ki, toy-bayramdır, yığışıb gəlsinlər.

Bir azdan məktəbin həyətində iynə atsan, yerə düşməzdi. Atlı cavanlar, qız-gəlinlər, ağsaqqallar axışıb gəldilər. İki yerdə toy dəstgahı düzəlmişdi. Hümmət cıdırhəngi çalır, kəndin dəliqanlıları atlarını zurnaçının qabağında oynadıb cıdıra hazırlaşırdılar. Atlar yüyəni gəmirir, dəfin ahənginə uyğun olaraq titrəyir, şaxə qalxıb yəhərin altında çırpınırdılar. Sonra da cilovun boşaldığını görüb güllə kimi keçidin altından keçib, kənd yoluna düşürdülər. O biri dəstədə isə Dursun oyun havaları çalıb qız-gəlini oynadırdı.

Bütün kənd zümzümə içində idi. Qaranlıq qarışana qədər çalıb oynadılar. Camaat gedəndən sonra Mürsəl xeyli otağa keçə bilmədi. Səs-küy kəsdiyindən qüssələndi, uşaq kimi qəribsədi. Göyün üzünə səpələnmiş ulduzlara, ağ buludları yarıb keçən aya doyunca baxdı. Hardasa bülbül oxuyurdu. Arabir kəndin kənarındakı dərədən anadil səsi gəlirdi. Hərdənbir həzin-həzin axan İncə çayının şırıltısı da eşidilirdi. Mürsəl gecə yarısına qədər eyvanda dayanaraq bu zümzüməli gecəyə tamaşa etdi. Heç yatmağa həvəsi yox idi. Otağa girib yorğan-

döşəyə uzanandan sonra da gözünə yuxu getmədi. Yerin içində o üz-bu üzə çevrildi. Ancaq səhərə yaxın gözünə yuxu getdi.

Ertəsi günü zurnaçılar yenə gəldilər. "Səhər havası" çaldılar. Camaat məktəbin həyətinə toplaşdı. Ancaq nə Mürsəl müəllim göründü, nə də onun qrammofonu oxudu. Uçitel təşviş içində pilləkənlə yuxarı qalxdı. Pəncərədən Mürsəl müəllimin otağına baxdı. Pəncərənin şüşəsi çilik-çilik olmuşdu. Stolun üstündəki çıraq öləziyib sönmüşdü. Mürsəl isə qızıl al qana boyanmışdı.

## 6

Uçitel birdən-birə titrətməli adam kimi büzüşdü. Pencəyinin yaxasını dartıb düymələdi. Elə bil bir anın içində kişinin beli əyildi. Astaca addımlarla məscidə doğru getdi. Səhər tezdən olmasına baxmayaraq baş molla məscidin yuxarı tərəfində əyləşmişdi. Onun qaşları da, saqqalı da əmmaməsi kimi dümağ idi. Qabağında kitabə, üstündə də Qurani-Kərim var idi. O, Uçitelin gəldiyini hiss etsə də, qımıldanmadı, əvvəlki ciddiyyətilə, sakitcə Quranı oxumaqda davam etdi. Uçitel astanada ayaqqabısını soyunaraq onun mütaliəsinin qurtarmasını gözlədi. Hərçənd, bilirdi ki, molla Qurani-Kərimi oxumaqdan daha çox vərəqlərə baxır və özünü məşğul kimi göstərir. Ancaq gözləməli idi. Quran və namaz üstə olan adamı yarımçıq dindirməzdilər.

Aradan xeyli keçdikdən sonra molla Quranı örtdü, əbasını düzəltdi, ağarmış qaşlarının altından boylanan və hələ diriliyini itirməyən gözlərini astaca qaldırıb Uçitelin üzünə zillədi.

– Səhər-səhər xeyirdimi?

– Yox, molla, bu gecə bizim müəllimi öldürüblər.

Mollanın qaşları çatıldı, sir-sifəti turşaldı.

– İndi məndən diləyin nədir?

– Ölünü yerdən qaldırmaq lazımdı.

Molla fala baxırmış kimi qarşısındakı Quranı açıb vərəqlədi, çiynindən sürüşüb düşməkdə olan əbasını düzəltdi və astaca dilləndi:

– Xəbər verin, qohum-əqrəbasına gəlib meyiti aparsınlar.

Uçitel təxminən bu cavabı gözləyirdi. Amma cavabı da hazır idi.

– Yox, molla, o bizim kəndə qurban gedib, biz də onu dəfn etməliyik. Gəlmişəm siznən məsləhətləşəm və ölünü el adətincə yerdən götürək.

Mollanın sifətindən güclə seziləcək, incə bir işıltı keçdi.

– Uçitel, bilmirsənmi, komsomolu məsciddən götürməzlər. Onun üstündə Quran oxuyub, namaz qılmazlar. İndi ki, onu bizim kənddə dəfn etmək istəyirsiniz, aparın edin. Amma ümumi qəbristanlığa yaxın getməyin.

Uçitel ayaqqabılarını geyindi və məsciddən bayıra çıxdı. O nə edəcəyini hələ qəti qərarlaşdıra bilməmişdi. Məktəbin həyətinə girəndə allı-güllü parçalardan bəzəkli don geyinmiş qız uşaqlarını, əllərində bənövşə dəstələri tutan oğlanları gördü və başa düşdü ki, bu körpələrin heç nədən xəbəri yoxdur.

Məktəbin həyətində dayanan kəndlilər Uçitelə yaxınlaşdılar. Onlardan biri qabağa yeridi.

– Özünüzü darıxdırmayın, müəllim, dünyadı, adamın başına iş gələr. Müsəlman deyilikmi? Ölümüz düşüb, özümüz də müsəlman qaydası ilə yerdən götürərik.

Uçitel dirçələn kimi oldu. Ətrafındakılara baxıb özünə toxtaqlıq verdi.

Məktəbin geri yanında evlərdən kilim gətirib daldalanacaq düzəltdilər. Qulplu qazanları asıb su qaynatdılar. Meyiti yuyub təmizlədilər. Kimsə qara gün üçün yaxdanda saxladığı kəfənliyini gətirdi, meyiti kəfənləyib cənazəyə qoydular və üstünə kəlağayı örtdülər. Uçitel əvvəl istədi cənazəni ikinci mərtəbəyə eyvana qoysun, sonra fikrini dəyişdirib həyətin ortasına gəbə saldırıb meyiti ora qoydu.

Bayrama gələn uşaqlar yavaş-yavaş çoxalırdı. Onlardan bir neçəsi ikinci mərtəbəyə eyvana çıxmışdı. Onlar kənardaca dayanıb qorxa-qorxa, ürkəkliklə eyvanın küncündəki qrammofona baxırdılar. Uçitel dəfələrlə həmin uşaqların Mürsələ kömək etdiyini görmüşdü. Gah qrammofonun tozunu silir, gah dəstəyi hərləyir, gah da valları gətirirdilər. Amma indi bilmirdilər neyləsinlər. Bunu görən Uçitel üzünü eyvandakı uşaqlara tutdu:

– A bala, qurun maşını, çaldırın, oxutdurun!

Uşaqlar elə bil bir şey sındıracaqlarından ehtiyat edirlərmiş kimi, astaca qrammofonu işə saldılar.

Uçitel həyətdəki uşaqlardan iki nəfərini yanına çağırdı.

– A bala, cəld qaçın zurnaçı Hümmətin yanına. Ona deyin ki, Uçitel gözləyir. Yoldaşlarını götürüb təcili məktəbə gəlsin.

Azacıq keçmiş Hümmət dəstəsi ilə gəldi və cənazəni görüb təəccüblə Uçitelə baxdı.

– Hümmət kişi, çıx ikinci mərtəbənin eyvanına, bir yaxşı “Səhər havası” çal, qoy camaat yığışıb gəlsin.

Zurnaçı Hümmət dərhal eyvana qalxdı, üzünü səhər şəfəqlərinə qərq olmuş üfüqə tutdu və özünün dərdini, kədərini də “Səhər havası”na qatıb, kəndi haraya çağırdı...

Məktəbin həyətində tərpənməyə yer yox idi. Bütün kənd camaatı – başıpapaqlı kişilər, oğlanlar, qımqımılı-zümzüməli qız-gəlinlər axın-axın gəlib meydana toplaşmışdılar. Bayaqdan özünü yalqız hiss edən və hardasa qüssələnib kədərlənən Uçitel cənazənin yuxarı tərəfinə keçdi. Camaatın tam sakitləşməyini gözlədi, sonra astadan sözə başladı.

– Baş Mollamız “Komsomolu məsciddən götürməzlər” dedi. “Onun üstündə Quran oxumaq günahdı. Gedin, necə istəyirsiniz, elə də dəfn edin”. Mən də sizi köməyə çağırdım. Mürsəl müəllim böyük arzularla yaşayırdı. O, həyata yenicə atılmışdı. O özünü unudan insanlardan idi. O istəyirdi ki, kəndimizdə yeni məktəb, yeni klub tikilsin. O istəyirdi ki, kəndimizin qımqımılı-zümzüməli övladlarının sorağı uzaqlardan gəlsin. Bu həmin Mürsəl müəllim idi ki, bu tərəfdə ilk dəfə teatr göstərdi. Teatrın nə olduğunu sizə başa saldı. O çox işlər görmək istəyirdi, amma imkan vermədilər.

Uçitel əllərində bənövşə dəstələri boyunlarını büküb duran uşaqlara üzünü çevirdi:

– Yaxın gəlin, əlinizdəki çiçəkləri, bənövşələri müəlliminizin cənazəsinin üstünə səpin və onu, onun dediklərini heç vaxt unutmayın.

Cənazəni qaldırdılar. Kəndlilərdən biri Uçitelə yaxınlaşdı.

– Narahat olmayın, siz qəbristanlıqdan qayıdanacan hər şey hazır olacaq. Müsəlman deyilikmi.

– Müsəlmanıq. Ölümüzü müsəlman qaydası ilə basdıracağıq. Üç də verəcəyik, yeddi də, qırx da.

Uçitel cənazənin qabağına keçdi. Üzünü çaşıb qalmış Hümmətə çevirdi.

– Ay usta, cəngi çal.

Hümmət qabağa düşüb zildən cəngi çaldı. Camaat ömürlərində ilk dəfə belə şey gördüklərinə və heç nə başa düşməmələrinə baxmayaraq sakitcə cənazənin ardınca hərəkətə başladı. Elə bil bütöv kənd yerindən tərpəndi.

*V fəsil*

**1**

Güllü xanım bu gün itləri zəncirdən tez açdırmışdı. Gəlinlər itlərin yalaxlarını yal ilə doldurmuşdu. İtlər əvvəlcə zəncirdən açılandan sonra evin ətrafında hərlənmiş, Kürün yaxası boyu qaçmış, sonra da yalaxların üstə cumaraq mırıldaşa-mırıldaşa yala hücum etmişdilər. Güllü xanım eyvanda dayanaraq onlara tamaşa edir, tüfəng çiynində həyətdə hərlənən oğlu Həsən ağanı gözaltı süzürdü. O hiss edirdi ki, Ömər koxa rəhmətə gedəndən sonra Həsən ağa heç kəsə açıb-ağartmasa da, çox narahatlıq keçirir. Tüfəngi əlindən yerə qoymur, atını da çox vaxt gecələr belə yəhər altında saxlayır. Arvad fikir vermişdi ki, oğlu gah samanlıqda gecələyir, gah tövlədə qalır, gah da otaqların birində mürgüləyir. O bir yerdə yatmır, tez-tez yerini dəyişdirir. İndi, bu gün də narahat idi, bir yerdə dayanmır: gah samanlığın, gah tövlənin belinə qalxır, gah da ot tayalarının yanında hərlənirdi. Güllü xanım kəndin yuxarı başındakı səs-küydən, itlərin çaxnaşmasından ehtiyatlanırdı. O bu gecə nəsə baş verəcəyindən qorxurdu.

Ömər koxanın sağlığında hər şeyin sakit gəlib-keçəcəyini bilən Həsən ağa arxayın idi ki, bu ağsaqqalın sözündən heç kəs çıxa bilməz. O hamını başa salmışdı ki, Ələddinin ölümü bir bədbəxtliyin nəticəsidi və buna görə araya qan salmaq, təzə düşmənçilik törətmək lazım deyil. Hətta onun ayağına qəza mərkəzindən gələn və “Nə üçün şikayət eləmirsən?” – deyən hökumət adamlarını geri qaytarmış, “Ölən də, öldürən də öz uşağımızdır, burada heç bir qəsdi-qərəzlik yoxdur”, – demişdi. Ondan sonra Həsən ağaya dəyib-dolaşan olmamışdı. Həsən ağa onu da başa düşürdü ki, Ömər koxanın oğlu Şamil və Çıraqlılar onunla barışsalar da, ürəklərində kin var idi. Atalarının sözündən çıxa bilməsələr də, içəridən qovrulub yanırdılar. Ona görə də, Həsən ağa gözə az-az dəyir, Şamilin, Qönçə xanımın gözünə az-az görünürdü. Amma axır vaxtlar onu bir-iki dəfə idarəyə çağırmışdılar. Hətta bir dəfə kənd şurasının milisioneri Keçəl Xondulu zarafata salıb demişdi ki, “Nə vaxta qədər belə səksəkəli dolanacaqsan? Əlindən xata çıxıb, get üç-dörd ay yat sonra gəl, rahat dolan”.

Keçəl Xondulu Həsən ağagilin rəiyyəti hesab olunurdu. Balacalıqdan anadan yetim qalmışdı. Atası ilə qara damın altında tək yaşayırdı-

lar. Baxanı olmadığından başına yara düşmüşdü. Məhəllə uşaqları oynamağa, Kürə çimməyə gedəndə onu da özləri ilə aparırdılar, amma başı keçəl olduğundan ona suyun axarının aşağısında çimməyə icazə verirdilər. Elə özü də suyun axarının yuxarısına getməzdi.

Bir gün səhər tezdən Kürün sahilindən Xondulunun ağlamaq səsi gəldi. O, sahil boyu qaçıb atasını axtarırdı. Camaat səsə tökülüb gələndə Xondulu suyun qıjqoy yerini göstərib qışqırırdı:

– Bax, atam burda yoxa çıxdı. Binədən gəlirdik. Birdən-birə su daşdı. Atam məni tez bura gətirdi, qolumdan yapışıb bura tulladı, mən geri dönüb baxanda gördüm ki, yoxdur.

Kişinin meyitini iki gün sonra Kürün aşağısındakı qurulamış çiləkənin dibindən tapdılar. O gündən sonra Keçəl Xondulu Həsən ağagilin həyətində yaşadı, onlarla birlikdə yaylağa köçdü, arana endi...

Şura hökuməti qurulduqdan sonra isə onu kənd şurasında işə götürdülər, təzə paltar, silah verdilər, at bağışladılar. Xondulu kəndin sayılan adamlarından oldu.

Həsən ağa ona heç bir pislik eləməmişdi. Amma Xondulu Alqazaxlılara, elə Çıraq uşağına da düşmən kimi baxırdı...

**2**

Kənd itlərinin səs-küyü azalandan və çıraqlar öləziyib işıqlar seyrələndən sonra Həsən ağa qardaşı Şəmiddinin yanına getdi. Onlar hasara söykəndilər. Bir xeyli heç biri dinib-danışmadı.

Şəmiddin başa düşdü ki, qardaşı nəsə çox ağır bir məsələdən söz açmaq istəyir. Dinmədi. Gözlədi. Xeyli sonra onun titrək səsini eşitdi.

– Mən bu gecə getmək istəyirəm.

– Hara?

– O taya. Meşəyə. Ordan da qaçaqların yanına. Çox fikirləşmişəm. Bu gün də olmasa, sabah gecənin birində üstümüzü alacaqlar. Gəlmişəm, səninlə məsləhətləşəm.

Şəmiddin ağa xeyli susdu. Görünür fikrində dağı arana, aranı dağa köçürdü və qaranlıqda gözünü qardaşının üzünə zillədi.

– Bəs, ev-eşiyi, arvad-uşağı kimə tapşırırsan?

– Elə bilirəm, bir-iki il bir təhər dolanarlar. Onacan da aralar düzələr, qayıdıb gələrəm. Bəs sənin fikrin nədir?

Şəmiddin ağa dinmədi. Çiynindəki tüfəngin qayışını oynadaraq Həsən ağanı lal bir sükutla süzdü. Sonra sakitcə cavab verdi:

– Mən ev-eşiyi, arvad-uşağı başsız qoyub heç yana gedən deyiləm. İnsan anadan olanda alnına nə yazılıbsa, o da baş verəcək.

Həsən ağa qardaşından belə cavab gözləmədiyindən təəccübləndi.

– Mən gedəndən sonra elə bilirsən sənə rahatlıq verəcəklər? Gündə idarəyə çağırıb sorğu-suala tutacaqlar, mənim yerimi soruşacaqlar, al dilindən yanıma göndərəcəklər. O yan-bu yan olanda da atın döşünə salıb Şəkərin qalasına göndərəcəklər. Gəl mənim sözümə qulaq as, əl-ayağını yığışdır, arvad-uşağnan halallaş, elə bu gecə aradan çıxaq.

Bayaqdan sallağı oturub qardaşı ilə söhbət edən Şəmiddin ağa ayağa durdu. Həsən ağa da ayağa durdu.

– Yox, qardaş, sən gedəndən sonra bu arvad-uşağın içində bir başıpapaqlı qalmalıdır.

Onlar qucaqlaşdılar. Ay işığında bir-birinin üzünə baxdılar. Həsən ağa kövrəldi.

– Özün bilən məsləhətdi. Ancaq getsən, pis olmazdı, mən də tək qalmazdım, sən də.

Bir də qucaqlaşdılar. Səslərini içəri salıb hıçqırdılar. Sonra aralanıb hər kəs öz evinə getdi. Şəmiddin ağa eyvanda intizarla onun yolunu gözləyən arvadına heç nə demədi və dönüb qaranlıqda iki yanını basa-basa ləngər vuran qardaşına baxdı.

Həsən ağa anası Güllü xanımın yanında ayaq saxladı. Arvadın sərt və xırıltılı səsi eşidildi:

– Nə dedi?

– Getmədi.

– Bilirdim elə də olacaq. Arvadağızın biridir – Güllü xanım eyvanın yuxarı başında dayanıb kəndi dinşədi. Sakitlik idi. Əl-ayaq çoxdan yığşırılmışdı. Çıraqlar sönmüşdü. Ordan-burdan təkəm-seyrək işıq gəlirdi.

– Atın hardadı?

– Talvarın altında.

– Yəhər-yüyənini alma, uşaqlara demişəm xurcunu palaz-paltar və yemək şeyləri ilə doldurub atın tərkinə bağlayacaqlar. Sən də tüfəngini, tapancanı götür, daraqları güllə ilə doldur, qoltuqaltılarını əynindən çıxartma, özün də get uşaqların yanına bir az dincəl. Bir şey olsa, özüm xəbər verəcəm.

Həsən ağa anasının bu mehribanlığından kövrəldi. Oğlunun bu hərəkəti arvadı hirsləndirdi. Onun kəskin səsi eşidildi:

– Kişi ol. Arvad ha deyilsən, gözün yaşarır. Nə qədər canımda canım var, ev-eşiyə, arvad-uşağa qoymaram bir şey olsun.

Anasının bu sözlərindən sonra toxtayan Həsən ağa asta addımlarla öz otağına getdi.

**3**

Keçəl Xondulu öz silahlı dəstəsi ilə şura idarəsinin həyətinə toplaşmışdı. O, qəza mərkəzindən xüsusi tapşırıq almışdı. Bu gecə Həsən ağa tutulmalı idi. Kəndə tam sakitlik çökdükdən sonra Keçəl Xondulu atın belinə qalxdı. Yoldaşları da atlandılar. Xondulu yarım pıçıltılı səslə onları başa saldı.

– Yarınız Alqazax uşağının evinin alt tərəfini, yarınız da üst tərəfini kəsərsiniz. Elə edərsiniz ki, aradan bir quş da çıxa bilməsin. Həmləni uzaqdan götürün ki, başa düşən olmasın. Evə yaxınlaşanda da, saymazyana yaxınlaşarsınız. Onların üstünü beyqafıldan, yatdıqları yerdə almasaq, ələ keçirə bilməyəcəyik.

Sakitcə üç yerə bölündülər və Alqazaxlılar tərəfə yola düşdülər.

Otuzluq çırağın işığını aşağı çəkib öz otağında döşəkcə üstündə oturan Güllü xanım kəndin yuxarı başında hürüşüb susan itlərin səsini dinşədi və astaca addımlarla eyvana çıxdı. Atların ayaq tappıltısından başa düşdü ki, onlar tərəfə gələn var. Həsən ağanın qapısını taqqıldatdı. Oğlu anasının çağırışını dərhal başa düşdü və yapıncılı-çuxalı eyvana çıxdı. Güllü xanımın titrək səsi eşidildi:

– Əlli tərpən, bala, deyəsən gələn var.

Güllü xanım oğlunun yanında ömründə ilk dəfə kövrəlib boynunu qucaqladı.

Həsən ağa eyvandan tullanıb talvarın altına getdi. Yəhərə qalxıb atın üzünü Kürə tərəf çevirdi. İtlər evin ətrafını kəsən atlılara hücuma keçdilər. Tüfəng şaqqıltısı, qamçı səsi eşidildi. Hay-küyə arvad-uşaq ayıldı. Şəmiddini oyadıb tələm-tələsik geyindirdilər. Qönçə xanımın çığırtısına fikir vermədilər. Sonra Həsən ağagilin eyvanına çıxdılar. Güllü xanım bu haylı-küylü basqına fikir vermədən eyvanda dayanıb Kürü dinşəyirdi.

Keçəl Xondulu onun üstünə acıqlandı:

– Oğlun hardadı?

Güllü xanım əsasına söykənib ayağa durdu və atın döşünə salınmış Şəmiddini göstərdi.

Həsən ağa suvadağdan Kürə enmək istədikdə, atın böyründə dayanan Alanı gördü. Cilovu çəkdi. İt bunu hiss edib qabaq ayaqlarını yəhərin üzəngisinə qoydu və ağlayırmış kimi için-için zingildədi.

Həsən ağa aşağı əyilib Alanın üz-gözündən öpdü, başını sığalladı və kövrək, titrək səslə dilləndi:

– Salamat qal, Alan, buraları sənə tapşırıb gedirəm. Ev-eşikdən muğayat ol. Ya qismət, bir də görüşəcəyikmi?! Allah bilir!..

İt zingildədi və onun əlini yaladı. Həsən ağa atın başını qanırıb Kürə endi. Alan isə onun qaraltısı gözdən itincəyə qədər dalınca baxdı.

– Bəs bu kimdi, oğlum deyil?

Keçəl Xondulu səsini ucaltdı:

– Onu demirəm, Həsən ağa hanı?

Elə bu vaxt Kürün o üzündən dalbadal atılan güllə səsi və Alanın acı ulartısı eşidildi. Güllü xanımın bayaqdan azca əyilmiş beli düzəldi, elə bil boyu da ucaldı.

– Güllə səsini eşitmirsənmi? O tayda – meşədədi, bacarırsınız, gedin tutun.

Keçəl Xondulu sərt bir söyüş söyüb eyvandan düşdü və atın belinə qalxdı.

– Bu dəfə də aradan çıxdı, amma harada olsa, onu tapacam. – Üzünü yoldaşlarına çevirdi. – Tez olun, tərpənin.

Atlı dəstə kənd itlərini və yuxuya getmiş camaatı oyadaraq Alqazaxlılar tərəfdən yola düşdü.

**4**

Qəza mərkəzinə odun aparan arabalar geri qayıdırdı. Hava isti idi. Çöllər yaşıllaşmışdı. Şirələnmiş torpağın sinəsinə lalələr səpələnmişdi. Arabalar Acı Dərənin dikdirində dayandılar. Qabaq arabadakı ağsaqqal kişi o birilərini səslədi:

– A, bala, arabaları endirin dərəyə çayın qırağına, obaşdannan yola çıxdığımızdı. Həm heyvanlar bir az dincəlsin, həm də biz ağzımıza bir tikə çörək alaq.

Dikdiri aşağı endilər. Dərəyə düşən kimi suyun sərinliyi onları vurdu. İncə çayı dupduru idi. Yarğanların, qolpunların dibindən poqquldayıb qaynayan bulaqların suyu çayı daha da şəffaflaşdırırdı. Çayın

vadisi dərə boyu yamyaşıl bir zeh kimi uzanıb gedir və yuxarılarda gözdən itirdi. Qara bulaqların axarınca acı tərələr, lilparlar, yarpızlar bitmişdi. Böcəklər vızıltı ilə uçuşur, çiçəkdən-çiçəyə qonurdu.

Kəlləri, öküzləri boyunduruqdan açdılar. Heyvanlar əvvəlcə gərnəşib çırpındılar, sudan doyunca içdilər və sahil boyu oyxurub cücərən otları otlamağa başladılar.

Arabaçılar bir yerə yığışıb balaca bir süfrə açdılar. Torbadan, heybədən süzmə, qatıq çıxarıb iştaha ilə çörək yeməyə başladılar. Dərədəki güllərin, çiçəklərin, yarpızların ətri adamı məst edirdi. Çörək yedikdən sonra arabaçılar əl-ayaqlarını yudular, soyuq suyun təmasından xumarlanıb yaşıllığa uzandılar. Çayın yuxarısında Acı Dərənin uçurum yarğanının üst tərəfində qarğa-quzğun dolaşırdı. Ağsaqqal arabaçının gözü bunu aldı və xeyli o tərəfdən nəzərlərini ayırmadı. Sonra dirsəklənib oturdu. Üzünü yanındakı cavanlara tutdu.

– A bala, yuxarıda yaman qarğa-quzğun dolaşır, gedin görün nədir, amma ehtiyatlı olun.

Cavanlardan iki nəfəri əllərində çubuq asta addımlarla çay yuxarı getməyə başladılar. Onlar yarğanın altından poqquldayıb qaynayan və yaşıllıq içində olan bulağın bərabərinə çatanda bir adamın orada uzandığını gördülər, yaxınlaşmağa ehtiyat etdilər. Elə bu vaxt qoca arabaçı da gəlib çıxdı. O, diqqətlə şır-şırnan axan bulağın suyuna, acı tərələrə, ətri Acı Dərəni dolduran yarpızlara xeyli baxdı və sonra üzünü yarğana çevirdi və başa düşdü ki, bu adamı yarğanın qaşında vurub dərəyə tullamışlar. Bu adam bütün gecə səhərə qədər yaralı qalmış, suyun, bulaqların şırıltısını eşidincə sinəsi yanmış, su deyə inildəmişdi. Sonra bir təhər sürünərək bulağın üstə enmişdi. Təpimiş dodaqlarını suya yapışdırıb közərmiş yanğısını söndürmüş, özü də sönmüşdü.

Yaralı adama su verməzlər. Burada isə kim-kimə idi? Onu güllə ilə arxadan vurmuşdular. Qoca arabaçı və yoldaşları bir xeyli sakitcə dayandılar. Çayın yaşıl vadisinə sükut çökdü. Bircə vızıldaşıb çiçəkdən-çiçəyə qonan böcəklərin səsindən başqa heç nə eşidilmədi. Qoca arabaçı aşağı əyildi. Hələ də əli və üzünün bir hissəsi bulaq suyunun içində olan meyiti arxası üstə çevirdi. Onun qan laxtalanmış üzünə diqqətlə baxdı.

– Bu ki, bizim Şəmiddin ağadır, – deyib əllərini gözünün üstünə qoydu və astadan hönkürdü. Onun hönkürtüsü bulaqların şırıltısı, böcəklərin uğultusu və çiçəklərin ətri içində itib batdı.

## *VI fəsil*

### 1

Kəndin aşağı tərəfində, dərədən qalxan yolda bir dəstə atlı göründü. Heç nəyə fikir vermədən birbaş məktəbin həyətinə gəldilər. Onlar əyinlərinə qoyun dərisindən tikilmiş yarımkürk geymişdilər. Bellərinə çiyni qayışlı enli kəmər bağlamışdılar. Bir yanlarından onaçılan asmışdılar, o biri yanlarında isə uzun qılıncları sallanırdı. Ayaqlarında dərisi bir qədər qalın, dabanları məhmizli çəkmə var idi. Başlarına kənd adamlarının indiyə qədər görmədikləri qəribə papaq qoymuşdular. Papaqların ortasından elə bil beyinlərini yarıb çıxan buynuz qalxmışdı. Hamısının papağı eyni cür idi: alın yerinə qırmızı parçadan iri ulduz tikilmiş züllə papaq!

Məktəbin həyətinə gələn kimi atdan endilər. Uzaq yol gəldiklərindən sinələri azacıq tərləyən və nəfəsləri buxar kimi burunlarından çıxan atların cilovlarından tutub azca gəzdirdilər.

Hava bozarmışdı. Axşamdan başlayan şaxta bir az da şiddətlənmişdi. Görünür qar yağacaqdı. Məktəb bomboş idi. İki gün idi qış tətili başlamışdı.

Atlılardan üç nəfəri pilləkəni qalxıb sinif otaqlarına, sonra da birinci mərtəbəyə baxdılar. Nəsə danışdılar, nəyisə ölçüb-biçdilər. Bir azdan kənd yolunun aşağısından yeni qaraltılar göründü. Onlar piyada idilər. Bölüklərə, dəstələrə ayrılaraq cərgə ilə dörd qatar düzülmüşdülər. Gələnlərin əvvəli məktəbin həyətinə çatmışdı. Amma qonşu kəndə qədər uzanan yoldakı əsgərlərin sonu görünmürdü; elə bil əldən daşlanıb gəlirdilər. Onların da əynində uzun boz şinel, başlarında züllə papaq var idi. Çoxunun üzünə ülgüc dəyməmişdi. Sarı murdar tükləri soyuqdan biz-biz olmuşdu.

Məktəbin həyətində dayandılar; cərgə-cərgə, bölük-bölük. Bir azdan yolda dörd at qoşulmuş toplar da göründü və onlar da məktəbin həyətinə buruldular. Hamıdan sonra isə turbasından tüstü qalxan səyyar mətbəx gəldi və aşpaz mətbəxi eyvanın altına, xəlvət bir yerə çəkdi. Əsgərlərin cərgəsi pozuldu. Qazançalar danqıldadı, qaşıqlar cingildədi, hərə bir tərəfə səpələnib aşpazdan aldıqları xörəyi yeməyə başladılar.

Qılıncları yernən sürünən komandirlər onları yenidən cərgəyə düzdülər, nə isə izah elədilər. Əsgərlər qarışqa kimi sinif otaqlarına doluşdular.

Partaları sürüyüb həyətə tökdülər. Sonradan məktəbin həndəvərindəki həyətlərə doluşdular. Heç kimdən heç nə soruşmadan ot tayalarına yaxınlaşdılar, qucaqlayıb məktəbə doğru gətirdilər. Sinif otaqlarının döşəməsinə tökdülər. Özləri üçün yatmağa rahat yer düzəltdilər. İri, buz kimi qar dənələri səpələməyə başladı. Bir azdan isə bu qar dənələri lopa-lopa oldu, yer ağardı.

Yoldaş Fətullayev kənd şura sədri Mustafa kişi ilə birlikdə başının dəstəsi ilə at belində gəldilər. Yoldaş Fətullayev komandirləri də götürüb sinif otaqlarını, əsgərlərin yatacağı yerləri, ot döşənmiş döşəmələri şəxsən özü yoxladı və razı qaldı. Sonra üzünü Mustafa kişiyə çevirdi:

– Yoldaş sədr, bu otaqlar azlıq edəcək. Kənddə boş otaqlar varmı?

– Yoxdur, yoldaş Fətullayev.

Fətullayev tərs-tərs onun üzünə baxdı.

– Yoxdur – tap, evləri boşaltdır.

Mustafa kişi onun zəhmli baxışlarından və sərtliyindən titrəsə də, dilləndi:

– Bu qışın soyuğunda evləri necə boşaldım, arvad-uşağı necə çölə atım?

– Deyəsən, başın bədəninə ağırlıq edir?!

Mustafa kişi həyətdə qaynaşan əsgərlərə, yoldaş Fətullayevin sərt üzünə baxıb, gödəkcəsinin içində büzüşdü. Fətullayev isə sözünə davam etdi:

– Rusiyadan ölkələr basa-basa gələn bu adamları çöldə qoyacayıq?

Mustafa kişi harasa getdi və bir azdan kəndin evlərindən ağlaşan arvad-uşaq səsi gəldi.

## 2

Çapıq Əmrah ilin çox vaxtını binələrdə, yaylaqlarda, qonşu obalarda qohumlarının, özünə yaxın saydığı tanış-bilişlərin evində qalardı. O, qaçaq deyildi. Amma qaçaqvari bir həyat keçirirdi. Həmişə səksəkədə idi. Gözə çox görünməz, mərəkəyə çox çıxmazdı. Öz evinə havalar soyuqlaşanda, qış girəndə xəlvəti gələr, bir neçə gün qalardı. İndi də elə etmişdi. İki gün bundan əvvəl evinə gəlmişdi.

Evinə gələn kimi buxarını, dəmir sobanı möhkəm qalatmış, pəncərənin taxtalarını qapatmış, otaq boyu baş-başa uzanmış üstü gəbəli taxta döşəkçə, mütəkkə, yastıq saldıraraq çəkmələrini soyunub rahatca uzanmışdı. O istəyirdi ki, soyuq qış havasında sümükləri isinsin, bədəni qızışsın, heç olmazsa, bir-iki gün rahat yatıb dincini alsın. Amma səksəkəli həyat tərzinin təsiri ilə bir-iki saat mürgülədikdən sonra, qarmaqarışıq fikirlər, ötən günlərin olub keçənləri ona rahatlıq vermirdi. Tez-tez o üz-bu üzə çevrilir, gözünü tavana zilləyir, saatlarla tavana tamaşa edirdi. Onun fikri, xəyalı çözələndikcə çözələnir, ötən günlərə – Gəncəyə gedib çıxırdı...

... Xudadat bəy adəti üzrə işə başlamazdan əvvəl arxa otağa keçib paltarını dəyişdi, asılqandan asılmış ağ xalatını əyninə geyindi, fenandoskopunu əlinə alıb diqqətlə baxdı, istilik ölçəni, cərrahiyyə bıçaqlarını nəzərdən keçirdi və sonradan hər şeyi səliqə-sahmanla yerinə düzdü. Camaat ona Gəncə general-qubernatorluğunu təklif edəndə uzun müddət razı olmamış: "Mən həkiməm", – demişdi. Lakin atası Ələkbər bəy işə qarışandan sonra razılıq verməli olmuşdu. Xudadat bəy hər gün xəstəxanaya baş çəkər, sonra idarəyə gələrdi. Bu gün də elə etmişdi.

Üst-başını sahmana salıb iş otağına keçdi. Yazı masasının arxasında oturdu. Qapı açıldı, növbətçi zabit içəri keçib səhər poçtunu Xudadat bəyə verdi. Qubernator məktubları vərəqlədi və əlinə keçən ilk teleqramı oxudu: "Rusiyaya qayıdan soldatlar özləri ilə bərabər silahlarını da aparırlar. Əgər sülh üzrə onlardan silahı almaq olmazsa, o zaman Zaqafqaziya milli ordusu cəbhədə silahsız qalacaqdır. Bu cəhətdən soldat, fəhlə mərkəzi şurası qət etdi ki, milli və qeyri şuralara məlum etsinlər ki, evlərinə qayıdan soldatlardan silahları almaqdan ötrü lazımi tədbir görülsün. Bu xüsusda hər dəfə məzkur Şuraya məlumat versinlər".

Sədr: "Jordaniya".

Xudadat bəyin alnı qırışdı, teleqramı o üz-bu üzə çevirib xeyli baxdı. Kəşfiyyat ona məlumat vermişdi ki, Türkiyə cəbhəsindən: Kars və Ərdəhandan vətənə yola düşən rus hərbi eşelonları Gürcüstana daxil olmuşdur. Gürcü hökuməti onları Tiflisə yaxın buraxmamaq və ətraf stansiyalarda tərk-silah etmək istəyirdi. Bir neçə gün idi ki, bu hərbi eşelonlar Qardaban-Qarayazı stansiyalarında dayanıb yol gözləyirdilər. "Bu gürcülər də ilanı Seyid Əhməd əli ilə tutmaq istəyirlər. Həmin eşelonları tərk-silah etmək, həm də dava-qalmaqalı başqa ye-

rə salmağa çalışırlar. Çalışırlar ki, bu hadisə Azərbaycanda baş versin və sonradan dünyaya səs salsınlar ki, bu millət mədəniyyətdən uzaqdır və orda quldurlar hökmranlıq edir". Amma yeni yaranan dövlətə ordu və silah lazım idi. Xudadat bəy general-qubernator seçiləndən sonra bu haqda tez-tez düşünürdü.

Oktyabr inqilabından sonra Rus imperiyası dağıldı. Müstəmləkələr istiqlaliyyət əldə etdilər, öz dövlətlərini yaratdılar. O cümlədən Azərbaycanda da Demokratik Azərbaycan Cümhuriyyəti yaradıldı. İndi əsas məqsəd bu dövləti əldə saxlamaq idi. Bunun üçün əsas şərtlərdən biri Azərbaycanın ordusunu yaratmaqdır. Qəribə bir vəziyyət əmələ gəlmişdi. Çar Rusiyası müsəlmanlardan əsgər aparmırdı. Azərbaycanlılardan ibarət hərbi təlim keçmiş nizam-intizamlı ordu yox idi. Ancaq rus ordusunda xidmət etmiş çox görkəmli, qabiliyyətli generallarımız, komandirlərimiz mövcud idi. Xudadat bəy dərk edirdi ki, mütləq hərbi səfərbərlik elan etmək və yaxşı ordu yaratmaq lazımdır. Ordunu ordu halına salmaq üçün onu silahlandırmaq lazım idi. İndi belə fürsət ələ düşmüşdü: cəbhədən geri qayıdan qoşunları tərk-silah etmək, həm də davasız-şavasız.

Zəngi basdı. Növbətçi zabit içəri girdi. Xudadat bəy ona göstəriş verdi:

– Əmrahı tez mənim yanıma göndər.

Bir neçə dəqiqədən sonra Əmrah iş otağında fikirli-fikirli gəzişən Xudadat bəyin önündə dayandı.

– Aslan bəy Səfikürdskini, Rüstəmbəyli Şəfi bəy ilə Adıgözəl İmamverdi bəyi bura çağır. Sonra uşaqlardan göndər qaçaqların yanına. Qaçaq Qənbər, Xallı Heydər, Topal Hasanlı Cabbar, Tatoğlu Hasanı tapıb mənim adımdan xəbər versinlər ki, öz adamlarını yığıb təcili Şəmkir vağzalına yola düşsünlər. Ətraf kəndlərdəki adamları da yığsınlar. Dəmiryolunun alt və üst tərəfini kəssinlər və bizi gözləsinlər.

Çapıq Əmrah dərhal həyətə düşdü və bir dəstə atlı ilə qaçaqların dalınca getdi. Bundan sonra Xudadat bəy məsələni açdı:

– Ağalar, rus eşelonları Türkiyə cəbhəsindən gəlirlər, onları tərksilah etmək lazımdır. Şəfi bəy ilə İmamverdi bəy, siz təcili gedin Yevlağa, adamlarımıza xəbər verin, qoyun hazır dayansınlar. Əgər eşelonlar Gəncəni keçə bilsələr, Bakıya doğru getməyə qoymasınlar. Mümkün qədər bu işləri sakitliklə, qansız eləmək lazımdır. Di sizə yaxşı yol. Biz isə, Aslan bəy, səninlə birlikdə Şəmkirə yola düşməliyik.

Səhər dan qızaran zaman atlı dəstənin müşayiəti ilə Xudadat bəy Aslan bəylə faytona oturub Gəncədən Şəmkirə yola düşdülər. Xudadat bəy əlindəki kiçik yol çamadanını faytonun arxa tərəfinə qoydu. O, idarədən çıxmazdan əvvəl həmin çamadanı dava-dərman, sarğı ləvazimatları və cərrahiyyə bıçaqları ilə doldurmuş, bəlkə lazım oldu deyə xəyalından keçirmişdi. Hava soyuq idi. Yanvar ayının əvvəlində yerə düşən qar əriməmişdi. Yolun bəzi yerləri buz bağladığından at nallarından qığılcım qalxırdı. Şəmkirin üst tərəfindəki dağlar dümağ qar içində idi. Xudadat bəy üzünü faytonun küncündə sakitcə oturan Aslan bəyə çevirdi.

– Şekspirin belə bir sözü var: "Hünər yüksəklərə qalxmaqda deyil, hünər yüksəkliklərdə mətanətlə dayanmaqdadır". Camaatı ayağa qaldırmaq, onlara şirin vədlər vermək, onsuz da ciyəri alışıb-yanan adamları döyüşə aparmaq, ehtirasları qızışdırıb mövcud qanunları dağıtmaq o qədər də çətin deyil. Amma...

– Məsələnin çətini camaata təzə nə verməkdir? Vay o gündən ki, qazandıqlarını əldə saxlaya bilməyəsən, təzə bir şey verə bilməyəsən, – deyə Aslan bəy Xudadat bəyə cavab verdi. – Ümidi boşa çıxan və aldadılan xalqın faciəsindən böyük faciə yoxdur. İndi biz yeni dövlət qurmuşuq. Qurmaq asandır, onu əldə saxlamaq lazımdır.

Xudadat bəy faytonun içində yerini rahatladı.

– Çox təəssüf ki, bunu başa düşməyənlər var. Dövləti əldə saxlamaq üçün birinci növbədə ordu lazımdır. Xüsusi ilə bizə. Çünki dörd tərəfimiz xəbis qonşularla doludur. Ona görə nəyin bahasına olursa-olsun, eşelonları tərk-silah etməliyik.

Xudadat bəy susdu, hər şeyi unutmuş kimi dərin fikrə getdi. Onun məqsədi bu saat Türkiyə cəbhəsindən qayıdan rus eşelonlarını tərk-silah etmək idi. Bunun üçün əvvəlcədən tədbir görmüşdü. Dəmiryolunun ətrafında yerləşən kəndlərdən təxminən on min silahlı dəstə düzəltmiş, həmçinin, bu mahalın adlı-sanlı qaçaqlarını da bu işə cəlb etmişdi. Onlar dünən axşamadək burada pusquda dayanmışdılar. Rus qoşunları müqavimət göstərsələr, qan tökməyə məcbur olacaqdılar. Xudadat bəy bunu istəmirdi. O, uzun döyüşlərdən sonra salamat qalıb sevinclə vətənə qayıdan əsgərlərin şadlığını yox edib qan tökməyin əleyhinə idi. Fayton Şəmkir stansiyasına yaxınlaşanda uzaqdan keçmiş şəhər qalasının qalıqları və körpü aydınca göründü. Şəmkir çayının üstündəki körpünün xarabalıqları da aydınca görünürdü. Bu,

Şəmkir şəhərinin xarabalıqları idi. 935-367 hicridə "Şəmkur" adında bir padşah bu şəhəri tikdirmiş və öz adını həmin şəhərə vermişdi. Teymurləngin vaxtında bu şəhər salamat idi. İndi isə şəhərin adı və xarabalıqları qalmışdı. Bəşər övladı qəribədir. Yaratdıqlarını məhv edir. Əgər belə olmasaydı, tərəqqinin dalından insan nəsli çata bilməzdi. Xudadat bəy ətrafdakı qarlı-təpəli düzənlikləri, qarşıdakı dəmiryol vağzalını seyr etdikdən sonra vağzaldakı zirehli qatarı gördü. Bu qatar 60 nəfər döyüşçü ilə Tiflisdən gəlmişdi. Xudadat bəyin atlı dəstəsi vağzalın yanında dayandı. Xudadat bəy mühafizəçilərin müşayiəti ilə stansiya rəisinin otağına daxil oldu.

## 3

Eşelon Poylu körpüsü yaxınlığında dayananda komandir maşinistdən təəccüblə "Niyə dayandıq?" deyə soruşdu.

Başını pəncərədən çıxardıb yola baxan ağsaçlı və ağbığlı maşinist dilləndi:

– Simafor bağlıdır.

Qatar körpünün yaxınlığında Kürün yaxası boyu dayanmışdı. Vaqonların içi soyuq idi. Neçə gündən bəri dəmir sobaları qalamaq üçün heç nə tapmırdılar. Daş kömür və odun çoxdan qurtarmışdı. Əsgərlərdən biri sahildə kökündən qurumuş iri bir palıd ağacını gördükdə dərhal xırxı və baltasını götürüb vaqondan yerə düşdü. Bunu görən o biri vaqondakı əsgərlər də yerə tökülüşdülər. Qorxu və vahiməni unudaraq odun doğramağa başladılar. Doğranmış odunları qucaq-qucaq vaqona yığdılar. Azacıq sonra sobalar tüstüləndi, vaqonlar istiləndi. Neçə gündən bəri üşüdüyündən büzüşüb şinelə bürünən əsgərlərin bədənləri isindi.

Parovozun meşədə əks-səda verən kəsik-kəsik fiti eşidildi və ağır-ağır dartınaraq hərəkətə başladı. Kürün suyu sırsıra bağlamışdı. Çayın yaxası boyu meşədə ördəklər, qazlar uçuşurdu.

Qatar Poylu körpüsünü keçib Ağstafaya yaxınlaşdı. Yol yenə də bağlı idi. Onları ehtiyat yolunda dayandırdılar, dərhal qapılar açıldı. Əsgərlər əllərində su qabları perrona axışdılar. Divara iri hərflərlə "Kipyatok" yazılmış kranın ətrafında növbəyə düzüldülər. Təxminən bir saatdan sonra vaqonlarda özlərinə çay düzəldən əsgərlərin kefi yaxşılaşmışdı. Stansiya rəisinin otağında isə mübahisə gedirdi.

– Bizi nə üçün ləngidirsiniz?

– Yol bağlıdır.
– Necə yəni yol bağlıdır?
– Deyilənə görə, körpülər minalanmışdı.
– Bunu öyrənmək olmazmı?
– Olar, adam göndərmişik. Xəbər alan kimi sizi yola salacağıq.

**4**

Birinci eşelon stansiyanın iki verstliyində dayandı. Yol yenə bağlı idi. Eşelon rəisi vaqondan düşüb əsgərlərin müşayiəti ilə vağzala yaxınlaşdı və birbaş rəisin otağına keçdi. Xudadat bəy, Səfikürdski və zirehli qatarın komandiri içəridə oturmuşdular. Onları görən eşelon rəisi azca özünü itirsə də, amiranə tərzdə vağzal rəisinə müraciət etdi:

– Yolları nə üçün açmırsınız?

Xudadat bəy sakitcə ona cavab verdi:

– Əyləşin, məsləhətimiz var.

Komandir narazılıqla qaşqabağını turşaltdı və gurhagurnan yanan sobanın yanında oturdu. Araya xeyli sükut çökdü. Söhbəti necə, nədən başlamaqda çətinlik çəkirdilər. Nəhayət, Xudadat bəy astadan dilləndi:

– Əvvəla sizi müharibəni qurtarıb sağ-salamat evinizə qayıtmağınız münasibəti ilə təbrik edirəm. Əsgərlərin sevincinə ürəkdən şərik olduğumuzu bildirirəm. Amma bir məsələ bizi narahat edir. Siz öz silahlarınızla birlikdə geri dönürsünüz. Topla-tüfənglə vətənə qayıdırsınız. Belə bir dönüşün sizə nə xeyri ola bilər? Sizi – hazır əsgərləri, yeni döyüşlərə, toqquşmalara göndərə bilməzlərmi?

Komandirin qaşları çatıldı, alnı qırışdı və gözlərini qaldıraraq təəccüblə Xudadat bəyin üzünə baxdı:

– Nə demək istəyirsiniz?

Xudadat bəy söhbəti çox uzatmağı lazım bilməyib suala sualla cavab verdi:

– Ordudan qayıdan əsgərlərin silah nəyinə lazımdır?

– Silahsız da ordu olarmı?

– Düz deyirsiniz, silahsız ordu olmaz, amma siz artıq ordu deyilsiniz. Sizi Vətənə qayıdan kimi fəhlələrin, kəndlilərin, inqilab etmiş camaatın üstünə göndərəcəklər. Əliniz qardaş qanına boyanacaq, qırğın törəyəcək. Bütün bunların olmaması üçün təklif edirik: silahlarınızı təhvil verin!

Eşelon komandiri yerindən dik atıldı. O, sözün bu yerə gəlib çıxacağını gözləmədiyindən səsini bir qədər ucaltdı:

– Bəs, bu silahlar sizin nəyinizə lazımdır?

– Biz yeni hökumət yaradırıq. Bizə ordu və ordunu silahlandırmaq üçün silah lazımdır.

Komandir otaqda fikirli-fikirli xeyli gəzindi, pəncərədən yollara, "fıs-tısla" işləyən parovozlara baxdı. Sağa-sola hərəkət edən dəmiryolçuları seyr etdi, onların kəsik-kəsik çaldıqları tütək səslərinə qulaq asdı və birdən dabanı üstə fırlanıb üzünü Xudadat bəyə tutdu:

– Əgər təslim olmasaq, silahları təhvil verməsək, onda nə edəcəksiniz?

Xudadat bəy kəskin və ciddi suala, kəskin və ciddi cavab verməyi qərara aldı:

– Onda araya qan düşəcək, mən isə bunu istəmirəm.

Komandir söhbətin bu yerində sözünə ara verib "mən məsləhətləşməliyəm" deyə cavab verdi və dərhal bayıra çıxıb müşayiətçilərin müşayiəti ilə eşelona doğru getdi. Yarım saatdan sonra qatarın önündə ağ bayraq dalğalandı və eşelon vağzala yaxınlaşdı. Vaqonlardan tökülən əsgərlər tüfənglərini yol kənarında dayananlara təhvil verdilər. Sonra at qoşulmuş toplar, iri çaplı pulemyotlar vaqonlardan düşürüldü. Eşelon təmiz boşaldıqdan sonra parovozun kəsik fiti eşidildi. Əsgərlər hay-harayla qaçışaraq vaqonlara doluşdular. Bundan sonra vaqonlar ağır yük altından çıxmış kimi taqqıldaşa-taqqıldaşa irəliyə hərəkət etdilər. 2-ci və 3-cü eşelon da bu cür təslim oldu. Sonrakı eşelon vağzala yaxınlaşdıqda vaqondan səslər eşidildi: "Təslim olmayın!" "Qırın bu basurmanları!" "Atəş açın!". Azacıq sükutdan sonra vaqondakı toplardan, pulemyotlardan, tüfənglərdən şiddətli atəş başlandı. Yol qar tozanağına bulandı. Mərmilərdən biri zirehli qatarın dal tərəfinə toxundu və komandir yaralandı. Eşelonun vaqonlarına da çaxnaşma düşdü. Hiss olundu ki, orda əlbəyaxa vuruşma düşmüşdü. Yolun kənarında səbrlə dözən silahlı camaat, qaçaq dəstələri cavab atəşi verdilər. Bir anın içində hər şey bir-birinə qarışdı: partıltıdan, çatıltıdan, şüşə cingiltisindən qulaq tutuldu. Bu qeyri-bərabər döyüşdən qalib çıxa bilməyəcəklərini başa düşdükdən sonra əsgərlər ağ bayraq qaldırdılar.

Təxminən 10 min əsgər təslim oldu, silahlarını yerə qoydular. Xudadat bəy isə stansiya rəisinin iş otağında yaralıların yarasını sarıyırdı.

## 5

Şamxor yolu ilə Gəncəyə doğru irəliləyən izdihamın sevinci hədsiz idi. İndi onların böyük bir ordunu silahlandıracaq qədər silahları var idi. Müşayiətçilərin əhatəsində öndə gedən faytondakı Xudadat bəy tez-tez yanındakı Aslan bəy Səfikürdskini qucaqlayır "Artıq geniş səfərbərlik elan edə bilərik. İndi hər şeyimiz var" deyirdi. Silahları təhvil alanlardan bir neçəsi şəhərin girəcəyində atdan düşüb topların lüləsinə paçayırma minib "ura" – deyə qışqırırdılar. Küçə boyu düzülən camaat onları eyni sevinclə qarşıladı.

Şəhərin kənarındakı dəmir yolunda isə kirpik boyda görünən vaqonlar tüstülənə-tüstülənə arxayınca, takka-tukla irəliləyirdi.

# *VII fəsil*

## 1

Gecədən xeyli keçmişdi. Göyün üzündəki ulduzlar elə bil yazın belə tez və isti gəlməsinə sevinib sayrışırdı. Həmişə səksəkəli yatan şəhər bu gecə də narahat idi. Küçələrdə at ayaqlarının tappıltısı eşidilir, arabir təkəm-seyrək gözə dəyən keşikçilər görünürdü. XI rus-bolşevik ordusu bir aya yaxın idi ki, Gəncə şəhərini zəbt etmişdi.

Çay sahilində yerləşən zirzəmilərin birindən solğun işıq gəlirdi. İçəri zabitlərlə dolu idi. Bakıda müsavat hökumətinin devrilməsindən sonra təslim olmaq istəməyən zabitlər Gəncədəki narazı hərbiçilərlə birləşmişdi. İndi onlar gizlin məşvərətə yığışmışdılar. Məşvərətə Azərbaycan hökuməti dövründə Gəncə hərbi qarnizonun rəisi vəzifəsini icra edən Cavad bəy Şıxlinski və Gəncə atıcı alayının komandiri polkovnik Cahangir bəy Kazımov rəhbərlik edirdilər.

O vaxt Əmrah general Cavad bəy Şıxlinskinin yavəri idi. Hər şey indiki kimi yadındadır. General onu tez-tez zabitlərin arxasınca göndərirdi. Əmrah Cavad bəyin tapşırığı ilə keçmiş şəhər komendantı general-mayor Məmməd Mirzə Qacarı, qaçaq Sarı Ələkbəri, qaçaq Qənbəri, Topalhasanlı Cabbarı tapıb məşvərətə gətirdi. Başqa general və yüksək vəzifəli zabitlər də gəldilər. Hamının toplaşdığını görən general Cavad bəy zabitlərə oturmağı təklif etdi və özü də üstündə şəhərin xəritəsi olan yazı masasının arxasında oturdu. Aralığa xeyli sükut çökdü. Cavad bəy xəyalında nəyi isə ölçüb-biçdikdən sonra sözə başladı:

– Ağalar, XI Qızıl Ordunun bolşevikləri bizə yalan satmışlar. Xəlil Paşa da bizi inandırmışdı ki, rus qoşunları bizim ərazidən keçib Türkiyəyə İstanbulu müdafiəyə gedir. Bosfor, Dardanel təhlükə qarşısındadı. Biz bu ordunun tezliklə Türkiyəyə getməsinə kömək etməliyik. İndi isə bir aydı ki, Gəncədədirlər. Belə getsə, biz öz istiqlaliyyətimizi itirəcəyik. Ona görə də polkovnik Cahangir bəy Kazımovla belə qərara gəlmişik ki, Gəncəni üsyana qaldıraq. Sizi də bu məqsədlə məsləhətə çağırmışıq. Fikriniz nədir?

İçəridə oturan generallar və başqa hərbiçilər çiyinlərindən ağır yük götürülmüş kimi dərindən nəfəs aldılar.

– Biz bunu çoxdan gözləyirdik.

– Elə isə vaxt itirməyək, – deyə Cavad bəy sözünə davam etdi.

– Cənab general Məmməd Mirzə Qacar, şəhərin istehkamlarının hazırlanması, müdafiə xətlərinin möhkəmləndirilməsi, köhnə şəhər komendantı kimi məhəllələrin, küçə və dalanların hazırlanması və istehkama çevrilməsi sizə tapşırılır.

– Siz isə, – deyə general üzünü Sarı Ələkbər və Qaçaq Qənbərə tutdu. – Öz dəstənizlə əhalini ayağa qaldırmalı və döyüşə aparmalısınız. Səngərlərin silahlar və mərmilərlə təmin olunmasını isə Topalhasanlı Cabbara tapşırırıq. Bütün bunlardan əvvəl daha təcili görüləsi iş var. Bu haqda polkovnik Cahangir bəy Kazımovun sizə sözü var.

Bayaqdan deyilənlərə səbirsizliklə qulaq asan və vaxtın itiriləcəyindən qorxan polkovnik dərhal ayağa durub izaha başladı.

– Ağalar, bizim ordumuzun 1800 nəfəri bolşevik ordusu tərkibindədir. Rus bolşevikləri Azərbaycan ordusunu yenidən təşkil etməyə vaxt tapmayıblar. Ona görə də, milli ordunun məşhur generalı Məmməd Mirzə Qacarı diviziyanın təchizat şöbəsi rəisi vəzifəsində saxlayıblar. Hətta Mirzə Qacar şəhərin komendantıdır. Bu bizim xeyrimizədi. Demək, bolşevik ordusu tərkibində tərəfdarımız var. İndi mayın 23-də Bakıdan XI Ordunun Gəncəyə göndərdiyi komanda heyəti şəhərə gələrək dərhal hərbi hissələri yenidən təşkil etməyə başlamışdır. Onlar komanda hissəsini tamamilə təzələyirlər. Bütün köhnə zabitləri işdən götürür və yenisi ilə əvəz edirlər. Bir sözlə, rus ordusunun tərkibində bu saat böyük hərc-mərclik və başsızlıq var. İndi əsl fürsətdir. Ona görə də, elə bu gecə, bu saat işə başlamaq lazımdır. Hamıya əmr edirəm, təcili olaraq öz hissələrinizi ayağa qaldırıb nəzərə çarpmadan bolşeviklərin kazarmasını ələ keçirmək və şəxsi heyəti həbs etmək lazımdır.

## 2

Gəncə çayı selləmə gəldiyindən onun qıjıltısı şəhəri başına götürmüşdü. Bu qıjıltı o qədər güclü idi ki, küçələrdə, yollarda edilən hərəkətlər sezilmirdi. Başqa vaxtlar şəhərin 2-ci hissəsində körpünün yanındakı kilsə saatının səsi şəhərin ucqar küçələrində belə eşidilirdi. İndi isə beş addımlıqdan heç nə eşitmək mümkün deyildi.

XI Ordunun əsgərləri ac və yorğun olduqlarından axşamdan kazarmaya doluşmuş və yatışırdılar. Keşikçilər kazarmanın ətrafında dolaşır, yorğun-yorğun əsnəyir və növbələrinin haçan qurtaracağını gözləyirdilər. Onlardan divara söykənib mürgüləyənlər də var idi.

Üsyançılar dəstəsi körpünü keçib kazarmaya yaxınlaşdı. Qaçaqlar isə öz atlı dəstələri ilə arxa tərəfdən gələrək əsgərlərin yataq yerlərini əhatə etdilər. General Cavad bəy və polkovnik Cahangir bəyin başçılıq etdiyi dəstə bir göz qırpımında irəli cumdu, keşikçilər özlərinə gələnə qədər onları sıradan çıxartdı və əsgərlərin üstünü aldı. Əsgərlərdən silah götürmək və atəş açmaq istəyənlərə imkan vermədilər.

Üsyançılar tərk-silah etdikləri rus əsgərlərini cərgəyə düzüb qabaqlarına saldılar və birbaş Gəncə qalasına gətirdilər...

Cavad bəy Cahangir bəylə birlikdə qalanın keşikçi dəstəsini möhkəmlətdikdən sonra qərargaha qayıtdılar. Onların üzləri gülürdü. İlk əməliyyatları uğurlu keçmişdi. Zirzəmidə bir qədər oturdular və nəfəslərini dərdilər. Sonra Cavad bəyin yavəri Əmrahın gətirdiyi çayı içdilər. General Cavad bəy kəşfiyyatın ona gətirdiyi məlumatı yazı masasının üstünə qoydu və polkovniklə birlikdə oxumağa başladılar. “Şəhərin strateji əhəmiyyəti olan xeyli hissəsi rus qoşunlarının əlində idi. 20-ci atıcı diviziyanın 178-ci və 180-ci atıcı polkları çayın sağ sahilində, şəhərin ermənilər yaşayan hissəsində yerləşmişdir. Rabitə batalyonu və 3-cü briqadanın qərargahının komendant hissəsi isə şəhərin müsəlmanlar yaşayan şimal-qərb səmtində yerləşdirilmişdi. Düşmənin cəmi 2000 döyüşçüsü, 30 pulemyot, bir artilleriya divizionu, Zurnabad kəndində 450 nəfərdən ibarət 20-ci atlı briqadası, 8 pulemyotla bir atlı top batareyası və şəhərin 6 km-də yerləşən Helendorf qəsəbəsindəki diviziyanın öz iki, ikitoplu batareyası ilə artilleriya qərargahından ibarət idi. 3-cü briqadanın komandiri isə keçmiş çar zabiti Şirmaxer idi”.

Cavad bəy məlumatı oxuduqdan sonra üzünü Cahangir bəyə tutdu:

– Biz ikitərəfli plan hazırlamalıyıq. Birincisi, şəhərin bütün giriş yollarını istehkama çevirməliyik. Şəmkir yolundakı topların sayını artırmalı, keşikdə dayananların miqdarını çoxaltmalıyıq. Bu il Qoşqar çayı həddindən artıq daşdığından yolları sel basmışdır. Bu bizim xeyrimizədir. Gəncəyə gələn ikinci yol Xaçbulaq yoludur. Balçılı tərəfdən şəhərin yeganə əlaqə yolunu çox ciddi qorumalıyıq. Məni ən çox narahat edən Helendorf tərəfdir. Əvvəla, bu tərəfdə erməni kəndləri var, ikinci də həmin yol şəhərin ermənilər yaşayan hissəsiylə birləşir. Bu ermənilərin rus ordusuyla birləşəcəyinə şübhəm yoxdur. Bakıda olduğu kimi burada da onlar xəyanət edə bilər; gah daşnaka, gah bolşevikə çevrilərlər. Biz bunları nəzərdən qaçırmamalıyıq.

Cavad bəyə diqqətlə qulaq asan polkovnik dərhal ona cavab verdi:

– Şəhərin ətraf yollarını, ətraf kəndlərini qorumağı və nəzarət altında saxlamağı adlı-sanlı qaçaqlara tapşırmalıyıq. Bizim Sarı Ələkbər, Qaçaq Qəmbər, Topalhasanlı Cabbar, Topalhasanlı Xallı Heydər, Qabaxtəpəli Dəli Xəlil, Tatoğlu Hasan, Sarı Qafar, Qaçaq Məmmədqasım, Nainsafoğlu Məmmədəli kimi igidlərimiz var. Onları bolşeviklərin təsiri altına düşməyə qoymamalıyıq. Və şəhərin ətrafını qorumağı onlara tapşırmalıyıq. Adlı-sanlı general və zabitlərdən isə şəhərin özündə və hücumlarda istifadə etməliyik.

– Bəs qəti hücumu ayın neçəsində etməliyik? – deyə Cavad bəy soruşdu.

– Mayın 25-dən 26-a keçən gecə. Ancaq ona qədər alınası yerlər var. Mən döyüşçülərimi şəhərin erməni hissəsində yerləşən 178 və 180-ci polkların üstünə qaldıracam. Sonra da dəmiryol vağzalını tutarıq. İndi isə hazırlaş, gedək istehkamları yoxlayaq.

## 3

Hava olduqca isti idi. May ayının axırı olmasına baxmayaraq elə bil küçələrə od ələnmişdi. Qoşa minarəli Şah Abbas məscidinin önündəki avara meydanında göyə ucalan çinarların enli yarpaqları meh vurduqca astadan xışıldayırdı. Məscidin həyəti ibadət edənlərlə dolmuşdu. Başlarında ağ fəs, əyinlərində arxalıq olan kişilər balaca arxa yaxınlaşır, əllərindəki aftafanı su ilə doldurub dəstəmaz alırdılar. Hücrələrin kiçik qapıları açılıb-örtülür, buranın daimi sakinləri günor-

ta namazına hazırlaşırdılar. Məscidin kənarı ayaqqabı və başmaqlarla dolu idi. Həyətdəki çinarların kölgəsində dəvələr uzanmışdı. Dəmiryol vağzalına gedən yolun ətrafındakı kiçik dükanlar qaynaşırdı. Papaqçılar öz papağını, pinəçilər öz ayaqqabılarını, dərzilər öz paltarlarını küçəyə sərib müştəri gözləyirdilər. Özlərinə bir papaq, ya çuxa almaq istəyən kəndlilər isə dükanların qabağından dönə-dönə ötür, almaq istədikləri paltar-palazı dönə-dönə yoxlayırdılar. Başı boxçalı arvadlar isə çarşab içində günbəzli hamama doğru addımlayırdılar. Avara bağının sol tərəfindəki arxdan isə su aramsız şırıldayıb axırdı. Bu suyun şırıltısı Gəncənin küçələrinin hər iki tərəfi boyunca axan arx sularının səsini batırırdı.

Ağacların kölgəsində poqquldayan iri samovarların ətrafı adamla dolu idi. Sərin havada oturub çay içən, hətta özü ilə pendir-çörək gətirib naharlananlar da var idi. Arabir çiyinlərində səhəng su satan uşaqların ciyiltili səsi eşidilirdi: “Ay ürəyi yanan, yaxın gəlin, sərin su var, buzlu su var”. Bu səslərə meydanın başqa tərəfindən eşidilən səslər də qarışırdı: “Buzlu su, sərin su, isgəncəvi”.

Küçələrdə, meydançada əsgərlər, atlı zabitlər də dolaşırdı. Onlar dərhal atlandılar və süvari zabitlərin müşayiətilə səngərləri, döyüş vəziyyətini yoxlamağa getdilər. Cavad bəyin dəstəsi Şəmkir yoluna tərəf, Cahangir bəy isə körpünü keçərək erməni hissəsinə doğru yollandı.

Zahirən şəhər sakit görünsə də, bir daxili narahatlıq da sezilirdi. Bakıda aprel ayının 28-də Demokratik Azərbaycan Respublikası devrilmişdi. Bolşeviklər XI Qızıl Ordunun köməyi ilə hakimiyyəti ələ almışdılar. Parlamentin yığıncağında Həmid Sultanov və Çingiz İldırım hökumətə ultimatum vermişdilər. Sonra bu ordu Gəncəyə gəlmiş, şəhəri zəbt edərək əsasən Gəncə çayının sağ sahilində, şəhərin 2-ci hissəsində yerləşmişdi. Əsgərlər yarımçılpaq və ac idilər. Onlar qapılara düşüb dilənir, yeri gələndə oğurluq da edirdilər. Hər addımbaşı təhqir və cəza gözlənilirdi. Ona görə də, şəhər əhli uzun müddətdən bəri vərdiş etdikləri adəti saxlasalar da, narahat idilər. Günorta namazının vaxtı yaxınlaşırdı. Müəzzin asta-asta minarəyə qalxdı. Ötkəm və qumral səslə əzan oxudu və dindar müsəlmanları ibadətə çağırdı. Məscidlərdə ibadətlərin qurtarmasına qədər gözlədi və axırda onun zil səsi yenidən eşidildi:

– Ey müsəlmanlar, ey camaat, ey əhlidinlər, bilin və agah olun: şəhərimiz üsyan etmişdir. 2 mindən çox gavur əsgəri tutulub qalaya sa-

lınmışdır. İndi biz ayağa qalxmış şəhərimizin qiyamçılarına kömək etməliyik. Onların başçıları general Cavad bəy Şıxlinski və polkovnik Cahangir bəy Kazımovdu. Allah-taala onlara kömək olsun.

Müəzzin sözünü qurtaranda meydan adamla dolmuşdu. Tərpənməyə yer yox idi. Birdən izdihamın aşağı hissəsi dalğalandı. Camaat general Cavad bəy Şıxlinski ilə polkovnik Cahangir bəy Kazımovu çiyinləri üzərinə alaraq meydan boyu gəzdirdi.

Sevincdən gözləri yaşaran Pişnamazzadənin təklifi ilə xalq milli hökumətin bərpası uğrunda son damla qanına qədər vuruşacağına and içdi.

**4**

Rus bolşevikləri üsyanın başlanmasından üç saat sonra xəbər tutdular və dərhal qarovulda dayanan azərbaycanlı əsgərləri dəyişdirməyə başladılar. Lakin gecikmişdilər. Şəhər üsyançıların əlində idi. Bolşeviklər dərhal qərargaha yığışdılar. Komendant zirehli qatarların, hərbi hissələrin komandirlərini ətrafına topladı. Vəziyyətlə onları tanış etdi. Toplaşanlardan zirehli qatarın komandiri çox sakitcə və ağayana cavab verdi:

– Narahat olmayın, yoldaşlar! Səhər tezdən şəhəri toplardan atəşə tutarıq, səslərini kəsərlər. Mən müsəlmanları yaxşı tanıyıram. Onlarda döyüş qabiliyyəti yoxdur. Onların sənəti qaçaqçılıq, quldurluqdur.

– Səhv edirsiniz. Bu quldurlar bir anın içində əsgərlərimizi həbs edib şəhəri ələ keçiriblər, – deyə komendant yarıhirsli ona cavab verdi.

– Bakıya məlumat vermisinizmi?

– Hələ yox.

– Əgər öz gücümüz çatmasa, Bakıya bildirəcəyik və onlardan kömək istəyəcəyik.

– Müsəlmanların bir məsəli var: "Ehtiyat igidin yaraşığıdır". Əvvəlcədən tədbir görmək lazımdır.

Bolşevik komandirləri dərhal qüvvələri səfərbərliyə almaq üçün hissələrə adamlar göndərdilər. Lakin hər yerdə vahimə və başıpozuqluğa rast gəldilər. Onlar dəmiryol vağzalında təcili qərargah düzəltdilər və səhərə yaxın azacıq mürgülədilər. Mayın 26-da səhər tezdən dəmiryol vağzalının başı üzərində şrapnel mərmiləri şappıldadı və

çarpanalar dolu kimi ətrafa səpələndi. Alayuxulu və özlərinə arxayın olan rus-bolşevik zabitləri özlərinə gəlincə üsyançıların süvari dəstələri ətrafı üzüm bağları və dirrik olan yol ilə gələrək bir göz qırpımında vağzalı tutdular. Və onlar axşama qədər dəmiryolunu əldə saxladılar. Lakin 20-ci diviziyanın komandiri Velikanovun Qazaxdan gətirdiyi zirehli qatarların köməyi ilə bolşeviklər stansiyanı yenidən ələ keçirdilər.

Çayın sağ sahilində gecə yarıdan keçmiş canlanma başladı. Ordunun süvari və piyada hissələri, nizami erməni qoşunları və erməni başıpozuqları birləşərək körpüyə doğru hərəkət etdilər. Onlar səhər açılanda gözlənilmədən çayı keçib, şəhərin üsyan etmiş müsəlman hissəsini qəfildən yaxalamaq və yuxulu camaatı qılıncdan keçirmək istəyirdilər. Üsyançılar isə çayın sol sahilində səngərlər qazmış və ayıq dayanmışdılar. Üsyan başçıları, generallar, zabitlər və əsgərlər sahil boyu ehtiyatla gəzinirdilər. Şəhərin erməni hissəsində balaca bir hərəkət olan kimi qərargaha xəbər verirdilər.

Əmrah özünü qərargaha yetirdi və general Cavad bəyə xəbər verdi ki, Gəncənin 2-ci hissəsində nəsə bir hərəkət var. Yavərin dediyi bu sözləri eşidən Cahangir bəy də dərhal sıçrayıb ayağa qalxdı və onlar bir göz qırpımında həyətə çıxıb atlarına mindilər və başa düşdülər ki, bu il çayın suyu həddindən artıq daşqın olduğundan yeganə keçid ancaq körpüdən ola bilər. Dağlardan baş alıb gələn çayın qıjqoy suyu sahilləri yalayırdı.

Cavad bəy Əmraha əmr etdi zabitlərə çatdırsın ki, hazır olsunlar.

Dan yeri qızarıb günəşin ilk şəfəqləri pəncərələrdə oynarkən körpünün üstündə hücum edənlərlə üsyançılar qarşılaşdılar. Qılınclar havada oynadı. Səngərlərdən pulemyotların şaqqıltısı eşidildi. Hər iki tərəfin süvariləri döş-döşə gəldi. Aradan yarım saat keçməmiş körpünün üstü, çayın axarı insan cəsədləri ilə doldu. Aldığı yaradan, yaxud müvazinətini saxlaya bilmədiyindən körpünün məhəccərindən suya düşən atların kişnərtisi bir-birinə qarışdı. Qılınc cingiltisi və güllə səslərindən qulaq tutuldu. Körpünü ortaya qədər gələn düşmənlərin önündə Əmrah da at belində qılıncla çarpışırdı.

Onun körpünün üstünə nə vaxt gəlməsindən, qılıncını sıyırıb nə vaxt vuruşmağa başlamasından xəbəri yox idi. Gözlərini qan örtdüyündən heç nə görmürdü. Bircə onu bilirdi ki, qılıncı havada fırlanır, nəyəsə dəyir, nəyisə doğrayır.

Birdən Əmrahın önündə at belində az qala bütün körpünü tutacaq qıllı papaqlı, enli bir kürək göründü və bu kürəyin qılıncı havada parıldadı. Əmrahın atı şaxə qalxıb kişnədi. Əmrah da qılıncını hərlədi. Nə qədər çarpışdıqlarını bilmədi. Bir o yadında qaldı ki, alnında kəskin ağrı hiss etdi, üz-gözünü qan bürüdü. Onu da dərk etdi ki, son anda qılıncı nəyi isə xırçıltı ilə kəsdi, onun gözünün qabağında dayanan qıllı papaqlı sifət dığırlanıb suya düşdü, qarşısını kəsən at da, adam da yoxa çıxdı.

Gözünü açanda özünü bir ağacın dibində başı sarıqlı gördü. Bir də onu öyrəndi ki, düşmən geri oturdulmuş, körpü üsyançıların əlindədir.

Bundan sonra üsyançılarla bolşeviklərin ciddi və qanlı döyüşləri başladı. Üsyançılar üzüm bağlarına doluşan və şəhərin ucqar dar küçələriylə irəliləmək istəyən bolşevikləri əzərək geri oturtdular. Beləliklə, mayın 25-dən 30-dək qanlı çarpışmalar davam etdi və şəhər üsyançıların ixtiyarında oldu.

Bolşeviklər vəziyyətin ciddiliyini və ağırlığını görərək Bakıdan, Gürcüstan sərhədlərindən, hətta Ermənistandan öz hərbi qüvvələrini Gəncəyə çəkib gətirdilər.

Bakıdan yeni zirehli qatar və canlı qüvvə, P.V.Kurışkonun komandası altında 18-ci süvari diviziya, Gürcüstan sərhədindən qaubiçnı divizion və daha dörd zirehli qatar, Ermənistan sərhədindənsə daha bir polk – 179-cu polk gətirildi. Ən dəhşətlisi isə, Gəncəyə hücum edən mütəşəkkil rus-bolşevik ordusuna yenə də bolşevik bayrağı altında çıxış edən 3000 nəfərlik nizami daşnak hərbi birləşməsinin və onlara qatılmış ətraf və Gəncə ermənilərinin qoşulması idi.

Bütün qüvvələr Gəncədəki 20-ci diviziyanın komandiri Velikanova tabe edildi. Düşmən şəhərin ətrafla əlaqəsini kəsmək üçün Xaçbulaq yolundakı Balçılı kəndinin həndəvərindəki yeganə keçidi Kurışkonun 18-ci süvari diviziyasının köməyi ilə qanlı döyüşlərdən sonra tutdu. Və mayın 29-da şəhərə növbəti hücum başladı. Günortadan sonra şimaldan və şimal-qərb səmtindən hücum edən 178 və 179-cu atıcı polklar şəhərin ucqar küçələrinə daxil oldular və qanlı küçə döyüşləri başladı. Lakin az sonra həmin polklar gəncəlilərin qabağında duruş gətirməyib geriyə – öz əvvəlki mövqelərinə çəkildilər. Onlar belə müqavimətlə üzləşəcəklərini gözləmirdilər. Şəhərin erməni hissəsindən hücum edən birləşmələrin də burnu ovuldu. Üsyançılar onları suları seldən qabarmış, qıjıltı ilə axan Gəncə çayını keçməyə qoyma-

dılar. Kurışkonun cənub və cənub-qərbdən şəhərə soxulmağa can atan süvari birləşmələri də böyük itkilər verərək geriyə sürükdü. İki günlük hücumun boşa çıxmasını görən, əsgərlərinin sayı Gəncə əhalisi qədər olan və yüksək döyüş texnikası ilə təchiz olunmuş rus-bolşevik işğalçıları Voytsexovskinin komandası altında yenə də Gürcüstan sərhədlərindən tərkibində 175 və 176-cı atıcı polklar olmaqla daha bir briqadanı, bir yüngül artilleriya divizionunu və Bakıdan zirehli avtomobil divizionu ilə nizami erməni dağ batareyasını da təcili Gəncəyə gətirdilər. Düşmən son hücuma hazırdı. Onun beş piyada polku, 6 süvari polku, 7 xüsusi birləşməsi, 2 zirehli avtodivizionu, 8 zirehli qatarı, 57 ağır topu və nizami erməni birləşmələrindən başqa üç mindən çox erməni başıpozuğu vardı.

Bolşeviklərin növbəti hücumu mayın 31-də səhər tezdən başlandı. Onlar iki eşelonla, güclü top atəşinin köməkliyi ilə, dar küçə və dalanlara girməkdən çəkinərək, geniş küçələrdə döyüş texnikasından istifadə etməklə irəliləməyə çalışdılar. Dörd tərəfdən hücuma keçsələr də, bolşeviklər ağır itkilər verir və bu həmlələri də gözlədikləri nəticəni vermirdi. Və belə bir vaxtda Bakıdan xüsusi tapşırıqla Gəncəyə gələn Azərbaycan Kommunist Partiyasının fövqəladə komissarları Həmid Sultanov və Sultan Məcid Əfəndiyev 3-cü briqadanın komandiri Şirmaxerin dəstəsi və bir neçə yerli bolşevikin köməyi ilə azsaylı gözətçiləri tərk-silah edərək Gəncə qalasında saxlanılan 2000 rus soldatını, komandirləri və qərargah işçilərini azad etdilər. Onlar da yaxınlıqdakı silah anbarında silahlanıb şəhərin müdafiəçilərinə arxadan zərbə endirərək küçə döyüşlərinə girişdilər. Bunu gözləməyən üsyançılar təşvişə düşdülər. Xainlik öz işini gördü. Üsyançıların ölüm-dirim mübarizəsi aparmalarına baxmayaraq düşmən hər tərəfdən şəhərə doluşurdu. Atışma həyətlərdə, damlarda, evlərdə gedirdi. Mayın 31-də şər qarışanda adda-budda yerlərdə atışma getsə də, Gəncə artıq düşmən tapdağında idi...

...Çapıq Əmrah bütün bunları yadına saldıqda üşürgələndi. Büzüşərək buxarıya yaxınlaşdı və əlindəki odunları ocağa atdı. Buxarı qorlanıb alovlandı. Şəhər alındıqdan sonra üç gün aparılan talanı, Qoşqar çayını keçmək istərkən suya qərq olanları gözünün qabağına gətirdi. Selləmə yağış altında aşıb-daşan Gəncə çayında gördüyü bir mənzərə indi də onu dəhşətə gətirdi. Çay sahildəki ağaclardan birini kökündən qoparıb suya salmışdı. Ağacın düşdüyü yerdə su lillənib bu-

rulğana çevrilmişdi. Bu burulğanda iki meyit fırlanırdı. Biri qarayanız, biri sarışın. Onlar bir-birinin çiynindən möhkəm yapışmışdılar. Əmrah xeyli onlara baxdı və ayırd edə bilmədi ki, bunlar son anda bir-birlərini boğub suya batırmaq istəmişlər, yoxsa bir-birlərinə köməyə çalışmışlar. İndi də bir-birlərini buraxmırdılar. Burulğan isə onları gah suyun dibinə çəkir, gah da üzə çıxardıb fırladırdı.

O, yenə odun götürüb ocağa atdı və birdən pəncərədən kəndin yollarında və məktəbin həyətində ora-bura qaçışan, qucaqlarında ot daşıyan zülləpapaq əsgərləri gördü.

## *VIII fəsil*

### 1

Qar aramsız yağırdı. Hər yer dümağ örtüyə bürünmüşdü. Elə bil kəndin üstünə ay doğmuş və hər yeri işıqlandırmışdı. Bu, Çapıq Əmrahın xoşuna gəlmədi. Beləcə qarlı günlərdə hər qaraltı aydınca seçilirdi.

O, sakitcə tövləyə endi. İçəri püş səpilmişdi. Baca basdırılmışdı. Malların nəfəslərinin hənirtisi içərini isitmişdi. Çapıq Əmrahın bədəni qızışdı, sümüyü açıldı. Ondan olsaydı, burdan heç yana getməzdi. Atına yaxınlaşdı. Həmişə yəhərli-yüyənli saxladığı kəhərin telini sığalladı, üzənginin və dal tapcırlarının möhkəmliyini yoxladı. Əlini atın sağrısına çəkdi, boynunu, üzünü sığalladı və sonra gözlərindən öpdü. Bir xeyli beləcə, üzü atın üzündə dayandı. Kəhər sahibinin bu mehribanlığından riqqətə gəldi. Qabaq ayağını tərpədib astaca oxrandı. Çapıq Əmrah toxtaqlıq verib atı həyətə çəkdi. Tüfəngini götürdü, xəncərini bağladı və yapıncısını çiyninə saldı. Ağ yun başlığını papağının üstündən geyindi. Pəncərədən sakitcə boylanan arvad-uşağına üzünü belə çevirmədən quş kimi sıçrayıb yəhərə qalxdı. Onun məqsədi xəlvəti yollarla gözə görünmədən kənddən çıxmaq və qonşu obaya getmək idi. Dərə ilə İncə çayının sahilinə endi. Ağacların arxasından sivişib keçdi və azacıq sonra kəndin yuxarı başındakı dikdirdə göründü və elə zənn etdi ki, aradan çıxmışdır. Azacıq nəfəsini dərdi və ətrafı dinşədi. Qarın üstündə tərpənən qaraltıları görəndə isə başa düşdü ki, yollar, bənd-bərələr kəsilmiş, kənd mühasirəyə alınmışdır. At da bunu hiss etdi. Dayanıb irəli getmək istəmədi. Əmrah bilirdi ki, onun atı qabaq-

da bir qaraltı görəndə, qorxu hiss edəndə qulaqlarını şəkləyib ətrafı dinşəyir və bədəni titrəyirdi. O bununla sahibinə bildirmək istəyirdi ki, yol xatalıdır. Əmrah atın boynunu sığalladı və yalına yatdı. At qulaqlarını yapıxdırdı və hiss etdi ki, yolu kəsən qaraltıların yanından güllə kimi keçib sahibini dardan qurtarmaq lazımdır. Yerindən götürüldü. Keşikçilərin yanından yel kimi keçdi. Onu arxadan harayladılar. "Dayan!" – dedilər və çaxmaxlar şaqqıldadı. At sürətini bir az da artırdı. Əmrah aradan çıxdığına sevindi və "Ağrın alım, a kəhərim, bir azca da tərpənsən, dardan təmiz qurtararıq", – deyə ürəyindən keçirdi. Elə bu vaxt at büdrədi, dal ayaqları üstə şaxə qalxdı və birdən arxası üstə yerə sərildi. Əmrah ayağını üzəngidən çıxara bilmədi. Onun qılçası atın altında qaldı. Gözünü yumub-açınca buynuzlu əsgərlərin süngüləri sinəsinə dirəndi. Keşikçilərin yarımkürk geyinmiş, uzun qılınclı komandirləri də at belində gəldi. Çapıq Əmrahı dartıb ayağa qaldırdılar. Tüfəngini aldılar, xəncərini belindən açdılar. Komandir atın belindən əyilərək onun yapıncısını götürdü və öz çiyninə saldı. Başlığı da boynuna doladı. "Necədi, əsil Qafqaz igidinə oxşayırammı?" – deyə əsgərlərə müraciət etdi. Gülüşdülər, sonra da Çapıq Əmrahı qabaqlarına qatıb kəndə gətirdilər.

## 2

Yoldaş Fətullayev kənd şura sədri Mustafa kişinin isti otağında əyləşmişdi. Döşəməyə gəbələr salınmışdı. Divardan da gəbələr asılmışdı. Küncdəki nikelli çarpayının üstünə təzə ipək yorğan-döşək düzülmüşdü. Evin ortasındakı dəmir soba gurhagurnan yanırdı. Ocaq azca öləziyən kimi Mustafa kişi əyilib doğranmış odunlardan sobaya atırdı. İçəri elə isti idi ki, kəndin üstünü qış aldığını, bayırda qar-boran olduğunu adam heç ağlına gətirə bilmirdi. Bura Mustafa kişinin qonaq otağı idi. Qəza mərkəzindən gələn hörmətli adamlar burada çörək yeyər, burada da yatardılar. Fətullayev mizin arxasında oturub həmişə özü ilə gəzdirdiyi yan çantasını açmış və kağızları stolun üstünə səpələmişdi. O nəyi isə axtarır, müxtəlif adlar, famillər yazılmış siyahıları diqqətlə nəzərdən keçirir, dönə-dönə yoxlayırdı. O özünün və rus əsgərlərinin buraya nə üçün gəldiyini hələ heç kəsə deməmişdi. Mustafa kişi də qorxusundan soruşmamışdı. Şura sədri bilmirdi ki, qaran-

lıq qarışıb, əl-ayaq yığşırılandan sonra əsgərlər həyətlərə, qapılara dağılmışdı. Onlar heç kəsi içəridən bayıra buraxmır və keşik çəkirdilər.

Gecədən xeyli keçmiş yoldaş Fətullayev kağızlarını yığışdırdı və üzünü Mustafa kişiyə tutdu:

– Səhər tezdən – işıqlaşan kimi adamların burda olsun. Silahlı komsomolçularını deyirəm. Onlarla söhbətim var. İndi isə, gəl yataq, səhər tezdən durmalıyıq, işimiz çoxdur. Amma elə elə ki, gecə peç sönməsin.

Yoldaş Fətullayev şinelini, çəkməsini soyundu və paltarlı yorğan-döşəyə girdi.

Mustafa kişi səhərə qədər yata bilmədi. Tez-tez qalxıb ocağa odun atdı və nə qədər fikirləşdisə, rus əsgərlərinin qəfildən kəndə gəlmələrinin səbəbini aydınlaşdıra bilmədi.

İşıqlaşan kimi axşamdan Mustafa kişidən tapşırıq alan silahlı komsomolçular onun evinin qapısını kəsdirdilər. Yoldaş Fətullayev onları başına yığdı.

– Bu saat dağılışarsınız kəndə. Gedərsiniz evlərə. On beş yaşından yuxarı nə qədər başıpapaqlı varsa, gətirərsiniz məscidin həyətinə. Dünəndən baxmışıq, ondan münasib yer yoxdur. Həm məscidin özü böyükdü, həm də ətrafı hasarlıdı.

Bir azdan kəndə hay-haray düşdü. Arvad-uşağın səs-küyünə, ağlamalarına heç kəs fikir vermədi. Rus əsgərləri kişiləri süngünün qabağına salıb məscidin həyətinə gətirdilər. Yoldaş Fətullayev məscidin və həyətin içinin dolduğunu gördü və bundan sonra hasarın üstünə çıxdı. Bayaqdan təşviş içində qalan və öz aralarında xısın-xısın söhbət edən kişilər daş hasarın üstünə çıxan Fətullayevi görüncə susdular. Fətullayev aralığa sükut çökdükdən sonra amiranə səslə dilləndi:

– Camaat, hökumətin qərarı var: hamı silahını könüllü şəkildə təhvil verməlidir. Kimin tüfəngi, naqanı, xəncəri varsa, gətirməlidir. Kim silahını könüllü təhvil versə, ona heç nə etməyəcəyik, buraxacayıq, gedəcək evinə. Amma inad göstərsəniz, qurban verəcəksiniz. Sizə ən uzağı bir gün vaxt verirəm. Silahlarınızı gətirin!

Camaat heç nə başa düşmədi. Təşvişlə bir-birinin üzünə baxdı. Fətullayev hasarın üstündən düşüb gedəndən sonra da nə edəcəklərini bilmədilər.

Əslində onların çoxunun silahı var idi. Rus beşaçılanlarını, naqanları, İran və türk tüfənglərini parçalara büküb samanlıqlarda, tövlələrin axurlarında, pərdilərin arasında, ot tayalarının altında gizlətmişdilər.

Heç kəs silahı olduğunu boynuna götürmək istəmirdi. Hamı fikirləşirdi ki, "Silahın nə zərəri var? Yüz gün yaraq, bir gün gərək". Züllə papaqlı rus əsgərləri məscidi ikiqat mühasirəyə aldılar. Yarımkürklü və uzun qılınclı komandirlər məscidin ətrafında dolaşdılar. Yoldaş Fətullayev iki saatdan sonra bir də gəldi. Daş hasarın üstünə bir də çıxıb sözlərini bir də təkrar etdi. Amma camaatdan tərpənən olmadı.

Lopa-lopa qar yağırdı. Məscidin həyətinə toplaşanların hamısı qar içində idi. Çoxunun əynində isti paltar olmadığından soyuqdan büzüşmüşdü. Çoxusu ac idi. Səhər qoymamışdılar ki, çörək yesinlər. Kənd arvadları məscidin ətrafındakı evlərə yığışmış, damların üstünə çıxmışdılar. Onların əllərində bağlamalar, heybələr var idi. Kişilərə çörək gətirmişdilər. Amma keşikçilər onları yaxına buraxmırdılar.

Sözə baxmayıb irəli cuman arvadları süngünün ucunda geri qaytarırdılar.

Mustafa kişi arvad-uşağın ağlaşmasına dözmədi. Qorxa-qorxa Fətullayevə yanaşdı:

– Camaat acdır. Arvadlar çörək gətiriblər, bəlkə...

Fətullayev dabanı üstə fırlandı və şura sədrinin sözünü ağzında qoydu:

– Olmaz! Bir də bilmirsən o bağlamalarda nə var?

Qaranlıq qarışdı. Amma kişilərdən tərpənən olmadı.

## 3

Fətullayev qəza mərkəzində olan zaman, ya da Gəncəyə, Bakıya getdiyi vaxt müəyyən tapşırıqlar alır, kimləri isə axtarır, onların izinə düşürdü. Ətraf qəzalarda kəndlərdən qaçanların kimlər olduğunu öyrənməyə çalışırdı. Ona görə də, hər söhbətə saymazyana qulaq asır, hər kəndə öz adamlarını göndərir, hətta qaçaqların dəstəsinə də adam yollayırdı. Bu adamların çoxu qaçaqların etibarını qazanmaq üçün cinayət də törədirdilər.

Yoldaş Fətullayev gizli arxiv sənədlərini də nəzərdən keçirirdi. Mərkəzdən qaçmış və gözdən yayınan əksinqilabçıları tapmaq üçün gizli yollar axtarırdı. Onu ən çox narahat edən Gəncə üsyanı idi.

Yoldaş Fətullayev yenə Mustafa kişinin isti qonaq otağında əyləşmişdi. Yenə kağızları səpələyib nəyi isə axtarırdı. Mustafa kişi isə sobaya aramsız odun atırdı.

Yoldaş Fətullayev armudu stəkandakı çayını içdi və üzünü Mustafa kişiyə tutdu:

– Ağlın nə kəsir, sizin camaatın silahı yoxdu?

– Meşə çaqqalsız olmaz, yoldaş Fətullayev, bir də belə qarışıq zamanda silah saxlamağın nə zərəri var? Hürriyyətlik ilində hərə özünə bir açılan tapmışdı ki, özünü qorusun. Çox qarışıq zəmanəyə gəlib çıxmışıq. Adam başında papağını güclə saxlayır.

Fətullayev ayağa durdu. Otaqda bir xeyli gəzindi və üzünü yenə Mustafa kişiyə tutdu:

– İndi isə həmin açılanları götürüb meşələrə, dağlara çəkilirlər, hərə bir quldur dəstəsi düzəldir. O müzür ünsürlər şura hökumətini yıxmaq istəyirlər. Onu bilmirlər ki, sinfi düşmənlər qulaqlarının dibini görsələr, onu da görəcəklər.

Mustafa kişi hiss etdi ki, yoldaş Fətullayev hirslənib. Sözünün dalını demədi. Elə bu vaxt qapı astaca aralandı. Mustafa kişi ayağa durdu və əli silahlı komsomolçuya yaxınlaşdı.

– Mustafa qağa, Çapıq Əmrahı gətirdilər.

Mustafa kişidən qabaq yoldaş Fətullayev təəccüb və həyəcanla dilləndi:

– Kimi?!

– Çapıq Əmrahı.

Bu ada yoldaş Fətullayev çoxdan rast gəlmişdi. Mərkəzdən bütün qəzalara gizli təliqələr göndərilmişdi. Fətullayev də onu axtarırdı, onun izinə düşməyə çalışırdı. İndi gözlənilmədən Qaymaqlı kəndində onunla rastlaşırdı. Sevinc və həyəcan hissi onu bürüsə də, üzə vurmadı. Sakitcə Mustafa kişidən soruşdu:

– Çapıq Əmrah orduda olubmu?

– Müsavat hökuməti vaxtı zabit olub. Bilirsinizmi, yoldaş Fətullayev, hamı ona “paruçik” deyir. Elə bizim kənddə də onu Əmrah kimi tanıyan azdı. Ona “barcuy” deyirlər.

– İndi o hardadı?

Bu dəfə qapının ağzında dayanan silahlı komsomolçu dilləndi:

– Şura idarəsinin zirzəmisində.

Fətullayev şinelini götürdü, onaçılanını belinə bağladı və qapıya yaxınlaşdı.

– Mən onu görməliyəm.

Mustafa kişi onun yolunu kəsdi:

– Bu saat zirzəmi buz kimidir, iti bağlasan, it durmaz. Qoy onu gətirdək buraya. İsti otaqda otur, nə qədər istəyirsən, danışdır.

Az keçməmiş Çapıq Əmrahı gətirdilər. Keşikçilərin ikisi içəridə, qapının ağzında, qalanları isə pəncərələrin önündə dayandılar.

Çapıq Əmrah içəri girəndə Fətullayev diksinən kimi oldu. O elə zənn edirdi ki, gətirilən dustaq qorxusundan özünü itirəcək və Fətullayevin qarşısında ayaq üstə gücnən dayanacaqdı. Amma Çapıq Əmrahın şaxanə duruşu, uca boy-buxunu onu çaşdırdı. Başa düşdü ki, qarşısındakı dustaqla ehtiyatlı olmaq lazımdır. Ona oturmağa yer təklif etdi. Əmrah stul çəkdi və ayağını-ayağının üstünə aşırıb əyləşdi. Bir xeyli dinmədilər. Otağın istisindən azca təntiyən Əmrahın papağını başının üstündən geri itələməsi Fətullayevin gözündən yayınmadı. Diqqətlə Əmrahın alnında görünən çapığa baxdı.

– Sənə niyə Çapıq Əmrah deyirlər?

Əmrah gülümsündü və alnına işarə etdi:

– Buna görə.

– Bu nə çapıqdı belə?

– Qılınc çapığıdır. Rus qılıncının çapığı.

– Harda vurublar səni qılıncla?

– Gəncədə.

– Sənin Gəncədə nə işin var idi?

– Mən zabitəm. Müsavat ordusunun zabiti. Öz hökumətimi qorumaq üçün vuruşmalı idim. Bilirsənmi, kişi yorğan-döşəkdə ölməz. Kişi ya gərək gülllədən, ya da xəncər yarasından ölsün. Bir də azadlıq uğrunda vuruşmamaq, bir qaşıq qandan qorxub geri çəkilmək namərdlikdi.

Fətullayev gözaltı onu süzdü və hirslə ayağa qalxdı:

– Gəncədə döyüşdünüz. İnsan qırğınından başqa nə qazandınız?

Çapıq Əmrah da ayağa durdu və Fətullayevlə döş-döşə dayandı:

– Mərdlik! Cəsarət. Bəs, siz nə qazandınız? Camaatı qorxaqlığa, xəyanətə öyrətdiniz. Hamını qırdınız, tökdünüz, elədiniz gözü qıpıq.

– O, sözünə ara verdi. Papiros çəkməyə icazə istədi və tüstü-duman içində söhbətinə davam etdi. – İndi buraya nəyə gəlmisiniz? Rus əsgərlərini nəyə gətirmisiniz?

Fətullayev əsəbiləşdiyini gizlədə bilmədi.

– Qaçaq-quldurların kökünü kəsməyə.

– Yox. Siz kişilərin kişiliyini əlindən almağa gəlmisiniz. Onları qorxutmaq, gözlərinin odunu almaq istəyirsiniz. Arvad-uşaq yanında

kişiləri hörmətdən salmaq, onların qürurunu sındırmaq istəyirsiniz. Heç bilirsiniz qürur nə deməkdi? Bilməzsiniz. Çünki siz qürurlu adamları, elə xalqı da tapdalamağa çalışırsınız. Sizə kişi yox, madyan lazımdır.

Fətullayev bu sözlərə cavab verməkdə çətinlik çəkdi və səsini ucaltdı:

– Paruçik! Çox baş aparırsan! Biz xalqı nadanlıqdan, oğruluqdan, mədəniyyətsizlikdən qurtarıb kamil insanlara çevirmək istəyirik. Bizim yaratdığımız cəmiyyət kamil insan cəmiyyəti olacaq. Bəşəriyyətin arzuladığı, böyük mütəfəkkirlərin təsvir etdikləri kamil insan cəmiyyəti, aydındırmı?

Çapıq Əmrah hiss etdi ki, söhbəti davam etdirmək mənasızdır. Odur ki, son sözünü deməyi qərara aldı:

– Cəmiyyət də insan kimidir. Axtalanmış adamdan kişi çıxmadığı kimi, axtalanmış cəmiyyətdən də kamil cəmiyyət ola bilməz!

Fətullayevin qışqırmaqdan başqa çarəsi qalmadı:

– Aparın!

Çapıq Əmrah otaqdan çıxmazdan əvvəl ətrafa boylandı, döşəməyə salınmış gəbələrə, küncdəki nikelli çarpayıya, çata-çatnan yanan sobaya və bir də hirsindən çənəsini çənəsinə sıxan Fətullayevə baxıb acı-acı gülümsündü.

Onu keşikçilər qabaqlarına salıb apardılar.

Fətullayev xeyli özünə gələ bilmədi. Otaqda fırlandı. Mustafa kişi gördü ki, o, hirsindən azacıq titrəyir. Qəti bir qərara gələ bilmir. Tez ayağa durdu. Qonşu otaqdan yemək, çay gətirdilər.

– Gəlin, əyləşin, ağzımıza bir tikə çörək alaq. Səhərdən acıq.

Fətullayev stul çəkib oturdu. Yeməyə əl vurmazdan əvvəl çantasını açdı, oradakı möhürlü kağızlardan birini götürdü. Bu kağız “üçlüyün” hökm kağızı idi. Camaat arasında bu üçlüyə “Troyka” deyirdilər. İnsanların çoxunun taleyini bu üç adamın imzası həll edirdi. Onlar müqəssirləri məhkəməsiz, qanunsuz mühakimə edir, hökm çıxardır və hökmü də dərhal yerinə yetirirdilər. Fətullayev qarşısındakı ağ kağıza xeyli baxdı və birdən qətiyyətlə yazdı: “4 yanvar 1932-ci il. Qaymaqlı kənd sakini, keçmiş müsavatçı Çapıq Əmrah güllələnsin!” Kağızın aşağısında imzalar var idi. Üçlük üzvlərindən ikisi əvvəlcədən ağ kağıza qol çəkmişdilər. Fətullayev imzalara baxdı və özü də əsəbi halda imza atdı. Sonra “Troyka”nın hazır qərarını çantasına qoyub stəkanı qabağına çəkdi.

## 4

Qar ara vermişdi. Göyün üzündə gün işıldayırdı. Amma hava sazaq idi. Dünəndən kişilərinə çörək gətirən arvadlar evlərinə getməmişdilər. Onlar qonşu həyətlərdə, damların böyründə, çəpərlərin dibində büzüşüb oturmuşdular. Ümid edirdilər ki, böyüklərin ürəyinə insaf gələcək və kişilərə yemək üçün evlərdən gətirilən şeyləri qəbul edəcəklər. Damların üstü, çəpərlərin dibi, kənd yolları, evlər qarın altında qalmışdı. Başqa vaxt olsaydı, kənd adamları damların üstünü, həyət-bacaları qardan təmizləyər, mal-qaranı həyətə çıxardar, sonra da kürəyi götürüb yollarda cığır açardılar. Bacalarından tüstü qalxan evlərin belindəki qarı təmizləməyin ayrı ləzzəti var idi. Uşaqlar da, elə böyüklər də bundan ayrı zövq alardılar. Amma indi həyətlərdə nə malqara görünür, nə də qar təmizləyirdilər.

Məsciddəki camaat soyuqdan titrəşirdi. Bir yandan qar-şaxta, bir yandan da aclıq onları əldən salmışdı. Soyuqdan donmamaq üçün ayaqlarını yerə döyür, kürək-kürəyə verib bir təhər qızışırdılar. Qar adamın gözünü qamaşdırırdı.

Yoldaş Fətullayev yenidən hasarın üstündə göründü. Yenidən eyni sözləri təkrar etdi:

– Camaat, silahlarınızı gətirin, yoxsa qurban verəcəksiniz.

Yerindən tərpənən olmadı. Yoldaş Fətullayev hasardan endi. Məscidin ətrafında züllə papaq əsgərlər iki cərgə düzülmüşdü. İndi bir cərgə də gəldi. Yanlarından uzun qılınc sallanan yarımkürk geyinmiş komandirlər də çoxaldı. Onlar qılınclarını qınından siyirib çıxartdılar. Qışın istilik gətirməyən zəif günəşi qılıncların ağ tiyəsində parıldadı. Arvadların arasına çaxnaşma düşdü. Üz-gözlərini cırıb saçlarını yoldular. Dizlərinə, sinələrinə döydülər. Hıçqırıq səsi ətrafı bürüdü. Məscidin həyətindəki kişilər də həyəcanlandılar.

Çapıq Əmrahı gətirdilər. Qabaqda iki, yanlarda iki, arxada da iki keşikçi var idi. Züllə papaq əsgərlər çaxmaqları hərləyib gülləni lüləyə vermişdilər. Az qalırdı ki, süngü ilə kişini dəlik-deşik etsinlər. Çapıq Əmrah gödəkcəsinin yaxasını düymələdi, papağını qaşının üstünə endirdi. Hərəkət etməzdən əvvəl qışın şaxtalı havasını sinəsinə doldurdu. Doymurmuş kimi dalbadal nəfəs aldı. Sonra bir qırğı baxışı ilə kəndi nəzərdən keçirdi. Yollara, həyətlərə, dağların ətəyinə qədər gedən təpəliklərə və göyün üzündə işıldayan günəşə baxdı. Elə bil vidalaşırdı. Ürəyinə dammışdı ki, bu dünyanı bir daha görməyəcək.

Əlini cibinə saldı, gümüş papiros qutusunu çıxartdı. İri bir cığala kağızı götürüb arasını sarı saçaqlı tütünlə doldurdu və eşdi. Papirosun tüstüsünü də hərisliklə sümürdü. Birdən geri döndü. Mustafa kişi ilə nəzərləri çarpazlaşdı. Şura sədri bir-iki addım geri çəkilib əsgərlərin arasında gizlənmək istədi. Bunu görən Fətullayev sinəsini qabağa verdi. Ancaq birdən sarsıldı. Ona elə gəldi ki, Çapıq Əmrahın gözlərində şimşək çaxdı və Fətullayevi ildırım kimi vurdu. Çapıq Əmrah acı-acı gülümsündü və ağlaşan arvad-uşağın içində öz arvadının səsini də eşitdi, üzünü onlara tutub səsini ucaltdı:

– Ağlamayın, kişi qızı kimi mərd olun! Dost var, düşmən var, özünüzü sındırmayın. Ağlaşmanı sonra qurarsınız. Paltar-palazımı ortaya sərib dil deyərsiniz, ürəyinizi boşaldarsınız. – Sonra da üzünü camaata tutdu. Papağını çıxardıb baş endirdi. – Salamat qalın. Mən sizin yolunuzda qurban gedirəm. Əyər yanınızda bir günahım varsa, məni halal eləyin.

Papirosunu son dəfə sümürüb kötüyünü yerə atdı. Ətrafdakı komandirlər, onun nə danışdığını başa düşməsələr də, sakitcə dayanıb gözləyirdilər.

Çapıq Əmrah camaata bir daha baş əydi və qabağa yeridi. Komandirlərdən biri arxa tərəfdən irəli çıxdı. Əlindəki naqanın lüləsini onun kürəyinə zillədi. Tapança açılanda Çapıq Əmrah azca təngildədi və yıxılmamaq üçün özünü tarazlayıb geri döndü. Əlində naqan dayanan rusun üstünə yeridi.

– Adamı arxadan vurmazlar, ay namərd.

Əlində naqan olan komandir Çapıq Əmrahın baxışlarına dözə bilmədi və bir-iki addım geri çəkilib dalbadal atəş açdı. Əmrah hiss elədi ki, gözlərinə qaranlıq çökür, dizləri bükülür. Bir azca da keçsə, dizi üstə çökəcək. Beyni, ürəyi və bütün varlığı ölümlə dirim arasında vuruşan Əmrah dumanlı şəkildə dərk etdi ki, düşmən önündə əyilmək, onun qarşısında diz çökmək olmaz.

Əmrahın sinəsindən qan şoralanırdı. Hələ də ayaq üstə təngildəyən və az qala irəli yeriyəcəyindən vahiməyə düşən komandir qorxusundan bir güllə də atdı. Çapıq Əmrah kökündən kəsilmiş nəhəng ağac kimi arxası üstə yerə sərildi. Onun qolundan yapışıb sürüdülər və hasarın böyrünə uzatdılar. Ağ xalatlı iki həkim gəldi. Ölünün gözlərinə, sinəsinə, ürəyinə qulaq asdılar. Onların göstərişi ilə Çapıq Əmrahın alnına iki güllə də sıxdılar...

## 5

Gün əyilmişdi. Yenidən sazaq başlayırdı. Kimsə hasarın dibinə yaxınlaşdı və tüfəngini gətirmək üçün icazə istədi. Onu iki rus əsgəri süngünün qabağına salıb evinə apardı. Oğlan tövlənin axurunda gizlətdiyi tüfəngi götürdü və əsgərlərə verdi. Onu buraxdılar. Bundan sonra camaat irdələndi, silahlarını gətirib təhvil verdilər. Axşam üstünə yaxın məscidin həyəti boşaldı.

Uzun qılınclı atlı komandirlər qonşu kənddən gətirdikləri dustaqları məktəbin həyətindəki kalafaya doldurdular. Dustaqlar elə zənd etdilər ki, onları elə buradaca güllələyəcəklər. Amma onlara dəymədilər. Aradan bir az keçəndən sonra Qaymaqlı kəndinin sakinlərindən də bir dəstə gətirib onlara qatdılar.

Siyirmə qılınc dayanan atlılar, kalafanın dörd yanını kəsdirdilər və dustaqları başa saldılar ki, onlar yolboyu deyilənlərə danışıqsız qulaq asmalı, keşikçilərin sözündən çıxmamalıdırlar. Kim bu şərtləri pozsa, yerindəcə güllələnəcəkdir. Dustaqlar yola düşmək istərkən arxadan bir qadın səsi gəldi:

– Dərdin alım, ev sarıdan narahat olma. Ocağını sönməyə, çırağını öləziməyə qoymaram. Bir hörüyümü ağ, bir hörüyümü qara hörəcəm, balalarını saxlayacam.

Kişilər elə bil ürəkləndilər. Siyirmə qılınc altında yola çıxdılar. Azacıq sonra kəndin aşağıdakı döngəsində gözdən itdilər.

Camaat səhər yuxudan ayılıb, pəncərədən boylananda kəndi boş gördü. Rus əsgərləri gecə ikən çıxıb getmişdilər. O gündən sonra qız-gəlin səhər-səhər suya gedəndə təzə ipək paltar geyinmədilər. Zinyət taxıb sığallanmadılar. Heç kəsə, heç kimə qımqımı qoşmadılar, zümzümə etmədilər.

# *IX fəsil*

## 1

Qəza mərkəzindən yola düşən fayton Acı Dərəyə çatanda atlı milislər tüfənglərini çiyinlərindən götürdülər. Gülləni lüləyə verib faytondan qabağa keçdilər. Yarğana yaxınlaşıb, qaçaq-quldurun pusquda dayana biləcəyi yerləri tapmaq və yol kəsən varsa, qəfildən üstlərini

almaq üçün hazır dayandılar. Bir xeyli səssiz-səmirsiz ətrafı dinşədilər. Nə gəlib-gedən vardı, nə də bir hənirti eşidilirdi. Təkcə dərənin dibi ilə axan su şırıldayırdı. Bir az da gözlədilər. Sonra milislərdən ikisi dərəyə enib, torpaq yolla aşağı düşdü. Qalanları isə barmaqları tətikdə qolpunlara, yarğanlara göz qoydular. Dərəyə enən atların əvvəl ayaq tappıltısı, sonra da nal şaqqıltısı eşidildi. Gözləyənlər başa düşdülər ki, yoldaşları dərənin dibinə çatdılar, çınqıllı-daşlı çayı keçdilər. Bir azdan isə yoxuşu qalxıb qarşıdakı dikdirdə göründülər. Hamı: bəri üzdə keşik çəkən atlı milislər də, faytondakılar da nəfəslərini dərdilər. Yol salamatlıq idi. Əgər qaçaq-quldur olsaydı, çoxdan meydana çıxmışdılar.

Faytonu əhatəyə aldılar. İki milis qabaqda, iki milis arxada, ikisi də yanda dərəyə endilər. Kələ-kötür yolda silkələnə-silkələnə, hər şıqqıltıdan diksinə-diksinə çayı keçdilər. Dikdirə qalxdılar və tezcə də sağa burulub xır yoluna çıxdılar.

Faytonun küncünə çəkilən yoldaş Fətullayev kəndə yaxınlaşanda onaçılanı taxta qoburuna qoydu. Faytonun irəli çəkilmiş günlüyünü geri qatladı. Küncdən çıxıb qabağa gəldi və yan tərəfə dirsəkləndi.

Çöllər cücərmək istəyirdi. Torpaq şirələşmişdi, quzeylərdə ala-tala qar ağarırdı. Kənd evlərinin bacalarından burula-burula qalxan tüstülər azalmışdı. Fayton kəndə yaxınlaşdı və ikimərtəbəli evin qarşısında dayandı, milislər atdan düşdülər. Yoldaş Fətullayev ayağa qalxdı.

Elə faytonun içindəcə uzun şinelinin üstündən bağladığı onaçılanı yana çəkdi. Aşırmasını düzəltdi. Ulduzlu papağını qaşının üstünə endirdi. Elə bil kəndə gəlməyini hamıya bildirmək, boy-buxununu göstərmək istəyirdi.

Əyninə rəngi solmuş, qara rəngli nimdaş dəri pencək, dabanı və burnu didilmiş çəkmə geyinən və özü-özünə müraciət edəndə belə, "yoldaş Fətullayev" deyən bu adam qəza mərkəzində, idarələrdə özünü yoxsul, işgüzar və inqilabçı komissar halına salırdı. Kəndlərə çıxanda isə görkəmini tamamilə dəyişir və istəyirdi ki, camaatı vahimələndirsin.

Onu kənd şura sədri pilləkənin başında qarşıladı. İki əli ilə görüşdü, yol verdi. Əvvəlcə yoldaş Fətullayev, sonra şura sədri idarəyə keçdilər. İçəri ala-toran idi. Üç pəncərəli bu evin iki pəncərəsinin dal taxtaları qapalı idi. Şura sədri öz yazı masasını küncə qoymuşdu. Elə eləmişdi ki, bayırdan içəri girəndə onun harada oturduğunu görmək mümkün olmasın.

Yoldaş Fətullayev keçib sədrin yerində oturdu. Gözü qaranlığa alışana qədər susdu. Sonra qırıq divana, bir də divar boyu düzülmüş sınıq-salxaq oturacaqlara baxdı. Gözünü hərləyib his basmış tavana, qaralmış divarlara nəzər saldı. Masanın üstündəki çırağın şüşəsi də, dəmir sobanın trubası yerləşdirilmiş divar da qaralmışdı. Yoldaş Fətullayev qanrılıb geri, arxa tərəfdəki divara baxdı. Leninin parçada toxunulmuş şəklini də his basmışdı. Qaşqabağı turşaldı. Şura sədri elə bil onun ürəyindən keçəni başa düşdü.

– Yoldaş Fətullayev, ehtiyat iyidin yaraşığıdır. Belə qaranlıq eləmişəm ki, içəri girən məni görməsin, amma mən onu görüm.

– Çox da qorxaq olma, a kişi, dur pəncərələrin taxtasını aç. Qoy içərinin havası dəyişsin.

– Xətrimə dəyirsən, yoldaş Fətullayev, mən qorxaq deyiləm. Gecələr hamı yuxuya gedəndə yarğanların dibində, cərələrdə qaçaq-quldur axtarıram.

– Yaxşı-yaxşı, incimə. Gəl yaxın otur.

Qaybalı kişi stul çəkib oturdu və diqqətlə Fətullayevin üzünə baxdı.

Fətullayev yan çantasını açdı və möhürlü kağızlardan birini götürüb, xeyli diqqətlə baxdı və sonra itirdiyini sətirlərin arasından tapmış kimi dilləndi:

– Çoban Kərəməli sizin kənddəndirmi?

– Xeyr, yoldaş Fətullayev, bizim kənddə elə adam yoxdu.

– Bəs, aşıq Qarnet necə?

– Evdə olar. Dustaqlıqdan yenicə qayıdıb, – deyə Xondulu tələsik cavab verdi.

– Get, onu bura çağır.

Xondulu dərhal ayağa durdu. Bir azdan aşığı qabağına salıb gətirdi. Fətullayev onun səliqəli nimdaş paltarına baxdı. Kişi qaladan buraxılandan sonra xeyli yaxşılaşmışdı. Fətullayev ilan kimi onun üstünə fısqırdı:

– Yenə qaçaqlara saz çalırsan?

– Çalanda nə olar.

Fətullayev kişinin ətrafında fırlandı və istehza ilə gülümsündü.

– Keçən dəfə yaxanı qurtardın, amma bu dəfə əlimdən heç yana qaça bilməyəcəksən. – Fətullayev birdən-birə ciddiləşdi və aşığın üstünə qabardı. – Səni kim qaçırtdı?

Qarnet ağa diksindi. Əlini köynəyinin cibinə salıb, qatlanmış bir kağız çıxartdı.

– Mən qaçmamışam, məni buraxıblar.
– Kim?
– Kəsəmənli. Bu da mənim azadlıq kağızımdı.
Yoldaş Fətullayev aşığın əlindəki kağızı götürdü, diqqətlə o üzünə, bu üzünə baxdı və sonra çantasına qoydu.
– Yoxlayarıq. Öyrənərik. Sonra sənə cavab verərik.
Yoldaş Fətullayev aşığın keçirdiyi həyəcanlardan, onun təzədən qalaya düşməkdən qorxduğundan elə bil zövq alırdı. Gah gülümsünür, gah da ovçu hərisliyi ilə kişinin üst-başını, boyun-buxununu gözdən keçirirdi.
– Deyəsən, evdə sənə yaxşı baxırlar. Göbək-zad bağlamısan.
Aşıq ilan çalmış kimi dik atıldı, başı toppuza oxşar yumru ağacını havada oynatdı.
– Kimliyinə baxmaram, başını əzərəm. Mənim göbəyimdə sənin nə işin var? Oğraş!!!
Fətullayev kağız kimi ağardı və əlini onaçılanın qoburuna uzatdı. Onun heybətli və vahiməli səsi divarda cingildədi.
– Aparın, Acı Dərəyə qədər. Onda ağlı başına gələr.
Yoldaş Fətullayevin əlləri əsdi. Ayağa durub pəncərənin önündə dayandı. Xondulu aşığı aparandan sonra da xeyli özünə gələ bilmədi. O bu tərəfin camaatının sərt və köntöylüyünü bilirdi. Bilirdi ki, bunlar yeri gələndə sözlərindən dönmür, ölümdən belə çəkinmirlər.
Keçən il bu kəndə gələndə Ömər koxanı yanına – idarəyə çağırtdırmışdı. Xondulunu onun dalınca göndərmişdi. Ömər koxa demişdi ki, böyük kiçiyin ayağına getməz, kiçik böyüyün ayağına gedər. Nə olar mərkəzdən gələndə. Yoldaş Fətullayev məcbur olub qocanın ayağına getmişdi.
Ömər koxa eyvanda taxtın üstündə oturub çay içirdi. Fətullayev içəri girəndə yerindən tərpənmədi. Taxtın aşağı tərəfində ona yer göstərdi. Yoldaş Fətullayev birbaşa mətləbə keçdi.
– Niyə şikayət eləmirsən, a qoca?
Ömər koxa hirslə stəkan nəlbəkini geri itələdi və qonağın üstünə sərtləndi:
– Əvvəla ədəbli ol. Qoca sənin atandı. Mənim adım var. Sonrası da odur ki, məndən nə şikayət istəyirsən?
Fətullayev dirçələn kimi oldu.
– Nəvəni öldürəndən. Gül kimi oğlanı qanına qəltan eləyiblər, siz də susub baxırsınız. Bəs onun qanı yerdə qalacaq? Hayıf almayacaqsınız?

– Bala, sən buraya ayran içməyə gəlibsən, yoxsa ara qarışdırmağa? Get özünə peşə tap. Ölən də mənim uşağımdı, öldürən də. Burnunuzu hər yerə soxmayın.

– A kişi, onlar sinfi düşməndilər, müzür ünsürdülər. Onların kökünü kəsmək lazımdı.

Ömər koxa yavaşca ayağa durdu. Taxtdan düşdü. Fətullayev də yerindən durdu. Ömər koxanın nə deyəcəyini gözlədi. Ağsaqqal daxildən püskürüb gələn hirsini boğdu.

– Bizim tərəflərdə düşmən də olsa, qapıya gələn qonağa ağır söz deməzlər. Ona görə xətrinə dəymirəm. Yoxsa səni itlərin qabağına atıb didik-didik elətdirərdim. Necə gəlmisən, elə də çıx get bu evdən. Yoxsa axırı pis olar.

Fətullayev bunları yadına saldı və azacıq sakitləşəndən sonra, keçib yenidən sədrin yerində əyləşdi.

Qaybalı kişi Fətullayevin sakitləşdiyini gördükdən sonra öz həyəcanını güclə boğdu və kobud səslə soruşdu:

– Belə beyqəfildən gəlməyin xeyirdimi?

Fətullayev cavab əvəzinə bir azca ciddiləşib Qaybalı kişiyə göstəriş verdi:

– Kəndin firqəçilərini, cavan komsomolçuları bura çağır. Firqə özək katibi hardadır? Onu da tapdır.

Qaybalı kişi başa düşdü ki, Fətullayev buraya boş-boşuna gəlməmişdir. Nəsə mühüm bir məsələ var. Onun ürəyinə dammışdı ki, kəndin başı üstündə qara buludlar dolaşır.

"Allah özü axırını xeyirə döndərsin", – deyə ürəyindən keçirdi və bayırdakı milislərdən birini firqə özək katibinin dalınca göndərdi.

Fətullayev yenidən üzünü Qaybalı kişiyə tutdu:

– Silahlı dəstən hazırdırmı? Neçə nəfərdirlər?

– İyirmidən çoxdurlar.

– Onlara da de hazır dayansınlar. Bəlkə lazım oldular.

Qaybalı kişi bu dəfə lap ehtiyatlandı.

– Qaçaq-quldur üstünə gedəcəyik, yoldaş Fətullayev?

Bu dəfə Fətullayev dinmədi. Böyründən asılmış çantasını çıxarıb stolun üstünə qoydu, oradakı möhürlü kağızlardan birini götürüb vərəqlədi.

İdarənin qapısı açıldı. Əvvəlcə kənd firqə özək katibi, sonra isə komsomolçular əllərində silah içəri girdilər. Bir azca da keçdi. Şura sədrinin otağı adamla doldu. İçərini tüstü-duman bürüdü.

Yoldaş Fətullayev hamının yığışdığını yəqin etdikdən sonra yerini rahatladı və gizli bir sirr açırmış kimi söhbətə başladı.

– Bu saat adamlarınızı göndərin kəndə gəlib-gedən yolları kəssinlər. Heç kəsi şenliyə buraxmasınlar. Bizim burdakı danışığımızdan heç kəs xəbər tutmamalıdır. – O, şinelinin yaxasını aralayıb nəfəsini dərdi. – Artıq rəhbərin dediklərinin vaxtı çatmışdır. Qolçomaqları bir sinif kimi ləğv etmək lazımdır.

İçəridəki yaşlı kişilərdən biri qəzetdən bükdüyü maxorka papirosunu bir-iki dəfə sümürüb kötüyü yerə atdı və astaca soruşdu:

– Bunu nə təhər eləyəcəyik, yoldaş Fətullayev?

– Çox sadəcə. Onları arabalara doldurub lazım olan yerə göndərəcəyik. Torpağımız müzür ünsürlərdən təmizlənəcək.

Qaybalı kişi söhbətin bu yerə gələcəyini gözləmədiyindən qəfil xəbərdən diksindi. Gözünün qabağına Çıraq uşaqlarını və Alqazaxlıları gətirdi. Hiss elədi ki, onların başında qaranlıq var. Amma özünü bilməməzliyə qoydu.

– Bizim kənddə də sinfi düşmən varmı, yoldaş Fətullayev?

– Var, özü də lap əməllisindən. İndi biz bu gün o düşmənləri kənddən rədd etməliyik. – Üzünü Qaybalı kişiyə tutdu. – Sən öz adamlarını kəndin Ağalıq hissəsinə göndər, qoy oranı əhatə eləsinlər. Girmələrin, gəmi yollarının ağzını kəssinlər. Gəlib eləyən olsa, heç nə soruşmadan bir baş gülləyə tutsunlar.

Qaybalı kişi acı-acı gülmüsündü:

– Kim gələcək? Kənddə başıpapaqlı, vurub-tutan kişi qalıb ki, meydana çıxsın?

Söhbətin bu yerində Keçəl Xondulu qapını açıb içəri girdi.

Keçəl Xondulu şax addımlarla yeriyib Fətullayevin yanında əyləşdi. Fətullayev arxadan kömək gəlmiş adam kimi Xondulunun üzünə baxdı və qətiyyətlə dilləndi:

– Bu işlərə özün başçılıq elə, uşaqları da götür Ağalıq tərəfə get.

Xondulu hər şeyi bilirmiş kimi heç nə soruşmadan ayağa durdu və həyətdə dayanmış silahlı komsomolçulara işarə etdi və özü də atın belinə sıçradı. İçəridəkilər xeyli susdular. Fətullayevin sonrakı göstərişini gözlədilər. Fətullayev çantasından çıxardığı möhürlü kağıza xeyli baxdı və birdən ayağa durub şinelinin yaxasını düymələdi.

– Vaxtdır, gedək.

Bir azdan idarədən uzaqlaşan atlı silahlı dəstə kəndin Ağalıq şenliyinə tərəf üz tutdu.

## 2

Güllü xanımın qulağı almışdı ki, qonşu kəndlərdən adamları evli-eşikli, arvadlı-uşaqlı arabalara doldurub harasa göndərirlər. Onlara yorğan-döşək, paltar-palaz götürməyə də icazə vermirlər. Adambaşına cəmisi ikicə pud yük götürmək olardı. Güllü xanım gecələr səhərə qədər yerinin içində qıvrılır, hər şıqqıltıya diksinir, bir şey olan kimi ayağa durub otaqda gəzinirdi. Gəlinlərdən xəlvət yaxtanları açır, boxçaları yır-yığış edirdi. Vəzndən yüngül, qiymətdən ağır şeylərini ayrıca bir ehtiyatla paltarlarının ağıla gəlməz yerlərində gizlədirdi. Onun ürəyinə dammışdı ki, evlərinin başı üstdə qaranlıq var.

İki gün bundan əvvəl isə Qaybalı kişi onların yanına gizlincə adam göndərmişdi. Özü ortaya çıxa bilmirdi. Kənddə min göz, min çuğul var idi. Camaatın yarısının bir ayağı Gepoda, bir ayağı da kənddə idi. Şenlikdə biri asqıran kimi şəhər xəbər tuturdu. O, göndərdiyi adamdan Güllü xanıma ismarlamışdı ki, hazırlıq görsün, deyəsən, uzaq səfərə çıxacaqlar. Qaybalı kişi bu evdə çoxlu duz-çörək kəsmişdi, haqqı-salamı itirmək istəmirdi. Güllü xanım gəlinləri yanına çağırdı.

– Gedin, xəlvətcə əl-ayağınızı yığışdırın. Uşaqlara isti paltar götürün. Özünüz də qiymətli nəyiniz varsa, əlçatmaz, gözgörməz yerlərdə gizlədin. Özünüzü də elə aparın ki, guya heç nədən xəbəriniz yoxdur.

Gəlinlər dinməz-söyləməz qayınanalarının tapşırığını yerinə yetirdilər. Ertəsi günü sac asıb çörək bişirdilər. Xurcunlara yığdılar. Bir qarın yağ, bir motal götürdülər. Qışdan qalma qovurmanı xurcuna qoydular. Güllü xanım oğlu Şəmiddin güllələndikdən və Həsən ağanın qaçaqlara qoşulmasından sonra bilirdi ki, bu kənddə salamat yaşaya bilməyəcəklər. Düz on beş gün bundan əvvəl Ceyran çöldəki qoyun sürülərini, mal-qaranı, ilxını aparmış, "Bunlar daha kolxozundur" demişdilər. Güllü xanım nə edə bilərdi. Evdə başıpapaqlı qalmamışdı.

Fətullayevin dəstəsi gələnə qədər Keçəl Xondulu arabaları qoşdurdu. Güllü xanımın göstərişi ilə gəlinlər yükləri arabalara doldurdular. Bir-iki dəst yorğan-döşək, uşaqlara isti paltar götürdülər. Dünən bişirdikləri çörəyi xurcuna qoydular. Güllü xanım yaddan heç nəyi çıxartmamağa çalışırdı. Əli belində həyətin ortasında fırlanır, evlərinin ətrafını kəsdirən silahlı adamlara fikir vermirdi. Yoldaş Fətullayevin dəstəsi gələndə də halını pozmadı.

Gəlinlər köməkləşib bir kisə unu arabaya qoymaq istədilər. Bunu görən Keçəl Xondulu hirslə onların üstünə qışqırdı:

– Bu nədi?! Bəlkə çuvalları da arabaya dolduraq? Yaylağa zada ha, getmirsiniz?

Gəlinlər ona fikir vermədilər. Keçəl Xondulu yəhərin qaşından əyilib tüfəngin lüləsi ilə kisəni kənara itələdi. Ağ un ətrafa dağıldı. Güllü xanımın zəhmli səsi gəldi:

– Ə, a keçəl qurumsax, arvad-uşağın üstünə nə kişilənirsən?

– Ağzını təmiz saxla, ay qarı.

– Qarı anandır, bacındır. Mənim adım var.

– Bilirəm. Amma daha sənin xanımlığın getdi.

Güllü xanım götürə bildikləri şeyləri yığdıqdan sonra arabaya minməzdən əvvəl üzü Kürə baxan samanlığın üstünə çıxdı. Əlini belinə qoyub Kürün sahilinə enən yaşıllıqlara, əyri-üyrü cığırlara, suya enən qız-gəlinə tamaşa etdi. Körpəlikdən gəzib dolaşdığı bu yerlərin elə bil ətrini sinəsinə doldurub saxlamağa çalışdı. Su yolunda, yarğanların altında qızlarla deyib güldüyü günləri xatırladı. Ağalıq şenliyinin qızları Kürü üzüb o taya keçər, meşədən cır alma-armud yığar, Qara bulağın suyundan içib Kürdə çimişərdilər. Güllü xanım su pəriləri kimi çayda çimən, oxuyub zümzümə edən və öz bədənlərinin gözəlliklərinə heyran qalan bu qızların çox vaxt başçısı olardı. Bəzən saatlarla güllü-çiçəkli talaların ortasındakı palıd ağaclarının kölgəsində əyləşib qırqovulların, meşə xoruzlarının səsinə qulaq asmaqdan doymazdılar. Güllü xanım bir andaca xəyalən o günlərə gedib qayıtdı. Köksünü ötürüb qollarını sinəsində çarpazladı. Gözündə giləlməən yaşı sinəsinə axıtdı. Sonra həyətə düşüb astaca addımlarla eyvana çıxdı. Keçəl Xondulu ona acıqlanmaq, arvadı geri qaytarmaq istədi. Bunu görən Qaybalı kişi hirsləndi.

– Ə, nə insafsız adamsan. Qoysana arvad ev-eşiyi ilə halallaşa. Bəlkə bir də buraları görməyəcək.

Güllü xanım içəri keçdi. Bir-bir otaqlara baxdı. Divara vurulmuş xalılara, döşəməyə sərilmiş gəbələrə baxdı, yük yerinə yaxınlaşdı. Oğlanları gedəndən sonra ayrıca saxladığı və hər axşam, hamı yatandan sonra gizlicə qoxuladığı ipək yorğan-döşəyi qucaqladı. O hər gün bu yorğan-döşəkdən balalarının qoxusunu alırdı, ətir saçan qoxusunu. İndi də elə elədi. Yorğan-döşəyi qucaqlayıb dönə-dönə öpdü, qucaqladı. Ürəyinə dammışdı ki, bir daha əli bunlara toxunmayacaq. Balalarının ətrini bir daha duya bilməyəcək. Birdən onu dəli bir ağlamaq tutdu. Yorğan-döşəyi qucaqlayıb çiyni qalxa-qalxa hıçqırdı. Sinəsinə

dolmuş dərdi-qəmi göz yaşı ilə axıtdıqdan sonra yük yerindən aralandı. Bədənnüma güzgünün qabağından keçəndə özünü tanımadı. Bircə anın içində yumaq kimi büzüşmüşdü. Özünə toxtaqlıq verdi, üst-başını düzəltdi. Göz yaşını qurutdu. İstəmədi ki, düşmən onu belə sınğın görsün. Qapıdan çıxanda köksünü ötürdü və qurulu qoyub getdiyi evinə son dəfə baxdı.

Güllü xanım içəridə ev-eşiyi ilə halallaşana qədər bayırda at belində dayananlar öz ürəklərində hər şeyi bölüşdürmüşdülər. Onlar səbirsizliklə arabaların yola düşməyini gözləyirdilər. Güllü xanım özünü sındırmadı, şax addımlarla yeriyib arabaya çıxdı və əli belində ayaq üstündə dayandı.

Keçəl Xondulu da evin ətrafını dolaşdı və birdən gördü ki, Həsən ağanın balaca oğlu Söhrab təzə bir araba təkərini tövlənin böyründə gizlətmək istəyir. Atını birbaş onun üstünə sürdü. Uşağı qamçı ilə budarladı. Güllü xanım bunu gördü və əlini kəmərinin altında gizlətdiyi naqana uzatdı. İstədi güllələrin hamısını onun sinəsinə doldursun. Ani olaraq arabadakılara baxdı. İndi Alqazax uşağından başıpapaqlı qalmamışdı. Bu nəslin arvad-uşağının ümidi təkcə ona idi. Nəsli başsız qoymaq olmazdı.

Keçəl Xondulunun uşağı döyməsini bayaqdan marığa yatan Alan da görmüşdü. O, əvvəlcə zingildədi, qabaq ayaqları üstündə sürünə-sürünə arxadan onlara yanaşdı və birdən atın belinə sıçradı. Xondulunun boynundan yapışıb yəhərdən saldı. Sonra xirtdəyindən yapışdı.

Uşağın da öz tədbiri var imiş. Alan Keçəl Xondulunu atdan salan kimi axşamdan evin zirzəmisinə yığdığı neft tökülmüş ota od vurdu və qaçıb arabaya mindi.

Çıraqlıların arabaları çoxdan xır yolunda idi. Yoldaş Fətullayevin işarəsi ilə Alqazaxlıların köçü də xır yoluna yaxınlaşdı. Güllü xanımgilin evini birdən alov bürüdü. Ətrafdakılar özünə gələnə qədər yanan evlərin çatırtısı və tüstü qarışıq alovları göyə qalxdı. Evin ətrafını kəsən silahlı dəstə özünü itirdi. Yoldaş Fətullayev təlaşla köməyə adam çağırırmış kimi ətrafa boylandı.

– Xondulu hanı?!

Onu axtardılar və dərədə xırıldayıb son nəfəsini aldığı yerdə tapdılar. Gördülər ki, boğazında diş yerləri var. Ətrafa boylandılar və Alanın Kürə atıldığını gördülər. Onun arxasınca düşüb gülləyə basdılar. İt çayı üzüb cələyə keçdi. Sonra da çiləkənlərin arası ilə gözə görünmədən meşəyə adladı.

Ev çatırtı ilə yanıb söndü. Sürgün arabaları xır yolunun döngəsində görünməz oldular. Elə bu zaman meşədən ulartı səsi gəldi, acı bir ulartı. Bu, Alanın səsi idi.

**3**

Səhərə yaxın onların arabasını kiçik bir qəza dəmiryol stansiyasının ucqarında qatarlaşan qələmələrin kölgəsində, ehtiyat yolunda dayanmış vaqonların yanında saxladılar. Keşikçilər arabanın ətrafında fırlanaraq, içindəkilərə düşməyi əmr etdilər. Mürgüləşən uşaqlar, arvadlar oyandılar və bir xeyli harada olduqlarını başa düşmədilər.

Bütün yolboyu gözünü qırpmayan Güllü xanım yuxusunu dağıtmaq üçün azacıq dikəlib gərnəşdi və arabadan yerə düşdü. Toz-torpaqlı yük vaqonları deyəsən çoxdan dolmuşdu. Güllü xanım hiss etdi ki, yaxın kəndlərdən sürgünə göndərilənləri erkəndən gətirmiş və vaqonlarda yerləşdirmişdilər. İndi qapıları kip bağlanmış vaqonların ağzında gəzişən tüfəngli keşikçilərdən başqa heç kəs yox idi.

Onların arabaları qatarın yanında dayandıqda milis paltarı geyinmiş beş-altı kişi dərhal yaxınlaşdılar. Onlardan biri Çıraqlıların adamlarını, sonra Güllü xanımı təpədən-dırnağa süzdü və nədənsə ona “Siz bu vaqonda gedəcəksiniz”, – deyə qapısı açıq olan vaqonu göstərdi.

Güllü xanım Çıraq uşağına işarə etdi.

– Qoyun, bunlar da biznən bir yerdə getsinlər.

Kişi Güllü xanımın uca boy-buxununa diqqətlə baxıb razılaşdı. Sonra yanındakılara göstəriş verib tələsik uzaqlaşdı.

Səhərə yaxın daha da şəffaflaşan ayın işığında vaqonun içi aydınca görünürdü. Hər tərəf toz-torpaq və çirk idi. Güllü xanımın göstərişi ilə öz nəvələri və gəlinləri, eləcə də Çıraqlıların uşaqları vaqona çıxdılar. Arabadan götürdükləri süpürgə ilə döşəməni təmizlədilər. Sonra yerə kilim saldılar.

Arabadakı şeyləri daşıyıb bir küncə yığdılar. Bundan sonra Güllü xanımın əlindən tutub asma pilləkənlə vaqona qaldırdılar. Güllü xanım içəri yığılmış şeylərə, vaqonun o biri başında yerləşən Çıraq uşağının adamlarına diqqətlə baxdıqdan və müəyyən göstərişlər verdikdən sonra: “Paltar-palazınızı, qab-qacağınızı səliqə-səhmanla yığın, deyəsən yolumuz uzun olacaq”, – deyib döşəkçəsini, mütəkkəsini kili-

min üstə saldırdı. O özü də hiss etmişdi ki, uzun yol gedəcəklər. Ona görə də, indidən yerini rahatlayırdı.

Onlar vaqona doluşduqdan və arabalar getdikdən sonra xeyli sakitləşə bilmədilər. Uşaqlar ilk dəfə dəmiryolu gördüklərinə, vaqona mindiklərinə görə sevinir və yol dəyişənlərin arabir çaldıqları fit səsindən ləzzət alırdılar.

Hər şey yerbəyer edildikdən sonra bir milis nəfəri ehmalca başını qapıdan içəri saldı və üzünü Güllü xanıma tutdu:

– Xanım, qab-qacağınız varsa, özünüzlə çoxlu su götürün. Yolunuz uzaq olacaq.

Güllü xanım onun səsindəki mehribanlıqdan başa düşdü ki, kişinin sürülənlərə ürəyi yanır.

– Suyu hardan götürək, dərdin alım? – deyə soruşdu.

– Gəlin göstərim.

Dərhal sənəkləri götürdülər. Vaqondan tökülüşüb kişinin müşayiəti ilə üstünə "kipyatok" yazılmış su borusuna yaxınlaşdılar.

– Bax, bu qaynanmış sudu. Qablarınızı doldurun. Əyər başqa boş qabınız varsa, tez gətirin gəlin, sizi gözləyirəm.

Samovar, cürdək və vedrələri də suynan doldurdular.

Bayaqkı adamlar dəstə ilə gəldilər, hamının içəridə olub-olmadığını yoxladılar və sonra qapını çəkib bağladılar. Güllü xanım başa düşdü ki, zirəzələr cingildədi və qıfıl şaqqıldadı.

Hərə bir tərəfdə özünə yer elədi və azacıq sonra səhər mürgüsü vaqonu bürüdü. Bir Güllü xanım oyaq qaldı, bir də onun gəlini.

Güllü xanımın böyük oğlunun neçə ildən bəri evləndiyinə baxmayaraq övladı olmurdu. Nə qədər nəzir-niyaz demiş, qurban kəsdirmiş, pirə gedib dua yazdırmışdılarsa da, xeyri olmamışdı. Amma çox qəribə idi ki, kənddə işlər qarışan zaman gəlin birdən-birə hamilə olmuş və oğlan doğmuşdu. Ailənin sevinci yerə-göyə sığmırdı. Bəlkə də elə buna görə Şəmiddin qardaşı Həsən ağa ilə getməmişdi. O, yurdunda qalacaq oğlunu böyütmək arzusu ilə yaşayırdı. Ancaq onu gecə apardıqdan və geri qayıtmadığından gəlinin ürəyi uşağın üstündə nanə yarpağı kimi əsirdi. O, hər şeyi unutmuşdu. Evi-eşiyi yaddan çıxartmışdı. Fikri-zikri körpəsi idi. Gündüzlər pərvanə kimi başına fırlanır, gecələr də gözünə yuxu getmir, onun keşiyini çəkirdi. Güllü xanım gəlinini və nəvəsini gözaltı süzür, onlara xəlvəti göz qoyur, oğrun-oğrun izləyirdi.

O, üzə vurmasa da, gəlindən daha çox narahatlıq keçirirdi. Oğlunun yurdunda qalacaq bu uşaqla nəfəs alırdı. Onun səsi çıxan kimi ürəyi döyünürdü. Tez-tez əllərini göyə qaldırıb "Ey yeri-göyü yaradan Tanrı, Sən balamın yurdunda cücərən bu körpəni özün xətadan-bəladan xilas elə. İraq canından, oğlumu sonsuz, yurdunu boş qoyma. Görünür, balamın başı əlində deyil, salamat olsaydı, indiyəcən bir xəbəri çıxardı. Allah mərdiməzarların evini yıxsın. Mənim balam kimə nə pislik eləmişdi?"

İndi vaqonda, küncdə, döşəkçə üstündə oturan Güllü xanım gəlinindən gözünü çəkmir və onun uşağı necə yorğana bükdüyünə, necə sinəsinə sıxdığına, nəfəsini uşağın üzündə necə gəzdirdiyinə, ətirli şamama qoxulayan kimi, necə qoxuladığına göz qoyurdu. Gəlin isə bunlardan xəbərsiz idi. O, uşaqdan başqa heç nə görmür, uşağın mışıltısından başqa heç nə eşitmirdi.

Vaqonlar silkələndi. Parovoz içini arıtlayıb gəhilti ilə tərpəndi. Yükün ağırlığından fısıldadı və təkərlər relsin üstündə fırlanıb özünü bərkitdi və qatar asta-asta tərpəndi.

Güllü xanım başa düşdü ki, deyəsən, bu gedişlə el-obadan həmişəlik ayrıldılar.

**4**

Qatar 3 gün, 3 gecə yol getdi. Vaqonun havası kəsifləşdi. Yolboyu içəridən qapını ha döydülər, ha xahiş etdilər, onu bir azca açsınlar, ancaq bayırdan bircə cavab eşitdilər: "Ne polojeno". Güllü xanım bu sərt sözlərdən başa düşdü ki, indi qatarı müşayiət edənlər züllə papaq əsgərlərdi. Onlar "Ne polojeno" deyə qışqırdıqları zaman vaqonların ağzında itlər səs-səsə verib hürüşüb taxtaları cırmaqlayırdılar. Qatar hərdənbir hardasa dayananda belə qapını açmayan əsgərlər hirslənib tüfəngin qundağı ilə qapını döyəcləyib hətta camaatı qorxutmaq üçün göyə atəş də açırdılar.

Bir həftədən sonra Güllü xanımgil başa düşdülər ki, heç yerdə vaqonlar dayanmayacaq və abır-həya itəcəkdi.

Vaqonun ortasından pərdə çəkdilər. Uşaqlar, elə böyüklər də küncə iri qazan qoyub, utana-utana, hətta ağlaya-ağlaya təbii ehtiyaclarını ödədilər.

Vaqonun havasından baş çatlamağa başladı. Bayırdan isə bircə səs eşidilirdi. "Ne polojeno", dalınca da it hürməsi...

Bir gün gəlin körpəsini qucağına alıb, ağzında yaşmaq qayınanasının yanına gəldi. Uşağı Güllü xanıma görsətdi. Nənə nəvəsinin xumar gözlərinə, qımışan dodaqlarına, çatmaqaşlı bəyaz sifətinə diqqətlə və fərəhlə baxdı. Gəlin qayınanasının dodaqlarında ömründə ilk dəfə təbəssümə bənzər bir şey gördü. Bir az da ürəkləndi.

– Ana, gəlsənə bu uşağın adını Əvəz qoyaq.

Güllü xanımın dodağındakı təbəssüm yoxa çıxdı. Qaşqabağı töküldü və sifətini sərt bir ifadə bürüdü. Onun səsində də bir sərtlik hiss olundu.

– Bu ad hardan ağlına gəldi? Onun atasına nə olub ki, adını Əvəz qoyuruq. Mənzil başına çatarıq, özüm ona ad da qoyacam, qurban da kəsəcəm.

Gəlin kor-peşman geri qayıtdı.

Həmişə anasının qoynunda mışıl-mışıl yatan uşaq bir gecə səhərə qədər ağladı. Gəlin nə qədər layla çaldı, uşağı sinəsinə sıxdısa da, sakitləşdirə bilmədi. Güllü xanım başa düşdü ki, körpəyə nəsə olmuşdu.

Uşağın zağıltısı getdikcə çoxalır və səsi vaqonu başına götürürdü. Bu səs aradan xeyli keçəndən sonra güclə nəfəs alan körpənin hıçqırığına çevrildi və səhərə yaxın tamam kəsildi. Gəlin də uşağı qucağına sıxıb onun üzünə tamaşa edib sakitləşdi. Güllü xanım da azacıq rahatlandı.

Hava açıldı, gün xeyli qalxdı. Vaqonun içi işıqlandı. Ancaq nə mürgüləyən gəlinin səsi gəldi, nə də uşağın. Güllü xanım ehmalca ayağa durub onlara yaxınlaşdı və gördü ki, uşağın gözləri hərəkətsiz halda tavana zillənmişdi və ağzı azca aralanmışdı. Dünya görmüş arvad başa düşdü ki, körpə anasının qucağında canını çoxdan tapşırmışdı.

Heç kəsə sezdirmədən, sakitcə, için-için ağladı, göz yaşlarını sinəsinə axıtdı. Bir az özünü toxtatdıqdan sonra əyilib uşağı gəlinin qucağından aldı. Gəlin diksinib yuxudan ayıldı və körpəsini qayınanasının qucağından götürmək istədi. Güllü xanım uşağı anasına verməzdən əvvəl gəlininin sifətinə elə bir ifadə ilə baxdı ki, arvad sarsıldı. Gözünü zilləyib uşağa və sifəti tunc kimi bozarmış qayınanasına baxdı və başa düşdü ki, balası yoxdu. Əlini uzadıb saçını yolmaq, üzünü cırmaq və haray salıb dünyanı başına yığıb, hamını dərdinə şərik etmək istədi. Amma Güllü xanımın sərt sifətini və sərt baxışlarını gördü.

– Kişi qızı ol, dost var, düşmən var!

Vaqonun küncünə döşəkçə saldılar. Uşağı ora uzatdılar. Bütün yolboyu ehtiyatla işlətdikləri suyun qalığı ilə yudular və kəfənlədilər. Bundan sonra vaqondakılar – Alqazax və Çıraq uşağının adamları körpənin üstündə için-için ağlaşdılar. Qapını içəridən döydülər. Bayırdan eyni səs eşidildi. "Ne polojeno". Sonra da vaqonu cırmaqlayan it hürdü. İçəridən bir təhər başa saldılar ki, adam ölmüşdür.

Aradan xeyli keçdi. Qatarın sürəti azacıq azaldı. Qapı aralandı. Dərddən keyimiş gəlin daş kimi quruyub yerində qalmışdı.

Güllü xanım meyiti qucağına alıb azacıq aralanmış qapıya yaxınlaşdı və elə zənn etdi ki, vaqon dayanacaq, onlar yerə töküləcək və uşağı öz əlləri ilə basdıracaqlar. Ancaq uşağın meyitini onun əlindən aldılar, qapı dərhal örtüldü və tanış səs eşidildi: "Ne polojeno"...

Güllü xanım iki gün yatmadı. Gəlinini gözdən qoymadı. Gəlin elə bil keyikmişdi. Deyəsən, başına hava gəlmişdi. Güllü xanım gördü ki, gəlini əlinə keçən parçaları bürələyib bükdü, uşağın paltarını ona geyindirdi və qundaq kimi qucağına alıb sinəsinə sıxdı.

Gəlin uşaqla oynayır, gülür və ona aramsız layla çalırdı. Onun oxuduğu şirin oxşamalar Güllü xanımın sinəsini deşik-deşik edirdi.

"Balama qurban alçalar,
Balam havaxt əl çalar.
Balama qurban inəklər,
Balam nə vaxt iməklər".

Güllü xanım gəlininin səhərəcən eyni laylaları, oxşamaları dediyindən vaqondakıların da yata bilmədiyini görür və gəlininə sakitcə öyüd-nəsihət verirdi: "Qızım, səs salma, qoy uşaq yatsın. Görmürsənmi, tifil yenicə yuxuya gedib".

Qayınanasının bu sözlərindən sonra gəlin əskidən düzəltdiyi uşağı sinəsinə basıb mürgüləyirdi.

Bir gün Güllü xanım gördü ki, gəlinin də səsi gəlmir. Həmişə səhər tezdən oyanan və "körpə"sinə layla çalan gəlin tərpənmir. Arvadın ürəyi titrədi və gördü ki, gəlin "körpə"sini bağrına basaraq keçinmişdi...

Yolun harasındasa qatarı dayandırdılar, yanlarında boynu zəncirli it olan keşikçilər vaqona yaxınlaşdılar. Qapını açıb cənazəni götürdü-

lər. Vaqondakılar meyitin dalınca düşmək istədikdə qapı şaqqıltı ilə örtüldü və eyni tanış söz eşidildi: "Ne polojeno".

Güllü xanımın yadında qalın, ucsuz-bucaqsız meşəlik, bir də gəlininin züllə papaq əsgərlərin sürüyüb vaqondan saldıqları meyiti qaldı.

**5**

Onları meşə kənarındakı ucqar bir stansiyada vaqondan düşürdüb, dörd təkər arabalara doldurdular və meşənin dərinliyinə gətirdilər. Burada ətrafı tikanlı məftillərlə çəpərlənmiş daxmalar var idi. Gələnləri daxmalara bölüşdürdülər.

## *X fəsil*

**1**

Kəsəmənlinin atlı dəstəsi Naltökən yaylağına qalxırdı. O bilirdi ki, bu il də kənd camaatı Noylu bulağın üstündə dəyələrini qurmuşlar. Onun məqsədi həmin dəyələrin həndəvərində dolaşan, bir təhlükə olan kimi qaçıb meşələrdə daldalanan qaçaqların başçısı Halay bəylə görüşmək idi. Halay bəy heç kəsə dəyib-toxunmadığından özündən arxayın idi və binələrin ətrafında başını girləyirdi. Kəsəmənli bu yaşlı və gözəl müəllimin nə üçün çöllərə düşdüyünü tam aydınlığı ilə anlaya bilmirdi. Qəzada qaçaqların sayı çoxalırdı. Belə getsə, kəndlərdə hörmətli adam qalmayacaq, hamısı meşələrə, dağlara çəkiləcəkdi.

Kəsəmənli qərara almışdı ki, Halay bəyi üzə çıxartsın. Elə bu məqsədlə də yaylağa qalxırdı. Yollar qorxulu idi. Kəsəmənli öz dəstəsi ilə meşənin xəlvəti cığırları ilə irəliləyirdi. Yaylağa qalxdıqca hava təmizlənir və adam nəfəs almaqdan doymurdu. O, əvvəllər el yaylağa köçəndə dağa qalxar və ellə birlikdə arana dönərdi. Amma neçə il idi ki, bu tərəflərə ayaq basa bilmirdi.

Meşə qurtardı. Yaylağın çəmənliyi, güllü-çiçəkli yamacları göründü. Dəyələr Noylu bulağın üstünə səpələnmişdi. Lap kənarda balaca bir alaçıq var idi.

Kəsəmənli bu çadırın Halay bəyin olduğunu zənn etdi və atın başını qanırıb o tərəfə sürdü. Hardansa qayaların dibindən çıxan tüfəngli adamlar onların yolunu kəsdilər. Çaxmaqlar şaqqıldadı.

– Kimsiniz, hara gedirsiniz?

Kəsəmənli cilovu çəkib atı saxladı.

– Halay bəyi görmək istəyirik.

– Halay bəy kimdir, a kişi?

– Sizin başçınız. Ona deyin ki, Kəsəmənli səni görmək istəyir.

Qaçaqlar özlərini bilməməzliyə vursalar da, Halay bəyin yanına getdilər və Kəsəmənlinin onu görmək istədiyini söylədilər.

Halay bəy tüfəng qucağında mütəkkəyə söykənərək mürgüləyirdi. Ona soyuq dəymişdi. İxtiyar çağında dağda, dərədə dolaşa bilmirdi. Kəsəmənlinin adını eşidəndə ayağa durdu və üzünü keşikçilərə tutdu.

– Buraxın gəlsin!

Kəsəmənlini dəyənin yanına gətirdilər. Atının cilovunu tutdular. Kabı kişi içəri girdi. Dəyənin ortasında ayaq üstdə duran Halay bəy ilə qucaqlaşdılar. Bir xeyli beləcə dayandılar.

Halay bəyin göstərişi ilə qaçaqlar balaca süfrə açdılar, ortalığa çay-çörək qoydular. Kəsəmənli Halay bəyin solmuş bənizinə, qırxılmamış üzünə baxdı və astadan soruşdu:

– Necə dolanırsan?

Halay bəy könülsüz cavab verdi:

– Özün görürsən də. Qoca vaxtı çöllərə düşmüşəm.

– Axı, səni yerindən, yurdundan kim oynatdı?

Halay bəy cavab əvəzinə əlini pencəyinin döş cibinə uzatdı və oradan əl boyda göy bir kitabça çıxartdı.

– Rəhbərin altı şərtini oxumusanmı? Stalini deyirəm. Orda yazılıb ki, "Öz kadrlarımız yetişənə qədər köhnə mütəxəssislərdən istifadə edəcəyik". Cavanların hərəsi bu kitabçadan birini götürüb iclaslarda, yığıncaqlarda, dərslərdə üstümüzə qışqırırlar: "Siz köhnə ziyalılarsınız. Hələlik sizdən istifadə edirik. Özümüzünkülər yetişən kimi sizin hamınızı qovacayıq". Hətta dərsini bilməyən tələbələrdən biri sinif uşaqlarının qarşısında mənim üstümə qışqırdı: "Halay bəy, sənin mülkədar təbiətin istəmir ki, mənim kimi kəndli balası elm sahibi olsun. Amma unutma ki, mənim səni parçalayacaq qədər iti dişlərim və dırnaqlarım var!" İndi sən özün söylə, Kabı, mən belə adamlarla necə dolanım?

Kəsəmənli diqqətlə ona qulaq asdı və astaca gülümsündü.

– Meşə çaqqalsız olmaz, Halay bəy, sən hər gədə-güdənin sözündən niyə inciyirsən?!

– Mən gədə-güdələrin sözündən incimirəm, onlardan qorxuram. Onlar rəhbərin altı şərtini əsas götürərək nə oyun desən, çıxarda bilərlər. Şərtlərdən biri də budur ki, "Qolçomaqları bir sinif kimi ləğv etmək". Bax bunlar adamları bir-birinə qırdırmaq deməkdi.

Kəsəmənli Halay bəyi diqqətlə dinlədikdən sonra astadan sözə başladı:

– A bəy, bir qulaq as, hər gədə-güdənin sözü səni qorxutmasın. Biz qan töküb gədalar üçün hökumət qurmamışıq. Yadındadımı, hələ seminariyada oxuyanda sən maarifçilik yolu ilə getməyi qarşına məqsəd qoymuşdun. İndi sən bizə daha çox lazımsan. Xalqımızı maariflәndirmək lazımdır. İndi bizim ziyalılara daha çox ehtiyacımız var. Arzularımız baş tutduğu yerdə sən nahaq geri çəkilirsən, Halay bəy!

Halay bəy ani olaraq xəyalən gənclik illərinə, ilk müəllimlik çağlarına getdi və o günlər üçün burnunun ucu göynədi.

Halay bəy xatirələrinə ara verib diqqətlə Kəsəmənlinin üzünə baxdı.

– Elə bilirsən, onlar sənə inanırlar?

Kəsəmənli bu gözlənilməz və sərt sualdan diksindi. Qan sağılmış gözləri müsahibinin üzünə zilləndi. Elə bil birdən-birə sifəti codlaşdı. Halay bəy hiss etdi ki, Kabının qaşları səyridi.

Halay bəy başa düşdü ki, dostunun qüruruna toxunmuşdu. O, Kəsəmənlinin söz götürən olmadığını uşaqlıqdan bilirdi. Amma ürəyindəki sözləri axıracan deməyi qərara aldı.

– Mən sənin inamına şübhə etmirəm. Dediyin sözdən dönməyəcəyini də bilirəm. Bilirəm ki, sözünə bütöv adamsan, tüpürdüyünü yalayan deyilsən. Ölərsən, amma namərdlik eləməzsən. Ancaq mən onlardan qorxuram.

– Onlar kimdi?

– İş başına doluşan namərdlər. Nə çoxdur anasının əmcəyini kəsənlər. Onlar sənə hörmət edirlər, çünki sən onlara lazımsan. Səni ən qorxulu yerlərə göndərirlər. Qaçaq-quldur üstünə yollayırlar. Sən onları öldürsən də, bunların xeyrinədi, başına bir iş gəlsə də. Mənim sözlərimdən incimə, Kabı, özün bilirsən ki, mən açıq danışanam.

Kəsəmənli ayağa durdu.

– Deyəsən bizim söhbətimiz baş tutmayacaq, Halay bəy, inamını nə yaman itirmisən? Mən səni üzə çıxartmaq istəyirəm. İstəyirəm ki, sənin kimi gözəl bir müəllim dağlara, daşlara düşməsin. Qəza firqə özək katibi ilə də məsləhətləşmişik. Xalq maarif komissarlığına yazmışıq. Səni seminariyaya müdir təyin etmək istəyirik, öz təcrübəndən istifadə edəsən, gözəl müəllimlər hazırlayasan. Kəndlərimizdə məktəblər açırıq, hələlik orda üçaylıq, altıaylıq müəllimlər kursunu qurtaranlar dərs deyir. Bizə isə savadlı müəllimlər lazımdı.

Kəsəmənli üst-başını düzəldib alaçıqdan çıxmaq istədi. Halay bəy onun qolundan yapışdı.

– Kabı, mən heç nədən qorxmuram. Ölümə də aparsan, gedəcəm. Səni əliboş geri qaytarmaram. Amma ürəyimdəkiləri sənə deməli idim.

– Bir də, Halay bəy, sən nə cinayət işləmisən? Adam öldürməmisən, yol kəsməmisən. Sən gəl, mənim dediklərimə inan. Bu dünyada kişilik də var, mərdlik də. Sözünə bütöv adamlar çoxdu. Sən gəl, ətəyindən daşı tök, gedək evə. Mən qoymaram başından bir tük əskik ola.

Halay bəy dinmədi. Stəkanı qabağına çəkib fikirli-fikirli çayını içdi. Kəsəmənli hiss etdi ki, o, qəti qərara gələ bilmir. Qoca vaxtı dağlarda, daşlarda dolaşmaq onu bezdirmişdi. Bunun qışı var, çovğunu var, qorxusu, səksəkəsi var. Dolanmaq o qədər də asan deyil. Öz dəstəsinə söz vermişdi ki, beş-on günə buralardan baş alıb gedəcək və Arazın o tayına keçəcəklər. O, çayını içib stəkanı geri itələdi və üzünü Kəsəmənliyə tutdu.

– Yox, Kabı, beş-on gün hərlənib keçəcəm o taya, yoldaşlarıma da söz vermişəm. Onları yarı yolda qoya bilmərəm.

– Yox, Halay bəy. Mən əliboş geri qayıda bilmərəm. Gəlmişəm, səni özümlə aparacam.

– Bəs yoldaşlarım?

– Onları da.

Ayağa durdular. Halay bəy Həsən ağanı yanına çağırdı. Dəyənin böyründə xeyli pıçıldaşdılar.

– Məni on gün gözləyin. Dalınızca gələcəm. Ya üzə çıxacayıq, ya o taya gedəcəyik.

Halay bəy atın belinə qalxıb Kəsəmənlinin dəstəsi ilə yola düşdü.

## 2

Gecədən xeyli keçmiş qapının ağzında üstü örtülü bir maşın dayandı. Milis işçiləri yolu kəsdilər. Onlardan iki nəfəri təpiklə qapını açdı və barmaqları tətikdə içəri girdilər. Halay bəy pencəyini soyunmuşdu. Balalarını dizinin üstünə almışdı. Düz iki gün idi ki, onlarla oynayırdı. Uşaqlar atalarının boynunu qucaqlayır, onun sinəsinə qısılırdılar. Halay bəy yatanda da oğlunun hərəsini bir qolu üstünə alır və uzun müddət onların körpə mışıltısına qulaq asırdı. İndi milislər içəri girəndə uşaqlar yenə onun dizinin üstündə idi. Halay bəy uşaqları qucağından düşürtdü və təşvişlə gələnlərin üzünə baxdı.

– Halay bəy, paltarını geyin, bizimlə gedəcəksən!

– Hara?

– Yoldaş Fətullayevin yanına.

Halay bəy diksindi. Yavaşca ayağa durub, paltarını geyindi. Otaqdan çıxmazdan əvvəl dönüb evinə, uşaqlarına və arvadına baxdı. Köksünü ötürdü. Onu maşına qoyub qapını üzünə bağladılar.

Maşın silkələnə-silkələnə kələ-kötür yollarla yarım saat getdikdən sonra dayandı. Onu düşürtdülər. Halay bəy qaranlıq və kəsif havadan sonra yay gecəsinin təmiz havasından doyunca nəfəs aldı və bir müddət hara gətirildiyini ayırd edə bilmədi. Bişmiş kərpicdən tikilmiş hündür hasarın ortasındakı iri dəmir darvazanı döydülər. İçəridən səs gəldi.

– Kimdi?

– Açın qapını, dustaq gətirmişik.

Zirəzələr, siyirmələr cingildədi. Qapı azca aralandı və Halay bəyi içəri saldılar.

Halay bəy başa düşdü ki, onu şəhərin kənarındakı qalaya gətiriblər. El arasında buraya "Şəkərin qalası" deyirlər. Qala qırmızı kərpicdən tikilmişdi. İkimərtəbəli böyük bina idi. Geniş həyəti və hündür hasarı var idi. Pəncərələri dəmir çərçivəyə alınmışdı və ölü gözü kimi qaralırdı.

Keşikçi milislər onu içəri apardılar. Qapını arxasınca bağladılar. Üfunətli və boğanaq havadan az qala boğuldu. Tavandan təkəm-seyrək elektrik fanarları asılmışdı. Onların içində ildırım zolaqları kimi kəsişən işıq telləri şəhərin elektrik stansiyasının motor səsinə uyğun olaraq gah şiddətlənir, gah da öləziyirdi. Qala ikimərtəbəli idi. Dəmir

barmaqlıqlarnan hissələrə ayrılmışdı. Bura qaladan çox karvansaraya oxşayırdı. Görünür, nə vaxtsa bu binanı tikdirən "Şəkər kişi" heç nəyi nəzərə almamışdı.

Halay bəy içəridəki şıqqıltılardan başa düşdü ki, qalada dustaqlar var. Onlar divar boyu uzanmışdılar. Bəziləri oturub söhbət edir, bəziləri isə tünd, turşməzə havaya dözməyib öskürüşürdülər. İçəri təzə dustaq gətirildiyini görüb söhbətlərinə ara verdilər.

Halay bəy gözləri qaranlığa alışmadığından haraya gedəcəyini bilməyib ortada dayandı. Elə bu vaxt küncdən səs gəldi.

– Bu tərəfə gəl, burda yer var.

Halay bəy küncə doğru getdi.

Döşəməyə ot tökmüşdülər. Dustaqlara yorğan-döşək əvəzinə quru ot vermişdilər. Halay bəy küncə çatanda ordakılarnan astaca salamlaşdı və otun üstündə oturdu. Gecədən xeyli keçəndən sonra səs-səmir kəsildi. Hərə bir tərəfdə büzüşüb yuxuya getdi.

Halay bəy isə əllərini başının altında çarpazlayıb arxası üstə uzandı. Gözlərini tavana zillədi. Gah közərən, gah da öləziyən şimşəkvari tellərin qızartısına tamaşa elədi. İşıqlar can verən xəstə adamın ürəyi kimi, gah döyünür, gah da nəbzini itirirdi. Qulağına səs gəldi. Dinşədi. Bu zəng səsi idi. Qala hasarının üstündə keşik çəkənlərin bir-birini yoxlaması idi.

Növbədə duran hər keşikçinin yanında iki dəmir parçası var idi. Biri havadan asılmışdı. O biri isə toxmağa bənzəyirdi. Hər yarım saatdan bir baş darvazanın yanındakı keşikçi bu dəmirləri danqıldadırdı. Onu eşidən ikinci, üçüncü və dördüncü keşikçi də öz "zəng"ini çalırdı. Beləliklə səhərə qədər bir-birilərini vaxtaşırı yoxlayırdılar.

Halay bəy bu yeknəsəq danqıltılara qulaq asdı və hətta bu danqıltıları saymağa başladı. Onun yadına Qarayazı meşəsində, gecə sakitliyində səhərə qədər bir-birini çağıran anadillərin qərib, məhzun səsi gəldi.

Günortaüstü dustaqları həyətə, gəzintiyə çıxartdılar. Halay bəyin qulağına gözləmədiyi halda zurna səsi gəldi. Bu Hümmətin dəstəsi idi. Kəsəmənli keçən dəfə qalanı yoxlamağa gələrkən onları burda görmüş və təəccüblə soruşmuşdu:

– Sizi niyə buraya gətiriblər?

– Qiyas bəyin oğlunun toyunu biz eləmişik, ona görə.

Kəsəmənli bir şey anlamasa da, gülümsündü və yarı zarafatla soruşdu:

– Zurna-dəfinizi də gətirmisinizmi?

İndi də Hümmət çaşıb qaldı.

– Yoldaş naçalnik, heç bura zurna-balaban yeridi?

Kəsəmənli elə o günü kəndə adam göndərdi, Hümmətin dəstəsinin zurna-dəfini gətirtdi və qala rəisinə tapşırdı ki, bundan sonra günorta gəzintisi vaxtında icazə ver, çalıb oynasınlar. Soruşan olsa, deyərsən ki, Kəsəmənlinin göstərişidir.

– Üzümə təəccüblə baxma. Nə olar dustaq olanda. Onlar da insandır. Qoy bir az şadlansınlar.

– Bəs...

– Bilirəm, nə demək istəyirsən. Qələt eləyir.

O gündən günorta gəzintisi toy-düyünlə keçirdi.

Dustaqlar cərgəyə düzüldülər. Keşikçilər onları saydılar, sonra da gəzməklərinə icazə verdilər. Yaşlı və özlərini bir az nasaz hiss edən dustaqlar hasarın dibində domuşuqlu oturdular. Cavanlar xeyli ortada fırlandılar. Onlardan biri qolunu çırmayıb üzünü zurnaçıya tutdu:

– Ay Hümmət qağa, bir dirə-döymə havası çal.

Cavanlar dəstələrə bölündülər, meydanın ortasında dairə çəkdilər. Hümmət zurnanın səsini zilə qaldırdı və cavan dustaqlar hay-haraynan oyuna başladılar. Bayaqkı oğlanın səsi yenidən eşidildi:

– Ay Hümmət qağa, indi də güləşəngi çal, görüm, qabağıma kim çıxacaq?

Gəzinti qurtardı. Keşikçilər dustaqları içəri doldurdular. Bir anlığa hər şeyi unudan Halay bəy də içəri keçmək istərkən ona bir bağlama verdilər. Halay bəy təəccüblə keşikçiyə baxdı.

– Bu nədir?

– Yeməkdi, sizə göndəriblər.

– Kim göndərib?

– Çoban Kərəməli. Dedi ki, adımı deyin, Halay bəy özü tanıyacaq.

Ertəsi günü gəzintidən sonra Halay bəyi içəri buraxmadılar. Qolundan tutub qapının ağzında saxladılar. İki milis nəfəri onu qalanın arxa tərəfindəki böyük meydana apardı. Halay bəy qala divarlarının dibinə baxa-baxa xeyli sakitcə addımladı. Torpaq kələ-kötür idi. Bəzi yerlərdə aşağı çökmüş, bəzi yerlərdə isə qabarmışdı. Ona bel verdilər və hasarın dibini qazmağı əmr etdilər. Halay bəy heç nə anlamasa da, beli götürdü və torpağı eşməyə başladı. Elə bu vaxt bir əl çiyninə toxundu.

– Müəllim, beli mənə ver, sizə zəhmət olar.

Əlini uzadıb Halay bəydən beli aldı. Müəllimin sual dolu baxışlarını gördü və astaca gülümsündü:

– Siz mənə dərs demisiniz. Xeyli vaxtın söhbətidir, yadınızdan çıxmış olaram. Çox zəhmli idiniz. Amma biz, tələbələr, sizi bir-birimizə görsədib "Riyaziyyatın allahıdır" deyirdik. Siz bizə Kiselyovun "Rəhbər cəbr kitabını" dönə-dönə izah edirdiniz. Kim Şapoşnikovun kitabındakı məsələ və misalların hamısını həll etməyibsə, onu imtahana buraxmırdınız. Gecələr də məşğələyə gəlir, ən çətin məsələləri izah edir, bizim hər şeyi başa düşdüyümüzə əmin olduqdan sonra evə gedirdiniz. Yaxşı günlər idi, müəllim!

Bu sözləri deyən milislərin başçısı idi. Onun otuz-otuz beş yaşı ancaq olardı.

Halay bəyi gözdən qoymasalar da, bir az sərbəst gəzməsinə imkan verdilər. O, balaca bir təpənin üstündə dayandı, qəza mərkəzi olan kiçik şəhərin yanından keçən çayın qıjıltısına qulaq asdı. Kəndlərə uzanan əyri-üyrü yollara, Didvan dağının ətəyindən burulub Dilican dərəsinə gedən xır yoluna, uzaqdan ağ buludlara bürünmüş Göyəzən dağının zirvəsinə və Avey tərəflərə baxdı. Hər şey sakit, hər şey ona məhzun kimi göründü...

Gecə yarıdan sonra qalanın qapısı aralandı.

Keşikçilərin amiranə səsi eşidildi:

– Halay bəy kimdi?

– Mənəm.

Dustaqlar yerlərində tərpəşdilər. Keşikçilər isə ayağa durub onlara yaxınlaşan Halay bəyi geri qaytardılar.

– Paltar-palazını da götür.

Bu, pis əlamət idi. Buradakı dustaqlar bilirdilər ki, gecə yarısı aparılan məhbusların başında qaranlıq var. Paltar-palazın götürülməsi onun bir daha geri qayıtmayacağına işarə idi. Gecə yarısı paltar-palazla aparılan məhbusları ya vaqonlara doldurub yatapla uzaq – qarlı, meşəli Sibirə, ya da o dünyaya göndərirdilər.

Halay bəyi qala divarının dibində qazılan və torpağı qaralan çuxurun yanına gətirdilər.

Hava sərin idi. Ağacların yarpaqları astadan xışıldayırdı. Gecənin səhərə yaxın sükutu ətrafı bürümüşdü. Arabir dəmiryol vağzalından parovozların kəsik fit səsləri eşidilirdi. Sonra vaqon təkərlərinin yeknəsəq, ahəngdar taqqıltısı gəlirdi. Halay bəy bir anda səyyar xəyalın

ağuşunda ötən günlərə qayıtdı. Həmin vaqonlarda Tiflisə, oradan da Qoriyə, seminariyaya oxumağa getdiyi günləri xatırladı. Sonra dönüb göyün üzünə baxdı. Ulduzlar sayrışırdı. Amma bir parça ağ bulud, ayın ətrafında dolaşırdı. Adama elə gəlirdi ki, ay buludların üstünə yeriyir. Halay bəy uşaq vaxtı yay günlərində ayla buludların bu cür "döyüşlərinə" çox tamaşa etmişdi. Anası həyətə gəbə döşəyər, üstünə yorğan-döşək sərər və uşaqlarını açıq havada yatırdardı. Bax, o günlərdə Halay bəy arxası üstə uzanıb saatlarla ulduzlara baxar və buludların üstünə yeriyən aya tamaşa edərdi. El arasında "Karvan yolu" deyilən kəhkəşan ulduzları haçalanmış yol kimi uzanıb gedirdi. Deyirdilər, uzaq, müqəddəs yerlərə ziyarətə gedən zəvvarlar gecələr karvanlarını çəkib bu yolun işığı ilə Qüdsiyyətə doğru addımlayırlar. Halay bəy qazılmış çuxurun kənarında dayanaraq karvan yoluna səpələnmiş sayrışan ulduzlara baxdı və yolun onun ruhunu haraya aparacağını düşündü.

Elə bu vaxt ağacların başında yaşayan və indiyəcən heç kəsin görmədiyi anadil quşlarının bir-birini səsləyən məhzun səsi eşidildi. Halay bəyin bu dünyadan qəflətən gedərkən eşitdiyi sonuncu səs anadillərin məhzun, kədərli səsi oldu. Şərq tərəfdə isə iri şəffaf dan ulduzu parıldayırdı.

Səhərə az qalırdı.

## 3

Yazı masasının böyründə divardan asılmış telefon cingildədi. Kəsəmənli dəstəyi götürdü. Tanış və mehriban səs eşidib gülümsündü.

– Salam, Abdal qağa, sabahın xeyir. Qulaq asıram.

Telefonda qəza firqə özək katibinin şadyana səsi eşidildi.

– Kabı, Bakıdan xəbər gəldi. Onlar bizim xahişimizi yerinə yetiriblər. Xalq Maarif Komissarlığı əmr göndərib. Halay bəyi seminariyaya müdir təyin ediblər. Əmri sənə göndərirəm. Halay bəyi də, maarif şöbə müdirini də çağır yanına, gedin məktəbə. Müəllimləri yığın, iclas aparın, Halay bəyi təqdim edin, qoyun kişi bu gündən işə başlasın. Sonra nəticəsini mənə deyərsən.

Kəsəmənli dəstək əlində xeyli dayandı. Onun zəhmli sifətinə elə bil işıq çilənmişdi. Qan sağılmış gözləri durulmuşdu. Kişi sevindiyin-

dən bilmirdi nə etsin. Masanın üstündəki zınqırovu cingildətdi. Keşikçi milis qapının ağzında göründü.

– Bu saat get Halay bəyi mənim yanıma gətir.

Ayağa durdu. Üst-başını sahmana saldı ki, kişini şadyana qarşılasın. Bir azdan qapı aralandı və milis nəfəri göründü. O, tək idi. Kəsəmənli təşvişlə milisin üzünə baxdı.

– Bəs Halay bəy hanı?

Növbətçi milis boynunu aşağı salıb büzüşdü və səsi titrəyə-titrəyə astadan dilləndi:

– Yoxdur. İki gün bundan əvvəl gecə gəlib evindən aparıblar.

Kəsəmənlini elə bil ilan çaldı. Yerindən dik atıldı.

– Hara?!

– Qalaya.

Növbətçi gördü ki, Kəsəmənlinin başı azacıq əsdi, sifətinin cod tükləri daha da codlaşdı. Əvvəlcə çiyinləri, sonra da bütün bədəni titrədi. Dabanı üstündə fırlanıb öncə sağ, sonra da sol çiyni tərəfdən arxaya boylandı. Elə bil kiminsə kürəyini nişan aldığını gördü. Növbətçi milis son zamanlar Kəsəmənlinin yol gedərkən, ya da at belində olarkən birdən təşvişlə geri boylandığını, elə bil arxadan kiminsə onu vuracağını bilmək üçün belə etdiyini çox görmüşdü.

Kəsəmənli ayağa durdu. Otağın içində iki dəfə fırlandı, pəncərələrin, qapının ağzında dayandı. Elə bil çıxmağa yer axtarır, ancaq yol tapmırdı. Onun gözləri qıpqırmızı qızarıb qan çanağına dönmüşdü. Gözlərini tor basmışdı. Heç nə görmürdü. Əlləri də titrəyirdi. Növbətçi milisioner “Kişini, deyəsən, vurğun vuracaq” – deyə düşündü, cəld masanın üstündəki su qabına yaxınlaşıb ona bir stəkan su verdi.

– Kabı qağa, özünüzə toxtaxlıq verin.

Kabı kişi bu sözlərdən ayılan kimi oldu. Növbətçi kişi onun boyun damarlarının sakitləşməsindən başa düşdü ki, Kəsəmənli yavaş-yavaş özünə gəldi.

Kabı azacıq toxtadıqdan sonra güllə kimi bayıra çıxdı və bir göz qırpımında atın belinə sıçradı.

Həmişə həyətdə yəhərli-yüyənli atlarnan dayanan milislər də atın belinə qalxdılar. Onlar Kəsəmənli ilə dabanbasaraq Fətullayevin idarəsinə gəldilər.

Kəsəmənli sürətlə qapını açıb içəri girdi. Fətullayev fısıltısını içəri yığmış ilan kimi sakitcə oturmuşdu. O, Kəsəmənliyə fikir vermədi və

azacıq yerində qımıldandı. Fətullayev nimdaş, rəngi bozarmış qara də-ri pencəyini geyinmişdi. Ayağındakı çəkmələr də, başındakı dəri papaq da nimdaş idi. Zahirən sakit görünən gözlərində elə bil ilan-çayan qay-naşırdı.

Kəsəmənliyə elə gəldi ki, onun qarşısında, masanın üstündə nə-həng bir ilan qıvrılıb yatmışdı. Ancaq bu ilanın başı tərpənir, gözləri nəyə isə zillənirdi. Bir balaca ləngisən, ya da ehtiyatsızlıq etsən, bir göz qırpımında üstünə atılacaq, bədəninə dolanıb səni tas-tas edəcək-di. Kəsəmənli bunları düşünsə də, səsinə sakitlik verdi və qətiyyətlə soruşdu:

– Halay bəy hardadı?

– Yoxdur.

– Necə yəni yoxdur? Sən nə ixtiyarla...

Elə bil masanın üstündə yatan nəhəng ilan tərpəndi. Onun bədəni buğum-buğum titrədi və başını dik qaldırdı.

– Mən qanunsuz heç bir iş görmürəm, "Troyka"nın qərarı ilə hə-rəkət edirəm. Al, bu da qərar. Özü də, xahiş edirəm, hay-haray salma-yasınız, hökm yerinə yetirilmişdir. Artıq gecikmək olmazdı.

Kabı kişinin əli sezilmədən qobura yaxınlaşdı. Naqanın çıxması ilə otağı şaqqıltının bürüməsi bir oldu. Top hərləndikcə gilizlər ətrafa sə-pələndi. Fətullayev masanın üstə sərildi. Kəsəmənli onun şoralanan qara qan içində ölmüş sifətinə baxdı və bir göz qırpımında qapıdan çı-xıb atın belinə sıçradı. Dilican dərəsi tərəfə çapdı. Bir də o zaman ayıldı ki, Naltökən yaylağına çatmışdı. Cilovu çəkdi, atın köpüklənmiş sinəsinə, sonra da arxasınca gələnlərə baxdı. Kəsəmənli bir səfərə çı-xanda, qaçaq-quldur üstünə gedəndə onu tək buraxmayan milislər indi də onun yanında idilər. Kabı kişi nəfəsini dərib Noylu bulağın üstün-dəki dəyələrə və Halay bəyin çadırına baxdı. Köks ötürüb üzünü yol-daşlarına çevirdi.

– Gəlin, qayıdın evinizə.

– Biz səni tək qoya bilmərik.

– Mən qayıdası olmayacam. Mənə görə arvad-uşağınızı başsız qoymayın.

Milislər onun sözünə baxmadılar. Birlikdə qaçaqların alaçığına yaxınlaşdılar. Həsən ağa qabağa yeridi. Halay bəyi görməyəndə Kə-səmənlinin gözünə baxdı. Bu zabitəli və zəhmli kişinin gözlərində yaş gilələnmişdi.

– Namərdlərdən qoruya bilmədim. – O, birdən-birə kişiyə yaraşmayan daxili bir çılğınlıqla hönkürdü. Sakitləşdikdən sonra hələ də bir şey anlamayan Həsən ağaya dedi. – Yoldaşlarına de, hazırlaşsınlar. Üstümüzü almamış burdan getməliyik. – O, atın üstündən qanrılıb Noylu bulağa baxdı. Ciyəri yanırdı. Bunu başa düşən bir gəlin iri qalaylı bir parçı su ilə doldurub ona yaxınlaşdı. Kəsəmənli qabı götürüb başına çəkdi.

Qaçaqlar atlandılar. Tərpənməzdən əvvəl zirvəsi qarlı dağlara, güllü-çiçəkli alp çəmənliklərinə, meşədən qarağat və çiyələk yığan uşaqlara baxdılar. Atları tərpətdilər. Qarşıda Arazın lilli və boz-bulanıq suları axırdı.

## EPİLOQ

Dünyaya çox buynuzlu-buynuzsuz cahangirlər gəldi. Biri özündən əvvəlkini bəyənmədi, o biri sonrakını. Biri dünyanı qana çalxaladı, o biri əmin-amanlığa çağırdı. Biri bəşər övladının min illər boyu yaratdığı qayda-qanunları zor ilə tapdaladı və ortalığa yeni həyat tərzi atdı. Yer kürəsini əlində fırladıb qan çanağına çevirən Hitler meydana çıxdı. Onun qarşısında Stalin dayandı. Ruzvelt, Çörçil, Mao-Tsze-Dun və De Qoll siyasəti dünyada baş alıb yeridi. Biri o birinin əleyhinə, biri o birinin tərsinə. Hamısı da ədalətdən, vicdandan dəm vurdu. Bütöv xalqlar tayqalara, Sibirə sürgün edildi. Başqa birisi hakimiyyətə gələrkən bu cəza alanları günahsız müqəssirlər adlandırdı, salamat qalanları yerlərinə-yurdlarına qaytardı. Onlara kömək etdilər.

Sibir meşələrində qohumlarını və nənəsi Güllü xanımı itirdikdən sonra qürbətdə tək qalan Söhrab sarsılmadı. Meşəlikdə, kəndin kənarında, balaca bir təpənin döşündə, nəhəng şam ağacının dibində dəfn edilmiş Güllü xanımın hər gün qəbri üstünə gedib ağlayar və and içərdi ki, oxumağından qalmayacaq. Gündüzlər meşəyə, böyüklərlə birlikdə ağac doğramağa gedər, gecələr isə axşam məktəbində oxuyardı.

Aradan on illər keçdi...

Bir gün onlara azadlıq verdilər, günahsız olduqlarını söylədilər və evə buraxdılar. Bağlanmış yollar açıldı. Sərhədlərdə gediş-gəliş başladı. Söhrab artıq kişi həddinə dolmuşdu. Onların kəndi çoxdan yox olmuşdu. Amma Söhraba kömək etdilər. Şenliyin yuxarı başında ona

ev tikdilər. Söhrab institut qurtardı və onu kənddə yenicə tikilmiş böyük üçmərtəbəli məktəbə direktor təyin etdilər.

Alqazaxlılar və Çıraq uşaqlarının yurd yerində üzüm əkilmişdi. Evlər uçurulmuş, təkcə bircə daş ev qalmışdı, onu da quşçuluq ferması etmişdilər. Ətrafda inkubator toyuqları ağarışırdı.

Söhrab yolunu hər gün köhnə yurd yerindən salar, ürəyini çulğalayan yetim duyğuların qoynunda qovrulardı. Bu gün də məktəb uşaqlarını üzüm yığmağa gətirmişdi.

Maşınlar asfalt yol ilə aramsız şütüyürdü. Alqazaxlıların yurd yerinin bərabərində xarici markalı bir maşın dayandı. Bir xeyli qapılar örtülü qaldı. Maşından enən olmadı. Görünür, içəridəkilər nəyi isə hafizələrində itirəcəklərindən ehtiyat edirmiş kimi qorxurdular. Xeyli keçdi. Qapı açıldı və içəridən ucaboylu, saçı-saqqalı ağarmış bir kişi düşdü. Görünür vaxtı ilə iri gövdəli bu adam ayağını üzəngiyə qoyub yəhərə qalxarkən atın beli çökərmiş. İndi isə elə bil gözü qaraldı və maşına dirsəklənib xeyli sükut içində dayandı. Gözləri ilə nəyi isə axtardı. Kənd evlərinin yoxa çıxdığına təəccüb elədi.

"Bu el-oba necə olmuşdu? Camaat hara getmişdi?" – deyə düşündü və ağlına gələn dəhşətlərdən sarsıldı. Birdən üzümlüklərin kənarında göyə ucalan çinar ağacını və ilan kimi onun başına dolanan tənəyi gördü. Qocanın sifətində, gözlərində işartı əmələ gəldi. Sevincək, asta addımlarla çinara yaxınlaşdı. Ağacı vaxtı ilə öz əlləri ilə basdırmışdı. Tənəyi də özü gətirmişdi. Çinarın gövdəsinə sarmaşan tənəyin xırdaca qoraları turşməzə idi. İsti havada ağacın kölgəsində oturub bu qoranın salxımlarından yeməkdən doymazdı. İndi ağacın və tənəyin salamat qalmasına həddən artıq sevinən qoca ağacın kölgəsinə gəldi və oradakı daşın üstündə oturdu. Gözünü Kürə, meşəyə, Ceyran çölün son bahar yaşıllığına bürünmüş dərəli-təpəli çöllərinə zillədi. Oradakı qoyun yataqlarını, mal-qara saxladığı günləri, camışları isti havada haylayıb gölə tökdükləri anları xatırladı. Birdən yadına qürbətdə olan bir hadisə düşdü.

Bir gün Arazı o üzə keçənlərin bir dəstəsi bazara getdi. Onlar daxılın arxasında oturan çobanın satdığı qoyun-quzuya baxdılar və kök bir quzunu seçib götürdülər. Heç yüz metr aralanmamışdılar ki, qoyun daxılın üstündən atlanıb özünü balasının üstünə saldı və onu kişilərin əlindən almağa çalışdı. Quzunu sakitcə geri qaytardılar. Qaçaqlardan biri kədərli-kədərli dilləndi:

– Qoyun qoyundur ki, balasını əldən vermədi, amma biz hər şeyi atıb canımızı götürüb qaçdıq.

Qoca çinarın dibindəki daşın üstündə oturaraq əlləri ilə üzünü örtüb astadan hönkürdü. Bayaqdan kənarda dayanıb bu qərib adama göz qoyan yaşlı bir kişi asta-asta ona yaxınlaşdı. Üzüm dərən uşaqlardan da irəli gələn oldu. Ancaq heç kəs ondan heç nə soruşmadı. Uşaqlar kənardaca oturdular. Birdən Kürün sahilindən dikdirə çıxan cığırda əvvəlcə bir cüt qulaq və sonra canavar sifəti göründü. Uşaqlar qorxudan titrətdi və qaçmaq istədilər. Canavarı görən saqqallı qərib kişi dirçəldi və canavara diqqətlə baxıb birdən "Alan" deyə pıçıldadı. Elə bil canavar bu sözü eşitdi. İtin qan yaddaşı hərəkətə gəldi. Keçəl Xondulunu öldürdükdən və uzun müddət meşədə tək yaşadıqdan sonra canavar sürüsünə qoşulmuş və oralara hərlənən bir insan övladı gördükdə üstünə atılmışdı. Ona görə də heç kəs qorxusundan o tərəflərə hərlənməz, "Alan törəmələrindən özünüzü gözləyin" deyərdilər. İndi birdən-birə bu canavarlardan birinin bu sahilə gəlməsi və "Alan" sözünü eşidən kimi sakitləşməsi uşaqları və yerli qocanı təşvişə salsa da, qəribi sevindirmişdi.

Alan əvvəlcə çömbəltmə oturub qərib kişiyə baxdı. Sonra biləklərinin üstündə sürünərək ona yaxınlaşdı. Sifətini kişinin dizlərinə qoydu. Qərib isə onun başını tumarladı.

Bayaqdan qorxa-qorxa bu mənzərəni seyr edən qoca birdən qəribdən soruşdu:

– Ayə, sən Həsən ağa deyilsənmi?

Qərib qoca başını qaldırdı və göz yaşı içində "Bəli, – dedi. – Bə bizim el-oba hanı?".

– Oğlun Söhrab buradadı. Bu saat çağırtdıraram. Bə niyə belə bixəbər gəlmisən?

– Qorxurdum ki, heç kəsi tapmayam.

Uşaqlar güllə kimi qaçıb üzümlükdə dolaşan Söhrabı tapdılar. Bir-birinin sözünü kəsə-kəsə: – Müəllim, atanız gəlib, – dedilər.

Söhrab heç nə anlamadı. Bir müddət key kimi dayanıb uşaqlara baxdı. Sonra "Hardadı" deyə soruşdu.

– Orda, çinarın dibində oturub.

Söhrab quş kimi yerindən götürüldü, çinara doğru getdi və birdən dayanıb geri qayıtdı. İri uşaqlardan ikisini yanına çağırıb evə göndərdi.

– Tez olun qaçın evə. Qapıdakı qara qoçu maşına qoyub gətirin. Əhd eləmişəm. Ayağının altında qurban kəsəcəm.

Özü yenidən çinara doğru qaçdı.

...Həsən ağa canavarın başını sığallayırdı. O isə insan kimi kövrəlmişdi. Gözləri tez-tez yaşarırdı.

Söhrab çinara yaxınlaşanda uşaqlar qara qoçu da gətirdilər. Söhrab dərhal qoçu yıxıb boğazladı və özünü atasının üstünə salmaq istədi. Amma Həsən ağanın sakitliyi onu çaşdırdı. Kişi kürəyini çinar ağacına söykəyib elə bil yuxuya getmişdi. Əsən meh saqqalını astadan tərpədirdi. Bayaqdan Alanın başını sığallayan əli tərpənmirdi.

Söhrabın keyləşdiyini görən qoca Məmməd kişi yönünü yana çevirib göz yaşlarını sildi.

– Dəymə, bala, qoy dincəlsin. Onu torpaq çəkib gətirib bura.

Söhrab birdən diz çökdü. Əllərini göyə qaldırdı.

– Ey yeri-göyü yaradan Tanrı, niyə bizim qurbanlığımız ilə ehsanlığımızı bir-birinə qatırsan?! Biz hüzurunda nə pis iş görmüşük?!

Deyəsən Alan törəməsi də olanları başa düşdü. Başını astaca qaldırıb ağzını göyə tutdu. Ulamaq istədi. Amma ulamadı. Başını Həsən ağanın əlləri üstünə qoydu.

Külək yarpaqları astadan xışıldatdı. Həsən ağanın uzun saqqalı ehmalca tərpəndi. Göz yaşı içində atasının böyrünə qısılan Söhrab, Alan, bir də Həsən ağa elə bil sahildə heykəlləşdilər. Kür isə yenə həmişəki kimi gah meşəyə doğru burulub axır, gah çiləkənlərin üstündən aşır, gah da yarğanlara, qolpunlara çırpılırdı. Elə bil dünyada heç nə olmamışdı.

**Son**

*1995*

## NAMUS QAÇAĞI

O dayandı. Nəfəsini dərib şaxtadan qıpqırmızı olmuş əllərini hovxurdu. Ağzından, burnundan çıxan isti nəfəs dağ çəni kimi ətrafa yayıldı. Dönüb aşağı, dərədəki kəndə baxdı. Yastı-yapalaq evlər qarın altında qalmışdı. Bacalardan qalxan şəffaf maviyə çalan tüstülər havada laylanmışdı. Hər yer ağ örtüyə bürünmüşdü. Yol-iz çoxdan itmişdi. Dağlara bu il yaman qar düşmüşdü.

Onun toyu idi. Bu axşam mağar başlamalı idi. Samanlığı süpürüb təmizləmişdilər. Döşəməyə ot sərib üstünə kilim salmışdılar. Pərdilərdən otuzluq lampalar asılmışdı. Bacaları basdırıb peçləri qalamışdılar ki, içəri isti olsun.

Zurnaçılar çoxdan hazır idilər. Dəfçi dəfini qurudur, zurnaçı ilə züyçü zurnaları qoşalaşdırırdılar. O bilirdi ki, kəndin qız-gəlinləri boğçadakı paltarlarını çıxardıb ora-burasını sığallayır, donların, koftaların qırışını açır, bəzənib-düzənir, qaşlarına, gözlərinə sığal verib, tellərini bururdular. Qış aylarında səhərəcən toyda qoşa-qoşa oynamaq bu kəndin adəti idi. Göyə fişəng atar, gecə lopa işığında gəlin gətirərdilər.

O sevinirdi. Səhər-səhər sulamağa apardığı at da yəhərin altında oynayır, yüyəni çeynəyib boynunu sağa-sola əyir və qar basmış yollarda cığır açırdı. Elə bil başa düşürdü ki, sahibi böyütdüyü, gözünün ağı-qarası təkcə balası İlyasın əlini başına yığacaqdı. Onun da evinə gəlin gələcək, onun da qara damı silinib-süpürüləcək, taxtın üstündə gərdək qurulacaq, qapısında şax bəzədilib lopa yandırılacaqdı.

Kəndin kənarındakı balaca çayın suyu gecənin şaxtasından sırsıra bağlayıb donmuşdu. Buz layları yatağını aşıb ətrafa yayılmışdı. At yelini saxlamadı. Sahibinin yüyənini çəkməsinə fikir vermədən özünü suya saldı. Buz layları çat-çat olub çilikləndi. Hardasa lap yaxında at kişnədi. İlyas qanrılıb baxdı. Gələn koxalıların Rəşidi idi.

O, İlyasın bərabərində atın başını çəkdi. Hər ikisi bir-birini süzdü. İlyas onun uca boyuna, vəznəli çuxasına, buxara papağına, gümüş toqqalı sallamalı kəmərinə, belindəki xəncərinə baxdı, o da İlyasın məxmərdən tikilmiş qalife şalvarına, zər baftalı nişan dolağına, çəkmələrinə, nimdaş pencəyinə və papağına.

– Deyəsən toy eləyirsən?

– Bəli.

– Mənim qabağıma keçirsən?

İlyas diksindi. Elə bil güllə kimi açılan bu sərt sözdən at da diksindi. Başını qaldırıb fınxırdı. Onun burnundan fısqıran nəfəs zolaqlanıb havanı yardı.

– Zöhrə mənim nişanlımdır.

– Elə gözəl qız sənin kim gədaya yem ola bilməz.

– Ağzını təmiz saxla!

Cilovların çəkilməsi ilə atların döş-döşə dayanması bir oldu. Onların nəfəsi bir-birini vurdu. İlyasın əli gödəkcəsinin cibindəki naqanın dəstəyini sıxdı.

Rəşid özündən xeyli cavan olan, üzünə yenicə ülgüc dəymiş İlyası yuxarıdan aşağı, rişxəndlə süzdü. Yüyəni çeynəyən atın başını çəkib qamçını havada oynatdı.

– Yadında saxla, mənim tikəmə əl uzadanın anasını ağlar qoyaram.

Elə bil İlyasın gözündə hər şey qaraldı. Kəndin üstünə yorğan kimi sərilmiş qar da, şırıltı ilə axan büllur suyun üzünə yayılan buz da, solğun-solğun işıldayıb göz qamaşdıran gün də birdən-birə yoxa çıxdı. İndiyə qədər eşitdiklərinə inanmamışdı. Rəşidin "toy gecəsi qızı onun əlindən alacam, sonra istəsə özünə qaytararam" deməsinə fikir verməmişdi, "ara sözüdür" deyə xəbər gətirənləri sakitləşdirmişdi. Bir də Rəşidin arvad-uşağı vardı. O, belə fikrə düşsə, qan su yerinə axardı. Namusu itə veriblər, it də yeməyib. Belə şey olardımı?

İlyas fikirdən ayılıb özünə gələndə Rəşid uzaqlaşmışdı. İlyas isə hələ də çayın kənarında dayanmışdı. Gözlənilməz zərbədən özünü elə itirmişdi ki, yerindən tərpənə bilmirdi. Atasından eşitmişdi ki, koxalılar tayfası arxalı tayfadı, özləri də mərdimazardırlar. Əllərindən nə köpəkoğluluq desən, gələrdi. Şura hökuməti yeni qurulanda bir az səslərini içlərinə salmışdılar, amma indi, dağda-daşda qaçaq-quldur dəstəsi çoxalır. Onlar da yenidən kəndin ortasında at oynadıb, ona-buna sataşırdılar. Bilirdilər ki, onların kəndi əldən-ayaqdan uzaq yerdədir, dağ gədiklərinin arxasında yerləşən bu kəndə gəlmək üçün bələnlər aşıb, dərələr keçmək lazımdır. Qış aylarında isə yol-iz bağlanır, yaz gəlib dağların qarı tamam əriməmiş divan-dərə adamları buralarda görünmür.

İlyas atını məhmizlədi. Özünü nə qədər şax tutsa da, sınmışdı, bayaqkı şuxluğu yox idi, həyətə çatan kimi atası da bunu hiss etdi, gözlərini oğlunun üzündən çəkmədi. Sakitcə, atı tövləyə aparan oğluna

baxdı. İlyas heç nə olmamış kimi xeyli qapıda hərləndi, mağar yerini yoxladı, tədarük görənlərə baş çəkdi və birdən atasına yaxınlaşıb "Siz işinizdə olun – dedi – mən axşama qayıdacağam". Kişi dinmədi. Doqqazdan çıxıb dağlara doğru addımlayan oğlunun arxasınca baxa-baxa qaldı.

O, Zöhrəni ilk dəfə bir yay axşamı bulaq üstündə görmüşdü. Elə o gündən də qızı ürəyi tutmuşdu. Amma ona yaxınlaşa bilməmişdi. Xeyli vaxt uzaqdan-uzağa qızın qarasıyla gəzib, izini izinə qatmışdı. Hiss eləmişdi ki, sinəsi doludur, onun qabağını kəsib bircə kəlmə deyə bilsə, ürəyindəkilərin hamısı gözü açılmış bulaq kimi poqquldayıb qaynayacaq. Evdə-eşikdə qərar tuta bilmirdi. Dolama cığırla dağın döşünə qalxır, ağacların daldasında gizlənir, çaya enir, bulaq üstünü kəsdirir, hər yerdə o qırmızı donlu qızı axtarırdı.

Bir dəfə yenə meşənin dərinliyinə çəkilmişdi. Ürəyi dolu idi, dərdini açmağa bir adam tapmırdı. İstəyirdi ki, özünə bir sirdaş tapsın, hər şeyi ona danışsın ki, bəlkə yüngülləşə. Heç ömründə oxumamışdı, amma indi söz sinəsini deşirdi, oxumaq istəyirdi. Birdən papağının dalını qaldırdı, onun səsi şaqqıldayıb meşədə, qarşıdakı qayalarda cingildədi: "Çərşənbə günündə çeşmə başında, gözüm bir alagöz xanıma düşdü". Elə bil yüngülləşdi. Ürəyini boşaldıb nəfəsini dərdi. Hər şey susmuşdu. Bircə onun qayalarda əks-səda verib təkrarlanan səsindən başqa.

Qaqqıltı qopdu. O, yerindən sıçrayıb dinşədi. Səs aşağıdan gəlirdi, bulaq üstündən. İlyas başa düşdü ki, gülüşən qızlardı. Ona, onun mahnısına gülürdülər. Bədənini soyuq tər basdı, istədi dağyuxarı dırmaşsın, baş alıb bu yerlərdən getsin, ilim-ilim itsin ki, ona gülən qızların səsini bir də eşitməsin. Amma ayaq saxladı. Dinlədi. Gülüşqarışıq bir səs gəldi qulağına:

– Yandıran yansın, ədə, özünə nə divan tutursan?

Ağaclar yenidən səs-səsə verib şaqqıldadı. Yarpaqlar titrədi. Amma bu gülüşlər səngiyəndə o, aydınca bir səs də eşitdi:

– Gədəni niyə utandırırsınız, qoyun oxusun, yaxşı səsi var.

Bu sözləri deyən Zöhrə idi. Onu yandırıb-yaxan, dağlara-daşlara salan Zöhrə!

Bir dəfə ürəkləndi. Bulağın üstünə endi. Qızlar onu görən kimi özlərini yığışdırdılar. Sürüşüb çiyinlərinə düşən kəlağayılarını irəli çəkib saçlarını qulaqlarının arxasına yığdılar. Koftalarının yaxasını, donları-

nın büzmələrini dartışdırdılar. Bəziləri də həyalı gəlinlər kimi kəlağayılarının bir ucunu ağızlarına yaxınlaşdırıb yaşmaq tutdu. İlyas özünü itirdi. Səhər-səhər bulaq suyunda güzgülənib sığallanan bu qızların hansına yaxınlaşıb nə deyəcəyini bilmədi. Onların lal sükutundan, qayır-qayır qaynayan gözlərindəki bic şıltaqlıqdan qorxdu. Bilirdi ki, bu yerə baxan qızların dilinə düşmək yaman işdir, Allah adamı onların şitliyindən saxlasın. Dili-dodağı təpidi, udqundu və güclə dilləndi:

– Bir içim su verin, nə olar?!

Səhənglərini cərgə ilə düzən qızların arasından bir pıçıltı keçdi və oğlan bulağın novuna əyilmiş Zöhrəni indicə gördü. Qız əlindəki niluferi dolça kimi su ilə doldurub İlyasa verdi. O, əlləri titrəyə-titrəyə suyu aldı, başına çəkdi və bir də istədi. Zöhrə çiçəyi kənara qoyub dolçanı doldurdu. O, dişi göynəsə də qabı birnəfəsə boşaltdı və yenə su istədi. "Bu yazığın ciyəri yanırmış ki," – deyə kimsə söz atdı. Qızların bu atmacasına cavab vermədi. Üçüncü dolçanı yarıya qədər içdi və qalanını Zöhrənin yalın ayağına tökdü. Qız diksindi, qonur gözlərini İlyasın üzünə zillədi. Bu baxışlarda ani bir qığılcım oynadı, şimşək kimi çaxdı və qızın dodaqları qaçdı. Qızın qımışmağı təzədən onun canına od saldı. Bulaq başından nə vaxt aralandığından, dağa necə dırmaşdığından xəbəri olmadı. Bir də onu gördü ki, iri bir vələsin altında, göy otluqda, çiçəklərin arasında uzanmışdır. Qızların gülüşü yenidən qulaqlarına dolub güyüldədi. Amma ürəyi sakitləşmişdi. Suyu qızın ayağına tökmüşdü. Demək, ürək sözünü demişdi. Bu, dağlarda bir adət idi. Çoxdan, lap dədə-babadan qalma adət. Qız da hirslənməmişdi, əvvəlcə qımışmış, sonra da başını aşağı salıb qızarmışdı. Demək, onun da ürəyi oğlanı tutmuşdu...

Bir gün kənddə yenə toy vardı. Oktyabr bayramının ildönümünü qeyd edirdilər. O vaxt qayda idi: kənd camaatı məktəbin qabağına toplaşardı. Uşaqlar rəngli kağızlardan naxışlar kəsər, zəncir düzəldər və sinif otaqlarını, eyvanları bəzəyərdilər. Kənd cavanları atlarının quyruğunu düyüb cıdıra hazırlaşardılar. Qulplu qazanlarda xörək bişər, qara zurna dilə gələrdi. Düz nağıllardakı kimi üç gün, üç gecə çalıb-oynayardılar.

Hava xoş idi. Elə məktəbin həyətində son bahar yaşıllığının üstünə gəbə-kilim də döşəmişdilər. Kəndin ahıl arvadları, qızları, gəlinləri bardaş qurub oturmuşdular. Zurnaçılar ortada, stulda əyləşmişdilər.

Əvvəlcə cıdırhəngi çalındı, sonra güləşəngi. Cavanlar at çapıb, qurşaq tutub yorulandan sonra oyun başladı. Kəndin gözəlləri qoşalaşdılar.

İlyasın gözü bacısıyla Zöhrədəydi. Onlar yanaşı oturmuşdular. Bu gün hər şey həll olunmalıydı. İlyasın bacısı meydana çıxmalı, ortada bir az hərlənəndən sonra Zöhrəni çağırıb oynatmalı idi.

Zurnaçılara yanaşdı. Qulaqlarına nəsə pıçıldadı. Sümüyə düşən ağır bir hava çalınan kimi İlyasın bacısı ayağa durdu, qollarını qaldırıb bir dövrə vurdu və oynaya-oynaya gedib Zöhrənin qabağında dayandı. Qız əvvəlcə dartındı, oynamaq istəmədi. Onu dümsükləyib ayağa qaldırdılar. Zöhrənin başında bənövşəyi yelinli ağ kəlağayı vardı. Cığaları qıvrılıb yanağına düşmüşdü. Qırmızı koftasının yaxasına pullar düzülmüşdü. Qırçınlı uzun donu topuğuna enirdi. Hiss olunurdu ki, dikdaban çəkməsini yenicə geyinib.

Qol-qola verib ortada süzdülər. Dəfçi nəsə qışqırdı, kiminsə adını çəkdi, "Sağ olsun oynayanlar" – dedi. İlyas bunları eşitmədi. Onun gözü Zöhrə ilə bacısındaydı. Zöhrənin oyunu onu valeh etmişdi. Bu qız nə gözəl oynayırdı, asta-asta, sındıra-sındıra. Dəfçi hər dəfə çomağını dəfə endirəndə qızın qolları tərpənirdi buğum-buğum.

İlyasın bacısı oyununa ara vermədən hərləndi və sezilmədən Zöhrənin kəlağayısının yelənli ucunu ələ keçirdi. Zöhrə gözünü yumub-açınca ovcundakı pulu kəlağayının ucuna düyünlədi. Bu qızı bəlləmək deməkdi. Əgər qız dartınsa, pulu açıb atsa, demək razı deyil. İlyas gördü ki, qız qıpqırmızı oldu və dartındı. Ancaq bacısı qızı tərpənməyə qoymadı, qucaqlayıb üzündən öpdü. Zöhrə başını aşağı salıb yerinə keçəndə dəfçi yenə qışqırdı:

– Sağ olsun oynayan nişanlısıynan...

İndi o, dizinə qədər qara bata-bata, ağacların budağından yapışa-yapışa dağa qalxır, meşənin dərinliyində özünə məskən salmış Qaçaq Süleymanın yanına gedirdi. İlyas qaçaqların harada gizləndiyini təxminən bilirdi. Eşitmişdi ki, Süleymanın dəstəsi əzgilli taladan bir az o yana, Sarı qayanın alt tərəfində yerin altında lağım atıb, özlərinə sığınacaq düzəldiblər. Bura əlçatmaz bir yer idi. Qışda orada daldalanır, yaz-yay aylarında bir az da yuxarı qalxırdılar.

Yuxarı qalxdıqca qar daha da qalınlaşır, sazaq adamın iliyinə işləyirdi. Onun qaşı, kirpikləri buz bağlamışdı. Papağının sallama qulaqları donub quş qanadları kimi havada qalmışdı.

İlyas Qaçaq Süleymanı bircə dəfə görmüşdü. Düz iki il bundan əvvəl, belə qarlı bir gündə, qaçaqlar atlarını çapıb kəndə doluşdular. Boğazına kəndir saldıqları bir adamı atın yedəyində darta-darta məktəbin qabağındakı meydana gətirdilər. Hamı tamaşaya yığışdı. İlyas boğazı kəndirli adamı tanıdı. Müəllim idi. Şəhərdən gəlib qonşu kənddə dərs deyirdi. Onun paltosunu çıxartmışdılar. Bircə köynəkdə idi. Dizə qədər qara batmışdı.

Qaçaqlardan biri qaşqa kəhər atını məhmizləyib qabağa çıxdı. İlyasın nəzərinə ilk çarpan onun çatılmış qaşları altında parıldayan qan sağılmış gözləri oldu. Kişinin üzündəki tüklər də biz-biz idi. İribədənli, enlikürəkli, genişsinəli bu adam yəhərin üstündə qırğı kimi oturmuşdu. Kürkünün üstündən bağladığı onaçılan, çiynindən aşırılan çalın-çarpaz qoltuqaltılar, yəhərin qaşından asdığı beşaçılan onun zəhmli sifətini daha müdhiş göstərirdi.

– Camaat, bilirsinizmi bunun günahı nədir?

Heç kəsdən səs çıxmadı. Hamı dönüb qarın içində başı, sinəsi açıq dayanan müəllimə baxdı. Onun sifəti, qulaqları şaxtadan göyərmişdi.

– Bu bizim namusumuza toxunub. – Elə bil camaatın üstünə su ələndi. Bunu hiss edən qaçaq sözünü tamamladı, – qızları başına yığıb teatr çıxardıb.

Kəndin ağsaqqallarından biri çiyninə saldığı kürkünün yaxasını çəkib düzəltdi və bir-iki addım irəli yeridi.

– İndi fikrin nədi, ay oğul?

– Gözünüzün qabağında bunun başını kəsəcəm.

– Əl saxla, a bala, adam hər şeydən ötəri qan tökməz. Görmürsənmi fağırın biridi, çevir balalarının başına, burax getsin.

Qaçaq Süleymanın üzü əsdi. Qamçısı ilə papağını alnından geri itələdi. Onun gözləri kişinin üzünə zilləndi.

– Yəni deyirsən, namusumuzu ayaqlar altına ataq?

– Kim deyir onu, a bala, namussuz yaşamaqdan ölmək yaxşıdır.

Qaçaq Süleyman inadından dönmək istəmədi. Amma kənd camaatı ondan əl çəkmədi. Əl-ayağına düşdülər, yalvar-yaxar edib qaçağı yumşaltdılar.

– Yaxşı, anan namaz üstündəymiş, qurban ol bunlara. Səni buraxıram, amma burdan elə əkilərsən ki, heç izin-tozun da qalmaz. Bir də gözümə dəysən böyük tikəni qulağın boyda eləyəcəm.

Müəllimin boynundan kəndiri açdılar. Paltosunu verdilər və dağlardan arana enən cığırla yola saldılar.

Qaçaq Süleyman kənddən getməzdən əvvəl atının cilovunu çəkdi.

– Camaat, – dedi – yadınızda saxlayın, məni çöllərə salan elin namusudur. Nə qədər sağam, qoymaram bu mahalda bir adamın namusuna toxunsunlar!

İlyas səhər çay kənarında Rəşidlə sözləşəndən sonra bunları yadına saldı və dağlara üz tutdu. Onun gözünə heç nə görünmürdü. Nə şaxtanı hiss edir, nə də qaranlığa düşüb qurd-quşa yem ola biləcəyini ağlına gətirirdi. Onun beynində bircə fikir dolaşırdı: harda olsa, Qaçaq Süleymanı tapmaq, ürəyindən keçənləri düz gözünün içinə demək. O bilirdi ki, qaçaq öz adamlarına tapşırıb onu tikə-tikə doğratdıra bilər, ya da özü əli titrəmədən onaçılanın tətiyini sıxar və həddini aşmış bu cavanı bir andaca yox edər. İlyas bunların hamısını ürəyində ölçüb-biçmişdi və necə deyərlər, kəfəni boynuna dolamışdı. Yəqin etmişdi ki, bu yoldan sağ-salamat qayıtmayacaq, amma fikrindən dönməmişdi.

– Dayan, kimsən?

İlyas fikirdən ayılanda sinəsinə tuşlanmış lüləni gördü və anladı ki, qaçaqlara rast gəlib. Sevindi.

– Məni Qaçaq Süleymanın yanına aparın.

– Aldatdım deməzsən ki?

– Doğru sözümdür. Vacib işim var.

– Ə, sənin onnan nə işin ola bilər?

– Olmasa, bu boranda, qarda bələnlər aşıb buraya gəlməzdim ki?

İlyasın sərt cavabı qaçağı bir az çaşdırdı. Tüfəngi aşağı salıb ona yaxınlaşdı. Diqqətlə üst-başını süzdü və arxaya keçdi.

– Düş qabağıma! Onsuz da buradan salamat qayıtmayacaqsan.

– Qayıtmayanda da qayıtmaram, məni niyə qorxudursan?

– Yekə-yekə danışma, düş qabağıma.

O, içəri girəndə Qaçaq Süleyman qara damın küncündə, peçin yanına qoyulmuş taxtın üstündə, mütəkkəyə dirsəklənərək uzanmışdı. Çəkmələrini soyunsa da yarağını çıxartmamışdı. Qoltuqaltıları çiynində, tüfəngi yanında, onaçılan qarnının üstündəydi. İlyası görəndə dikəldi, ayaqlarını taxtdan sallayıb oturdu və qan sağılmış gözlərini onun üzünə zillədi. İlyas bu zəhmli baxışlardan sarsılmadı, əksinə, sakitləşdi. Əslinə baxsan ona elə gəlirdi. O bilmirdi ki, keyləşib. Qulaq-

ları heç nə eşitmir, gözləri gözlərinə sancılmış gözlərdən başqa heç nə görmür, harada olduğunu, kiminlə üz-üzə dayandığını belə ayırd edə bilmirdi.

– Xeyir ola, komsomol, niyə gəlibsən?

Bu səs onu ayıltdı. Beyninin uğultusu, qulaqlarının güyültüsü bircə anda yoxa çıxdı və qaçağın özü də elə bil dumandan sıyrılıb bütün aydınlığı ilə önündə dayandı. İlyas qurumuş dodaqlarını dili ilə islatdı və düz onun gözünün içinə baxdı.

– Sənin üzünə tüpürməyə.

Bircə an, yalnız bircə an ortalığa sükut çökdü. İlyas elə bil çiyinlərini ildırım daşı tək basıb əzən yükün altından çıxıb yüngülləşdi. Ona elə gəldi ki, sinəsi genişləndi, nəfəsi açıldı. Və birdən qan sağılmış gözlərin sərt baxışlarını üzündə hiss etdi. Bu baxışların üzünə sancılması ilə qollarının daldan qanrılıb burulması bir oldu. Onu sürüyüb bayıra atmaq istədilər. Qaçaq Süleymanın zəhmli, amiranə səsi eşidildi:

– Buraxın, qoyun sözünü axıracan desin. Niyə mənim üzümə tüpürürsən, bala?

– Ona görə ki, yalançısan, hər yerdə namusdan danışırsan, amma sənə arxalananlar namussuzluq eləyirlər. Toy günü gəlini nişanlısının əlindən almaq istəyirlər.

Kişini elə bil ilan çaldı. Yerindən sıçrayıb dik atıldı.

– Kimdi o biqeyrət?

– Koxalıların Rəşidi.

Qaçaq Süleymanın qaşları çatıldı. Üzünün tükləri biz-biz oldu. İlyas gördü ki, kişinin geniş sinəsi körük kimi qabarıb endi. Bir xeyli fikirli-fikirli ortada hərləndikdən sonra taxtın üstünə uzanıb mütəkkəyə dirsəkləndi.

İlyasın sözü onu yaman tutmuşdu. Doğrudan da, onu çöllərə salan nəydi? Neçə il idi ki, evindən-eşiyindən niyə didərgin düşmüşdü? Kim idi onu yuvasından hürküdən? Süleymanın atası da, özü də, elə qohum-qardaşları da şura hökuməti qurulanda hamıdan çox sevinmişdilər. Yenicə ayınları açılıb, dirçəlmişdilər. Onların nəsli kasıb dolanmışdı, amma heç kəsin qabağında əyilməmişdilər. Atası həmişə onlara deyərdi ki, kişinin birinci sifəti namusdur. Gərək təkcə öz namusunu yox, qonum-qonşunun, el-obanın da namusunu qoruyasan. Kişi olan başqasının qız-gəlininə xain gözlə baxmaz. Bu sözlər uşaqlıqdan onun beyninə həkk olunmuşdu. Sonra böyüyüb kəndin dəliqanlılarına qoşu-

landa da, toyda-mağarda cıdıra çıxıb at çapanda da, kəndin cavanları ilə qurşaq tutub güləşəndə də atasının sözləri qulaqlarından getmirdi. Onu barmaqla göstərirdilər. Kürəkləri enli, beli nazik idi, az qalırdı üzükdən keçsin. Ona gözü düşənlər çox idi. Bilirdi ki, kəndin qızları onun dalınca həsrətlə boylanırdılar və az qalırdılar ki, qabağa düşüb ürəklərini açsınlar, altdan yuxarı üzünə baxıb həyadan pörtə-pörtə "Nə olar, mənciyəzi al" desinlər. Ona söz atan gəlinlər də olurdu. Amma Süleyman onlara gözünün ucuyla da baxmırdı. Kəndin ağsaqqalları "halal olsun, kişinin oğluna" – deyib, onunla qürurlanardılar.

Onu kənddə yenicə düzəlmiş komsomol özəyinə katib seçdilər. Cavanları başına topladı, əkinə-biçinə, məktəbə, savad kurslarına kömək elədi. Dəstə getdikcə böyüdü, Süleymanın sorağı da böyüdü, ətraf kəndlərə də yayıldı.

Onların kəndində Əbdürrəhman adında bir bəy də vardı. Əzazilin biriydi, boylu arvadlar onu görəndə uşaq salardılar. Şura hökuməti qurulanda başına dəstə toplayıb bir neçə il heç kəsi tanımaq istəməmişdi. Atını çapıb hamıya bildirmişdi ki, buraların ağası mənəm, başqa xəyala düşməyin. Bir dəfə də Süleymanın qabağını kəsib hədələmişdi. "Deyəsən çox əllaməlik eləyirsən, bala, ağır otur, batman gəl, başın bədəninə ağırlıq eləməsin". Hətta bir dəfə üstünə tüfəng də çəkmişdi. Güllə Süleymanın papağını silib keçmişdi.

Bir gecə "Gepo"nun adamları sakitcə gəlib, Əbdürrəhman bəyi də, oğlanlarını da apardılar. Onların evini idarə elədilər. Üst gözdə kənd şurası, firqə özəyi yerləşdi. Bir otaq da komsomola verdilər. Arvad-uşağı isə aşağı, zirzəmiyə oxşar yerə köçürdülər.

Bəyin bir cüt maral kimi qızı vardı, abırlı, həyalı. Kəndin arasına az-az çıxardılar, ataları tutulandan sonra isə heç gözə görünmədilər. Süleyman göz qoyardı, qızlar zirzəminin qaranlıq küncündə bir-birinin qoynuna qısılıb oturardılar. Oduna, suya da qarı ilə bəyin arvadı gedərdi. Atası bir dəfə Süleymanı bir küncə çəkdi. "Oğul, – dedi – bilirəm komsomolsunuz, bəylərlə vuruşursunuz, yaxşı eləyirsiniz. Amma arvadda, uşaqda işiniz olmasın. Qulağıma pis sözlər gəlir. Deyəsən Keçəl Xondulu dinc durmur. Yadında saxla, elin namusu bizim namusumuzdur. Təmiz adımızı ləkələməyin". Atasının sözündən sonra Süleyman yoldaşlarına göz qoydu. Tapşırdı ki, fərağat otursunlar.

Bir dəfə gecədən xeyli keçmiş idarədən işıq gəldiyini gördü. Qanrıldı. Elə bildi ki, rayondan təhkimçi gəlib, nə isə vacib bir işi var.

Qapının ağzına çatanda heyrətləndi. İçəridən taqqıltı gəlirdi. Elə bil süpürüşürdülər. Kimsə hıçqırırdı. Süleyman çiynini qapıya verdi və ona elə bir güc gəldi ki, zirəzə yerindən oynadı. İçəri girəndə gözlərinə inanmadı. Əbdürrəhman bəyin qızları küncə qısılmışdılar. Üst-başları cırıq-cırıq idi, saçları üzlərinə dağılmışdı. Keçəl Xondulu porsuq kimi qızarmışdı. Qollarını çirməmiş, köynəyinin yaxasını açmışdı. Şalvarının üstündən tumanbağısı sallanırdı. Gözləri pişik gözü kimi parıldayırdı. Qapı açılanda boynunu içəri çəkib belini donqarlandırdı və qan hərisi vəhşiyə dönərək yay kimi gərildi. Bircə an da keçsə, irəli atılacaqdı. Süleymanın beyni uğuldadı və gözlərinə qan sağıldı. Naqanı çıxartmağı ilə tətiyi çəkməyi bir oldu. Şaqqıltı qopdu. Dalbadal, altı dəfə...

Bayırda at fınxırdı. Ayaq tappıltıları və qarışıq səslər eşidildi. Sonra qara damın qapısı cırıltı ilə açıldı. Qapı aralanan kimi içəri soxulan işıq zolağı damın yarıqaranlıq havasını qılınc kimi doğradı, divarda süründü və taxtın üstündə uzanmış Süleymanın üstünə düşdü, qapı örtülən kimi də yox oldu. İlyas dik atıldı. Qarlı havadan sonra gözü qamaşan və evin ortasında dayanıb boylanan Rəşidi görəndə qan beyninə sıçradı. Amma Qaçaq Süleyman yerindən tərpənmədi. Gözü qaranlığa alışandan sonra qollarını açıb üstünə yeriyən Rəşidə əhəmiyyət vermədi. Mütəkkəyə dirsəkli halda uzandı, bir azca ayaqlarını yığıb, taxtın aşağı tərəfində ona yer elədi. Rəşid pərt olsa da, üstünü vurmadı, ayaq tərəfdə oturdu. Onlara çay gətirdilər. Yalnız bundan sonra Qaçaq Süleyman başını qaldırıb qonağın üzünə baxdı:

– Kürkünü soyun, soyuq dəyər.

Onun sakit, amiranə səsi Rəşidi çaşdırdı. Gözü Süleymanın üzündə qımışa-qımışa kürkünü çıxartdı.

– Deyirlər kəndinizdə toy var?

Qəfil sualdan Rəşid diksindi. Stəkanı nəlbəkiyə qoyub qaçağın üzünə baxdı. Bilmədi nə desin.

– Niyə dinmirsən?

Rəşid tələsik cavab verdi:

– Var.

– Kimin toyudur?

– Murad kişinin dığası İlyasın. – Rəşid elə bil dirçəldi. Qaş-gözünü oynadıb sözünə davam etdi. – İndi hər qor-qoduq adam olub ortaya düşüb. Başın haqqı ona dağ çəkəcəm.

İlyas dözmədi. Küncdən çıxıb irəli gəlmək istədi. Amma Süleyman gözünü ağardıb onu yerində oturtdu. Deyəsən Rəşid heç onu görmürdü.

– Fikrin nədir?

– Elə bu gecə qızı onun əlindən alacam.

– Araya qan düşməyindən qorxmursan?

– Nədən qorxacam? Dalımda dağ kimi dayanıbsan.

Qaçaq Süleyman papağını çıxardıb dizinin üstünə qoydu. Fikirli-fikirli başını ovxaladı. Ortalığa çökən sükut xeyli çəkdi. Birdən onun qaqqıltısı divarda şaqqıldadı. Rəşid də ona qoşuldu. Gözləri yaşarıncaya qədər gülüşdülər.

– Ağzıyın dadını yaman bilirsən ha.

– Bə nə. Gərək bu gəda-güdaların anasını ağladasan.

– Bə qorxmursan?

– Nədən?

– Xam qızla yatmaqdan.

– Arxayın ol, hələ canım suludu.

İlyas küncdəcə dayanıb söhbətin hayana səmt alacağını gözləyirdi. Dişi bağırsaqlarını kəssə də susurdu. Başına nə iş gələcəyini bilmirdi. Bircə onu hiss edirdi ki, Qaçaq Süleymanın səsi titrəyir, qaşları çatılır və üzünün tükləri biz-biz olur.

Süleyman papağını başına qoydu. Ayaqlarını taxtdan sallayıb oturdu. Əvvəlcə peçin yanında quruyan çəkmələrini geyindi, sonra ayağa qalxıb kürkünü, onaçılanı belinə bağladı, qamçısını əlinə aldı. Rəşidin çaşdığını görüb dilləndi:

– Dur gedək. – Onlar qapıya yaxınlaşdılar. Qaçaq Süleyman Rəşidi qabağa salıb geri döndü. – Komsomol, sən də dur.

Rəşid qanrılıb İlyasa baxmaq istədi, ancaq Süleyman itələyib onu bayıra çıxartdı.

Hava ayazımışdı. Gün işıldasa da soyuq idi. Meşəyə, talalara sərilmiş qar adamın gözünü qamaşdırırdı.

– Atları bəri çəkin!

Qaçaqlar bir göz qırpımında tövlədə saxladıqları yəhərli-yüyənli atları gətirdilər. Qaçaq Süleyman ayağını üzəngiyə qoyan kimi sıçrayıb atın belinə qalxdı. O biriləri də atlandılar. Yalnız bu zaman İlyas özünü itirdi. Buraya gəldiyinə peşman oldu, özünü danladı.

Qaçaq Süleyman bu saat iki il bundan əvvəl müəllimin boğazına kəndir salıb kəndə gəldiyi şəklə düşmüşdü. Qaşları çatılmış, üzünün tükləri biz-biz olub kirpi tikanına dönmüşdü. Beşaçılanı yəhərin qaşından asılmışdı, çalın-çarpaz bağladığı qoltuqaltıları, onaçılanı yerindəydi. İlyas gözlədi ki, bu saat onun paltarını soyunduracaqlar, boğazına ip salıb atın döşünə qatacaqlar, dərə aşağı sürüyüb kəndə aparacaqlar və kim bilir başına daha nə kimi oyunlar açacaqlar. Ürəyində özünü yaman danladı, uşaqlıq elədiyini başa düşdü. "Özüm heç, bir can borcluyam, öldürərlər cəhənnəmə öldürsünlər, amma el-oba biabır olacaq". Rəşid atın üstündən dönüb rişxəndlə ona baxanda az qaldı ürəyi partlasın.

Qaçaq Süleyman cilovu gəmirən atın başını dartdı.

– Təzə bəyə də at verin.

Rəşid təəccübləndi:

– Onu da aparaq?

– Bə nə. Heç bəysiz də toy olar?

İlyasa at gətirdilər. Oğlan duruxdu. Gözlərini Qaçaq Süleymanın qan sağılmış gözlərinə zillədi və ilk dəfə bu gözlərdə mehribanlığa bənzər bir işartı gördü. Deyəsən kişinin sifəti də işıqlanmışdı. Dodağında təbəssümə bənzər bir şey sezilirdi.

– Min, bala, səni toya piyada aparmayacağıq ki? Eldən ayıb olar.

İlyas bu sözlərin arxasında dərin, gizli bir kinayə olduğundan şübhələnsə də, sıçrayıb atın belinə qalxdı. Qaçaqlar atları məhmizləyib özlərinin tanıdıqları kəsə yolla dərəyə endilər.

Sazaq başlamışdı. Atların ayaqlarının altında qar xarıldayırdı. Ağacların budaqları şaxtadan çatdayıb qırılırdı. Orda-burda qarğalar qarıldaşırdı. İlyası fikir götürmüşdü. Qaçaq Süleymanın sözlərini bir yana yoza bilmirdi. "Təzə bəyə at verin!", "Səni toya piyada aparmayacağıq ki?" Bunlar nə demək idi? Yoxsa məni ələ salırdılar? Görəsən atam indi neyləyir? Yəqin damın üstünə çıxıb-düşməkdən, yollara baxmaqdan gözünün kökü saralıb. Barı anama heç nə deməyəydi, yazıq arvadın bağrı çatlayar. Görəsən qız evinin qulağına bir şey çatmayıb ki? Zöhrə indi mənim harada olduğumu bilirmi? Bilirmi ki, qaçaqların yanındayam, ondan ötəri gəlib buralara çıxmışam. Özümü də işə salmışam, onu da. Bəlkə heç buraya gəlməyəydim, Rəşid mənə neyləyə bilərdi ki? Heç camaat qoyardımı ki, kənddə namussuzluq ola. Nəysə... Özü yıxılan ağlamaz, Allaha pənah...

Onlar dərənin aşağısı ilə axan çayın sahilinə çatdılar. Su buz bağlayıb ağız-ağıza qovuşmuşdu. Qaçaq Süleyman cilovu çəkib buzun altında axan suyun həzin şırıltısına qulaq asdı. Sonra qamçı ilə yoldaşlarına nəsə işarə etdi. İki nəfər atdan düşdü. Buzun üstü ilə çayın ortasına qədər getdilər. Tüfəngin qundağı ilə buzu sındırdılar. Quyunun ağzı boyda dəyirmi yer açdılar. Qaçaq Süleyman üzünü Rəşidə tərəf tutub gülümsündü:

– Çimməklə aran necədir?

– Bu soyuqda?

– Bəli. Deyirlər soyuq su adamın belini bərkidir.

Rəşid döyükdü. Süleymanın üzünə baxdı. Bilmədi gülsün, yoxsa ciddiləşsin.

– Zarafatı burax.

– Zarafat niyə, düz sözümdür, axşam qız yanında olacaqsan.

Rəşid atın cilovunu çəkib qaçağın üzünə bozardı:

– Başına at təpibdir, nədir, məni ələ salırsan?

– Dedim ki, çiməcəksən!

O, əlini naqana aparmaq istədi. Elə bu an qamçı Rəşidin üzündə şaqqıldadı və Qaçaq Süleymanın hirs dolu boğuq səsi eşidildi:

– Atdan düş, oğraş!!

Onu sürüyüb yerə saldılar. Kürkünü, şalvarını, pencəyini çıxartdılar. Bircə tuman-köynəyinə dəymədilər. Qolundan yapışıb darta-darta suyun ortasına gətirdilər. Çapalamasına, yalvarmasına fikir vermədilər. Suya basıb çıxartdılar. Bircə anda bədəni qıpqırmızı oldu. İslaq tuman-köynək ətinə yapışdı. Çənəsi şaqqıldadı. Buna fikir vermədilər, yenidən qolundan yapışıb buzun sınıq yerinə saldılar. Onun söyüşlərini, iniltiyə çevrilən yalvarışlarını eşitmədilər. Başçı "bəsdi" deyənə qədər çimizdirdilər. Axırıncı dəfə başıaşağı suya salıb kənara atdılar. Rəşid şappıltı ilə buzun üstünə sərildi. Onu geyindirib atın belinə atdılar. Şallaqdan hürkən at, baş götürüb dərə aşağı çapdı.

İlyas cınqırını çıxartmadan, heyrət və sevinclə gördüklərinə tamaşa edirdi. O, özünü elə itirmiş və elə keyləşmişdi ki, Qaçaq Süleymanın səsini eşitmədi:

– A bala, get arxayın toyunu başla, bir köpəkoğlu sənə söz deyə bilməz. Bəlkə özüm də gəldim.

İlyası iki atlının müşayiəti ilə yola saldılar.

Həmin axşam iki yerdə səhərəcən işıq yandı. Biri Murad kişinin həyətində, o biri isə Rəşidin evində. Murad kişinin həyətində yanan lopa idi, Rəşidin evində otuzluq lampa. Murad kişinin tərtəmiz silinib-süpürülmüş və palaz döşənmiş samanlığında mağar idi – çalıb-oynayırdılar, Rəşidgildə isə sətəlcəmdən od tutub yanan kişiyə küpə salır, üstünü yorğanla bərk-bərk örtürdülər. Səhər tezdən zurnaçılar damın üstünə çıxıb "atdandırma" çalanda bir dəstə atlı dağlara qalxdı. Cağ yerinə qədər ot döşənib üstünə gəbə, yorğan-döşək salınmış arabada bəzəkli bir gəlin üzünə salınmış duvağı aralayıb göz qamaşdıran qarda cığır salan təkərlərin izi ilə evlərinə baxıb kövrələ-kövrələ Murad kişinin qapısına gəldi. Kəndin aşağısında, koxalılar tərəfdənsə ağlaşma səsi ucaldı.

*1982*

## NAMƏRD GÜLLƏSİ

*Dostum Hüseyn Arifə*

Niftalı koxa atın örüşünü dəyişəndə bir istədi yəhəri-yüyəni də alsın, əvvəllərdə olduğu kimi, arxın suyu ilə belinin tərini yusun, amma fikrini dəyişdi. Atı elə yəhərli-yüyənli örüklədi, həm də örüyü bir az da yaxına, arxın alt tərəfinə çəkdi. Bilirdi: hava isti idi, at qan-tər içindəydi, amma əlacı yox idi. O, əvvəllər atını hara gəldi örüklər, örüşünü də tez dəyişərdi, qoymazdı ki, tərləsin. Yəhərini götürərdi ki, at nəfəsini dərsin, istəyəndə otlasın, istəyəndə kişnəyib şahə qalxsın, istəyəndə mıxı qopardıb ilxıya cumsun. Qaynar gözlü kəhərin işıldayan dərisinə, səyriyən sağrısına, qız teli kimi yumşaq yalına baxmaqdan doymayan Niftalı çox vaxt atı yalmanlayıb belinə qalxar, birbaş Kürə sürüb çimizdirər, çox vaxt da yalına yatıb o üzə adlayardı. O vaxt özünün də, atının da qorxusu-hürküsü yoxdu. Həm cavan idi, həm də... Amma indi, illah da koxalığa keçəndən sonra, səksəkəli yaşayırdı...

O, astaca addımlarla dikdirə çıxdı. Arxın üstündən adlayıb ağacların kölgəsində dayandı. Gözünü üfiqlərə qədər uzanıb gedən taxıl zəmilərinə zillədi. Astaca meh əsirdi. Qara qılçıq sünbüllər xışıldayırdı. Otları çoxdan saralıb-solmuş dərəli-təpəli bu boz çöllərin ortasında qoşalaşan qovaq ağaclarının yarpaqları da xışıldayırdı. Hansı rəhmətliyinsə savab üçün əkdiyi bu ağacların dibindən axan arxın suyu da qırçınlanıb şırıldayırdı. Niftalı koxa kölgəyə atılmış palaza, döşəkcə və mütəkkəyə baxdı. O həmişə biçinçilərə baş çəkməyə gələndə burada uzanıb dincələrdi. İndi də həmişəki kimi elə yarlı-yaraqlı palazın üstünə keçib mütəkkəyə dirsəklənmək istədi. İstədi ki, isti təntitsə də, nə çəkmələrini soyunsun, nə də tüfəngini, qoltuqaltısını çıxardıb yanına qoysun. Amma gördü ki, mümkün deyil, tər yuyub aparır. Bir də kimdən qorxacaqdı? Kərəm yəqin ki, bu saat Dilican tərəfdədir, yayın istisində buralarda olmazdı. Olsa da qorxusu yoxdu. O, ömründə əliyalın adama güllə atmazdı. Bircə o gədədən ehtiyat edirdi. Kənddən qaçandan sonra buralarda, kolda-kosda dolaşırdı...

Tüfəngini ağaca söykədi, çəkmələrini soyundu, yaxası qaytanlı köynəyinin düymələrini boşaltdı və palazın üstünə uzanıb mütəkkəyə dirsəkləndi. Cib dəsmallarının uclarını düyünləyib başlarına keçirmiş biçinçilərin oraqları cingildəyirdi. Bu cingiltilər kövşənlərin xışıltısına

qarışmışdı. Biçinçilər tələsirdi. Onlar da istəyirdilər ki, işlərini tezcə qurtarıb aldıqları haqqı elə buradaca aranda, xırmanda döyüb, taxıllarını yaylağa, balalarına aparsınlar. Elə Niftalı koxa da tələsirdi. El çoxdan yaylağa qalxmışdı. Amma o, köçünü saxlamışdı. Sözün düzü, kənddə tək qalmaqdan ehtiyatlanırdı. O qədər anasının əmcəyini kəsənlər var ki... Elə biri gəlmə Mürşüd.

Onun əslinin-nəslinin haradan olduğunu kənddə heç kəs bilmirdi. Bircə o məlum idi ki, çoxdan – lap çoxdan, Niftalıgilin doqqazında üs-tü-başı yamaqlı, acından hülqumu qalxıb-enən, məlul-müşkül baxışlı bir oğlan boynunu büküb dayanmışdı. Əlində əsa, çiynində nimdaş heybə, başında tükü tökülmüş papaq var idi. Soyuqdan üzünün tükləri biz-biz durmuş, dodaqları qaysaqlanmışdı. Gözü batmış quyunun dibindəki su kimi güclə işıldayırdı.

Səs-küyə bayıra çıxdılar, itlərə acıqlandılar, "a bala, kimsən"? – deyə doqqazdakını səslədilər. Niftalının atası kürkünü çiyninə saldı, oğlu ilə bərabər doqqaza çıxdı, hardansa azıb gəlmiş bu Allah bəndəsinə təffərinclə baxdı və başa düşdü ki, bura adamına oxşamır. Son vaxtlar belələrinə tez-tez rast gəlmək olurdu. Ya düşmənini öldürəndən sonra baş alıb buralara pənah gətirir, ya da bir parça çörək ucundan çöllərə düşürdülər. Kişi oğlanı təpədən-dırnağa diqqətlə süzdü və "yox, bu adam öldürüb qaçana oxşamır, – deyə ürəyindən keçirdi. – Yəqin başqa əmması var". Əslinə baxsan kişinin oğlanın çuxura düşmüş gözlərindən xoşu gəlməmişdi.

Elə bil qərib bunu hiss etdi, qışın girhagirində qapıdan geri qaytarılacağını başa düşdü və səsinə yazıqlıq verdi:

– Qaçqınam, ay dayı, heç kimim yoxdu.

Kişi oğlunun üzünə baxdı, Niftalı isə gözünü qaçqının yırtıq çarığından çıxmış barmağına zillədi.

– Buranı sənə kim nişan verib?

– Heç kim. Yolu əlimə alıb gəlmişəm. Qapınıza pənah gətirmişəm.

Ata oğula baxdı, oğul da ataya.

– Adın nədir?

– Mürşüd.

Düzmü deyirdi, Allah bilir, kağızı yox, şahidi yox, gəlmə adam idi. Elə o gündən ona kənd arasında "gəlmə Mürşüd" dedilər.

Əvvəlcə mala baxdı, sonra əkinə-biçinə getdi. Niftalıynan dostlaşıb lap qardaş oldular. Atası öləndən sonra Niftalı ona torpaq da verdi,

köməkləşib balaca bir daxma da tikdilər, mal-qaradan pay ayırıb bir at da bağışladı. Qohum qızlardan birini də alıb onu ev-eşik elədi.

Gəlmə Mürşüd diribaş idi. Əlinə maya salandan sonra Tiflisə, Gəncəyə ayaq açdı. Dolanması da yaxşılaşdı, özü də gümrahlaşdı.

Niftalı bir gün eşitdi ki, Mürşüd arvadını incidir. Həftələrnən evə gəlmir, şəhərdə kefdə-damaqdadır, uşaqlarına baxmır. Ürəyi götürmədi. Yanına çağırdı. İki-üç gün gözlədi, amma Mürşüddən cavab çıxmadı. Bir gün yolda qabaqlaşdılar.

– Niyə görünmürsən? – Nə olub, görünməyim vacibdir?

– Bəlkə bir sözüm var?

– Sənin mənə nə sözün ola bilər?

– Ə, nə yekə-yekə danışırsan?

– Danışmayanda, susmayacağam ki?

Atlar yüyəni gəmirib fınxırışdılar. Döş-döşə gəlib dal ayaqları üstündə fırlandılar. Yolun tozu göyə qalxdı.

– Ə, deyəsən, gözün ayağıyın altını seçmir?! Nə tez havalandın, bala?!

– Artıq-əskik danışma, sözünü de!

Niftalı kişi hirsini zorla boğdu.

– Bir də eşitsəm ki, arvad-uşağa əl qaldırıbsan, dalına bülöv çalaram, bildin?!

– Qələt eləyərsən, keçmişini də yanına alarsan!

– Ə, gəlmə köpəkoğlu, mənə cavab qaytarırsan?!

Qamçının göydə şaqqıldamağı ilə Mürşüdün atın dırnağının dibinə düşməyi bir oldu. Niftalı koxa elə yəhərin üstündən onu budarladı. At da sahibi kimi qəzəblənib onu tapdaladı. Koxanın hirsi soyumadı. Sıçrayıb yəhərdən düşdü. Toz-torpaq içində qıvrılan gəlmənin yaxasından tutub yoldan kənara sürüdü. Xəncər havada parıldadı.

– Qələt eləmişəm keçmişimlə, ay Niftalı, məni öldürmə, balalarım yazıqdı. Sən dədəyin goru, məni çevir uşaqların başına, savab iş görərsən.

Koxanın qolu boşaldı. Mürşüdün quyunun dibində işıldayan suya bənzər gözlərinə nifrətlə baxdı və yaxasını buraxdı.

– Di get, qurban ol evdəkilərə.

Mürşüd dinməz-söyləməz ayağa durdu. Üstünün tozunu çırpdı, elə dinməzcə də yəhərin qaşından yapışıb atın belinə qalxdı. Bir xeyli sakitcə kəndə doğru sürdü və birdən yüyəni dartıb geri qanrıldı.

– Yaxşı, a koxa, bu hayfı səndən almasam, kişi deyiləm. – Niftalı özünə gələnəcən atın başını qanırıb qışqırdı. – Mənə sırıdığın qancığı da gəlib apara bilərsən!

Koxa atı minib tüfəngi hərləyənəcən, tozlu yolda gözdən itdi. Səhərisi də eşitdi ki, başını götürüb evdən qaçıb...

Niftalı koxalığa keçəndən sonra istəsə də, istəməsə də xətrə dəyməli olurdu. Divan-dərədən nə qədər uzaq gəzsə də, onların gözünə sataşmamağa çalışsa da olmurdu, axtarıb tapır, üzünü danlayırdılar ki, filan oğrunu niyə tutmamısan, filan qaçağa niyə çörək veriblər, niyə qoyubsan Qaçaq Kərəm Kürdən keçib yaylağa qalxıb? Deməyə nə var? Amma belə şeylərdən ötrü el-oba ilə üz-göz ol, görüm necə olursan? Vəzifə boyunduruq kimi bir şeydir. Elə ki boynuna qoydular, belinə minib istədikləri səmtə sürəcəklər. Ya gərək dözəsən, ya da gərək onları da özünlə bərabər sürüyüb boyunduruqlu-moyunduruqlu tökəsən Kürə!

Havadan od ələnirdi. Kövşənlərdən qalxan ilğım təndir alovu kimi havanı yalaya-yalaya boz təpələri aşıb kəndin üstünə yayılır, oradan da suyu işıldayan Kürün üstündən keçib Qarayazı meşəsinin ağaclarını qarsıyırdı. Niftalı koxanın kölgəsində uzandığı ağacların gövdəsinə yapışmış cırcıramalar səs-səsə verib elə cırıldayırdılar ki, adam qulağını tutmalı olurdu. Niftalı koxanı isti, üstəlik də cırcıramaların səsi təntitmişdi. Ayaqlarını suya salıb sərinləmək və sinəsini, başını yuyub bir az dincəlmək istədi. Ayağa durdu, yaxası qaytanlı köynəyini soyundu, arxa yaxınlaşıb domuşuqlu oturdu. Əlini suya uzatdı. Kür tərəfdən uzanıb qəbristanlığın yanından dikdirə qalxan tozlu-torpaqlı yolla gələn atlıları görmədi. Cırcıramaların səsi qulağına düşdüyündən atların fınxırtısını, üzəngilərin cingiltisini, ayaq tappıltılarını eşitmədi. Bircə onu hiss etdi ki, güllə açıldı, kürəyi qovuşdu. Əlini sudan çəkib qamətini düzəltdi, qanrılıb dala baxdı. Gördü ki, atlıların biri yüyəni çəkib atı şahə qaldırdı, geri dönüb kiminsə üstünə qışqırdı, qamçı şaqqıldadı.

– Namərd köpəkoğlu!

Daha heç nə eşitmədi. Kövşənlərin xışıltısı, yarpaqların pıçıltısı, arxın şırıltısı, cırcıramaların səsi birdən-birə zəiflədi, uzaqlaşdı və eşidilməz oldu. Havanı qarsalayan ilğım elə bir qor kimi gözünə doldu, bəbəklərinin önündə dalğalandı və dumana çevrildi, hər şey bu dumana büründü...

Kərəm atdan sıçrayıb özünü ağacın altına yetirdi və Niftalı koxanın başını dizinin üstə aldı. Güllə kürəyindən dəyib sinəsindən çıxmışdı.

Gözləri qapalı idi. Təkcə dodaqlarının xəfif titrəyişindən bilinirdi ki, hələ nəfəsi var. Kərəm aralarına qan düşüb düşmənçilik başlayandan bəri onu belə yaxından görməmişdi. Kişi xeyli dəyişmişdi. Balaca buxaq bağlamış, sifəti qaralmış, qalın bığı azca codlaşmış, gicgahları ağarmışdı. Gözlərinin ətrafında xırdaca qırışlar əmələ gəlmişdi. Kərəm hiss elədi ki, Niftalı koxanı qan aparır. Təntidi. Əlini atıb köynəyin yaxasını açdı və bilmədi kişiyə necə kömək eləsin. Elə bil bunu Niftalı koxa da hiss etdi. Qımıldandı. Göz qapaqları aralandı. Zəndlə Kərəmin üzünə baxdı. Torlanmış bəbəklər lal sular kimi durğunlaşdı və birdən-birə genişləndi. Kərəm hiss etdi ki, koxanın bədəni titrəyib dartındı, elə bil kişinin canından üşütmə keçdi. Onun da bədəni gizildədi. Qəhərləndi.

– İndi mən neyləyim, ay Niftalı, Gəncəyə gedə bilmərəm, Tiflisə də ki, əlim çatmaz. Sənin dərdinə nə çarə qılım?

Kişi səs eşidib əvvəlcə diksindi, sonra dirçəldi. Başını azacıq qaldırıb bulanıq gözlərini qarşısındakının üzünə zillədi. Deyəsən kimin dizinin üstündə olduğunu başa düşdü. Əvvəlcə həyəcanlandı. Kərəm onun gözlərindəki işartının səyridiyini hiss etdi. Öləziməkdə olan çıraq təkin atılıb düşən bu həyat işartıları titrədiyi kimi də birdən-birə sakitləşdi. Dodaqları tərpəndi.

– Kərəm?

– Düz tanımısan, Niftalı, mənəm.

– Lap yaxşı, sən olmağın yaxşıdır.

Bu söz Kərəmi sarsıtdı. Elə bil dizinin üstündə can verən qanlı düşməni yox, əziz bir adamıydı. Elə bil bu adam həmişə dağda, dərədə onun izinə düşən, onun qanına susayan, fürsət tapan kimi ələ verməyə hazır olan adam deyildi. Düşmənçilikdən çox-çox əvvəl bir yerdə oynadıqları, Kürü üzüb Qarayazıya keçdikləri, atları yalmanlayıb kənd arası ilə çapdıqları, gözaltı elədikləri qızların görüşünə bir yerdə getdikləri uşaqlıq dostu, uşaqlıq sirdaşı idi. İndi isə bir-birlərinin üzünə həsrət qalmışdılar. Yaraqlı-yasaqlı idilər. O, Kərəmə yaxın düşə bilmirdi, Kərəm də ona. Kərəm tüfəng götürüb dağlara-daşlara düşmüşdü. At belində ömür keçirirdi. Başının dəstəsi ilə Tiflisdən vurub Gəncədən çıxır, Dilican dərəsində haqq-ədalət divanı qurur, dağları aşıb Arazı keçir, sorağı gah İrəvandan gəlirdi, gah da İrandan. Niftalı koxa isə evində, qohum-qardaşının əhatəsində səksəkə içində yaşayırdı. Koxa olandan sonra dəyişmişdi. Kərəm ona bir-neçə dəfə ismarış

eləmişdi ki, kənd adamlarına dəyib-dolaşmasın, amma xeyri olmamışdı. Kərəm onu axtarırdı, çoxdan axtarırdı qulaqburması vermək üçün.

– Dəstəndə təzə adam varmı?

Kərəm güclə eşitdiyi bu sözlərin cavabını xeyli ləngitdi.

– Var.

– Kimdi?

– Mürşüd.

– O gədamı?

Bu söz Kərəmin ortasından beşaçılan gülləsi kimi keçdi. Elə bil gözünə qaranlıq çökdü. Yaralandı, yaman yaralandı.

– Mənə pənah gətirdi, neyləyim?

– Bizə də pənah gətirmişdi, axırını ki, gördün.

Kişi inildədi. Kərəmə elə gəldi ki, onu inildədən yaranın ağrısı deyil, əməyinin, zənninin itməsinin ağrısıdır.

Niftalı koxanın sifətini soyuq tər basdı, üz-gözünü qırışdırdı, sonra bu ağrı və iztirabların əvəzində çöhrəsində təbəssümə bənzər bir ifadə sezildi.

– İndi arxayın ölə bilərəm... Şükür Allaha, zənnim puça çıxdı... Yoxsa o dünyaya nisgilli gedəcəkdim. Çox şükür, Kərəm, gözümdən düşmədin... Başımı bir azca yuxarı qaldır.

Kərəm onun qoltuğunun altından tutub dizlərinə dirsəkləndirdi. Kişi ağrını udub sakitləşdi. Sifətindən quş nəfəsinə bənzər xəfif bir dirilik işığı ötdü. Uzaqlara baxdı. Kərəm hiss etdi ki, onun torlanmaqda olan gözü Kürün o üzünə, Ceyrançöl düzənliyindən sürüşüb sahil boyu uzanan Qarayazıya, bir az bəridəki kənd evlərinə, biçənəklərə, kövşənlərə, dərz tayalarına, mal-qara haylayan uşaqlara zilləndi. Biçənəklər yerlərində quruyub qalmışdılar. Yenə meh əsirdi, yenə taxıl zəmiləri xışıldayır, yenə arxın suyu qırçınlanıb axır, yenə cırcıramalar zil səslə cırıldayırdılar. Niftalı koxanın gözünün önündən təndir istisinə bənzər dalğa-dalğa ilğım keçirdi. Ancaq o ayırd edə bilmirdi ki, gözümü torlanır, yoxsa ilğımmı keçir?

Birdən dirçəlib üzünü ətrafdakı atlılara çevirdi. Baxışları ilə Kərəmin yoldaşlarını bir-bir süzdü. Gözü Mürşüdə sataşanda yenidən yay kimi dartınıb gərildi. Kərəm gördü ki, kişinin halı birdən-birə dəyişdi, yanaqlarına elə bil qızartı çökdü. Bu qızartı son döyüntülərini keçirən ürəyin damarlara vurduğu axırıncı qan damlalarının qızartısı idi. Kişinin öləziməkdə olan gözləri Kərəmin üzünə zilləndi.

– Kərəm, bircə diləyim var...
– De görüm.
– Naqanını çıxart, məni alnımdan özün vur.
– Nə danışırsan?
– Qoy desinlər ki, Niftalı koxanı Qaçaq Kərəm öldürüb... Kişini kişi öldürər, qardaş, gəda-güda yox.
– Əlim qalxmaz.
– Dediyimi eləməsən, atayın belindən gəlməyibsən.
Kişinin sinəsi qalxdı və asta-asta endi.
Kərəm qəhərləndi. Boğazına yığılmış yaşı güclə uddu. Gözləri ilə axtarıb Mürşüdü tapdı. Əlləri əsdi. İstədi tüfəngi hərləyib elə buradaca, tülkü kimi büzüşmüş namərdi qanına bulasın. Amma fikrini dəyişdi. "Onsuz da Niftalının qohumları onu sağ buraxmayacaqlar" – deyə düşündü. Bir də əlini murdarlamaq istəmədi.
– Onun tüfəngini də, atını da əlindən alın, qoyun rədd olsun! Özünüz də atdan düşün, tüfənginizi yəhərin qaşından asın. Bizi gülləyə də bassalar, əl-ayaq tərpətməyin. Kəndə gedəcəyik.
Kərəm qərara almışdı. Niftalı koxanın meyitini kəndə özü aparacaqdı. Kişini əlləri üstünə alacaq, atı isə dalcan gələcəkdi. Qaçaqlar da atların yüyənlərini boynuna atıb cənazənin ardınca dinməz-söyləməz addımlayacaqdılar. O bilirdi ki, bu ağır işdir. Kənd adamları onların qabaqlarına çıxacaq, arvad-uşaq hay-haray salıb üz-gözünü cıracaq, vay-şivən salıb saçlarını yolacaq, qarğış edəcəklər. Bəlkə onlara güllə də atacaqdılar. Artıq-əskik danışanlar, divan-dərəyə xəbər verənlər də tapılacaqdı. Amma inanmırdı. İnanmırdı ki, kəndlərində belə namərdlər tapılsın. O, əmin idi ki, meyiti sakitcə kəndin arası ilə Niftalı koxanın evinə qədər aparacaqlar. Onları lal sükutla da olsa, el adətincə qarşılayacaqlar. Kərəmgil kişinin dəfnində də iştirak edəcəklər. Kişinin üçündən sonra koxanın qohum-əqrəbasına başsağlığı verib atlanacaq və dağlara sarı üz tutacaqlar.
Kərəm qollarını və dizlərinin üstündə sərinlik hiss etdi. Başa düşdü ki, kişinin bədəni soyuyur. Amma üzünə zillənmiş solğun gözlərinin dərinliyində bir intizar var...
Əlini astaca naqanın qoburuna apardı. Barmaqları əsə-əsə düyməni açdı...

*1987*

## ÖLÜLƏRİ QƏBRİSTANDA BASDIRIN

Şəhərin mərkəzindəki bağ Rəşidin ürəyinə hər yerdən çox yatırdı. Dörd yolun kəsişdiyi və bütün küçələrin birləşdiyi bu bağda həmişə qış-yay adam olurdu. İsti günlərdə ağacların kölgəsində sərinləməyə bura gəlir, soyuq havada evdə darıxan yaşlılar özlərinə həmsöhbət tapmaq üçün yenə buraya çayxanaya toplaşırdılar. Elə cavanların çoxu da burada görüşürdülər. Rəşidə şəhərin kənarında, çay sahilində güllü-çiçəkli bağlarda yer təklif etmişdilər, amma razı olmamışdı. Keçmiş təcrübəsindən bilirdi ki, belə yerlərə yaz-yay aylarında müştəri çox gəlsə də, hava soyuyub göyün üzü bozaran kimi seyrəlirdi. İki-üç saatdan bir altında maşın olan kefi kök adamlar görünür, onlar da bir-iki saat oturub gedirdilər. Sonra sükutdan qulaq cingildəyirdi. Amma Rəşid istəyirdi ki, hamıya qulluq eləsin, atlıya da, piyadaya da. Dəqiq bilirdi: kooperativ restoran şəhərin mərkəzində olsa, bütün fəsillərdə hamı axışıb bura gələcəkdi, heç bircə saat da müştərisiz qalmayacaqdı. Fikrini rayonun rəhbər işçilərinə də demişdi, razı olmuşdular. Üstəlik də söz vermişdilər ki, əllərindən gələni əsirgəməyəcəklər. Rəşid özünə köməkçilər tapmış və hər şeyi ölçüb-biçmişdi. Restoran ikimərtəbə olacaqdı. Ümumi salonu, ayrıca otaqları xüsusi planda tikiləcəkdi. Onun fikri bu idi ki, həm də yeməkxana açsın, orada nisbətən ucuz xörəklər satsın. Tənəffüsə çıxanlar, işə tələsənlər, yol adamları vaxt itirmədən nahar etsinlər. İkinci mərtəbədə xüsusi kabinələrdə isə ayrı dəmdəsgah olsun. Hətta rayonlarına yeni bir dəb də salmaq istəyirdi. Arvad-uşaqları ilə gələnlərə gözdən uzaq yerdə ayrıca otaqlar düzəldəcəkdi. İçərisini lap ev kimi sahmana salacaqdı. Hər şey ölçülüb-biçilmişdi: restoranın yanında çayxana düzəldəcəkdi. Özü də çayı bütün dəmdəsgahı ilə verəcəkdi. Səhər-səhər bal, yağ, qaymaq salma çayla. Mixəyi, darçını, kəkotusu, löyün-löyün mürəbbələri də böyründə. Elə eləyəcəkdi ki, şəhərdəki bütün çayxanalar bağlanacaq, kişilərin çoxu səhər yeməyini evdə yox, Rəşidin çayxanasında yeyəcəkdilər. Amma bir məsələ qanını yaman qaraltmışdı.

Bağın ortasında köhnə bir qəbir vardı. Görünür vaxtilə bu qəbrin ətrafına dəmir məhəccər çəkiblərmiş. Sonradan paslanıb çürümüş, yağışın-qarın altında qalıb ovxalanmış, bağ-bəndi qırılıb yerə tökülmüşdü. O da hiss olunurdu ki, qəbrin dörd yanında qızılgül kolları əkilibmiş. İllər keçdikcə baxımsızlıqdan quruyub solmuş, tapdalanmış və yerlə-

yeksan edilmişdi. Kolların kökü çürümüşdü. Amma hərdən torpaq şirələnib bahar havası ilə nəfəs alanda çürümüş kötüklərin ora-burası cücərir, tezcə də solurdu. Qəbrin özü də dağılmışdı. Nə sinədaşı vardı, nə də başdaşı. Suvağı tökülmüş, ağ daşları isə quzulayıb ovxalanmışdı. Bir-iki il də keçsəydi, bu sahibsiz qəbir torpağın altında qalıb tamam itəcəkdi. Bağa gəlib-gedən qocalardan, saymazyana, bu qəbrin kimin olduğunu soruşmuşdu. Amma düz-əməlli cavab verən olmamışdı. Hamı çiynini çəkib uzaqlaşmışdı. Rəşid niyyətini heç kəsə açmadan beş-on gün sual-cavab apardı, axırda yəqin etdi ki, qəbrin sahibi yoxdur. Restoranın himini qoyanda qəbri dövrəyə alıb, səssiz-səmirsiz, döşəmənin altına salar, beləliklə də hər şey bitər, nə dil bilər, nə də dodaq. Amma ürəyində bir səksəkə vardı. Bilirdi ki, şəhərlərdə, xüsusən də rayon mərkəzlərində, hər adamı bağda basdırmırlar...

Onun on doqquz yaşı vardı, şıvırtı bir oğlandı. Qaşları çatma, gözləri ala, kürəyi enli bu cavan yolnan gedəndə çəpərlərin dibindən boylanan qızların sayı artırdı. Hərdən o elə bil kürəyində gizilti hiss edir və dönüb geri baxanda çəpərin dibinə sinənlərin kəlağayından başqa heç nə görmürdü. O hiss edirdi ki, doqqazlarda çiyni sənəkli qızlarla qarşılaşanda qan üzünə vurur, qızlar da pul kimi qızarıb başlarını aşağı salır, kəlağayılarını çəkib üzlərini gizlətməyə çalışırlar. Özü də hiss etmədən əyin-başına sığal verir, quşburun çarıqlarını səliqə ilə geyinir, dolağını kip dolayır, sallamalı gümüş kəmərini şəstlə köynəyinin üstündən belinə bağlayırdı. Toyda-mağarda kənarda qalmırdı. Qara zurnada güləşhəngi çalınan kimi meydana atılırdı. Bircə cıdıra çıxanlara qoşula bilmirdi. Atı yox idi.

* * *

Bir gün kəndin qurtaracağındakı dəyirmanın üst tərəfinə çəmənliyə getmişdi. Ot qurşağa çıxırdı. Qovaq ağaclarının ağ, qu kimi ləçəkləri havada uçuşur, çəmənlikdəki çiçəklərin üstünə qonurdu. Haradasa qumru quşları oxuyurdu. İydə çiçəklərinin ətri havaya elə hopmuşdu ki, nəfəs aldıqca adam bihuş olurdu. Onun başı bu məstlikdən gicəlləndiyindən harada olduğunu unutmuşdu.

Birdən at fınxırdı. Başını qaldıranda qurşağa çıxan otu ortadan biçən cığırda yedəyində yəhərli-yüyənli atla dayanan qızı gördü. Baxışları toqquşanda elə bil şimşək çaxdı, qıpqırmızı oldu, dili-dodağı təpidi. Qız isə boynunu yana əyib gözünü ona zillədi.

– Bıy, ciyərin yansın, ədə, tula qovmuş dovşan kimi qabağıma hardan çıxdın?

Qızın səsi onu özünə gətirdi. Elə bil gözünün önündən duman çəkildi. Ürəyinin döyüntüsü, qulaqlarının güyültüsü azaldı.

– Mənə niyə qarğayırsan, sənə nə pislik eləmişəm?

– Bundan artıq nə pislik eləyəcəksən, neçə vaxtdır ciyərimi yandırırsan. Çəpərin dalından boyuna baxmaqdan boynum uzana qalıb.

– Axı, nə sən mənim üzümü görübsən, nə də mən sənin.

– Üzünü görməsəm də sorağını almışam. Adın xoşuma gəlirdi. İndi də özünü görüb bəyəndim. Adın da Cavanşirdi, özün də. Lap cavan şirə oxşayırsan. Düz sözümdü, meylim sənə yaman qondu.

Cavanşir başa düşdü ki, onun qarşısında dayanan adını eşidib üzünü görmədiyi Həcərdi, Şəmistan ağanın qızı Həcər. Özünü ələ aldı. Sözün düzü bu tayfadan qorxurdu. Eşitmişdi ki, onların qızları da, kişiləri də qan çanağıdır. Onlara yaxınlaşan da peşman olur, uzaqlaşan da. Onu da eşitmişdi ki, bu tayfanın adamlarının gözü bir şeyi tutdumu, əl çəkən deyillər. Ona görə də cığırdan çıxıb aralanmaq istədi. Amma qız yolu kəsdi.

– Əlimə yenicə keçibsən, məsələni dağ eləməmiş buraxan deyiləm.

Cavanşir özünü tamamilə itirdi. “Bu qız deyəsən, lap gerçəklədi” – deyə xəyalından keçirdi. Amma özünü sındırmadı.

– Sonra peşman olarsan.

– Bax, bu oldu kişi söhbəti.

Cavanşir udqundu. O görmüşdü ki, kəndlərindəki qızlar kişi səsi eşidəndə, kişi papağı görəndə qaçıb gizlənir, qəfil qabaqlaşanda isə ayaqları dolaşa-dolaşa başlarını aşağı salıb aralanırlar və dalda yer axtarırlar ki, gizlənsinlər. Amma bu, yolu Ərəbzəngi kimi kəsmişdi.

Cavanşir belə bir qızın qabağından qaçmağı kişiliyinə sığışdırmadı. Ehtiyatı, utanmağı buraxdı və qızı təpədən dırnağa süzdü. Onun başında yaşıl yelənli ağ kəlağayı vardı. Zil qara saçlarını ortadan tən ayırmışdı. Qulağına yumru qızıl sırğa taxmışdı. Cığaları qıvrım idi, qulağının üstünə düşmüşdü, özü burmamışdı. Boynunda iki qatar mərcan muncuq vardı. Dərisinin ağlığı mərcanda əks edirdi. Çənəsinin altında güclə seçiləcək buxaq vardı. Dodağı elə bil qaymaq idi. Nəfəs aldıqca titrəyən burnunun sol yanındakı qara xal sifətini daha da gözəlləşdirirdi. Cavanşir onun qabarıq sinəsinə, yaxası açıq atlas koftasına, belinə kip bağladığı gümüş kəmərinə, qırçınlı ipək güllü donuna baxdı və as-

tadan köksünü ötürüb gözünü qızın gözünə zilləmək istədi, bacarmadı. Qızın adamı nizə kimi deşən baxışları onu yenə sarsıtdı. Əyri ucları ilan kimi qıvrılan qaşları altında oyur-oyur oynayan qara gözlərə baxmaq çox çətin idi. Cavanşir təntidi. "Zalım qızı az qalır adamı gözləri ilə yesin" – deyə xəyalından keçirdi və baxışını yayındırıb Həcərin çiyninin üstündən ata baxdı. Gümüş sinəbəndli at yüyəni çeynəyirdi.

– Nə oldu, baxıb qurtardın?

Cavanşir özünə toxtaxlıq verdi.

– Qurtardım.

– Bəyəndin?

– Bəyəndim. Atın qəşəngdir, özün də ki, tanrı gözəlisən.

Qız qəhqəhə çəkdi.

– Bax, bu oldu kişi söhbəti. Atama deyərəm, toyumuz olanda bu atı mənə cehiz verər.

– Əvvəl gərək özünü verə, sonra cehizini.

– O, əlimdədir. Kimə barmağımı tuşlasam, mənim olmalıdır. Eşitməyibsənmi ərə gedəndə biz nəslin qızlarını seçmirlər. Biz özümüz oğlanları seçirik.

– Sən də özünə oğlan seçibsənmi?

– Bu günə qədər seçməmişdim, amma indi seçdim.

– Kimi?

– Səni.

– Məni?

Cavanşirin səsi titrədi və bir addım geri çəkildi.

– Olmaya qorxdun? Qorxma, sənə pis arvadlıq eləmərəm. Gecə-gündüz nazını çəkər, erkək at kimi bordayıb tumarlayaram ki, cıdıra çıxanda büdrəməyəsən.

Qızın əvəzinə Cavanşir qızardı. "Bu günü qara nə danışır, deyəsən heç qorxusu-hürküsü yoxdur. Başı batmış utanıb eləmir də. Demirmi birdən beynim qızar. İydələrin də çiçəkləyən vaxtıdı. Gələn yox, gedən yox," – xəyalından keçirdi. Həcər də ciddiləşdi. Oxunu atıb yayını gizlətmək olmazdı. Sözünü axıra çatdırdı.

– Cavanşir, yadında saxla, səni heç kimə verən deyiləm. Gözüm tutub, meylim qonub. Hünərin var, geri dur!

– Mən ki, sənə heç nə deməmişəm.

Bu dəfə Həcər həyəcanlandı. Sinəsi qalxıb endi, dodaqları səyridi:

– Yoxsa ürəyini çalan var, mənə düzünü de?

– Ürəyimi çalmaq istəyən çoxdu, amma hələ heç kəsə meylimi salmamışam.

– Sala da bilməzsən. Çünki mən varam.

Cavanşir gördü ki, qız lap gerçəkləyib. Əslinə baxsan Cavanşir özü də onun sorağını çoxdan almışdı. Qonşularından, xala və bibi qızlarından eşitmişdi ki, Şəmistan ağanın deyib-gülən, at çapan, nazlı-duzlu bir qızı var. Amma anası bir dəfə sözə qarışmışdı: "A bala, onlar varlı-hallı, arxalı nəsildir, biz onlara tay ola bilmərik". O gündən Cavanşir bu söz-söhbətdən uzaq gəzməyə çalışırdı. İndi isə gözlənilmədən qabaqlaşmışdılar.

At yüyəni yeyib kişnədi və şahə qalxıb dartındı. Cavanşir gördü ki, bir az da keçsə xallı göy at yüyəni qızın əlindən qoparıb qaçacaq və onu tutmaq çətin olacaq. At madyan görmüşdü.

Sıçrayıb yüyəndən yapışdı və atın yönünü qovaq ağaclarına tərəf çevirdi. Göy at dartındı, fınxırdı və yüyənin güclü əldə olduğunu görüb sakitləşdi.

Cilovu qıza verəndə əlləri bir-birinə toxundu. Diksinib bir-birlərinin üzünə baxdılar. Elə bil qarşısında dayanan qız bayaqkı Həcər deyildi. Birdən cəsarətə gəldi. Qollarını qızın belinə dolayıb sinəsinə sıxdı. Göz-gözə, nəfəs-nəfəsə dayandılar. Cavanşir qızın titrəyən bədəninin təmasından lərzəyə gəldi. Dodaqlarını dodaqlarına yapışdırdı. Qızın təpimiş dodaqları onu yandırdı. Həcər sustaldı, göz qapaqları yumuldu. Cavanşirin isti nəfəsi onun boynunda, sinəsində gəzdi. Bircə an da keçsəydi, oğlan qızı qolları arasına alacaq, cığırdan aralayıb otluğun qalın yerində arxası üstə yıxacaqdı. Ancaq Həcər gözlənilmədən çırpındı və ilan kimi qıvrılıb kənara atıldı. Atılması ilə də Cavanşirə tərs şillə çəkməyi bir oldu.

– Üz verəndə, astar istəmə!

– Özün...

– Behini aldın, elçini göndər!

Həcər atın belinə sıçradı. Göy at götürüldü. Cavanşir qızın dalınca baxa-baxa qaldı.

Yenə havada qovaq ağaclarının ləçəkləri uçuşur, hardasa qumru quşları ötüşürdü...

Həcər çox gözlədi, amma Cavanşir tərpənmədi.

Bir gün kənddə toy vardı. Cavanlar cıdıra hazırlaşırdılar. Şəmistan ağa da göy xallı atını minib gəlmişdi. At dəfin səsini eşidəndə oyna-

mağa başladı. Meydanda – xırman yerində – fırlandı, şahə qalxdı, sonra yorğa yerişlə iki-üç dövrə vurub camaata yaxınlaşdı. Birdən Cavanşirin yanında dayandı, onu imsilədi. Şəmistan ağa təşviş içində cilovu çəkib atdan düşdü. Gözaltı Cavanşiri süzdü. "Bu at onu hardan tanıyır?" – deyə fikirləşdi və gördü ki, at oxranır, çəçiyini yerə döyür, oğlan isə gözünü atdan çəkmir. Birdən yüyəni Cavanşirə verdi.

– A bala, sıçra atın belinə, göstər hünərini.

Oğlan çaşıb qaldı.

– Di tez ol, sonra dallarından çata bilməzsən.

Ayağını üzəngiyə qoymağı ilə atın belinə qalxmağı bir oldu. Şəmistan ağa bir xeyli, qürurla, atın dalınca baxdı və qanrılıb meydandan aralanmaq istəyəndə qulağına səs gəldi. "İndi atını minməyə verdi, sonra da qızını verəcək". Meydan kişinin başına fırlandı. Özü də hiss etmədən xəncərin dəstəyindən yapışıb yarıyacan siyirdi və dabanı üstə fırlanıb söz deyəni doğramaq istədi. Ancaq necə oldusa əl saxladı. "Lənət sənə, kor şeytan", – dedi və xəncəri qınına saldı. Ömründə ilk dəfə özünü eşitməzliyə vurdu və barmağını dişlədi. "Demək belə, Həcərin sirri varmış, ona görə gələn elçiləri qapıdan qaytarırmış". Kişi nə cıdıra baxa bildi, nə də deyilənləri eşitdi, nə də Cavanşirin hamıdan qabaq gəlib nəmər aldığını, atın boynunu tumarlaya-tumarlaya ona yaxınlaşdığını gördü. Evə də necə gəldiyindən xəbəri olmadı, qızı ilə dəhlizdə qarşılaşanda bircə anlığına onun gözlərinə baxdı. Qızı suçlu adam kimi başını aşağı salıb geri çəkildi.

Bir həftə evdə heç kəsi dindirmədi, arvad-uşağın üzünə baxmadı. Heç kəs bilməsə də Həcərin ürəyinə damdı ki, atası nəsə eşidib...

Bir axşam Şəmistan ağa arvadını yanına çağırıb, qapını örtdürdü.

– Qızın niyə ipə-sapa yatmır, yoxsa əngəli var?

– Bıy, a kişi, ağlını başına yığ, o nə sözdü, danışırsan?

– Bə, niyə elçi gəlmək istəyənləri doqqazdan yola salır?

– Həlbət ürəyinə yatan yoxdu.

– Yoxdu, yoxsa var?!

Arvad başını aşağı saldı. Əri ilə söz güləşdirmək istəmədi. Anladı ki, kişi deyəsən duyuq düşüb, sözün düzünü deməyi məsləhət bildi.

– Olanda nə olar, yetişmiş qızdı. Özün həmişə demirdinmi ki, kimi istəsə ona verəcəm. Kişi bir az sakitləşən kimi oldu.

– Kimdi, bə, niyə ortalığa çıxmır?

Arvad çiynini çəkdi.

– Nə bilim?

Şəmistan ağa yenidən həyəcanlandı. Ürəyindən nə keçdisə, oturduğu yerdə dikəldi və az qaldı gözü ilə arvadı yesin.

– Yoxsa, o gədədi?

– Kim, Cavanşirmi?

– Demək bilirsən? Bəlkə, xəlvətcə onları görüşdürürsən də?!

– Vallah üzünü də görməmişəm. Bircə dəfə qızın dilindən qaçırıb ki, özümə oğlan tapmışam, adı da Cavanşirdir.

Aralığa sükut çökdü.

Cavanşir bir kişi kimi onun da xoşuna gəlirdi. Boylu-buxunlu, yaraşıqlı bir oğlandı.

– Yəni deyirsən dul arvad oğlundan kişi çıxar?

– Niyə çıxmır? Əlin, gözün üstündə olsa, çıxar.

Bu hadisədən xeyli sonra yaylağa köçdülər. Ordan-burdan qızı yenə istəməyə başladılar. Cavanşirgildən isə səs çıxmadı.

Kəndin kişiləri dəyələrin aşağısındakı çəmənliyə yığışmışdılar. Cavanlar da kənarda dayanmışdılar. Ordan-burdan söhbət edirdilər. Buğaların döyüşündən, kəllə buğanın kəllə-kəlləyə gəlməsindən söz salmışdılar. Hərə bir xatirə, hərə bir əhvalat danışırdı. Axırda Şəmistan ağa da söhbətə qarışdı. "Keçmişdə, bildiyiniz kimi, hər naxırın öz buğası olardı. Bizim də iki-üç buğamız vardı, əldən düşmüşdülər. Atam soraqlaşdı, axtardı və bir cins yazabuğa aldı. Çox yaraşıqlıydı, tükləri qızıla çalırdı. Dərisi də elə bil məxmərdi. Naxırı qomarğalayıb qabağına qatırdı. Qoymurdu ki, buğalar yaxın gəlsin. Buynuzu ilə yeri eşib onları hürküdürdü. Naxırda inəklər də vardı, düyələr də. Buğaya gəlmək vaxtlarıydı. Elə ki, buğanın biri inəyə, ya da düyəyə yaxınlaşmaq istəyirdi, yazabuğa böyür-böyür böyürür və onların yolunu kəsirdi. Amma üzülmüşün özü də düyələrə yaxın gəlmirdi. Atam gördü ki, iş belə getsə mal qısır qalacaq. Yazabuğanı naxırdan aralayıb kəsdi və alışma elədi".

Kişilər gülüşdülər, yaman gülüşdülər. Cavanşir isə sözü özünə götürüb pul kimi qızardı.

O gecə anası ilə danışdı. El dağdan arana enəndə qıza elçi göndərdilər və nişan taxdılar. Cavanşir toya hazırlaşanda isə onu Qəza Firqə özəyinə çağırdılar və ikiillik firqə məktəbinə oxumağa göndərdilər.

Geri qayıdanda onu tanımaq olmadı. Özü də dəyişmişdi, əyin-başı da. Ayağında uzunboğaz çəkmə, belində aşırmalı enli kəmər vardı. Tünd bənövşəyi rəngli şivyotdan qalife şalvar-köynək geyinmişdi.

Kürəyi bir az da enlənmiş, özü bir az da gözəlləşmişdi. O, qarşısına məqsəd qoymuşdu: Qəzada birinci "Kommuna" yaratmaq. Fikrini Firqə özək katibinə də dedi. Bəyəndilər və başa saldılar ki, bunun üçün əvvəlcə qolçomaqları əzmək lazımdır.

Ertəsi günü Şəmistan ağanı idarəyə çağırdı. Bir xeyli sözü nədən başlayacağını bilmədi. Kişi gözləyirdi ki, iki ildən çox onun yolunu gözləyən Həcərdən söz salacaq, toy haqda məsləhətləşəcəkdi. Amma Cavanşir sözünü qəribə başladı.

– Şəmistan əmi, özün bilirsən ki, kəndimizdə səndən varlı adam yoxdu.

– Nə demək istəyirsən?

– Gərək mal-qaranı təhvil verəsən.

– Kimə?

– Kolxoza. Kəndimizdə kommuna quracayıq.

– O nə olan şeydi?

Cavanşir izah elədi. Kişi diqqətlə qulaq asdı və birdən ayağa sıçradı.

– Get özünə peşə tap, bala, mən heç kəsə mal-qara verən deyiləm!

– Verməzsən, zorla alarıq.

– Nə ixtiyarla?

– Qolçomaq olduğuna görə.

Bir həftədən sonra şəhərdən milislər tökülüşüb gəldilər. Şəmistan ağanın evini qomarğaladılar. Kişini tapa bilmədilər. Gecəynən duyuq düşüb, qaçmışdı. Ev-eşiyi bir-birinə qatdılar, arvad-uşağı çölə tökdülər. Yorğan-döşəyi, ələ keçən pal-paltarı bir arabaya doldurub dörd milisin müşayiəti ilə qəza mərkəzinə yolladılar. Oradan da sürgünə...

Əl-ayağa dolaşan olmadığından işi yaxşı getdi. İki ilə kəndi sökdü, əyri-üyrü çəpərləri dağıtdı, köhnə evləri uçurtdu və çay kənarında, gözəl, sulu yerdə cərgə ilə yeni evlər tikdirdi. Dəyirman yerində balaca bir elektrik stansiyası da qurdurdu. Evlərə işıq gəldi. Arvadların canı hisli çıraq şüşəsi təmizləməkdən qurtardı. Hər şey onun gözündə gözəlləşmişdi. Kommunanın balaca "Fordzon" traktoru, taxıldöyəni, otbiçəni vardı. Klubu hər gecə işləyirdi. Belə bir qayda qoymuşdu: kəndə gələn qonaq qohumunun evinə yox, kommunanın qonaq otağına düşməli idi. Qohumlar burada görüşməli, kommunanın hesabına düzələn yemək-içməyi də bir yerdə yeməliydilər. Cavanşirin adı dillərə düşmüşdü. tez-tez mərkəzdən adamlar gəlir, şəklini çəkir, qəzetlərə məqalələr yazırdılar. Onun başı işə o qədər qarışmışdı ki, çox vaxt evə

də gəlmirdi. Elə idarədə divana uzanıb yatır, ya da şinelini üstünə salıb dirsəklənir, bir azca çimir alırdı. Anasının da gecəsi-gündüzü yoxdu. Arvad səksəkə içində səhərəcən, doqqazda, oğlunun yolunu gözləyirdi. Həftədə bir-iki dəfə ancaq görüşürdülər. Görüşəndə arvad kəlağayısının ucu ilə gözünü silə-silə oğlunu danlayırdı:

– A bala, özünü az öldür, vallah qədrini bilən olmayacaq. Eldən ötrü ağlayan kor olar, oğul, bir özünü də fikirləş, ev-eşik qur, arvad-uşaq sahibi ol, mən də istəyirəm nəvəm olsun.

– Darıxma, ana, hər şey düzələcək. Bir də məsəl var: Balığı burax dəryaya, balıq bilməsə də xaliq bilər. O ki qaldı evlənməyə, hələ vaxt var. Bir də ki, ilk oxum daşa dəydi.

– Taqsır özündə oldu, bala, qızışdın, binəvaları yerindən-yurdundan didərgin saldın. Görəsən yazıqlar indi hardadırlar?

Cavanşir tutuldu. Hardasa, ürəyinin dərinliyində kövrələn kimi oldu.

– Kişi buralarda, dağda-daşda gizlənir. O biriləri uzaqdadır, əlçatmaz yerdə.

– Deynən bədbəxtləri gedər-gəlməzə göndəribsən.

– Mən göndərməmişəm, Şura hökuməti göndərib.

– Səndə də taqsır oldu, oğul, Həcər sənin nişanlın idi, istəsən qoymazdın.

– Mən qolçomaq qızını ala bilməzdim!

Arvad gördü ki, oğlu hirslənir, onu sakitləşdirmək istədi.

– Nə deyirəm, bala, özün bilən yaxşıdı. Amma qorxuram. Uzun saçlının ahı yerdə qalmır, bir az ehtiyatlı ol.

Bu söhbətdən sonra Cavanşir az qala ayağını evdən kəsdi.

Bir axşam yenə gecəyarıyacan iclas apardı. Yorulduğundan evə qayıtmadı. Divana uzanıb idarədə yatmağı qərara aldı. O üz-bu üzə çox çevrildi, gözünə yuxu getmədi. arada durub papiros çəkəsi oldu. Ürəyi yaman döyünürdü, narahat idi. Gördü ki, yata bilmir, eyvana çıxdı. Məhəccərə söykənməyi ilə dalbadal atılan güllələrin qulağının dibindən vıyıltı ilə keçməyi bir oldu. Dirəyin dalına mətərislənib naqanını çıxartdı və qarasına iki-üç güllə atdı. Kəndin aşağı tərəfində itlər hürüşdü, çataçat güllə açıldı. Birdən göyün üzü qızardı. Cavanşir başa düşdü ki, ot tayaları, tövlə, anbar, evlər yanır. Tez idarəyə girdi, rayona zəng çaldı, köməyə milis çağırdı və kəndin aşağı tərəfinə qaçdı. Camaat səksəkə içində yuxudan ayılmışdı. Tüfəngi olan tüfəng, olmayan balta, yaba götürmüşdü. Arvad-uşaq bir-birinə qarışmışdı.

Cavanşir özünü yetirəndə artıq evləri yanıb külə dönmüşdü. O, dəli kimi oldu. Özünü oda atdı, tüstü-duman içində anasını axtardı. Anası yox idi.

Rayondan atlı milislər gələndə artıq iş-işdən keçmişdi. Qaçaqlar çıxıb getmiş, kəndin yarısı yanıb kül olmuşdu.

Onu evə yaxın qoymadılar. Anasının yanıb kösövə dönmüş cəsədini göstərmədilər. Meyiti qəbrə sallayanda da qolundan tutub kənarda saxladılar. Düz bir həftə gündüzlər gözə görünmədi. Gecələr isə əlində tüfəng kəndi dolaşdı, yolları, bəndi-bərəni kəsdi, kimi isə gözlədi, gələn olmadı. Səkkizinci gün tezdən durdu, üzünü qırxdı, paltarını səliqə ilə geyindi, naqanı belinə bağladı, beşaçılanı əlinə alıb, atın belinə qalxdı. Düz birbaş Qəza Firqə Özəyinə getdi.

– Mənə otryad verin, qaçaqların üstünə gedəcəm.

İki gündən sonra, gecəyarısı, əlli yaraqlı-yasaqlı atlı ilə birlikdə dağlara qalxdı. İşıqlaşmamış qaçaqların üstünü kəsmək istəyirdi. Ona demişdilər ki, Şəmistan ağanın dəstəsi yaylaqdadır, özü də bu gecə binədə toyda olacaqlar. O bu yerlərə yaxşı bələddi, bütün keçidləri, cığırları tanıyırdı.

Dan ulduzu doğanda mənzilə çatdılar. Səssiz-səmirsiz binələrin ətrafını kəsdilər. Üç tərəf hündür qayalıqdı. Dəyələr isə, aşağıda, talada qurulmuşdu. Qabaq uçurum idi. Bircə yol vardı. O da qayaların arasından keçirdi. Çadırların birindən saz səsi gəlirdi. Deyəsən, aşıq dastan başlamışdı.

Cavanşir başa düşdü ki, qaçaqlar bu dəyədədir. Yoldaşlarına xəbər çatdırdı ki, tələsməsinlər, elə eləsinlər ki, arvad-uşağa güllə dəyməsin. İşıqlaşana yaxın aşığın səsi kəsdi. Qaçaqlardan iki-üç nəfəri dəyədən çıxıb atların örüyünü dəyişdilər. Bir azdan araya elə bir sükut çökdü ki, dərədəki bulaqların şırıltısı aydınca eşidildi. Cavanşir başa düşdü ki, qaçaqlar yatdılar.

Səhərlə gecənin qovuşduğu mürgü anına qədər gözlədilər.

Qaçaqlardan biri alt paltarında dəyənin böyrünə, su üstünə çıxdı. Güllə açıldı. Kişi yumbalana-yumbalana atlara tərəf dığırlandı. Bu tələsik atəş Cavanşirin qurğusunu pozdu. O, səssizcə dəyəyə hücum etmək və qaçaqları yatdığı yerdə diri tutmaq istəyirdi. Amma indi atışmalı oldular.

İşıqlaşana qədər atışdılar. Səhərə yaxın dəyədən səs-səmir gəlmədi. Nəfəslərini dərib gözlədilər. Birdən dəyədən kimsə çıxıb dərə-

yə doğru qaçdı. Qaçdıqca da qanrılıb geriyə güllə atdı, Cavanşir Şəmistan ağanı tanıdı. Darağı xəzinəyə basdı, gülləni lüləyə verib nişan aldı. Şəmistan ağa nişana gəlmədi. O, ilan kimi qıvrıla-qıvrıla qaçırdı. Cavanşir lap aşağıda, dərənin qaşında, qulaqlarını şəkləyib dayanan atı da gördü. Tanıdı. Xallı göy at idi. Bir az da keçsə Şəmistan ağa atın belinə sıçrayıb, özünü dərəyə sala bilərdi. Gözlədi. Şəmistan ağa ayağını üzəngiyə qoyub, yəhərin üstünə qalxanda, səhərin aydınlığında, kişi nişana gəldi. Cavanşir tətiyi çəkdi. Göy at kişnəyib şahə qalxdı və yəhərdən yıxılmamaq üçün onun boynunu qucaqlayan sahibini də götürüb qayalığa doğru çapdı. Cavanşir yolu-izi gözəl tanıyan atın Şəmistan ağanı da götürüb aradan çıxa biləcəyindən ehtiyatlanaraq ayağa durdu. Qalxmağı ilə də güllə açılmağı bir oldu. Onun çiyni alışıb yandı. Yenə tətiyi çəkdi. Atın dayanıb dövrə vurmağından başa düşdü ki, Şəmistan ağa yəhərdə deyil...

Gün xeyli qalxandan sonra aşağı endilər. Yaralıların silahlarını aldılar. Qollarını bağlayıb arabalara mindirdilər. Ölüləri isə atın belinə qoyub yəhərə sarıdılar. Barmaqları tətikdə, dağlardan qəza mərkəzinə endilər.

Bütün şəhər təşviş içindəydi. Qəza mərkəzinin ortasından keçən yeganə küçənin hər iki yanı adamla dolu idi. Çiyni sarıqlı Cavanşir qabaqda, at belində gəlirdi. Onun dalınca yəhərə sarınmış meyitlər, arxada arabalar irəliləyirdi. Süvari “otryad” dəstəsi yolun sağı və solu ilə cərgələnmişdi. Nal şaqqıltısı divarları titrədirdi. Arvadlar kəlağayılarının ucları ilə gözlərini silib, için-için ağlayırdılar. Evlərin pəncərələrindən boylananlardan üzlərini cırıb, dizlərinə döyənlər də vardı. Heç kəs irəli çıxıb ölüsünə, dirisinə sahib dura bilmirdi.

Dəstə meydanın ortasında dayandı. Qəza Firqə özək katibi, fəallar, komsomollar, rayonun rəhbərləri gəldilər. Mitinqə başladılar. Cavanşirin tərifini göylərə qaldırdılar. Pionerlər onun şərəfinə şer də oxudular. Axırda xallı Göy atı ona mükafat verdilər: “Apar, min, halalındır” – dedilər. Əli-qolu bağlı qaçaqları Şəkərin qalasına apardılar. Ölüləri isə gecə qaranlığında xəlvəti haradasa basdırdılar.

Göy at Cavanşiri yaxın qoymadı. Əvvəllər bircə dəfə, Həcərin yanında onu görən at qabaqlaşanda yüyəni çeynəyib dayanar, doğma adam kimi imsiləyərdi. Başa düşürdü ki, sahibi Həcər bu oğlana meylini salıb. Amma indi Cavanşiri görəndə gözləri oynayıb burun pərələri genişlənir, yüyəni çeynəyib irəli atılır, şahə qalxır, çəçiyi ilə onu tapdalamağa çalışırdı. At düşmənini bağışlamaq istəmirdi. Cavanşir

hər dəfə atın yanına gedib qayıdanda özünü-sözünü bilmirdi, elə bil peşmanlayırdı. Dilsiz-ağızsız heyvanın hərəkəti onu sarsıdırdı. İşdə də özünə yer tapa bilmirdi. "Deyəsən, heyvanlar insanlardan yaxşıdır, dönük çıxmırlar, dostu da tanıyırlar, düşməni də. Doğrudan da onlar mənə nə pislik eləmişdilər? Kəndə səs yayılanda ki, Cavanşirin əli Həcərə dəyib, o dişlənmiş tikədir, heç kəs daha yaxın durmaz, Şəmistan ağa onu doğram-doğram eləyərdi, qabağına kim duracaqdı? Amma əl qaldırmadı. İnsaflı adam idi. Doğrudan da o, kənddə kimə pislik eləmişdi, kimin toyuğuna daş atmışdı, nə olar varlı olanda? Diribaş adamdı, özünə var-dövlət düzəltmişdi. Həcərin özü onu nə qədər çox istəyirdi. Bircə dəfə əli-əlinə, dodağı-dodağına, nəfəsi-nəfəsinə toxunmuşdu deyə oturub illərlə yolunu gözləmişdi". Cavanşir axır vaxtlar hara gedirdisə Həcər yedəyində at qarşısında dayanırdı. Qızın titrəyən bədəninin, təpimiş dodaqlarının təmasını yenidən hiss edirdi. Qumru quşlarının səsi qulaqlarında canlanır, qovaq ağaclarının ləçəkləri gözünün önündə uçuşurdu. Xallı Göy at oxranıb onu imsiləyirdi. Cavanşir bilmirdi neyləsin, hara qaçsın ki, bu düşüncələrdən yaxasını qurtarsın. Anası da gecəli-gündüzlü ondan əl çəkmirdi, səsi qulağında canlanırdı: "Həcər sənin nişanlın idi, istəsəydin qoymazdın sürgün olunsunlar". "Mən qolçomaq qızını ala bilməzdim". "Bilmirəm, qolçomaq nədir, amma düz eləmədin, bala, sözünə dönük çıxdın. Yadında saxla, uzunsaçlının ahı yerdə qalmaz". Belə hallarda Cavanşirin gözləri yaşla dolurdu. "Sən düz deyirsənmiş, ana, uzunsaçlının ahı yerdə qalmadı. Onun ahı məni yox, səni tutdu. Amma mən də sənin qanını aldım". Cavanşir elə bilirdi ki, bu sözlərdən sonra anası sakitləşəcək. Amma tərsinə, arvad elə bil dabanları üstündə fırlanıb tərstərs oğlunun üzünə baxdı: "Nə olsun?!". Cavanşir hər dəfə Göy atı görəndə bu cür xəyallar ondan əl çəkmirdi, gecələr də qarmaqarışıq yuxular görürdü. Ona görə də atı ilxıya qatıb, gözündən uzaq etmək istədi. Bir-iki gün fikirləşdi, sonra qərarını dəyişdi. Görünür nə qədər kədərli, əzablı olsa da, atın yada saldığı xatirələr ona əziz idi. Mehtərə tapşırdı. Tövlədə bordayıb saxladılar. Hətta bir gün onu qəzaya çağırıb firqə özəyində işləməyi təklif edəndə, Cavanşir dərhal razılıq verib şəhərə gedəndə belə atdan əl çəkmədi. Özü ilə qəza mərkəzinə apardı. Atın onu yenə yaxın qoymamasına baxmayaraq saxladı. İllər keçdi. O məşhurlaşdı. Qəzaya gələn ilk minik maşınını ona verdilər. Göy at isə tumarlandı, sığallandı, Cavanşiri görəndə isə dəliyə döndü...

Bir axşam...

Pəncərə açıq idi. Bütün günü qəza mərkəzində, yenicə salınmış bağda, inqilabın ildönümünü bayram etmişdilər. Qara zurnalar səs-səsə vermiş, boynu qalstuklu pionerlər, atlı cavanlar, əli şüarlı insan seli "Yaşasın Bakıdan gələn Şura hökuməti" – deyə-deyə taxtadan yenicə düzəldilmiş "tribunanın" önündən keçmişdilər. Cavanşir iş yoldaşları ilə birlikdə rəsmi keçidi qəbul etmişdi. Boğazı ağrıyanacan şüar demişdi. Təntənə axşamüstü qurtarmışdı. İdarədə balaca bir məclis də düzəltmişdilər. Cavanşir gecədən xeyli keçəndən sonra evə qayıtmışdı.

O həmişə şəhərin qurtaracağındakı evində yatmazdan əvvəl pəncərələrin dal taxtalarını örtərdi. Bu dəfə heç pəncərəni də bağlamadı. Həm hava isti idi, həm də bir azca içmişdi. Evdə nəfəs almaq olmurdu. Fikirləşdi ki, elə paltarlı çarpayıya uzanıb bir azca dincəlsin. Sonra durub həm çay içər, həm də qapı-bacanı cağlayıb əməlli-başlı yatar. Amma özünün də xəbəri olmadan uzanan kimi yuxu onu apardı. Ağır, dərin, şirin yuxuya getdi. Xəbəri olmadı ki, pişik kimi ayaqlarını asta basan bir adam pillələri qalxıb pəncərənin önündə dayandı. Bu Həcər idi. Kişi paltarı geyinmişdi. Başında buxara papaq, əynində çərkəzi paltar, belində xəncər, boynunda başlıq vardı. Beşaçılanı əlində hazır tutmuşdu.

Ay işığında xeyli otağa, Cavanşirə baxdı. Kişiləşmişdi. Saçına, gicgahlarına dən düşmüşdü. Həcərin onu son dəfə gördüyündən beş il keçmişdi. Amma Cavanşir elə bil qırx yaşlı kişi idi. Qız diqqətlə baxdı: bığları codlaşmış, sifətinə qırışlar düşmüşdü. Uzanışından görünürdü ki, yaman yorulub. Yuxu elə aparıb ki, heç dünyadan xəbəri yoxdur. Qızın ürəyi titrədi. Bir anlığına hər şeyi unudub pəncərədən içəri düşmək, onun çəkmələrini soyundurmaq istədi. İstədi ki, onun belindən kəmərini açsın, köynəyini, şalvarını soyundurub, başının altına yastıq qoysun, sonra da sinəsinə qısılsın. Bir pişik qılığı, pişik xorultulu nəfəsi ilə ona tumar çəksin, ona layla desin. O, belə anı çox gözləmişdi. Gözləmişdi ki, Cavanşir onun əri olacaq və Həcər ərini ağzında dili kimi saxlayacaq.

Bir pişik astalığı və çəldliyi ilə yüngülcə atılıb pəncərədən içəri düşdü. Cavanşir bir şey hiss etmiş kimi yanı üstə çevrildi. Həcər barmağı tətikdə gözlədi. Amma Cavanşir oyanmadı. Qız elə bil sevindi. Dərindən nəfəs alıb rahatlandı. Əlini uzadıb Cavanşirin belindəki qoburun düyməsini açdı, ehmalca naqanı çıxartdı. Naqanın lüləsinə, topuna baxdı. Güllələr yerindəydi...

Ertəsi günü şəhərə səs yayıldı ki, raykomu vurublar, Göy atı da aparıblar. Dünya axışıb gəldi. Milislər, "QPU" işçiləri tökülüşdülər. İcraiyyə komitəsinin, prokurorluğun adamları gəldilər. Hər yeri ələk-vələk elədilər, iki gilizdən və Cavanşirin gülləsi atılmış naqanından başqa heç nə tapa bilmədilər. Bir gündən sonra xəbər gəldi ki, Göy at özünü yarğandan atıb, amma alnında güllə yeri var. "Qolçomaqların işidir" – dedilər. Beş-on adam tutdular. Mərkəzdən də adamlar gəldi. Çox məsləhətləşdilər. Axırda qərara aldılar ki, Cavanşiri Şura hökumətinin yolunda canını qurban verən bir adam kimi qəbristanda yox, bağda dəfn etsinlər. Matəm mitinqi açdılar. Tabutun başının üstündə natiqlər bir-birini əvəz etdilər. Hamı da söz verdi ki, əziz dost, əziz Cavanşir, sən rahat yat, səni unutmayacağıq və bütün yarımçıq qalmış işlərini axıra çatdıracağıq. Çaxmaqlar şaqqıldadı, milislər gülləleri lüləyə verdilər, beşaçılanların ağzını göyə tutdular və üç dəfə yaylım atəşi açdılar...

* * *

...Rəşidin kooperativi iki il idi ki, işləyirdi və bu kooperativin sorağı Bakıya qədər gedib çıxmışdı. Buraya gələn hörmətli qonaqları şəxsən özü qarşılayırdı. Əvvəlcə iş otağına aparır, yumşaq səndəllərdə əyləşdirir, yemək-içmək hazır olana qədər kəkotulu çay gətirdir, videomaqnitofona türk müğənnilərinin lentlərini qoyur, qonaqlar bir stəkan çay içib dincəldikdən sonra qollarından tutub ikinci mərtəbəyə qaldırır, onlar üçün hazırlanmış xüsusi otağa aparırdı. Hər şey qaydasında idi.

O, adəti üzrə bir gün yenə ikinci mərtəbənin dairəvi eyvanında, kölgədə qoyulmuş yazı masasının arxasında əyləşib, gəlib-gedən müştərilərə, ağacların kölgəsində çay içənlərə göz qoyurdu ki, narazılıq olmasın. Birdən gözünə saçı ağarmış, beli bükülmüş bir qarı sataşdı. Onun yanında orta yaşlı iki kişi və dörd-beş yaşlı bir oğlan uşağı vardı. Ağacın sərinliyində oturub çay içirdilər. Bura adamlarına oxşamırdılar.

Qarı ayağa durdu, qamətini düzəldib ətrafa boylandı və asta addımlarla restoranın başına dolandı. Rəşid başa düşdü ki, qarı nə isə axtarır, yoxsa tez-tez dayanıb ağaclara baxmaz, irəli-geri addımlayıb təşviş içində dayanmazdı. Rəşid də təşvişə düşdü. Asta addımlarla pilləkəni aşağı endi və qarıdan bir az aralıda ayaq saxladı.

– Nə axtarırsan, nənə?

Qarı sərt baxışlarını Rəşidin üzünə zillədi.

– Burda bir qəbir vardı.

– Nə qəbir, nənə?

– Adam qəbri.

Rəşid eşitmişdi ki, on, on beş il əvvəl yaşlı bir qadın qəbrin ətrafında gül əkmişdi. Bəlkə bu qarı elə həmin arvad idi? Elə bil ürəyi qopub düşdü. Qarının qəbir sahibi olacağını və haray salacağını ağlına gətirəndə bədənini tər basdı. Amma özünə toxtaqlıq verdi.

– Bura bağdı, nənə, ölünü qəbristanda basdırarlar.

Qarının qaşları çatıldı. Dikəldi. Birdən-birə çöhrəsi məhzunlaşdı. Yaşarmış gözlərini əlinin arxası ilə sildi.

– Düz deyirsən, bala, ölünü qəbristanda basdırarlar.

Uşaq qaça-qaça gəlib qarının ətəyindən yapışdı.

– Həcər nənə, atam çağırır, gedək.

Qarı getdi. Ayaqlarını sürüyə-sürüyə yola çıxdı. Elə bil beli bir az da büküldü.

Restorandan isə müğənninin səsi gəlirdi.

Dünya mənim, Dünya sənin, Dünya heç kimin...

*İyun, 1990*

## MÜNDƏRİCAT



ROMANLAR



HEKAYƏLƏR

